# Əhli Sünnə Vəl Cəmaat
# Sələfi Salihin
# Əqidəsi

# TÖVHID

## (Allahın Qulları Üzərində Olan Haqqı)

Toplayan və Tərcümə Edən: K.Hüseyn
İxtisas Redaktoru: R. İsbarxanlı

بسم الله الرحمن الرحيم

**RƏHİMLİ VƏ MƏRHƏMƏTLİ OLAN ALLAHIN ADI İLƏ**

***Ey Rəbbimiz! Bizi doğru yola yönəltdikdən sonra ürəklərimizə şəkk-şübhə*** *(azğınlıq, əyrilik)* ***salma! Bizə Öz tərəfindən bir mərhəmət bəxş et, çünki Sən, doğurdan da, bəxşiş verənsən!*** *(Ali İmran 8).*

***Ey Rəbbimiz! Unutduqda və ya yanıldıqda bizi cəzalandırma! Ey Rəbbimiz! Bizdən əvvəlkiləri yüklədiyin kimi, bizi ağır yükləmə! Ey Rəbbimiz! Gücümüz çatmayan şeyi bizə yükləyib daşıtdırma! Bizi əfv edib bağışla, bizə rəhm et! Sən bizim ixtiyar sahibimizsən. Kafirlərə qələbə çalmaqda bizə kömək et!*** *(əl-Bəqərə 286).*

Allahım! Bütün əməllərimin saleh əməl olmasını və bunları heç kimsə üçün deyil, sadəcə Sənin rizan üçün olmasını diləyirəm.

Allahım! Bu kitabı yazan, tərcümə edən, oxuyan, dinləyən, yayan və bu kitabın üzərində əziyyəti olan hər bir kəs üçün xeyirli et! Amin!

بسم الله الرحمن الرحيم

إنَّ الحَمْدَ لله ، نَحْمَدُهُ وَنَسْتَعِينُهُ وَنَسْتَغْفِرُهُ، وَنَعوذُ بالله مِنْ شُرُورِ أَنفُسِنا ، وَمِنْ سَيِّئاتِ أعمالنا ، مَنْ يَهده اللهُ فلا مُضِلَّ لَهُ ، وَمَن يُضلل فَلاَ هَادِيَ لَهُ ، وأَشهدُ أنْ لاَ إِلهَ إلاَّ اللهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّداً عَبْدُهُ وَرَسُولُهُ.

﴿ يا أَيُّها الَّذِينَ آمَنُوا اتَّقُوا اللهَ حَقَّ تُقاتِهِ وَلاَ تَمُوتُنَّ إلاَّ وأَنتُم مُسْلِمُونَ ﴾ سورة آل عمران : الآية ، ١٠٢.

﴿ يا أَيُّها النَّاسُ اتَّقُوا رَبَّكُمُ الَّذي خَلَقَكُم مِّن نَفْسٍ وَاحِدَةٍ وَخَلَقَ مِنْهَا زَوجَها وَبَثَّ مِنهُما رِجَالاً كَثِيراً وَنِسَاءً واتَّقُوا اللهَ الَّذي تَساءَلُونَ بِهِ وَالأَرْحامَ إنَّ اللهَ كانَ عَلَيْكُم رَقِيباً ﴾ سورة النساء : الآية ، ١.

﴿ يَا أَيُّها الَّذِينَ آمَنُوا اتَّقُوا اللهَ وَقُولُوا قَولاً سَدِيداً ، يُصْلِحْ لَكُمْ أَعْمالَكُمْ وَيَغْفِر لَكُمْ ذُنُوبَكُم وَمَن يُطِعِ اللهَ وَرَسُولَهُ فَقَدْ فَازَ فَوزاً عَظِيماً ﴾ سورة الأحزاب : الآية ، ٧١.

أما بعد : فإنَّ أَصْدَقَ الحديث كلامُ الله ، وخَيرَ الهَدْيِ هَدْيُ مُحَمَّدٍ – صلَّىٰ الله عليه وعلىٰ آله وسلَّم – وشرَّ الأُمور مُحْدَثاتُها وكلَّ مُحْدَثَةٍ بِدعَةٌ ، وكلَّ بدعةٍ ضلالَةٌ ، وكلَّ ضلالةٍ في النَّار (*).

---

(*) هذه الخطبة ؛ تسمَّىٰ : «خطبة الحاجة» وهي تُشرع بين يدي كلّ حاجة ، والتي كان رسول الله ﷺ يعلِّمها أصحابه ؛ أن يقولوها بين يدي كلامهم ، في أمور دينهم سواء كان ؛ خطبة نكاح ، أو جمعة أو محاضرة ، أو غير ذلك ، وهي في : «سنن ابن ماجه» و «سنن الترمذي» و «سنن أبي داود» و «سنن النسائي» ، وورد ذكر طرف من هذه الخطبة في : «صحيح مسلم».

# ÖN SÖZ

***Xutbətul-Hacə***

Həmd ancaq Allahadır, Ona həmd edir, Ondan yardım və məğfirət diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Allaha sığınırıq. Allah kimi hidayətə yönəltmişsə, onu heç kəs azdıra bilməz, kimi də azdırmışsa, heç kəs onu hidayətə yönəldə bilməz. Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq haqq ilah (məbud) yoxdur, O, təkdir, şəriki də yoxdur və şəhadət edirəm ki, Muhəmməd Onun qulu və Elçisidir.

(يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللَّهَ حَقَّ تُقَاتِهِ وَلَا تَمُوتُنَّ إِلَّا وَأَنْتُمْ مُسْلِمُونَ)

***"Ey iman gətirənlər! Allahdan lazımınca qorxun. Yalnız müsəlman olduğunuz halda ölün".*** *(Ali-İmran 102).*

(يَا أَيُّهَا النَّاسُ اتَّقُوا رَبَّكُمُ الَّذِي خَلَقَكُمْ مِنْ نَفْسٍ وَاحِدَةٍ وَخَلَقَ مِنْهَا زَوْجَهَا وَبَثَّ مِنْهُمَا رِجَالًا كَثِيرًا وَنِسَاءً وَاتَّقُوا اللَّهَ الَّذِي تَسَاءَلُونَ بِهِ وَالْأَرْحَامَ إِنَّ اللَّهَ كَانَ عَلَيْكُمْ رَقِيبًا)

***"Ey insanlar! Sizi tək bir şəxsdən*** *(Adəmdən)* ***xəlq edən, ondan da zövcəsini*** *(Həvvanı)* ***yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun.*** *(Adı ilə)* ***bir-birinizdən*** *(cürbəcür şeylər)* ***istədiyiniz Allahdan, həmçinin qohumluq əlaqələrini kəsməkdən qorxun. Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir".*** *(ən-Nisa 1).*

(يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللَّهَ وَقُولُوا قَوْلًا سَدِيدًا. يُصْلِحْ لَكُمْ أَعْمَالَكُمْ وَيَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ وَمَنْ يُطِعِ اللَّهَ وَرَسُولَهُ فَقَدْ فَازَ فَوْزًا عَظِيمًا)

***"Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz söyləyin!*** *(Əgər belə etsəniz)* ***Allah əməllərinizi islah edər və günahlarınızı bağışlayar. Hər kəs Allaha və Peyğəmbərinə itaət etsə, böyük bir səadətə*** *(Cənnətə)* ***nail olar".*** *(əl-Əhzab 70-71).*[1]

Şübhəsiz ki, sözlərin ən doğrusu Allahın kəlamı, yolların ən xeyirlisi Muhəmmədin ρ yoludur. Əməllərin ən pisi sonradan uydurulanlardır. Sonradan uydurulub dinə salınan hər bir əməl bidətdir, hər bir bidət isə zəlalətdir. Hər bir zəlalət isə oddadır.[2]

(قَالَ رَبِّ اشْرَحْ لِي صَدْرِي , وَيَسِّرْ لِي أَمْرِي , وَاحْلُلْ عُقْدَةً مِنْ لِسَانِي , يَفْقَهُوا قَوْلِي)

***"Ey Rəbbim! Köksümü açıb genişlət, işimi yüngülləşdir, dilimdəki düyünü aç ki, sözümü yaxşı anlasınlar!"*** *(Taha 25-28).*

---

[1] ***Xutbətul-Hacə*** adı ilə məşhur olan bu duanı cümə və s. xütbələrdə Peyğəmbər ρ oxumuşdu. Səhabələrinə də bunu əmr etmiş və özü də onları öyrətmişdir. Hədisin ilk hissəsini bizə Əhməd (№ 1/ 392, 293, 432); Əbu Davud (№ 2188); ət-Tirmizi (№ 1105); İbn Macə (№ 1892) və başqaları rəvayət etmişlər.

[2] ***Hədisin Ikinci Hissəsini***: Muslim "Şərhu Nəvəvi" (6/ 153-156); Əhməd (3/ 319, 371); ən-Nəsai (3/ 188, 189) və digərləri rəvayət etmişlər. Hədis alimi Muhəmməd Nəsirəddin əl-Albani hədisin bütün rəvayətlərini bir yerə toplayaraq "Xutbətul-Hacə" adlı bir kitab yazmışdır. İstəyənlər bu kitaba baxa bilərlər. Hədis Şeyx əl-Albani tərəfindən səhih hesab olunur.

Möhtərəm müsəlman bacı və qardaşlarımız! İlk öncə hamınızı Allahın salamı ilə salamlayıram. Allahın Kitabına və Allah Elçisinin ρ yoluna tabe olaraq bu əməli "***Bismilləh***" ilə başlayıram. Çünki, Allah Rəsulu ρ də öz məktublarını "***Bismilləh***" ilə başlamış və buyurmuşdur: "Hər mühüm bir işə "***Bismilləh***" ilə başlanılmazsa, o işin sonu kəsikdir"[3].

Nə üçün Kitabut-Tövhid? Kitab – ***Kətəbə - Yəktubu - Kitəbə -*** toplamaq, yığmaq sözündə əmələ gəlib, mənası - söz və hərflərin toplanmasıdır. Müəyyən bir əşyanı özündə toplayandır. İbn Qeyyim Σ deyir ki: "Tövhid iki qismdir: **1)** ***Tövhid fil-Mərifə vəl-İsbat*** **–** bilmək və təsdiq etmək. Rububiyyə və İsim və Sifətlər bura daxildir. **2)** ***Tövhid əl-İləhiyyə vəl İbaədə -*** ilahlaşdırmaq, ibadət və ya ***Tövhid Fi ət-Talabi vəl-Qasd*** **–** tələb və qəsd. ***"De: "Ey kafirlər!"*** *(əl-Kəfirun 1).* ***"De: "Ey Kitab əhli! Bizim və sizin aranızda olan eyni bir kəlməyə gəlin ki, Allahdan başqasına ibadət etməyək, Ona heç bir şeyi şərik qoşmayaq və Allahı qoyub bir-birimizi ilahiləşdirməyək". Əgər onlar üz döndərsələr, deyin: "Şahid olun ki, biz müsəlmanlarıq!"*** *(Ali İmran 64).*[4].

Əqidə nədir? Əqidə - ***Aqd*** – bağlamaq, düyün vurmaq deməkdir. "Mənim əqidəm belədir" deyildiyi zaman, yəni "mən qəlbim ilə bu inanclara bağlanmışam" deməkdir. Əqidə qəlbin etiqadıdır. İslam şəriəti iki hissəyə bölünür. **1)** ***Etiqadi -*** əməllə bağlı olmayan inanclar. Məs: Allahın Rəbliyinə etiqad, imanın altı dayağına iman və s. bunlar əsasdır. Onların üzərində digər şəriət əhkamları qurulur. **2)** ***Əməli*** – şəri əməllərdir. Məs: Namazın qılınması, orucun tutulması və s. Bunlar isə əsasın üzərində qurulan budaqlardır. Əsas səhih olmasa bunların heç birinin faydası olmayacaqdır. Etiqad düz olmadıqda, budaqların heç birinin faydası olmayacaqdır. ***"Sənə və səndən əvvəlkilərə belə vəhy olunmuşdur. Allaha şərik qoşsan bütün əməllərin puça çıxacaq və mütləq ziyan çəkənlərdən olacaqsan".*** *(əz-Zumər 65).* Allah Peyğəmbərə ρ müraciət edərəkən buyurur: "Əgər sən də Allaha şərik qoşsan əməllərin puça çıxar və mütləq ziyan çəkənlərdən olarsan". Ona görə də bütün Peyğəmbərlərin ilk dəvəti Tövhid olub, insanları şikrdən çəkindirmək idi. Allah Qurani-Kərimdə Nuh, Saleh, Hud, İbrahimin ρ adlarını çəkir. Onların sözləri insanlara: "Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın"- deməkdən ibarət idi. Peyğəmbərimiz Muhəmməd ρ on üç il Məkkədə insanları bu əqidəyə dəvət etdi. Çünki, təməl nə qədər möhkəm olarsa onun üzərində qurulan da möhkəm olar. Zəlalət üzərində qurulan hər bir şey isə zəlalətdir. Nə üçün Peyğəmbər ρ on üç il yalnız Tövhidə dəvət etdi?

***Bu Dəvətin Səbəblərdən Bəziləri:*** **1)** Çünki, məxluqatın yaradılışının səbəbi Tövhiddir. Əgər bu səbəb tək olsaydı kifayət edərdi. ***"Mən cinləri və insanları ancaq Mənə ibadət etmək üçün yaratdım".*** *(əz-Zəriyət 5).* Sələflər bu ayədə olan ***Liyabudun*** –

---

[3] Hədisi Əbu Davud rəvayət etmiş, əl-Albani zəif demişdir.

[4] İbn Qeyyim "Mədaricus-Salikin" 3/ 449-450.

***Vahhidun*** - kimi təfsir emişlər. ***Ləm*** – Ğayədir. Bu da məqsədə (səbəbə) dəlalət edir. Peyğəmbərlər İbadət Tövhidi üçün gəlmişlər. Allah insanları yalnız bir məqsəd ilə yaratmışdır – o da ***İbadətdir***. Yaratmağın hikməti ibadətdir. İbadət nə deməkdir? Xudu və Zull – İtaət və Zəlillik. Bu ibadətə Məhəbbət və Qiyədə (ardınca getmək) əlavə edilərsə bu da şəri ibadət olur. ***Tariq Muabbad -*** ərəblər hazır olan yola da "zəlil olmuş yol" deyirlər. Alimlər İbadət kəliməsinə bir çox təriflər vermişdilər. Lakin ən gözəl tərif İbn Teymiyyənin Σ verdiyi tərifdir: "Bura Allahın sevdiyi və razı qaldığı zahiri və batini hər bir söz və əməl (namaz, oruc, dua, qurban, nəzir, məhəbbət, qorxu, niyyət və s.) daxildir". İbadət üç şeylə olur: Dil - Qəlb - Əməl və bu ibadətlər üç şeyin üzərində qurulur: Məhəbbət - Ümüd - Qorxu.

**2)** Allah Tövhid olsun deyə Quranı nazil etdi. ***"Əlif Ləm Mim. Bu, qətiyyən şübhə doğurmayan, müttəqilərə doğru yol göstərən bir Kitabdır. O kəslər ki, qeybə iman gətirir, namaz qılır və Bizim onlara verdiyimiz ruzidən Allah yolunda xərcləyirlər; O kəslər ki, sənə nazil olana və səndən əvvəl nazil olanlara iman gətirir, axirətə də yəqinliklə inanırlar. Onlar öz Rəbbindən gələn doğru yoldadırlar Məhz onlar nicat tapanlardır".*** *(əl-Bəqərə 1-5).* **«Ey** *(libasına)* **örtünüb bürünmüş Peyğəmbər! Qalx** *(qövmünü Allahın əzabı ilə)* **qorxut! Öz Rəbbini uca tut. Libasını təmizlə. Əzaba səbəb olacaq pis şeylərdən uzaqlaş.** *(Etdiyin yaxşılığı)* **çox bilib başa qalxma. Rabbinin rizasını qazanmaq üçün səbr et».** *(əl-Muddəssir 1-7).* Allahın **«*Qalx və qorxut*»** buyurduğunun mənası, şirkdən qorxudub çəkindirmək və tövhidə dəvət etmək deməkdir. **«*Öz Rəbbini üca tut*»** tövhid ilə onu təzim et. **«*Libasını təmizlə*»** yəni əməllərini şirkdən təmizlə. **«*Pis şeylərdən uzaqlaş*»** yəni bütlərdən uzaq dur. Onlardan uzaq durmaq isə bütləri və bütpərəstləri tərk edib, onlardan uzaq durmaq deməkdir. Bütün bu buyuruqlardan sonra ona risalət verilmiş oldu. O, da qalxıb dəvət etdi və Allahın əmrini yerinə yetirdi.

**3)** İnsanlar doğru yolu tapsınlar, Allahdan qeyrisinə ibadət etməsinlər. ***"Allah bir-biri ilə çəkişən bir neçə şərikli ağası olan kişi ilə tək bir ağası olan kişini məsəl çəkir. Onlar məsəlcə eyni ola bilərmi? Həmd Allaha məxsusdur, lakin onların əksəriyyəti bunu bilmir".*** *(əz-Zumər 29).* İbn Qeyyim Σ deyir ki: "Allah bu ayədə müşrik ilə Muvahhid bir kimsəni ayıraraq misal çəkmişdir. ***Müşrik -*** əxlaqı pozulmuş, bir-birinə düşmən olan, ayrılığa düşmüş bir cəmaata sahib qul halında olub bir neçə ilaha ibadət edir. Bu ilahların istəkləri fərqli olduğu üçün heç birini də razı salmır. ***Müvahhid*** – olan Allaha ibadət etdiyi üçün halı – şirkdən uzaq olan, hədəf və məqsədini aparan yolu bilən və bütün ixtilaflardan uzaq olaraq hüzur içində olan bir kimsədir. Onun üzərində Rəbbinin rəhməti, ehsanı vardır. Bu iki qul heç bir olarmu?".[5]

**4)** Tövhid bütün Peyğəmbərlərin göndərilməsinə səbəbdir. ***"Biz hər ümmətə Allaha ibadət edin və tağutdan çəkinin deyə peyğəmbər göndərdik".*** *(ən-Nəhl 36).* ***"Ad***

[5] "İlamul-Muvakkin" 1/187.

***qövmünə də qardaşları Hudu göndərdik. O dedi: "Ey qövmüm! Allaha ibadət edin. Sizin Ondan başqa məbudunuz yoxdur. Yoxsa qorxmursunuz?".*** *(əl-Əraf 65).* ***"Səmud qövmünə də qardaşları Salehi göndərdik. O dedi: "Ey qövmüm! Allaha ibadət edin! Sizin Ondan başqa məbudunuz yoxdur. Rəbbinizdən sizə açıq-aydın dəlillər gəldi. Allahın qayadan çıxartdığı bu dişi dəvəsi sizin üçün bir möcüzədir. Onu buraxın Allahın torpağında otlasın. Ona bir pislik etməyin, yoxsa sizi ağrılı-acılı bir əzab yaxalayar".*** *(əl-Əraf 73).* ***"Mədyən qövmünə də qardaşları Şueybi göndərdik. O dedi: "Ey qövmüm! Allaha ibadət edin. Sizin Ondan başqa məbudunuz yoxdur. Rəbbinizdən sizə açıq-aydın bir dəlil gəldi. Elə isə ölçüyə və çəkiyə tam riayət edin, insanların əşyalarını əksik verməyin və yer üzü islah olunduqdan sonra orada fəsad törətməyin. Əgər möminsinizsə, bu, sizin üçün daha xeyirlidir".*** *(əl-Əraf 85).* ***"Biz Nuhu öz xalqına elçi göndərdik. O dedi: "Həqiqətən, mən sizin üçün açıq-aydın xəbərdar edən bir elçiyəm. Allahdan başqasına ibadət etməyin! Mən sizi yaxalayacaq məşəqqət gününün əzabından qorxuram".*** *(Hud 25-26).*

**5)** Bu, dəvətdə ən birinci olandır. ***"De: "Bu, mənim yolumdur. Mən və mənə tabe olanlar, mötəbər dəlillərə əsasən, insanları Allaha tərəf çağırırıq. Allah pakdır, müqəddəsdir. Mən də müşriklərdən deyiləm".*** *(Yusuf 108).* Peyğəmbər ρ Muazı ψ Yəmənə göndərdiyi zaman ona olan ilk nəsihəti: "İnsanları ***Lə İləhə İlləllah*** – kəliməsinə dəvət et!"- deməsidir[6]. Bu başlıq dəlildir ki, müsəlman Tövhidi bildikdən sonra insanları buna dəvət etməlidir. Bu zaman iki şeyə diqqət etmək lazımdır: **1)** Dəvət etdikdə Tövhidə dəvət etmək. **2)** Dəvəti də yalnız Allah üçün İxlasla etmək. Səhl ibn Sad ψ rəvayət edir ki: "Allah Rəsulu ρ Xeybər günü belə buyurdu: "Sabah bu bayrağı mütləq Allahın fəthi ona nəsib edəcəyi bir adama verəcəyəm ki, o, Allahı və Rəsulunu sevir, Allah və Rəsulu da onu sevir. Səhər açıldıqda (səhabələr) Allah Rəsulunun ρ yanına getdilər. Hər biri bayrağın ona verilməsini arzulayırdı. Peyğəmbər ρ belə buyurdu: "Əbu Talibin oğlu Əli haradadır?" Ona: "Gözü ağrıyır!"- dedilər. Peyğəmbər ρ dedi: "Xəbər göndərin, gəlsin". O, xəbər göndərilib gətirildi. Allah Rəsulu ρ mübarək tüpürcəyini onun gözlərinə sürtərək dua etdi. O, saat sağaldı. Sanki heç bir ağrısı yoxmuş kimi oldu. Daha sonra bayrağı ona verdi. Əli dedi: "Ya Rəsulullah! Xeybər (Yəhudiləri) ilə onlar da bizim kimi (müsəlman) olana qədər vuruşacağam". Peyğəmbər ρ: "(Ey Əli!) Tələsmə! Onların sahəsinə girdiyin zaman yavaş-yavaş yeri. Sonra onları İslama dəvət et və üzərilərinə vacib olan İslam əsaslarını onlara xəbər ver. Allaha and olsun ki, Allah bir nəfəri sənin səbəbinlə hidayətə yönəldərsə, bu sənin üçün qırmızı dəvələrdən də xeyirli olar!"- deyə buyurdu".[7]

---

[6] əl-Buxari 1395, Muslim 19.

[7] əl-Buxari "Fəth" 2942, Muslim 2406, ən-Nəsai "Sunənul-Kubra" 8403, 8587, İbn Hibban 6932, Əhməd "Müsnəd" 333.

**6)** Bu ən son anda da olandır. ***“Rəbbi ona: "Təslim ol!"– dedikdə, o: "Aləmlərin Rəbbinə təslim oldum!"– demişdi. İbrahim də, Yaqub da bunu oğullarına vəsiyyət etdilər: "Ey oğullarım! Həqiqətən, Allah bu dini sizin üçün seçmişdir. Siz də ancaq müsəlman olaraq ölməlisiniz! Yoxsa siz Yaquba ölüm gəldikdə onun yanında idiniz? O zaman o, öz oğullarına dedi: "Məndən sonra nəyə ibadət edəcəksiniz?" Onlar dedilər: "Sənin İlahına, atalarının – İbrahimin, İsmailin və İshaqın İlahı olan Tək İlaha ibadət edəcəyik. Biz yalnız Ona təslim olanlarıq!"*** *(əl-Bəqərə 131-133).* Peyğəmbər ρ buyurdu: “Kimin son sözü ***Lə İləhə İlləllah*** olarsa Cənnətə daxil olar”.

**7)** İnsana dinə girmək üçün ən birinci və ölüm anında ən son əmrdir. Ona görə də Peyğəmbər ρ ölüm anında olan kimsələrə ***Lə İləhə İlləllah*** kəliməsini təlqin etməyi əmr edərdi. Əbu Səid əl-Xudri ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Ölüm anında olan yaxınlarınıza Lə İləhə İlləllahı təlqin edin".[8]

**8)** Tövhid səni Cəhənnəmdən qurtaracaq ən böyük səbəbdir və bütün xeyirlərin əsasıdır. ***Həmçinin*** **-** ən böyük və bağışlanılmaz günah olan Allaha şərik qoşmaq dünya və axirətdə olan bütün bəlaların başıdır. Həyatdakı bütün digər pozuntular zəncirvari şəkildə həyatın əsası olan Tövhidin pozulmasından törəyir. Bu mövzu insan həyatında ən mühüm məsələdir. Ömər ψ deyir ki: “Biz Allahın İslam dini sayəsində gücləndirdiyi bir cəmaatıq. İslamdan başqasını seçəcək olsaq, onda Allah bizi zəlil edər”[9]. İslam ordusu Roma imperiyasının idarəsi altında olan Kipri fəth edərkən bütün müsəlmanlar qələbə sevincini yaşadığı halda məşhur səhabə Əbu Dərdə ψ kədərlənərək ağlayırdı. Bunun səbəbini soruşduqda, o dedi: “Baxın onlar necə də əzəmətli bir xalq idi. Hətta onların qüdrətli rəhbərləri də var idi. Onlar Allahın buyuruqlarını tərk etdikləri üçün Allahın da onları necə alçaltdığına baxın. Qorxuram ki, bir vaxt bu ümmət də Allahı və Onun Rəsulunu tərk edər, Allah da onları bu cür alçaldar”[10].

Lakin nədənsə bu məsələ əhəmiyyət baxımından ondan qat-qat aşağı dərəcədə olan digər məsələlərin kölgəsində qalmışdır. Müsəlmanlar Tövhid elminə çox diqqət yetirməlidirlər. Müsəlman: “Yenə də Tövhid!”- deməməlidir. Əsla! Həmişə Tövhid olmalıdır. Bu bizim dünya və axirətdə səadətimizin açarıdır. Hər bir müsəlman ailəsində Tövhid kitabı masaüstü bir kitab olmalıdır. Hər il oxunan, təkrarlanan bir kitab olmalıdır. Bu kitabı tərk etmək şərdir. Bilsən bu kitabda sənin üçün nə qədər xeyir vardır!? “Mən Tövhidi öyrənmişəm” deyən kimsə artıq xəta etmişdir. Tövhid Nəhv və Sarf elmi deyil ki, bir dəfə öyrəndin kifayət etsin. Tövhid – Allahın sənə verdiyi ömürlə bərabər davam edən bir kitabdır. Oxudun bitirdin, yenə də təkrarla, çünki şeytanın səndən ən çox istədiyi şey şirk etməyindir.

---

[8] Muslim 916.
[9] Tərğib Vət-Tərhib 3/ 351, 4393.
[10] “Hilyətul-Övliya” 1/ 216.

***Ümmətdə Şirkin Zühur Etməsinə Başlıca Səbəblər*:** **1)** Cahillik – düzgün əqidəni bilməmək və ya öyrənmək istəməmək, çox az diqqət etmək və ya heç diqqət yetirməməkdir. Nəsillər yetişmişlər ki, bu əqidəni bilmirlər, əqidəyə zidd olan məsələləri bilmirlər. Haqqı yalan, yalanı isə haqq kimi bilirlər. İbn Qeyyim ψ deyir: "Cahillik öldürücü xəstəlikdir. Onun müalicəsi (şəfası) iki şeydədir; Quran və Sünnə. Müalicə edən isə Rəbbani alimdir". Cahillik elmə zidd olandır. Öldürücü xəstəlikdir. İnsanı elə tələf edir ki, özü də hiss etmir. Cahillik xəstəlikdir, insanı elə bir tərzdə kor edir ki, xilasının harada olduğunu bilmir. Alimlər diri, cahillər isə ölüdürlər. Bu əqidə ***Tövqifidir***. Yəni sənin, mənim ağlım üzərində qurulmur. Onu quran Allahdır - əqidədə ictihada yer yoxdur. Əqidənin mənbəsi iki əsasdır: Quran və Sünnə. Nə üçün? Çünki, Allahı Onun Özündən başqa heç kəs yaxşı tanıya bilməz. Allahdan sonra onu gözəl tanıyan Peyğəmbəri Muhəmməddir ρ. İlk əvvəl əqidədə problem yox idi. İnsanlar bir əqidə, bir cəmaat idilər. Lakin xeyirli dövr, xeyirli əsr getdikdən sonra zəlalət əhli gəldi, əqidələr çoxaldı, cəmaatların sayı isə artı. Bütün bu cəmaatlar Quran və Sünnə ilə getdiklərini iddia edirlər. Lakin Quran və Sünnə onları tanımır, tanımaq da istəmir. Əqidələri fəlsəfə, ağıl, kiminsə ideyası, qəzəbi və hissləri üzərində qurulmuş camaatlar. Lakin biz Quran və Sünnəyə fəhm (başa düşmək) qaydasını da əlavə edirik. Sizin (zəlalət əhlinin Quran və Sünnəni) başa düşmək fəhmini yox, Quran və Sünnəni ən gözəl anlayan, bununla yaşayan səhabələrin fəhmini. Auf ibn Məlik ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Yəhudilər yetmiş bir firqəyə bölünəcəklər, onlardan yalnız biri Cənnətə, qalanları isə Cəhənnəmə düşəcəkdir. Xristianlar yetmiş iki firqəyə bölünəcəklər, onlardan yalnız biri Cənnətə qalanları isə Cəhənnəmə düşəcəkdir. Qəlbim əlində olan Allaha and olsun ki, mənim ümmətim yetmiş üç firqəyə bölünəcəkdir, onlardan yalnız biri Cənnətə, qalanları isə Cəhənnəmə düşəcəkdir".[11] İbn Ömərin N rəvayətində isə səhabələr Cənnətə düşən firqə haqqında soruşdular. Rəsulullah ρ buyurdu: "Onlar mənim və səhabələrimin yolu ilə gedənlərdir".[12] Başqa rəvayətdə: Rəsulullah ρ buyurdu: "O, da camaatdır".[13] Bu iki şəfanı öz yerinə qoyan, başa salan lazımdır. Hər bilən yox, Rəbbani bilən lazımdır. Çox insanlar müalicə etmək üçün özləri bu iki əsasa baş vururlar. Lakin onlar alim olmadıqları üçün ölüm tapırlar. Rəbbani alim bu iki əsası sənə doğru başa düşməyə yardımçı olacaqdır. Elm dərmandır. Lakin insan bədəninə uyğun olmayan dərman qəbul etsə bu onu ya şikəst edər ya da ki həlak. Çünki, həkim olmadan qəbul etmiş və bunu ona lazım olan miqdarda etməmişdir. Məhz buna görə də Xəvariclər həlak olmuşlar. Onlar Quran və Sünnəni götürdülər, lakin lazım olan yerə qoymadılar. Elə zənn etdilər ki, böyük günah sahibi əbədi Cəhənnəmlikdir. Onlar

---

[11] İbn Məcə.

[12] ət-Tirmizi, əl-Albani "Səhih Hədislər Silsiləsi" 1348.

[13] Əhməd 4/ 102, əl-Albani "Ziləlul-Cənnə".

bunu öz ağıllarından deyil, bu iki mənbədən götürdülər. Digər məzhəb və təriqətlərin azmalarına səbəb də bir başa bu iki əsasa baş vurmaları idi. Lakin onların başa düşməkdə həkimləri səhabələr deyildilər. Onlar həkim olaraq alimləri deyil, ağıllarını götürdülər. Bu ümmətin fərqi elmin miras edilməsidir. Yəni, yeni nə isə ortaya çıxmır, nə qalıbsa Peyğəmbərdən ρ miras olaraq qalan elmdir. Alimlər isə varis olaraq bunu götürüblər.

**2)** Onların Fanatik olaraq, hətta səhf olduqları halda ata-babalarının yolu ilə getmək. Kor-koranə olan təqlid. Əqidə məsələlərində öz imamına, axunduna, xocaya kor-koranə təqlid etmək (səhf və düz olmasına) baxmayaraq. Heç bir dəlilə əsaslanmadan iman gətirmək. ***“Onlar Allahı qoyub baş keşişlərini və rahiblərini, bir də Məryəm oğlu İsanı tanrılar qəbul etdilər. Halbuki onlara ancaq tək olan İlaha ibadət etmək əmr olunmuşdu. Ondan başqa tanrı yoxdur. O, bunların şərik qoşduqları şeylərdən uzaqdır”.*** *(ət-Tövbə 31).* ***“Onlara: "Allahın nazil etdiyinə tabe olun!"– deyildikdə, onlar: "Xeyr, biz atalarımızın tutduğu yolu tutacağıq!"– deyirlər. Bəs ataları bir şey anlamayıb doğru yola yönəlməyiblərsə necə?”*** *(əl-Bəqərə 170).* ***“Onlara: "Allahın nazil etdiyinə və göndərdiyi Elçiyə tərəf gəlin"– deyildikdə: "Atalarımızın tutduğu yol bizə bəsdir"– deyirlər. Əgər ataları bir şey bilməyib, doğru yola yönəlməyiblərsə onda necə olsun?”*** *(əl-Maidə 104).* ***“Biz səndən əvvəl hansı bir şəhərə xəbərdarlıq edən bir peyğəmbər göndərdiksə, onun cah-calal içində yaşayan sakinləri: "Biz atalarımızı bu yolda gördük və biz də onların yolunu tutub gedəcəyik!"– dedilər”.*** *(əz-Zuxruf 23).* ***“Üzləri odda o yan-bu yana döndəriləcəyi gün onlar deyəcəklər: "Kaş biz Allaha ibadət edəydik, Onun Elçisinə müti olaydıq!" Onlar deyəcəklər: "Ey Rəbbimiz! Biz başçılarımıza və böyüklərimizə itaət etdik, onlar da bizi haqq yoldan azdırdılar”.*** *(əl-Əhzab 66-67).* ***“Onlar Allahı qoyub baş keşişlərini və rahiblərini, bir də Məryəm oğlu İsanı tanrılar qəbul etdilər. Halbuki onlara ancaq tək olan İlaha ibadət etmək əmr olunmuşdu. Ondan başqa tanrı yoxdur. O, bunların şərik qoşduqları şeylərdən uzaqdır”.*** *(ət-Tövbə 31).*

**3)** ***Ğuluv*** – İbadət etməkdə, əməldə, tərifdə, adətlərdə həddi aşmaq deməkdir. Ölmüş saleh kimsələri öz məqamlarından yuxarı qaldırmaq. Etiqad etmək ki, onlar da Allah kimi hansısa qüvvəyə sahibdirlər. ***Şirkin Yaranması*** – birdən-birə baş verməmişdir. Şeytan öz işini addım-addım görür. İlk şirk də salehləri Ğuluv etməkdən sonra baş vermişdir. ***Ğuluv*** – şişirtmək deməkdir. ***Cəfa -*** ğuluvun əksidir. Adəm övladlarının dinlərini tərk etmələrinə səbəb onların salehlərlə bağlı olan həddi aşmalarıdır. ***Saleh*** – saleh əməllər edən, fitnə-fəsad daşımayan kimsədir. ***Saleh*** – Allahın və qulların haqqını verəndir. ***Sabiquna Bil-Xayrat*** – xeyirdə irəli keçən, mübah olan əməlləri edən kimsədir. Salehlərlə bağlı hədd haradadır? Allah üçün onları sevmək, hörmət etmək, qorumaq, əgər Peyğəmbərdirsə şəriətinə əməl etmək. Bu da dinin salehlərə qarşı qoyduğu həddir. Həddi aşmaq isə - onlara Allahın layiq

olduğu sifətləri vermək, Lövhi-Məhfuzda olanları bilməsi, şəriətin qoyduğu çərçivədən çıxmaqdır. Tərif etdikləri zaman Allah səviyyəsində tərif etmək (***İtra* -** o, tərif ki, onda yalan da vardır). Sevgidə həddi aşmaları onların salehləri ucaltmalarına, onlardan kömək istəmələrinə gətirib çıxartdı. Peyğəmbər ρ həcc vaxtı daş atmaq üçün səhabələrdən daş gətirmələrini əmr etdi. İbn Abbas ψ da xırda daşlar yığıb gətirdi. "Peyğəmbər ρ buyurdu: "Ey insanlar! Dində çox şişirtməkdən çəkinin. Sizdən əvvəlkiləri dində çox şişirtmək həlak etdi (əgər insan torpaq atsa Cəfa, yox əgər alma boyda daş atsa artıq Ğuluv etmişdir)"[14]. Peyğəmbər ρ buyurdu: "İfrata varanlar həlak oldular və bunu üç dəfə təkrar etdi"[15]. Xristianlar İsanı υ sevgidə şişirtdikləri üçün ona İlahi keyfiyyətləri verdilər. Yəhudilər isə İsa υ üçün "zinadan doğulan" deməklə cəfa etdilər. Vasat (orta) ümmət isə bu iki əməlin ortasında orta yolu tutanlardır. Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Məni Xristianların Məryəm oğlu İsanı υ tərif etdikləri kimi tərif etməyin. Mən sadəcə bir qulam, deyin Allahın qulu və rəsulu. Məni tərif etməkdə həddi aşmayın. Məni Allahın layiq bildiyi dərəcədən artıq yüksəltməyin. Rəbbim məni necə vəsf edibsə, elə də vəsf edin"[16]. Şirk isə on əsr və ya on nəsildən sonra Nuhun υ qövmündə salehləri ğuluv etməklə ortaya çıxdı. ***"İnsanlar*** *(əvvəlcə)* ***ancaq tək bir ümmət idilər*** *(eyni bir dində idilər).* ***Sonra*** *(aralarında ixtilaf düşdüyü üçün)* ***ayrıldılar".*** *(Yunus 19)".* ***"İnsanlar tək bir ümmət idilər".*** *(əl-Bəqərə 213).* İbn Abbas ψ deyir ki: "Adəm ilə Nuh υ arasında altı əsr (Başqa rəvayətdə: on əsr) vardır. Bu dövrdə yaşayan insanların hamısı da Allahın şəriəti üzrə idilər. Onların hamısı İslam dini üzrə idilər. Daha sonra ixtilafa, rəsulların şəriətlərinə uymağı tərk etdikləri üçün şirkə düşdülər. Allah da müjdələyən və qoxudan Rəsullar göndərdi. Göndərilən ilk Rəsul isə Nuh υ idi"[17]. İstənilən bir günah da belədir. Qadınların geyimi heç vaxt bu günkü kimi qısa olmayıb. İstənilən bir dövlətin adət ən-ənəsi olan geyimlərinə, milli geyimlərinə nəzər salsaq görərik ki, paltarı uzun və baş örtüyü də var. Lakin vaxt keçdikcə şeytan müəyyən bəhanə və hiylə ilə onların geyimlərini gördüyümüz hala gətirmişdir. Artıq pis bir əməl gözəl, gözəl bir əməl isə pis göstərilmişdir. Nuhun υ qövmü ilə baş verən də şeytanın addım-addım gəlməsi idi. ***"Və*** *(öz tabeçiliyində olanlara)* ***dedilər: "Öz tanrılarınızı tərk etməyin,*** *(xüsusi ilə)* ***Vəddi, Suvanı, Yəğusu, Yəuqu və Nəsri atmayın".*** *(Nuh 23).* İbn Abbas ψ rəvayət edir ki, bunlar Nuhun υ qövmünün əməlisaleh insanları idilər. Onlar öldükdən sonra şeytan onların yaşadığı qövmün insanlarına vəsvəsə edir ki, onların toplandıqları yerlərdə heykəllərini ucaltsınlar və onların adlarını həmin heykəllərə versinlər. Onlar da deyilən kimi etdilər. (Heykəlləri) düzəldən nəsil ölüb gedənə qədər onlara ibadət olunmadı. (Uzun müddət keçdikdən sonra) elm unudulduqda o, heykəllərə ibadət

[14] Əhməd 1/ 215, ən-Nəsai 5/ 268, 4063, İbn Məcə 3029, əl-Həkim 1711, əl-Albani "Səhihul-Cəmi" 2680.
[15] Muslim 2670, Əbu Davud 4608, Əhməd 1/ 386, Əbu Yəla 5004.
[16] əl-Buxari 3445, Əhməd 23,24, əd-Darimi 2784, İbn Hibban 6239, Əbu Yəla 153.
[17] İbn Kəsir 1/ 250, Məcmuul-Fətava 20/ 106.

etməyə başladılar[18]. Abd ibn Humeyd, Əbu Mutahhardan rəvayət edir ki, Əbu Cəfər (Bəkri) yanında Yezid ibn Muhəlləbdən bəhs edildi. Əbu Cəfər dedi: "O, Allahdan başqa ilk ibadət edilən yerdə öldürüldü". Sonra Vədd haqqında danışdı. Vədd müsəlman bir kimsə idi və qövmü tərəfindən sevilirdi. O, ölüncə Babil torpaqlarında qəbrinin ətrafında toplandılar və onun ölümünə üzüldülər. İblis onların Vəddə üzüldüklərini gördükdə dedi: "Sizin buna çox üzüldüyünüzü görürəm. Sizin üçün onun bir surətini çəkməmi istəyirsinizmi? Beləcə o, sizin toplandığınız yerdə olacaq və onun sayəsində Vəddi xatırlayacaqsınız". Onlar da: "Bəli, çək!"- dedilər. İblis onlara Vəddin bir surətini çəkdi. Onlar da onun surətini toplandıqları yerə qoydular və onu xatırlamağa başladılar. Onların Vəddi xatırladıqlarını gördükdə bu dəfə dedi: "Sizin hər birinizin evində belə bir heykəl düzəltməyimə nə deyirsiniz? Beləcə bundan sizin hər birinizin evində olacaq və onu xatırlayacaqsınız". Onlar: "Bəli, olar"- dedilər. (Şeytan) hər ev əhlinə onun kimi bir heykəl düzəltdi. Onlar da bu heykələ yönəldilər. Heykəl vasitəsilə Vəddi xatırlamağa başladılar. Onların uşaqları böyüdü. Atalarının bu heykəllə nə cür davrandıqlarını gördülər. Nəsillər çoxaldı. Onu xatırlamaq məsələsi unudulub getdi. Sonda isə onu Allahdan başqa İlah halına gətirdilər. Allahdan başqa yer üzündə ilk ibadət edilən şey Vəddin adı verilən Vədd bütüdür"[19]. Onlar bu heykəlləri düzəltdikləri zaman onlara ibadət etmirdilər. Çünki bunun qadağan olunduğunu bilirdilər. Onların alimləri bu heykəllərin qoyulmasına icazə verdikləri zaman böyük bir qəbahətə yol verdilər. Şeytan onlara vəsvəsə etdi: "Heykəlləri düzəldin ki, olara baxdıqda ibadət yadınıza düşsün". Çünki insanlar onlar üçün darıxırdılar. Bu bidətdir. Uzun illər keçsədə belə Nuhun υ qövmünün bidəti onları şirkə gətirib çıxartdı. Buradan da İmam Əhmədin Σ bu sözləri yada düşür. Allah buyurur: ***"Onun əmrinə qarşı çıxanları başlarına gələcək bir bəladan, yaxud da düçar olacaqları bir əzabdan qorxsunlar".*** *(ən-Nur 63).* "Bu bəlanın nə olduğunu bilirsiniz? Bəla – şirkdir. Çünkü, bir kimsə Peyğəmbərin ρ sözlərindən bəzilərini rədd edəcək olursa, qəlbinə bir miqdar azmaq düşər və sonda da məhv olar"[20]. Onların niyyətləri gözəl idi. Heykəlləri qoyduqda niyyətləri, onlara çox ibadət etmələrini xatırlamaq idi. Onlar şirk qoşmaq haqda heç düşünmürdülər. Ona görə də gözəl niyyət haramı halal etmir. Saleh kimsələr öldükdən sonra, elm yaddan çıxandan sonra şeytan öz vəsvəsəsini etdi. Ümmətdə alimlərin yeri onda bilinir. Ona görə də günümüzdə İbn Bazzı, əl-Albanini, Useymini Σ pisləyənlər bilsinlər ki, dolayı yolla şirkin yayılmasını istəyirlər. Bu hadisədə alimlərin insanlar arasında olan yeri bilinir. Onların getməsi dəhşətli hadisələrin baş verməsidir. Şeytan alimlərin vaxtında ibadət etməyi əmr etmədi, lakin alimlər ölən kimi, elm yox olan kimi dəvətinə başladı.

---

[18] əl-Buxari 4920.

[19] Durrul-Mənsur 6/ 269, İbn Urvə Hənbəli "Kəvakibud-Dərari" 6/ 112/ 2.

[20] Şeyx Useymin "Üç əsas" şərhi.

Artıq onlarda belə bir etiqad yaranmışdır ki: Mən bu qəbrin ətrafına gəlib burada Allaha dua etsəm, qurban kəssəm, nəzir desəm daha tez qəbul olunar, nəyinki evimdə oturub dua etsəm. Vaxt keçdikcə artıq bu heykəllərdən istəməyə başladılar. Ey filankəsin cəddi Allaha dua et ki, bizə şəfa versin. Şeytan bir başa onlara şirki göstərərək demədi ki: "Gəlin Allaha şərik qoşun". Çünki bilirdi ki, bunu bir başa etsə heç kəs qəbul etməz. Mərhələ-mərhələ, addım-addım gəldi. Halbuki, Adəm ilə Nuh υ arasında on əsr var idi. Bütün insanlar da bir din üzərində idilər. ***Xatırlama*** - İblis Adəm υ necə vəsvəsə etdi? Allah Adəmə υ əmr etdi ki – "Bu ağacdan yemə! Qalan nə istəyirsənsə et!" Lakin şeytan ona vəsvəsə edərək dedi ki: "Bilirsənmi ki, Allah sənə bu ağacdan yeməyi nə üçün qadağan edib?" Adəm dedi: "Xeyr". Şeytan: "Çünki, sən bu ağacdan yesən sənə əbədi həyat və tükənməz bir mülk veriləcəkdir". ***"Şeytan ona vəsvəsə edib dedi: "Ey Adəm! Sənə əbədiyyət ağacını və tükənməyəcək bir mülkü göstərimmi?"*** *(Ta ha 120).* Bir başa demədi: "Get, o, ağacdan ye!" İblis Adəmi - *əleyhissəlam* - aldatdı, onun nəslini isə yaxşı niyyətlərlə aldadır. Salehləri unutmayın, onları ziyarət edin, xatırlayın ki, siz də salehlərdən olasınız. Sonra bir müddət keçdikdən sonra salehləri Allah ilə aralarında vasitəçi edir, bir müddətdən sonra isə bir başa onlara ibadət etməyə təşviq edir və Tövhid əhlinə qarşı çıxaraq belə deyir: "Siz yeni din gətirmisiniz, biz ata-babalarımızdan belə görmüşük, öz əslinizə hörmət etmirsiniz" və s. Allah Nuhun υ qövmünü suya qərq etdi, Tövhid əhlindən başqa hamı məhv oldu. İllər, əsrlər ötdü, yeni nəsillər gəldi. Onlar da ata-babalarının başına gələni unutdular. Şeytan yenidən öz addımlarını atmağa başladı. Allah yeni Peyğəmbər, yeni kitablar nazil etdi. Rəvayət edildiyinə görə yüz iyirmi dörd min Peyğəmbər gəlib-getdi və beləcə Muhəmməd ρ qədər davam etdi. ***"Şübhəsiz ki, şeytan sizin düşməninizdir, siz də onu düşmən sayın. O öz tərəfdarlarını Od sakini olmağa çağırır".*** *(Fatir 6).* Ey mənim qardaşım! İnsanların qınağından, sözlərindən qorxma! Bir şeyi unutma ki, Haqq daima yardıma məzhər olur, lakin bununla birlikdə sıxıntı, çətinliklərlə sınanır. Buna heyrət etmə, çünki bu Rahmənin sünnətidir. ***"Beləliklə, Biz hər bir peyğəmbər üçün insanlar və cinlərdən olan şeytanlarından düşmənlər müəyyən etdik…".*** *(əl-Ənam 112).* O, halda bizim ümüdsüzliyə qapılmağımız caiz deyildir. Çünki gözəl aqibət təqva əhlinindir. Məgər Nuha υ qarşı çıxmadılar, və ya digər Peyğəmbərləri incitmədilər? Onlara da: "Siz ata-babalarınıza hörmət etmirsiniz, əcdadlarınıza qarşı çıxırsınız"- deyirdilər. Elə zənn edirdilər ki, bunu etməklə öz əcdadlarına hörmət edir və haqlarını qoruyurlar. Salehləri şişirtməyin nəticəsi bax budur.

**4)** Şirkin yaranmasının səbəblərindən biri də insanların Peyğəmbərlərin, salehlərin gəzdikləri, oturduqları yerləri əhatəyə alaraq oraları üstün saymalarıdır. Şirkin qarşısını almaq üçün – Peyğəmbər ρ və Səhabələr şirkə aparan kiçik bir şey olsa belə onun qarşısını dərhal alardılar. Ölüm anında olan Peyğəmbərin ρ düşündüyü Tövhid,

şirkin qarşısını almaq idi. Bu, məslənin nə dərəcədə mühüm olduğunu göstərir. Çünki salehlərin qəbirlərini şişirtmək sonda onlara ibadətə gətirir ki, insanlar da bunun dindən olduğunu zənn edirlər. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Allahım! Qəbrimi ibadət olunan büt (vasan) etmə! Öz Peyğəmbərlərinin qəbirlərini məscidlərə (ibadət olunan yerə) çevirən bir qövmə Allahın şiddətli əzabı düçar olar"[21]. Peyğəmbər ρ buyurdu: "Allah Peyğəmbərlərinin qəbirlərini ibadətgaha çevirən Yəhudilərə və Xristianlara lənət etsin"[22]. ***Həmiçinin*** – Peyğəmbər ρ Lat, Uzza, Manat adlanan bütlərin dağıdılmasını əmr edir. Yunus ibn Bukeyr, Əbu Xalidə Xalidi ibn Dinar, Əbu Aliyəyə dedi: "Tustəri fəth etdiyimiz zaman Hurmuzun mal saxladığı evin başında yazı olan ölü bir bədənin uzanmış olduğu bir çarpayı tapdıq. Onu Ömər ibn Xattabın ψ yanına gətirdik. Kəbi çağırdı və o, yazını ərəbcəyə çevirdi. Mən ərəblərdən o, yazını oxuyan ilk insanam. Bu Daniel υ deyilən birisi idi. O, nə zaman ölmüşdür? dedim. Üç yüz ildir. Ondan dəyişən nədir. Başında bəzi saçlarından başqa heç bir şey dəyişilməmişdi. Belədir, çünkü Peyğəmbərlərin ətlərini torpaq çürütməz. İnsanlar ondan nə diləyərdilər? Göy üzü tutulduğu zaman onun cəsədini çıxararaq yağmur gözləyərdilər". Dedim: "Siz nə etdiniz?" Gündüz vaxtı bir-birindən ayrı on üç qəbir qazdıq, gecə olduqda isə onu birində dəfn etdik və qəbiri yerlə düz etdik ki, insanlar başa düşməyib sonradan gəlib qazmasınlar". Səhabələrin hərəkətinə nəzər salın. Ömər: "Oranı əhatəyə alın, təmiz saxlayın, gələcək nəsillər üçün qoruyun"- demədi. Əksinə şirkin qarşısını dərhal alaraq belə yerləri yerlə bir edərdilər ki, insanlar axtarıb tapmasınlar. Şirkin qarşısını almaq Tövhidi qorumaqdır. ***Həmçinin* -** Ömərə ψ üçün beyət ağacının kəsliməsini əmr etdi. Çünki, insanlar artıq oranı ibadətgah etmişdilər. Ağaca iplər, cürbəcür əskilər bağlayıb, ətrafında təvaf edir, bərəkət diləyirdilər. Ömər ψ təhlükəni görüb ağacın kəsilməsini əmr etdi. Qureyşdə şirk necə başladı? Nuhun υ qövmündən qalan bütlər torpağın altından çıxdılar. ***Allahu Əkbər!*** Alaq otlar olur ki, təmizləyirsən yenə də çıxır. Şirk də belədir, qarşısını alırsan başqa yerdən çıxır. Abdullah ibn Ömər υ rəvayət edir ki, Peyğəmbər ρ ilə birlikdə Səmud qövmünün ərazisi olan Hicr ərazisinə gəldik. Oranın quyularından su aldıq və xəmir yoğurduq. Peyğəmbər ρ aldığımız suları boşaltmağımızı və yoğurduğumuz xəmirləri isə dəvələrə yedirtməyimizi əmr etdi. Peyğəmbər ρ: "Ağlayanlar müstəsna olmaqla (ağlamayanlar) nəbadə əzaba uğramış olan bu qövmün yurduna girsin. Əgər ağlamasanız onlara toxunan əzabın bir bənzəri sizlərə də toxunmasından qorunmaq üçün onların yurdlarına girməyin. Sonra Peyğəmbər ρ vaxtı ilə Salehin υ dişi dəvəsinin su içdiyi quyudan su almalarını onlara əmr etdi"[23].

---

[21] Məlik 1/ 172, Əhməd 2/246, Əbu Yala 6681, əl-Albani "Səhih".

[22] əl-Buxari, Muslim.

[23] Muslim 2980 – ***Hicr*** – Mədinə ilə Şam arasında bir vadinin adıdır. Bura Salehin υ qövmü olan Səmudun mərkəzi idi. Allah bu qövmü Peyğəmbərinə itaət etmədiklərinə görə məhv etmişdir. Tarixçilər Səmudu Nuhun υ nəslindən

***Subhənəllah!*** Peyğəmbər ρ Allahın qəzəbinə uğramış qövmlərin ərazisindən keçdikdə qorxaraq, ağlayaraq keçərdilər. Bunlar isə Allahın qəzəbinə gəlmiş, Allahın lənətinə düçar olmuş yerləri ziyarətgah edirlər. İbn Teymiyyə Σ Hira mağarası haqqında deyir ki: "Peygəmbər ρ peygəmbərlikdən öncə orada ibadətə çəkilərdi. İlk olaraq vəhy orada ona nazil oldu, lakin ona vəhyin ilk enməsindən sonra bir daha o, mağaraya çıxmadı, ona nə özü, nə səhabələri yaxınlaşmadı. Peygəmbərlikdən sonra Məkkədə on il qaldı. O, mağaranı ziyarət etmədi, oraya qalxmadı. Eyni şəkildə Məkkədə onunla birlikdə olan möminlər də oraya çıxmadılar. Peyğəmbər ρ hicrətdən sonra Hudeybiyyə ümrəsinə və Məkkənin fəthi vaxtı Məkkəyə gəldi və orada iyirmi gün qaldı. Lakin Hira mağarasına getmədi və oranı da ziyarət etmədi".[24]

**5)** Müsəlmanlar evlərində doğru əqidəni övladlarına öyrətməkdən məhrum olublar. Valideyin dindən başqa övladına hər bir şeyi öyrədir, evlənməyi, pul qazanmağın yollarını və s. Qəzet və jurnallar insanlara yalnız əyləncəni öyrədir. İmam Malik Σ deyir ki: "Bu ümmətin başı nə ilə islah olunmuşsa (düzəlmişsə, nə ilə doğru yola yönəlmişsə), bu ümmətin sonu da yalnız onunla islah olunur. O, gün din olmayan heç bir şey, bu gün də din olmaz"[25]. İbn Abbas ψ rəvayət edir ki, bir gün (minikdə) Peyğəmbərin ρ tərkində idim. O, buyurdu: "Ey oğul! Mən sənə bir neçə kəlimə öyrədəcəyəm. Allahı qoru ki, Allah da səni qorusun. Allahı qoru ki, Onu öz qarşında tapasan. Bir şey dilədikdə, Allahdan dilə! Kömək istədikdə Allahdan kömək istə! Bil ki, əğər bütün insanlar sənə xeyir vermək üçün bir yerə toplansalar, sənə Allahın yazdığından artıq heç bir xeyir verə bilməzlər. Bunu da bil ki, əgər sənə zərər vermək üçün bir yerə toplansalar, sənə Allahın yazdığından artıq zərər verə bilməzlər. (Çünkü) qələmlər qaldırılmış, səhifələrin (mürəkkəbi) qurumuşdur"[26]. Başqa bir rəvayətdə: (Peyğəmbər ρ): "Allahı qoru ki, Onu öz önündə tapasan. Yaxşı günündə Allahı yada sal ki, Allah da səni çətin (pis) günündə yada salsın. Bil ki, səndən yan keçən bəla sənə toxunmamalı idi. Başına gələn bəla isə səndən yan keçməməli idi. Bunu da bil ki, (Allahın) yardımı, zəfəri - səbrlə birlikdədir. Qurtuluş – kədər və sıxıntı ilə bərabərdir və şübhəsiz ki, hər bir çətinliklə birlikdə - asanlıq vardır"[27].

**6)** İnsanların Quran və Sünnədən uzaqlaşaraq dünyaya bağlanmaları, Allahı unutmaları. Dünya nemətlıri, var-dövlət çoxaltmaq, vəzifə dalıyca qaçmaq və s. işlər insanı Rəbbindən uzaq etmişdir. ***"…Dünya malı axirət yanında yalnız cüzi bir şeydir".*** *(ət-Tövbə 38).* Zeyd ibn Sabit ψ rəvayət edir ki, Allah Elçisi ρ buyurmuşdur:

---

sayırlar. Səmud ibn Cabir ibn İram ibn Şam ibn Nuh. Saleh υ İbrahimdən υ əvvəl yaşamışdır. Quran surələrinin adlarından da biri əl-Hicr surəsidir. Maraqlananlar bu surəyə baxa bilərlər.

[24] Məcmuul-Fətava 27/ 251.

[25] Qadi İyad "əş-Şifa" 2/ 88.

[26] ət-Tirmizi 2516. əl-Albani "Səhihul-Cəmi" 7834.

[27] əl-Albaninin tədqiqi ilə "Riyadus-Salihin" 63.

“Kimin niyyəti dünya malı əldə etmək olarsa, Allah onun işlərini puç edər, yoxsulluğu onun gözləri arasına qoyar, dünya malından da ona yalnız qədərinə yazılmış şeylər nəsib olar. Kimin də niyyəti Axirəti qazanmaq olarsa, Allah onun işlərini yoluna qoyar, onun qəlbini zəngin edər, dünya malı isə ona ram edilmiş halda gələr”.[28] Ərəblərdə günahlar elə bir həddə çatmışdı ki, heç bir qövm və tayfada belə bir azğınlıq olmamışdı. İçki evlərdə çəlləklər halında saxlanılır, qız uşaqları diri-diri basdırılır, 10 nəfər bir qadınla yaxınlıq etdikdən sonra qadın uşağı xoşuna gələn kişiyə isnad edirdi. Riba o, qədər çox idi ki, Kəbəni tikəndə söz verdilər ki, yalnız halal puldan tiksinlər. Bu qədər günahlar ola-ola Peyğəmbər ρ heç birindən başlamadı. Dəvətini yalnız Tövhiddən başladı. Çünki, bütün bu sadaladıqlarımız günahlar bağışlanandır. Bu gün müsəlmanlar şirkdən başqa hər şeydən danışırlar, xilafət qurmaq, təkfir etmək və s. Allahın haqqı tapdalanır, danışan isə yoxdur. İnsanların haqqı tapdalanan kimi danışırlar. Şirk qulun Cəhənnəmdə əbədi qalmasına, əməllərinin puç olmasına, illərlə etdiyi əməllərin itməsinə, yox olmasına səbəbdir. Allah müşrikə Cənnəti haram etmişdir. Günahlar isə belə deyildir.

***Tövhidin Faydaları Və Səmərələri* - 1.** Tövhidi həyata keçirən, haqqını verən bir qul hesaba çəkilmədən, əzaba uğramadan Cənnətə girəcəkdir. **2.** Tövhidi gerçəkləşdirmək günahların bağışlanması və kəffarəsidir. **3.** Dünya və axirətin sıxıntısı, qəmi, kədəri və əzabından qurtulub hüzura və rahatlığa çıxmağın ən böyük vəsiləsi və səbəbidir. **4.** Tövhid qəlbdə xardal dənəsi ağırlığından daha az miqdarda olduğu zaman Cəhənnəmdə əbədi qalmaqdan qurtulmaqdır. **5.** Sahibinə hidayəti, kamilliyə çatmağı, dünya və axirətdə əmin-amanlığı təmin etməkdir. **6.** Tövhid, Allahın razılığına və savabına nail olmağın yeganə səbəbidir. **7.** Zahiri və batini bütün əməllərin və sözlərin qəbulu, kamilliyə və savaba çatmaq tövhidə bağlıdır. **8.** Tövhid qulun yaxşılıq edib, pislikdən çəkinməsini asanlaşdırır. Onu müsibətlərə qarşı səbrli edir. **9.** Tövhid qəlbdə tam olduğu zaman Allah onun sahibinə imanı sevdirir. Qəlbində onu gözəl göstərir. Küfrü, üsyanı və günahı isə ona çirkin göstərir. **10.** Tövhid qulu yaradılmışlara qul olmaqdan, onlara bağlanmaqdan qurtarır. Həqiqi və ən yüksək izzət və şərəf də elə budur. **11.** Tövhid qəlbdə tam və kamil olduğu və tam bir ixlasla yerləşdiyi zaman əməlin azı çox olur, əməllərin və sözlərin mükafatı sayılmayacaq miqdarda qat-qat artır. Qulun tərəzisində onun ixlası göylər və yerin qarşılamayacağı qədər ağır gəlir. **12.** Allah tövhid əhli olan quluna dünyada və axirətdə izzət və şərəfi, hidayəti, asanlığı, xeyirli söz və əməllərində isabətli olmağı zəmanət verir. **13.** Allah iman əhli Muvahhidləri dünya və axirətin pisliklərindən qoruyur və onlara təmiz, gözəl bir həyat bəxş edir.

Tövhid ilə yanaşı Muvahhid bir kimsədə şirkə düşmək qorxusu (ondan qorunmaq) da olmalıdır. Çox az bir kimsə öz Tövhidinə görə qorxur. Bu Tövhidi istəyən, həris

[28] İbn Macə 4105, 4244. əl-Albani səhih olduğunu bildirmişdir.

olan bir kimsə mütləqdir ki, şirkdən qorxmalı və ondan qaçmalıdır. O, qorxu daima Muvahhidin qəlbində olmalıdır, qəlbi daima Allahdan qorxan kimsə isə daima Allaha itaətdə olacaq, Allahdan bağışlanma diləyəcək və şirkdən qaçacaqdır. Şirkə düşməmək üçün də insan şirkin bütün növlərini bilməlidir. Şeytanın ən başlıca məqsədi insanları şirkə salmaqdır. Çünki, bunu Allaha vəd vermişdir: ***"İblis dedi: "Onların dirildiləcəyi günə qədər mənə möhlət ver". Allah dedi: "Şübhəsiz ki, sən möhlət verilənlərdənsən". İblis dedi: "Sən məni yoldan çıxartdığına görə mən də Sənin düz yolunun üstündə oturub insanları tovlayacağam. Sonra onların yanına önlərindən və arxalarından, sağlarından və sollarından gələcəyəm və Sən onların əksəriyyətini şükür edən görməyəcəksən". Allah buyurdu: "Oradan mənfur və qovulmuş halda çıx! Onlardan hər kəs sənin ardınca getsə, əlbəttə, Cəhənnəmi sizin hamınızla dolduracağam".*** *(əl-Əraf 14-18).* İbrahim υ dua edərək onu və ailəsi üçün Allahdan istəyir ki: ***"…Məni və övladlarımı bütlərə tapınmaqdan uzaq elə!"*** *(İbrahim 35).* Əgər möminlərin imamı və Allahın dostu, öz qövmünə qarşı mübarizə aparan, bütləri sındıran kimsə şirkə düşməkdən qorxurdusa, deməli bütün müsəlmanlar Allaha şərik qoşmaq təhlükəsinə görə qorxu hissi keçirməlidirlər. Bundan sonra kim əmin ola bilər? O, zaman bu kitabı öyrən! Bu kitabı öyrənmə ki, insanları şirk və küfürdə ittiham edəsən, öyrən ki, özünü və ailəni müşrik olmaqdan, şirkə düşməkdən qoruyasan. Çox təəssüf ki, bir çox müsəlmanlar öz yaxınları şirkdə boğulduqları halda, bu kitabı yalnız insanları ittiham etmək üçün öyrənirlər.

Bu gün insnları Tövhidə çağıran, onlara şirkdən qaçmağı və şirkə düşməməyi öyrədən - insanların ən xeyirlisi və ən gözəl bir şeyə çağıranıdır. Günümüzdə insanları Tövhidə dəvət edənləri görürsən ki, incidir, təhqir edirlər, "sən düz danışmırsan", "biz ata-babalarımızı belə görmüşük" və s. Bu kimi sözlər deyirlər. Sələflər deyirlər ki: "Əgər onlar nəyə dəvət olunduqlarını, Tövhidin mahiyyətini bilsəydilər, mən onlar üçün atalarından, analarından belə əziz olardım". Lakin siz anlamayan bir qövmsünüz. Bunu Allahın haqqını bilən kimsə bilə bilər.

Şükürlər olsun aləmləri Rəbbi olan Allaha! Şükürlər olsun ki, verdiyi nemətlər sayəsində bu kitabı tərcümə edib toplaya bildik. Allaha nə qədər şükr etsək də layiqincə onun verdiyi nemətlərin əvəzini verə bilmərik. Çünki Allahın I bizi şükr etməyə müvəffəq etməsi özü də bir nemətdir ki, bunun da şükrə ehtiyacı vardır. Necə ki, Davud υ buyurur: "Ey Rəbbim! Sənə necə şükr edim ki, neməti verən, onunla ruziləndirən, sonra da nemət üstünə nemət verərək artıran Sənsən. Nemət də Səndən, şükr də Sənədən. (şükrüm belə Sənin bir nemətindir) Necə bunlara şükr edim". Allah: "İndi Məni tanıdın və Mənə şükr etdin, ey Davud! Çünki, şükr etməyin də Mənim bir nemətim olduğunu bildin". (Başqa rəvayətdə: "Ey Rəbbim! Vücudumdakı tüklərdən

hər birinin iki dili olsa, gecə və gündüz bütün vaxtlarda Səni zikr etsələr də belə, yenə də mənə verdiyin nemətin haqqını vermiş olmaram"[29].

***İrad -*** Çox vaxt qardaşlar mənə irad tuturlar ki, mən hərf və qrammatik səhvlər, cümlə qurluşları ilə bağlı xətaları çox edirərm. Bu iradı mən özüm üçün qəbul edirəm. Lakin çox qardaşlar var ki, tərcümələr zamanı ədəbi dilə çox üstünlük verdikləri üçün şəriətdən yayınırlar. Əgər səndə loru dildə, lakin şəriətə uyğun olaraq insanları başa salmaq daha gözəl alınırsa bu daha gözəldir, nəinki ədəbi dilə üstünlük verib şəriətdən yayınmaq. Bir də ki, məqsədimiz kitabı insanlara səhvsiz çatdırmaq deyildir, dini insanlara doğru çatdırmaqdır. Təki səhvlərimiz hərf və qrammatikada olsun, dində olmasın. Amin!

İlk növbədə Allahdan bu işimin dolğun, düzgün şəkildə toplayıb başa çatdırılmasını diləyirəm. Allahdan əməlimi onun üçün ixlaslı olmasını, məndən qəbul edib onunla müsəlmanları faydalandırmasını diləyirəm. Əgər haradasa xəta etmişəmsə bu nəfsimdən və şeytandandır. Şeytandan və çarəsizlikdən Allaha sığınıram. Burada düzəldilməsi mühüm olan yerləri tapdıqdan sonra mənə öyüd-nəsihət verəndən, səhvlərimi və xətalarımı mənə bəyan edəndən Allah razı olsun. Allah onu xeyirlə mükafatlandırsın! Mən ona əvvəlcədən öz təşəkkürümü bildirirəm.

Ayrıca bu kitabı toplamaqda mənə kömək edən, bu kitabda zəhməti olan, öyüd vermək və ya dua etmək məqsədilə mənə yardım edən hər bir kəsə də təşəkkür edirəm. Allah onları da xeyirlə mükafatlandırsın!

Güvəndiyim Allahdır, işlərimi Ona həvalə edirəm və Ona arxalanıram. Həmd və nemət yalnız Onadır. Müvəffəqiyyət bəxş edən və xətalardan qoruyan da Odur. ***"Məni yaradan və məni doğru yola yönəldən Odur! Məni yedirdən də, içirdən də Odur! Xəstələndiyim zaman mənə yalnız O şəfa verir. Məni öldürəcək, sonra diriləcək də Odur və Qiyamət günü xətamı bağışlayacağına ümid etdiyim də Odur! Ey Rəbbim! Mənə hikmət bəxş et və məni salehlərə qovuşdur! Sonra gələnlər arasında mənə yaxşı ad qismət et! Məni Nəim Cənnətlərinin varislərindən et".*** *(əş-Şuəra 78-85).*

Allahın salavat və salamı onun Peyğəmbəri Muhəmmədə ρ, onun ailə üzvlərinə, səhabələrinə və Qiyamətə qədər onun yolu ilə gedən saleh möminlərin üzərinə olsun!

***Bitirdim*: *Miladi 2010-cu il 07 Noyabr***
***Hicri: 1431-ci il Zül Hiccə 1***
***Həmd Olsun Aləmlərin Rəbbi Olan Allaha! (Yunus 10)***
***Peyğəmbər ρ buyurdu: "Yatağa girdiyin zaman (Kəfirun Surəsini) oxu: "Qul Yə Əyyuhəl Kəfirun – Həqiqətən o, şirkdən uzaq (qoruyan) edəndir".[30]***

---

[29] İmam Əhməd "Kitəbuz-Zuhd" 361, 362.

[30] ət-Tirmizi 3403, əl-Albani səhih demişdir.

# ŞƏHADƏT

***Şəhadət*** – bir şey haqqında bilərək (bildiyi halda onun haqqında) xəbər vermək, onun doğru və dəyişməz olduğuna inanmaq deməkdir. Şəhadət kəliməsi öz-özlüyündə onu söyləyən hər bir kəsin yalnız elmi, yəqinliyi, ixlası və səmimiyyəti əsnasında bu kəlməni söylədiyini açıqlayır. Bu xüsusiyətlərin olamaması şəhadət kəlməsini etibarsız edir. Şəhadət elm üzərində olan bir kəlimədir. Dünyəvi məsələlərdə insan bir şeyə şahidlik etdikdə bildiyi bir şeyə şahidlik edər. Bilmədiyi bir şeyə şəhadət edərsə bu – yalançı şəhadət adlanır. Bu şəhadəti insanlar da qəbul etməzlər. Şəhadəti deyən insan Allaha söz verir ki, mən Səndən başqa heç kimə ibadət etməyəcəyəm. Əgər o, bu sözünə əməl etməzsə: "Ya filankəsin cəddi!", "Ya filankəs!" deyərsə onda bu söz pozular. İqrar və itaət, qəlb və dil bir-birinə müvafiq olmadıqca şəhadət mötəbər sayılmaz. Çünki, Allah münafiqlərin söylədiklərini: *"(Ya Peyğəmbər)* ***Münafiqlər sənin yanına gəldikləri zaman: "Biz sənin doğrudan da Allahın Peyğəmbəri olduğuna şəhadət veririk!"- deyirlər".*** *(əl-Münafiqun 1).* Onlar bu kəliməni yalnız dilləri ilə söylədikləri üçün Allah onları yalançı adlandırmışdı. ***"Allah da sənin onun həqiqi Peyğəmbəri olduğunu bilir. Allah həm də münafiqlərin xalis yalançı olduqlarına şəhadət verir".*** *(əl-Münafiqun 1).*[31]

***Şəhadət Kəliməsi Özündə Üç Şeyi Birləşdirir;***

**1)** Şəhadət edən kimsə şəhadət etiyini etiqad etməli, yəni buna iman gətirməlidir. Qəlbi ilə etiqad etməlidir ki, Allahdan başqa ibadətə layiq heç bir haqq ilah yoxdur. Bu da Elm və Yəqinliklə olur. Etiqad, əgər orada elm və yəqinlik olmazsa etiqad sayılmaz.

**2)** Bu kəliməni söyləməkdir: ***"Allah Özündən başqa heç bir ilah olmadığına şahiddir. Mələklər və elm sahibləri də haqqa-ədalətə boyun qoyaraq o qüvvət və hikmət sahibindən başqa ibadətə layiq heç bir ilah olmadığına şəhadət verdilər".*** *(Ali-İmran 18).* Bunu elan etmək və söyləməkdir. Özünə müsəlman deyən bir kimsə ***Lə İləhə İlləllah*** kəliməsini dili ilə söyləməlidir. Dili ilə söyləməyən şəhadət edən sayılmaz. Bu ona bənzəyir ki: Peyğəmbər ρ buyurdu: "Həcc Ərafadır". Bu o, demək deyil ki, sən Ərafada dayanmaqla həcci yerinə yetirmiş oldun. Sözsüz ki, həccin rükunları və vacibləri vardır. ***Lə İləhə İlləllah*** – kəliməsinin də öz rükunları və vacibləri vardır. Problem ***Lə İləhə İlləllah*** kəliməsində deyildir, problem ***Lə İləhə İlləllah*** deyən kimsədədir. Buna görə də kimisinin tərəzisi ağır gəlir, kimisinin də yüngül.

**3)** Şəhadət barəsində digərinə xəbər verməkdir. Bu haqda xəbər verməsə, yəni bildirməsə şəhadət sayılmaz. Yəni mən etiqad edirəm, söyləyirəm və xəbər verirəm

[31] "əl-Əqidətul-Vasitiyyə" İbn Teymiyyə.

ki, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur. Bu üçü də bir yerdə vəhdət təşkil edir. Bu da Tövhid Kəliməsidir. İman da belədir: Dil - Qəlb - Əməl.

Şəhadət Kəliməsinin fayda verməsi üçün insan iki şeyi bilməlidir:

**1.** ***Şəhadət Verilən*** – Allahı tanımaq. Bu da öz-özlüyündə iki şeyi əhatə edir. 1) Ümumi tanımaq. 2) Təfsilatı ilə tanımaq.

***Əşhədu*** – elmlə deyilən bir sözdür. Bu da bəsirət, göz və xəbərlə əldə edilən bir elmdir. Osman ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Hər kim Allahdan başqa ibadətə layiq haqq ilah olmadığını bilərək ölərsə Cənnətə girər".[32] O, dediyi sözün düzgün olması üçün Allahı tanımaq lazımdır. Allahın tək olduğunu, bənzəri olmadığını, oxşarının, şərikinin olmadığını bilməlidir. Allah ***Saməddir*** – ehtiyacsız, möhtac deyildir. Allah yeməyə, içməyə, rahatlığa ehtiyacı yoxdur. Bütün məxluqat Allaha möhtacdır. Allaha zəiflik, xəstəlik, yuxu, ölüm və s. bu kimi naqisliklər üz vermir. Allah doğmayıb, doğulmayıb, yoldaşı da yoxdur. Allah aləmlərin Rəbbidir. Bütün mülk onun əlindədir. Əmr etmək də, yaratmaq da ona aiddir. İbn Teymiyyə Σ bu kəlməni belə izah edir: "***Ilah*** – ibadət və itaət olunandır. İlahlaşdırılan da yalnız ibadətə layiq olandır. Çünki o, elə bir xüsusiyyətlərə malikdir ki, istər-istəməz Onu yüksək məhəbbətlə sevmək, Ona itaət və ibadət etmək qaçılmazdır. ***Ilah*** – sevilən, ibadət edilən və qəlblərin (ürəklərin) ona olan məhəbbətindən ilahlaşdırılan deməkdir. Ona itaət edirlər və Onun qarşısında alçalırlar. Ondan qorxurlar və Onu arzulayırlar (istəyirlər). Bəlada Ona yönəlir, mühüm məqamlarda duaları ona yönəldirlər. Ruzi intizarında Ona təvəkkül edilir və Ondan sığınacaq istənilir. Onun adı zikr olunanda sakitləşirlər və Ona olan məhəbbətdən rahatlıq tapırlar. Allahdan başqa ibadətə layiq heç bir haqq ilah yoxdur". Artıq insan bunu bilərsə o, şəhadət dedikdə kimə şəhadət etdiyini bilər. Az da olsa o, Allahı başqa ibadət olunan ilahlardan ayıra bilməlidir. (Görürsən ki, insan ***Lə İləhə İlləllah*** deyir, lakin Allahdan qeyrisindən kömək diləyir, qurban kəsir, nəzir deyir və s. Deməli bu insan hələ də ***Lə İləhə İlləllah*** kəliməsini başa düşməyib). Az bir bilik ilə onunla əqidəsi düzgün olar, əməli qəbul olar. Bu kəlimə də ondan qəbul olunar. İnsan bu ümumi elm ilə İslam dininə daxil olur. Lakin insan bu elm ilə kifayətlənməməlidir. Mütləq o, elmini artırmalı və Allahı daha dəqiq tanımalıdır. İmanını artırmaq üçün Allahın İsim və Sifətlərini bilməlidir.

**2.** Şəhadət Kəliməsinin mənasını və səndən nəyi tələb etdiyini bilməlisən: ***"Allah Özündən başqa heç bir ilah olmadığına şahiddir. Mələklər və elm sahibləri də haqqa-ədalətə boyun qoyaraq o qüvvət və hikmət sahibindən başqa ibadətə layiq heç bir ilah olmadığına şəhadət verdilər".*** *(Ali-İmran 18).* Bu ayədən göründüyü kimi bu şahidlik ən böyük şəhadətdir. Belə ki, Allah Özü haqqında, mələklər və elm sahibləri Allahdan başqa heç bir haqq ilah olmadığına şahidlik edirlər. Çünki, şəhadət kəliməsi

---

[32] Muslim.

sayəsində hər bir kəsin malı və qanı qorunmuş, himayə altına alınmış olur. İbn Ömər N rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və Muhəmmədin Allahın Rəsulu olduğuna şəhadət edincə, namaz qılınca, zəkat verincəyə qədər insanlarla vuruşmağa əmr olundum. Bunu etdikdə, öz qanlarını və mallarını məndən qorumuş olurlar. İslamın haqqı ilə olması müstəsna. Haqq-hesablarını çəkmək isə Allaha aiddir".[33]

Şəhadət kəliməsi sayəsində Allah bizə əmr etdiyi əməlləri qəbul edir, onunla Cənnətə girmək və Cəhənnəmdən xilas olmaq mümkündür. ***"Ayələrimizi yalan hesab edənlərə və onlara təkəbbürlə yanaşanlara göyün qapıları açılmaz və dəvə iynənin gözündən keçməyənə qədər onlar da Cənnətə daxil ola bilməzlər".*** *(əl-Əraf 40).* Nə qədər günahlar böyük olursa olsun onun səbəbi ilə bağışlanılır.

İlkindən sonuncusuna qədər bütün Peyğəmbərlərin dəvət etdikləri, hətta dəvətlərinin özəyi və işlərinin başı da bu olmuşdu. Son Peyğəmbərimiz Muhəmməd ρ də Məkkədə on üç il yalnız bu kəliməyə dəvət etmiş və insanlara onun nə qədər mühüm olduğunu açıqlamağa çalışmışdı. *"(Ya Muhəmməd!)* ***Söylə ki, Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan bir kəliməyə tərəf gəlin! Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi*** *(özümüzə)* ***Rəbb qəbul etməyək! Əgər onlar yenə də üz döndərərlərsə, o zaman*** *(onlara)* ***deyin: "İndi şahid olun ki, biz həqiqətən müsəlmanlarıq*** *(Allaha təslim olanlarıq)****".*** *(Ali-İmran-64).*

## LƏ İLƏHƏ İLLƏLLAH

### Allahdan Başqa İbadətə Layiq Haqq İlah Yoxdur

Ümumən Allah I kitabları – ***Lə İləhə İlləllaha*** – görə nazil edib, Peyğəmbərləri – ***Lə İləhə İlləllaha*** – görə göndərib, bizim yaradılışımızda – ***Lə İləhə İlləllaha*** – görədir, cihadı da - ***Lə İləhə İlləllaha*** – görə fərz edib. Əsas da elə budur. Bu kəliməni bilmək və səndən tələb etdiyi şeyləri yerinə yetirmək. Əgər əsas möhkəm və düz olarsa onun üzərində qurulan hər bir şey də möhkəm və düz olar.[34]

***Lə Iləhə İlləllah*** – "Allahda başqa ibadət edilməyə layiq heç bir haqq ilah yoxdur" deməkdir. ***"Bil ki, Allahdan başqa ilah yoxdur".*** *(Muhəmməd 19).* ***"Allahdan başqa heç bir ilah yoxdur".*** *(Ali-İmran 2).* Bütün bu ayələrin mənası ibadət edilməyə haqq edən yalnız və yalnız Allahdır. Bu ifadə ilə Allahdan başqa ibadət olunan hər hansı bir ilah rədd edilmuş olur. Allahdan başqa ifadəsi ibadətin yalnız Allaha edilməsi, mülkündə heç bir ortağı olmadığı kimi, ibadətdə də onun hər hansı bir ortağı (şəriki) olmadığıdır.

---

[33] əl-Buxari, Muslim.

[34] Şeyx əl-Albani Σ deyir ki: "Xəta üzərində bina edilən hər bir şey xətadır".

***Lə İləhə İlləIlah*** **-** Tövhidə giriş üçün açardır. Çünki birinci bunu öyrənmək lazımdır. Bunu öyrənib sonra Tövhidə keçmək lazımdır. ***Lə İləhə İlləllah*** – iki əsas rükndən (hissə) ibarətdir: ***İnkar***. ***Lə İləhə*** (ilah yoxdur) **-** inkar edilir, Allahdan qeyri kimisə ibadətə layiq bilmək. Bu rükn şirki məhv edir. Bizə Allahdan qeyri ibadət olunanı inkar etməyi məcbur edir. ***İlləllah*** (Allahdan başqa) – isbat edirsən ki, yalnız Allah ibadətə layiqdir. Qullara Allaha ibadət etməyi vacib edir və buna uyğun olaraq da əməl etməyi vacib edir. ***"Hər kəs Tağutu*** *(Şeytanı və ya bütləri)* ***inkar edib Allaha iman gətirsə, o, artıq*** *(qırılmaq bilməyən)* ***ən möhkəm bir ipdən*** *(dəstəkdən)* ***yapışmış olur. Allah*** *(hər şeyi olduğu kimi)* **Eşidəndir, Biləndir!"** *(əl-Bəqərə 256).* ***"Biz hər ümmətə Allaha ibadət edin və tağutdan çəkinin deyə peyğəmbər göndərdik".*** *(ən-Nəhl 36).* Yəni, "Abdullah durub" dedikdə, mən Abdullahın durduğunu isbat etmiş oluram. Lakin mən bu sözümlə tək Abdullahın durduğunu isbat etmiş olmuram. Ehtimal başqalarının da durmuş olduğunu söyləmiş oluram. Bəli, bu an Abdullah durub, lakin onunla bərabər başqaları da dura bilər. Və ya "Abdullah durmayıb" desəm, bu dəfə mən Abdullahın durmadığını ortaya qoyaraq durduğunu inkar etmiş oluram. Amma "Abdullahdan başqa heç kəs durmayıb" dedikdə, mən Abdullahdan başqa heç kəsin durmadığını, yalnız Abdullahın durduğunu isbat etmiş oluram. ***Lə İləhə İlləllah*** – demək də belədir. Allahdan başqa ibadət ediləcək İlah yoxdur dedikdə, Allahdan qeyri ibadət olunan varlıqlar rədd edilir və yalnız İlah olaraq Allah qəbul edilir – deməkdir. Tövhid yalnız İnkar və İsbatla həyata keçir.

Lakin günümüzdə bir çox müsəlmanlar hələ də Lə İləhə İlləllahın mənasını bilmirlər. Seyyid Qutub – ***Lə İləhə İlləllah*** kəliməsinin mənasını bilmir, ***Lə İləhə İlləllah*** – "Allahdan başqa Hakim yoxdur" kimi tərcümə edirdi, bəziləri ***Lə İləhə İlləllah*** – "Allahdan başqa Allah yoxdur" və s. kimi tərcümə edirlər. Əbu Sufyan ψ müşrik ola-ola bu kəlimənin mənasını daha yaxşı başa düşür və bilirdi. Rum imperatoru ilə görüşür. Hədisdə deyilir: "Rum imperatoru məndən: "O, sizə nə etməyi əmr edir?"- deyə soruşduqda, mən: "O, bizə tək Allaha ibadət etməyi və Ona heç bir şeyi şərik qoşmamağı, bir də ata-babalarımızın dediyi şeylərdən çəkinməyimizi əmr edir. Sonra bizə namaz qılmağı, düz söz danışmağı (yalan danışmamağı), yaxşılıq etməyi və qohumluq əlaqələrini möhkəmləndirməyi (kəsməməyi) əmr edir!"- deyə cavab verdim".[35] ***Lə İləhə İlləllah - Lə Məbuda Bil Həqqi İlləllah*** – Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur" deməkdir. Özlərini İslama aid edən dəstələr ***Lə İləhə İlləllah*** – şəhadətini bir neçə cür təfsir etmişlər: **1.** ***Lə Məbuda İlləllah*** – Allahdan başqa ibadətə layiq məbud yoxdur. Batil təfsirdir. Çünki Allahdan başqa ibadət olunan məbudlar vardır. İstər bu batil yolla olsun, istər haqq. Fovzan *– hafizahullah -* deyir ki: "Kim ***Lə İləhə İlləllah*** kəliməsini bu cür təfsir edərsə ***Lə Məbuda İlləllah*** – bu açıq-aydın zəlalətdir. Bu da Vəhdətu Vucud əqidəsidir. Vacibdir Haqq – kəliməsini

[35] əl-Buxari 7, Muslim 1773.

söyləmək. (İlah) Məbud – ibadət olunan iki qismdir: Haqq olan Məbud, Batil olan Məbud. Allahdan qeyri ibadət olunan haqqı olmadan ibadət olunan batil məbuddur. İbadət edilməyə haqqı olan isə Allahdır. Digər ibadət olunan ilahlar isə batil ilahlardır". ***"Bu belədir. Çünki Allah haqq, müşriklərin Ondan başqa ibadət etdikləri*** *(bütlər, tanrılar)* ***isə batildir. Həqiqətən Allah Uca və Böyükdür".*** *(əl-Həcc 62)*[36]. **2. *Lə Xaliqa İlləllah – Lə Qadira Alə İxtira İlləllah*** – Allahdan başqa xaliq yoxdur, Allahdan başqa yaratmağa qadir heç kəs yoxdur. Bu təfsir yalnız Rububiyyətə dəlildir və bu təfsir Lə İləhə İlləllahın bir hissəsidir. Lakin Lə İləhə İlləllahın qəsd etdiyi məna deyildir. Çünki müşriklər də bunu qəbul edirdilər. Peyğəmbərin ρ məqsədi təkcə Rububiyyət deyildi. **3. *Lə Həkimiyyə İlləllah*** – Allahdan başqa hökm verən yoxdur. Bu təfsir Seyyid Qutubun təfsiridir. Kitablarda bu təfsirlərə rast gəlmək olar. **4.** Allahdan başqa Allah yoxdur – Allahdan başqa İlah yoxdur - **"Нет бога (или божества), кроме Аллаха -** Bu cür tərcümə etmək xətadır. Çünki İlah kəliməsi ərəb dilində İbadət mənasından başqa bir məna vermir. Lakin ***Rəbb*** – kəliməsinin idarə edən, yaradan, mülk sahibi və s. mənaları vadır. Bu kəliməni Ərəb dilinin qrammatikasında olan cümlə üzvlərinə görə İrab (təhlil) etdikdə ***Lə İləhə İlləllah*** – beş sözdən (kəlimədən) ibarətdir. Əslən isə ***Lə İləhə İlləllah*** **–** kəliməsi dörd kəlmədən ibarətdir. Bəs ***Haqq*** – kəliməsinin ərəb dilində gizlədilməsinə səbəb nədir? Ərəb dilində (***Lə Nəfiyə Lil Cins*** - Babında) Xəbər (***Haqq*** – kəliməsi) gizlədildikdə məna Ərəblərə aydın olduğu üçün bu şəkildə söyləmək olar. Yalnız və yalnız Ərəb dili qrammatikasında söhbətin nədən getdiyi aydın olduqda xəbər gizlədilir. Lakin digər dillərdə bu cür incəlik olmadığı üçün bunu etdikdə məna itir. Bu cür təfsiri kimə söyləsən heç kəs deməz ki: "Orada ibadət qəsd edilir". Lakin bu ümmətin alimləri ***Lə İləhə İlləllah*** **-** bu cür təfsir vermişlər - ***Lə Məbuda Bil Həqqin İlləllah***.

***İlah*** - məbud ibadət ediləndir. Ancaq ilah olan məbuddur. Hər bir kəsin ilahı, ona ibadət etdiyidir. Allahdan başqa ibadət olunanlar ilahdır, lakin batil ilahlardır. Çünki, bunlar haqq ilah deyillər: ***"Bu belədir. Çünki Allah haqq, müşriklərin Ondan başqa ibadət etdikləri*** *(bütlər, tanrılar)* ***isə batildir. Həqiqətən Allah Uca və Böyükdür".*** *(əl-Həcc 62).* ***"Bu ona görədir ki, Allah haqq,*** *(müşriklərin)* ***Ondan qeyri ibadət etdikləri isə batildir".*** *(Loğman 30).*

## LƏ İLƏHƏ İLLƏLLAH KƏLİMƏSİNİN ŞƏRTLƏRİ

***Lə İləhə İlləllah*** – kəlməsinin yeddi şərti var. Bu şərtlərin hər birinə əməl olunmadıqca, onların ifadə etdiyi mənaları Quran və Sünnəyə uyğun olaraq dolğun, düzgün başa düşülmədikcə, bu kəlmənin söylənilməsi heç bir kəsə fayda verməyəcəkdir. Vəhb ibn Munəbbihdən Σ: *"**Lə İləhə İlləllah*** – Cənnətin açarı deyildirmi?"-

[36] Fovzan "İanatul Mustafit" 62.

deyə soruşan bir kimsəyə o, belə cavab verir: "Bəli, lakin hər açarın dişləri vardır. Əgər dişli açar gətirərsənsə qapı sənin üzünə açılır. Yox, əgər açarın dişləri olmazsa qapı açılmaz".[37]

Aşağıda qeyd edəcəyimiz bu şərtlər Quran və Sünnəyə uyğun olaraq möhtərəm İslam alimləri tərəfindən qeyd olunmuşdu.

**1.** ***Elm*** – cahillikdən uzaq edən.
**2.** ***Yəqinlik*** – şübhələri yox edən.
**3.** ***Ixlas*** – şırkdən uzaq edən.
**4.** ***Məhəbbət*** – nifrətdən uzaq edən.
**5.** ***Sidq*** – yalanı yox edən.
**6.** ***Təslim*** – itaətsizliyi yox edən.
**7.** ***Qəbul*** – inkarı yox edən.

## ELM

Bu o, elmdir ki, ***Lə Iləhə Illəllah*** **-** kəliməsini dəlillərlə öyrənir və isbat edir. Bu da dil ilə söyləyib qəlb ilə bilməkdir. Onun mənasını, nə qəsd etdiyini, nəyi inkar və nəyi təsdiq etdiyini bilmədən söyləyənə heç bir faydası olmaz. ***"Öyrən bil ki, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur".*** *(Muhəmməd 19).* ***"Ondan qeyri ibadət etdikləri şəfaət edə bilməzlər. Haqqa şəhadət verənlər müstəsnadır".*** *(əz-Zuxruf 86).* Bu ayənin mənası, Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına dair şəhadət edərək dillərilə söylədiklərini qəlbləri ilə bilərək təsdiq etməkdir. ***"Mən həqiqətən Allaham. Məndən başqa heç bir ilah yoxdur".*** *(Ta ha 14).* Osman ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Hər kim Allahdan başqa ibadətə layiq haqq ilah olmadığını bilərək ölərsə Cənnətə girər".[38]

## YƏQİNLİK

Bu kəliməni söyləyən kimsə tam mənasıyla bu kəlimənin nə məna kəsb etdiyində yəqin olmalı və heç bir şəkk-şübhəyə düşməməli, bu kəlimə haqqında tam bir bilik və qavrayış sahibi olmalıdır: ***"Möminlər yalnız Allaha və Peyğəmbərinə iman gətirən və iman gətirdikdən sonra heç bir şəkk-şübhəyə düşməyənlərdir. Allah yolunda malları və canları ilə vuruşarlar. Məhz belələri sadiq olanlardır".*** *(əl-Hucurat 15).* Əbu Hureyra ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Mən şəhadət edirəm ki, Allahdan

[37] əl-Buxari "Cənaiz" 1, Əhməd 5/ 242.
[38] Muslim 26.

başqa ibadətə layiq haqq ilah yoxdur və mən onun elçisiyəm. Kim bu iki şəhadətə şübhə etmədən Allahın hüzuruna gedərsə, o qul Cənnətə girər"[39].

## İXLAS

Əməllərini şirkdən təmizləmək, şirkə yer verilməyən bir ixlasa sahib olmaq: ***"Bil ki, xalis din yalnız Allaha məxsusdur".*** *(əz-Zumər 3).* ***"Halbuki, onlara əmr edilmişdir ki, Allaha dini yalnız Ona məxsus edərək, digər bütün batil dinlərdən İslama dönərək ibadət etsinlər. Namaz qılıb, zəkat versinlər. Doğru-düzgün din budur".*** *(əl-Bəyyinə 5).* Əbu Hureyra ψ deyir ki, bir gün: Ya Rəsulallah! Sənin şəfaətinlə Qiyamət günü ən xoşbəxt olan insan kimdir?" Peyğəmbər ρ: "Ey Əbu Hureyra, mən elə də bilirdim ki, bunu səndən öncə heç kəs soruşmayacaqdır, sənin (elmə) olan hərisliyindən. Rəsulullah ρ buyurdu: "Qiyamət günü mənim şəfaətimlə ən xoşbəxt olan insan, qəlbində ixlas ilə ***Lə İləhə İlləllah*** - kəlməsini deyəndir"[40]. Əbu Hureyra ψ rəvayət edir ki, Rəsulullah ρ mənə buyurdu: "Bu divarın arxasında qəlbindən iman ilə Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına şəhadət edən hər kiminlə qarşılaşsan, onu Cənnət ilə müjdələ".[41]

## SİDQ

Bu kəlməyə sadiq olmaq. Bu kəlməni qəlbdən gələn doğruluqla, dilin söylədiklərini qəlb ilə təsdiq edərək söyləmək. Əgər qəlbi ilə bu kəliməni təsdiq etməzsə münafiq olur: ***"İnsanlar elə güman edirlər ki, təkcə: "İman gətirdik!"– demələri ilə onlardan əl çəkiləcək və onlar imtahan edilməyəcəklər? Biz onlardan öncəkiləri də sınaqdan keçirmişdik. Sözsüz ki, Allah doğru danışanları da, yalançıları da aşkara çıxardacaqdır".*** *(əl-Ənkəbut 2-3).* ***"Haqqı gətirən və onu təsdiq edənlər isə əsl müttəqilərdir".*** *(əz-Zumər 33).* Muaz ibn Cəbəl ψ rəvayət edir ki, Peyğəmbər *ρ* buyurdu: "Qəlbindən doğruluq və səmimiyyət ilə Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına, Muhəmmədin Allahın Rəsulu olduğuna şəhadət gətirən hər kəsə Allah Cəhənnəm odunu haram edər".[42]

---

[39] Muslim 27.
[40] əl-Buxari 99.
[41] Muslim 31.
[42] əl-Buxari 128, Muslim 32.

# MƏHƏBBƏT

Bu kəliməyə məhəbbətlə bağlanmaq. Bu kəlimənin daşıdığı, gətirdiyi hər bir şeyi sevmək və bu kəliməni söyləyənləri - Muvahhidləri sevmək: ***"İnsanların içərisində Allahdan qeyrilərini Allaha şərik qoşub Allahı sevən kimi sevənlər də var. Halbuki, iman gətirənlərin Allaha olan məhəbbəti daha qüvvətlidir".*** *(əl-Bəqərə 165). "****Ey iman gətirənlər! Sizdən hər kəs dinindən dönsə Allah onun yerinə elə bir tayfa gətirər ki, Allah onları, onlar da Allahı sevərlər. Onlar möminlərə qarşı mülayim kafirlərə qarşı sərt olarlar. Allah yolunda vuruşar və heç kəsin tənəsindən qorxmazlar. Bu Allahın lütfüdür, onu istədiyinə verər".*** *(əl-Maidə 54).* Ənəs ψ rəvayət edir ki, Peyğəmbər ρ demişdir: "Kimdə (bu) üç şey olsa, imanın şirinliyini dadmış olar: Allahı və Onun Elçisini ρ başqalarından daha çox sevmək; adamı yalnız Allah üçün sevmək; Cəhənnəmə atılmağı xoşlamadığı kimi, küfrə qayıtmağı da xoşlamamaq".[43] ***"Ey iman gətirənlər! Yəhudi və Xaçpərəstləri özünüzə dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizdən kim onlarla dostluq edərsə, o da onlardandır. Allah zalim tayfanı düz yola yonəltməz! Sizin vəliniz*** *(dostunuz)* ***ancaq Allah, onun Peyğəmbəri və iman gətirənlərdir. O kəslər ki, boyun əyərək namaz qılar və zəkat verərlər".*** *(əl-Maidə 51-55).* ***"Ey iman edənlər! Əgər atalarınız və qardaşlarınız küfrü imandan üstün tutarlarsa, onları özünüzə dost bilməyin. Sizdən onları dost tutanlar özlərinə zülm etmiş olarlar".*** *(ət-Tövbə 23).* ***"Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşmənini dost tutun".*** *(əl-Mumtəhinə 1).*

# TƏSLİM

***Lə İləhə İlləllah*** – kəliməsinə boyun əymək. İnqiyad - Allahın qoyduğu bütün qayda–qanunlara, şəriətə və sünnəyə əməl etmək: "***Kim yaxşı əməl sahibi olub özünü Allaha təslim edərsə o, artıq ən möhkəm bağdan yapışmış olur. Bütün işlərin axırı Allaha gəlib çatacaqdır".*** *(Loğman 22). "****Tövbə edib Rəbbinizə dönün. Əzab sizə gəlməmişdən əvvəl Ona təslim olun. Sonra sizə heç bir kömək olunmaz".*** *(əz-Zumər 54).* ***"Amma, xeyr!*** *(Ya Rəsulum!)* ***Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim*** *(münsif)* ***təyin etməyincə və verdiyi hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə,*** *(həqiqi surətdə)* ***iman gətirmiş olmazlar".*** *(ən-Nisa 65).* Peyğəmbər ρ buyurdu: "Sizdən heç bir kimsənin nəfsi-istəyi mənim gətirdiyimə tabe olmadıqca iman etmiş olmaz".[44] ***"Allah və Peyğəmbəri bir işi hökm etdiyi zaman heç bir mömin kişiyə və qadına öz işlərində başqa yol seçmək*** *(öz ixtiyarları ilə ayrı cür hərəkət etmək)* ***yaraşmaz. Allaha və Onun***

---

[43] əl-Buxari 16, Muslim 43.

[44] İbn Həcər "Fəthul-Bəri" 13/ 289, İbn Rəcəb "Cəmiul-Ulum vəl Hikəm" s. 338, İbn Əbi Asim "əs-Sünnə" 1/ 12,13.

***Peyğəmbərinə asi olan kəs, şübhəsiz ki,*** *(haqq yoldan)* ***açıq-aydın azmışdır!"*** *(əl-Əhzab 36).* ***"Əgər sənə*** *(sənin bu təklifinə)* ***cavab verməsələr, bil ki, onlar öz nəfslərinə uymuşlar. Allahdan bir dəlil*** *(hidayət)* ***olmayınca öz nəfsinə uyandan*** *(Rəbbinə şərik qoşandan, küfr edəndən)* ***haqq yolu daha çox azmış kim ola bilər?! Allah zalım tayfanı doğru yolda müvəffəq etməz!"*** *(əl-Qəsəs 50).*

# QƏBUL

Bu kəlimənin gətirdiyi hər bir şeyi qəbul etmək və inkara əsla yol verməmək, Allaha ibadət etmək və şirki inkar etməkdir: "***Onlara Allahdan başqa heç bir ilah yoxdur - deyildiyi zaman təkəbbür göstərirdilər".*** *(əs-Saffət 35).* ***"Biz səndən əvvəl hansı bir şəhərə xəbərdarlıq edən bir peyğəmbər göndərdiksə, onun cah-calal içində yaşayan sakinləri: "Biz atalarımızı bu yolda gördük və biz də onların yolunu tutub gedəcəyik!"– dedilər".*** *(əz-Zuxruf 23).* Abdullah ibn Məsud ψ deyir ki: "Kim Qurani-Kərimin bir hərfini belə inkar edərsə (küfr) bütün kitaba qarşı küfr etmişdir".[45]

Bu sadaladığımız şərtlər ***Lə İləhə İlləllah*** kəlməsinin ayrılmaz bir hissəsidir. Bu şərtlər üzərində düşünüb fikirləşmək, onlara lazımı qaydada əməl etmək isə sizin üzərinizə düşən bir haqdır. Çünki, biz dünya və axirətimizi yalnız bu kəlməni öyrənib, ona düzgün əməl etməklə xoşbəxt və firavan edə bilərik. Ubadə τ rəvayət edir ki, Peyğəmbər ρ demişdir: "Kim Allahdan başqa heç bir məbudun olmadığına, Onun Tək olduğuna və heç bir şəriki olmadığına, Muhəmmədin Onun qulu və Elçisi olduğuna, İsanın Allahın qulu, elçisi, Məryəmə göndərdiyi kəlməsi və Onun ruhundan olduğuna, Cənnətin haqq, Cəhənnəmin də haqq olduğuna şahidlik etsə, nə əməl etmiş olursa-olsun, Allah onu Cənnətə daxil edər". Başqa rəvayətdə Rəsulullah ρ buyurur: "Cənnətin hansı qapısından istərsə, onu oradan içəri salar".[46] Əbu Səid əl-Xudri ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Musa υ öz Rəbbinə dedi: "Ey Rəbbim! Mənə elə bir kəlimə öyrət ki, Səni onunla yada salım və dua edim". Allah buyurdu: "Ya Musa! De: "***Lə İləhə İlləllah***". Musa υ dedi: "Ya Rəbbim! Axı Sənin bütün qulların bu kəlməni deyir". Allah buyurdu: "Ya Musa! Əgər yeddi qat göyü və yeddi qat yeri və Məndən başqa orada olanları tərəzinin bir gözünə, ***Lə İləhə İlləllah*** kəlməsini tərəzinin digər bir gözünə qoysalar bu kəlimə ağır gələr".[47] Abdullah ibn Amr ψ rəvayət edir ki, biz Peyğəmbərin ρ yanında oturmuşduq. Bədəvilərdən olan bir kişi gəldi. Onun əynində yaşıl atlasdan bir cübbə var idi. O gəlib Peyğəmbərin ρ başının üstə durub dedi: "Sizin qardaşınız hər bir adlı-sanlı adamı alçaldır, yaxud hər bir adlı-

---

[45] Abdur-Razzaq 8/ 472.

[46] əl-Buxari 3435 , Muslim 28.

[47] İbn Hibban 2324, əl-Həkim 1936, ən-Nəsai "Sunənul-Kubra" 10670, 10980, Əbu Yala "Müsnəd" 13993, əl-Bəğavi 1273, İbn Həcər "Fəth" 11/208, Şueyb Arnavut "Zəif".

sanlı adamı alçaltmaq istəyir və hər bir çobanı ucaldır. Peyğəmbər ρ onun cübbəsinin ətəyindən tutub dedi: “Məgər mən sənin əynində ağılsız adamın geydiyi libasın olduğunu görmürəm?” Sonra (sözünə davam edib) dedi: “Allahın peyğəmbəri Nuh υ vəfat edərkən oğluna belə demişdi: “Mən sənə vəsiyyətimi söyləyirəm: Sənə iki şeyi əmr edir və iki şeyi qadağan edirəm. Sənə ***“Lə ilahə illəllahı”*** əmr edirəm. Əgər yeddi göy və yeddi yer tərəzinin bir gözünə və ***“Lə ilahə illəllah”*** digər gözünə qoyulsaydı, bu tövhid kəlməsi ağır gələrdi. Və əgər yeddi göy və yeddi yer ucsuz bucaqsız bir halqa olsaydı, ***“Lə ilahə illəllah”*** onu sındırardı. (Həmçinin) Sübhanəllah və bihamdihi kəlmələrini (əmr edirəm). Çünki, bu kəlmələr hər şeyin duasıdır. Bunun sayəsində hər şeyə ruzi verilir. Və iki şeyi sənə qadağan edirəm: (Allaha) şərik qoşmağı və təkəbbürlük etməyi. (Peyğəmbərə ρ) deyildi ki: “Ey Allahın Elçisi! Bu şirki bildik. Bəs təkəbbürlük nədir? Məgər birimizin özündə olan (gözəl) əbasını geyməsi təkəbbürlükdürmü?” (Peyğəmbər ρ): “Xeyr”- deyə cavab verdi. (Kişi) dedi: “Məgər birimizdə gözəl qaytanlı gözəl ayaqqabıların olması təkəbbürlükdürmü?” (Peyğəmbər ρ): “Xeyr”- deyə cavab verdi. (Kişi) dedi: “Məgər birimizin minəcək heyvana sahibi olması təkəbbürlükdürmü?” (Peyğəmbər ρ): “Xeyr”- deyə cavab verdi. (Kişi) dedi: “Məgər birimizlə oturub-duran dostların olması təkəbbürlükdürmü? (Peyğəmbər ρ): “Xeyr”- deyə cavab verdi. (Kişi) dedi: “Bəs təkəbbürlük nədir, ya Rəsulallah?” (Peyğəmbər ρ) dedi: “Haqqı danmaq və insanlara xor baxmaqdır”.[48] Abdullah ibn Amr ibn əl-As ψ rəvayət edir ki, Allah Elçisi ρ buyurdu: “Ümmətimdən olan bir kişi Qiyamət günü məxluqatın qarşısına çağırılacaq və ona doxsan doqquz ədəd kitab göstəriləcək. Hər bir kitabın ölçüsü gözün gördüyü son məsafəyə qədər olacaq. Sonra Allah Y buyuracaq: “Bunlardan birini inkar edə bilərsənmi?” O: “Xeyr, ey Rəbbim!”- deyə cavab verəcək. Allah buyuracaq: “(Əməlləri) yazan gözətçi mələklərim sənə zülm ediblərmi? Bu qədər kitabın qabağında sənin savabın ola bilərmi?” O, qorxu içində: “Xeyr!”- deyə cavab verəcək. Allah buyuracaq: “Əksinə, dərgahımızda sənin üçün savab vardır. Odur ki, bu gün sənə zülm edilməyəcək”. Bu vaxt onun qarşısına içində “Əşhədu əllə iləhə illəllah və ənnə Muhəmmədən abduhu və rəsuluhu” yazılmış bir kağız parçası qoyulacaq. O deyəcək: “Ey Rəbbim! Bu qədər kitabın qabağında bu kağız parçası nə fayda verə bilər?” Allah buyuracaq: “Sənə zülm olunmayacaq!” Sonra kitablar tərəzinin bir gözünə, kağız parçası isə digər gözünə qoyulacaq və bu kağız parçasının ağırlığından o kitablar havaya qalxacaq”.[49]

Tövhid günahlara kəffarədir. Qul Allahın haqqını nə qədər çox ödəyərsə, bir o qədər də onun Cənnətə düşmək ehtimalı artar. Bütün bu hədislər dəlildir ki, Tövhid əhli əbədi olaraq Cəhənnəmdə qalmayıb sonda Cənnətə girəcəkdir. Hətta etdiyi günah və asiliklərinə baxmayaraq. Bu Tövhidin ona riayət edən qullarına verdiyi

[48] əl-Buxari "Ədəbul Mufrad" 548.

[49] ət-Tirmizi 2639, 2850; İbn Macə 4300. 4442. əl-Albani hədisi səhih adlandırmışdır.

nemətdir. Lakin insan unutmamalıdır ki, ***Lə İləhə İlləllah*** **-** kəlməsi bütün yaradılmışlardan daha ağır olmasına rəğmən bir çox insanların tərəzisində yüngül gələcəkdir. İtban ψ rəvayət edir ki, Rəsulullah ρ buyrdu: "***Lə İləhə İlləllah*** deyib, bununla Allahın Üzünü (Vəchini) tələb edən kimsəyə Allah Cəhənnəmi haram edər".[50]

Bəzən səkkizinci şərti də qeyd edirlər: 8) Allahdan qeyri ibadət olunan hər bir şeyi inkar etmək və uzaqlaşmaq. ***"Hər kəs Tağutu*** *(Şeytanı və ya bütləri)* ***inkar edib Allaha iman gətirsə, o, artıq*** *(qırılmaq bilməyən)* ***ən möhkəm bir ipdən*** *(dəstəkdən)* ***yapışmış olur. Allah*** *(hər şeyi olduğu kimi)* ***Eşidəndir, Biləndir!"*** *(əl-Bəqərə 256).* ***"Biz ancaq bunu deyirik ki, bəzi tanrılarımız*** *(onlara tapınmağımızı qadağan etdiyinə görə)* ***sənə sədəmə*** *(xətər)* ***toxundurmuşdur*** *(ona görə də ağzına gələni danışırsan)". (Hud)* ***belə cavab verdi: "Allahı şahid tuturam və siz də şahid olun ki, mən sizin*** *(Rəbbinizə)* ***qoşduğunuz şəriklərdən uzağam! Bircə Ondan*** *(Allahdan)* ***başqa!*** *(Yalnız Ona ibadət edirəm).* ***İndi hamılıqla mənə qarşı nə hiylə qurursunuzsa, qurun və mənə heç möhlət də verməyin!"*** *(Hud 54-55).* Əbu Məlik ψ rəvayət edir ki, Rəsulullah ρ buyrdu: "***Lə İləhə İlləllah*** deyib, Allahdan başqa ibadət olunan hər bir şeyi inkar edən insanın canına, malına qəsd etmək haramdır. Onunla haqq hesabı Allah özü çəkəcəkdir".[51] Bu hədis ***Lə İləhə İlləllah*** – kəlməsinin məna və məfhumunu çox gözəl bir şəkildə ortaya qoyur. Belə ki, mal və canın qorunma altına girməsi bu kəlməni tələffüz etməyə görə deyildir. Hətta mənasını qavramaq, iqrar etmək, bir və tək olaraq Allaha dua etmək də kifayət deyildir. Allahdan başqa hər ibadət olunanı rədd etmədikcə, bir kimsənin malı və canı toxunulmaz deyildir. Bu məsələdə şübhə duyan kimsənin də malı və qanı toxunulmaz deyildir.

## MUHƏMMƏDƏN ρ RƏSULULLAH

***Mənası*** – Onun Allah tərəfindən göndərilmiş Peyğəmbər olduğuna inanmaq, onu sevməyin vacib olduğuna, əmr etdiyi şeylərdə ona itaət etməyə, verdiyi xəbərlərdə onu təsdiq etməyə və heç bir sözü onun sözündən irəli keçirməməyə inanmaq deməkdir. Bu iki şəhadət kəlməsi bir-birindən ayrılmazdır. Buna görə də həm azanda, həm də təşahüddə bir yerdə zikr edilir. əl-İnşirah surəsinin 4-cü ayəsində: "***Sənin adsanını, şan-şöhrətini ucaltmadıqmı?***" (Yerdə, göydə səndən söhbət gedər, xütbələrdə adın çəkilər). Mücahid Σ deyir: "Mən xatırlanacaq olsam mütləq sən də xatırlanacaqsan. Şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur və Muhəmməd Allahın qulu və rəsuludur".[52]

---

[50] əl-Buxari 425, Muslim 33, Əhməd 5/449.

[51] Muslim 23.

[52] İbn İshaq "Fadlus-Saləti alən-Nəbi" s.86. əl-Albani mursəl hədis olduğunu bildirmişdir.

***Muhəmmədən Rəsulullah -*** Muhəmməd Allahın qulu və Rəsuludur kəlməsini dil və qəlb ilə qəbul etmək, ona uyğun olaraq da əməl etmək (yaşamaq). **1)** Onun xəbər verdiklərini - Təsdiq. **2)** Əmr etdiklərinə - İtaət. **3)** Onun qadağan etdiklərini - Tərk. **4)** Allaha onun buyurduğu şəkildə ibadət etmək. Bu kəlmənin iki rükunu var: ***Abduhu (Qulu) - Rəsuluhu (Elçisi)***. İki şeyi inkar edir: ***İfrad -*** şişirtmək, həddi aşmaq. ***Qulu -*** bilməklə şişirtməkdən, ondan kömək istəməkdən uzaqlaşmış olur. ***Təfrid -*** alçaltmaq, bunu da dağıdan Rəsulullahdır. Ona itaətdə səhlənkar olmaq, Sünnəsindən uzaqlaşmaq, bidətlər etmək, təqlid etdiyi insanların sözlərini onun sözündən üstün tutmağı qadağan edir. Muhəmməd ρ Allahın qulu və bütün insanlara, hətta cinlərə göndərdiyi Rəsulu olduğuna dair dilin söylədikləri sözə uyğun olaraq, qəlbin dərinliyində də bunu təsdiq etmək deməkdir. ***"Ya Peyğəmbər! Həqiqətən, biz səni*** *(ümmətinə)* ***bir şahid, bir müjdəçi və bir qorxudan kimi göndərdik! Biz səni Allahın izni ilə ona tərəf çağıran və nurlu bir çıraq olaraq göndərdik!"*** *(əl-Əhzab 45-46).*

Buna görə də keçmişə və gələcəyə dair verdiyi bütün xəbərlərdə, haram və halal etdiyi bütün xüsuslarda onu təsdiq etmək, verdiyi əmrləri yerinə yetirmək, qadağan etdiklərindən uzaq olmaq lazımdır. ***"De ki: "Əgər Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızın üstünü örtüb sizi bağışlasın. Allah bağışlayan və mərhəmətlidir".*** *(Ali-İmran 31).* Əbu Hureyra Abdur-Rahmən ibn Saxr ψ rəvayət edir ki, Rəsulullahın ρ belə buyurduğunu eşitdim: "Sizə nəyi qadağan edirəmsə ondan uzaq durun, nəyi əmr etmişəmsə ondan bacardığınız qədər istifadə edin. Şübhə yoxdur ki, sizdən əvvəlki ümmətləri çoxlu sual verməleri və Peyğəmbərlərinə müxalif olmaları məhv etdi".[53]

Ona itaətin Allaha itaət etmək olduğuna, ona üsyan etməyin Allaha üsyan etmək olduğunu bilmək deməkdir: ***"Peyğəmbərə itaət edən şəxs Allaha itaət etmiş olur. Kim üz döndərsə, bil ki, biz səni onların üzərində gözətçi göndərmədik".*** *(ən-Nisa 80).*

Çünki, Allahın risalətini bizə təbliğ edən odur. Allah onun əli ilə dini tamamladı, dinin təbliğini bitirmədən onun ruhunu almadı. O, ümmətini gecəsi gündüzü kimi aydın olan bir yolun üzərində buraxıb getdi. Ondan sonra bu yoldan həlak olandan başqası azmaz: ***"Onun əmrinə qarşı çıxanlar başlarına gələcək bir bəladan, yaxud da düçar olacaqları bir əzabdan qorxsunlar".*** *(ən-Nur 63).* İmam Əhməd Σ deyir: "Bu bəlanın nə olduğunu bilirsinizmi? Bəla – şirkdir. Çünki, bir kimsə Peyğəmbərin ρ sözlərindən bəzilərini rədd edərsə, qəlbinə bir miqdar azmaq düşər və sonda da məhv olar".[54]

O, Allahın quludur, ona ibadət olunmaz. Muhəmmədin Rububiyyətdə, kainatın idarə edilməsində, ya da ibadətdə haqq sahibi olduğuna heç bir şəkildə inanmamalıyıq. Əksinə o, quldur, ona ibadət edilməz, o bir elçidir. O, Allahın istədiyindən artıq

---

[53] əl-Buxari, Muslim.

[54] Şeyx Useymin "Üç əsas" şərhi.

nə özünə, nə də hər hansı bir kimsəyə nə fayda, nə də zərər vermək gücünə malik deyil: *"**De ki: "Mən sizə demirəm ki, mənim yanımda Allahın xəzinələri vardır. Mən qeybi də bilmirəm və sizə də demirəm ki, mən mələyəm. Mən özümə gələn vəhyə tabe oluram". De ki: "Kor görənlə bir olurmu? Məgər düşünmürsünüz!"** (əl-Ənam 50). **"Peyğəmbərləri onlara cavab olaraq demişdilər: "Biz də sizin kimi adi bir insanıq. Lakin Allah öz bəndələrindən dilədiyinə nemət bəxş edər. Allahın izni olmadan biz sizə heç bir dəlil gətirə bilmərik".** (İbrahim 11). **"De ki: "Mən də sizin kimi ancaq bir insanam. Mənə vəhy olunur ki, sizin tanrınız yalnız tək olan Allahdır. Kim Rəbbi ilə qarşılaşacağına ümid bəsləyirsə yaxşı iş görsün və Rəbbinə etdiyi ibadətdə heç kəsi şərik qoşmasın".** (əl-Kəhf 110).*

Ona Allah tərəfindən əmr edilən şeylərə tabe olan bir əmirdir: *"**De ki: "Mən sizə nə bir zərər, nə də bir xeyir vermək qüdrətinə malik deyiləm!" De ki: "Məni Allahdan heç kəs qurtara bilməz və mən Ondan başqa heç bir sığınacaq tapa bilmərəm!"** (əl-Cinn 21-22). "**De: "Mən Allahın istədiyindən başqa özümə nə bir fayda, nə də bir zərər yetirməyə qadir deyiləm. Əgər qeybi bilsəydim, əlbəttə, özüm üçün xeyir artırardım və mənə pislik toxunmazdı. Mən sadəcə, iman gətirən bir qövm üçün qorxudan və müjdələyənəm".** (əl-Əraf 188).* Rəvayət edilir ki, Ömər τ demişdir: "Mən Peyğəmbərin ρ belə dediyini eşitmişəm: "Xristianlar Məryəm oğlunu şişirtdikləri kimi, siz də məni şişirtməyin! Mən sadəcə Allahın quluyam. Elə isə (mənə): "Allahın qulu və rəsulu!"-deyin".[55] Cündəb ibn Abdullah ψ rəvayət edir ki, Peyğəmbər ρ ölümündən beş gün qabaq buyurdu: "Nə badə məndən sonra əvvəlkilər kimi Peyğəmbərlərinin qəbirlərini ibadətgaha çevirdikləri kimi edəsiniz. Mən bunu sizə qadağan edirəm".[56] Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Allahım! Qəbrimi ibadət olunan büt (Vasan) etmə! Peyğəmbərlərinin qəbirlərini məscidlərə (ibadət olunan yerə) çevirən bir qövmə Allahın şiddətli əzabı düçar olar".[57] Peyğəmbər ρ buyurdu: "Allah Peyğəmbərlərinin qəbirlərini ibadətgaha çevirən Yəhudilərə və Xristianlara lənət etsin".[58] Beləliklə, bizə aydın oldu ki, nə Allahın Rəsulu, nə də ondan daha aşağı mərtəbədə olan yaradılmışlardan heç birisi ibadətə layiq deyildir. İbadət ancaq bir və tək olan Allaha edilir.

O, bütün yaradılmışların ən xeyirlisidir. Ən fəzilətli və Allah dərgahında ən dəyərli insandır. Dərəcə etibarı ilə ən yüksək və Allaha ən yaxın olandır. *"**Biz səni aləmlərə ancaq bir rəhmət olaraq göndərdik".** (əl-Ənbiya 107).* Yalnız azmışlar Allahın rəhmindən üz döndərərlər. Peyğəmbər ρ buyurdu: "Qiyamət günü insanların seyyidi

---

[55] əl-Buxari 3445, Əhməd 23,24, əd-Darimi 2784, İbn Hibban 6239, Əbu Yəla 153.

[56] Muslim.

[57] İmam Məlik 1/ 172, Əhməd 2/ 246, Əbu Yala 6681, əl-Albani "Səhih".

[58] əl-Buxari, Muslim.

mənəm, qəbri açılacaq ilk kişi mənəm. İlk şəfaət edən və şəfaəti qəbul olunacaq ilk kişi də mən olacağam".[59]

Allah ona kitab vermiş, dinin əmini etmiş, risalətini təbliğ etməkdə və onu səhf etməkdən, xəta etməkdən qorumuşdur: ***"O, kefi istəyəni danışmır. Bu ancaq nazil olan bir vəhydir".*** *(ən-Nəcm 3-4).*

Onun risalətinə iman etmədikcə, Peyğəmbərliyini qəbul etmədikcə heç bir kimsənin imanı düzgün sayılmaz. Ona iman edən Cənnətə, ona üsyan edən Cəhənnəmə girər: ***"Allaha and olsun ki, onlar öz aralarında baş verən mübahisələrdə səni hakim təyin etmədikcə və verdiyin hökmlərə görə öz nəfslərində sıxıntı duymadıqca və sənə tam şəkildə itaət etmədikcə iman sahibi olmazlar".*** *(ən-Nisa 65).* ***"Hər kəs özünə doğru yol aşkar olduqdan sonra Peyğəmbərlərdən üz döndərib, möminlərdən qeyrisinin yoluna uyarsa onu istədiyi yola yönəldər və Cəhənnəmə varid edərik. Ora necə də pis yerdir".*** *(ən-Nisa 115).*

Əvvəlki Peyğəmbərlər öz qövümlərinə, Muhəmməd Peyğəmbər ρ isə bütün bəşəriyyətə Peyğəmbər olaraq göndərilmişdir: ***"Biz səni bütün insanlara müjdə verən, qorxudan bir Peyğəmbər göndərdik".*** *(Səba 28).* Cabir ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Bütün Peyğəmbərlər öz qövümlərinə göndərilib, mən isə hamıya göndərilən bir Peyğəmbərəm".[60]

Muhəmməd ρ Peyğəmbərlərin və Rəsulların sonuncusudur. O, Allahın risalətinin təbliği üçün seçdiyi son elçisi olmuş, ona kitabların ən uca və ən əzəmətlisi endirilmişdi. O, Rəsulların əzəmətlisi, aləmlərin Rəbbinin həbibi və xəlilidir: ***"Muhəmməd aranızdakı kişilərdən heç birinin atası deyildir. Lakin o, Allahın Rəsulu və Peyğəmbərlərin sonuncusudur".*** *(əl-Əhzab 40).* Ondan sonra kim Peyğəmbərlik iddiasında olarsa kafirdir, bu yalanı təsdiq edən də kafirdir. Bunda şübhə edən də kafirdir. Mömin ondan sonra Peyğəmbərin olmayacağına iman edir. Əbu Hureyra τ rəvayət edir ki, Peyğəmbər ρ demişdir: "Mənim və əvvəlki peyğəmbərlərin məsəli, gözəl və heyrətamiz bir ev tikmiş, lakin kərpicinin birini qoymamış bir kimsənin məsəlinə bənzəyir. Camaat bu evin yan-yörəsindən keçir, ona təəccüb edir və deyirlər: "Nə üçün bura bir kərpic qoyulmayıb?" (Sonra) Peyğəmbər ρ davam edib dedi: "O kərpic mənəm və mən peyğəmbərlərin sonuncusuyam".[61] Cubeyr ibn Mutim τ rəvayət edir ki, Peyğəmbər ρ demişdir: "Mənim beş adım var: mən həm Muhəmməd[62], həm də Əhmədəm[63], mən Allahın mənim vasitəmlə küfrü yox etdiyi Mahiyəm[64], mən, ayağı altında insanların məhşərə toplandığı Haşirəm[65], mən

[59] Muslim, Əbu Davud 4673, Musnəd 2/ 540.
[60] əl-Buxari, Muslim.
[61] əl-Buxari 3535.
[62] "Muhəmməd" – Mədh olunan.
[63] "Əhməd" – Mədh olunmağa layiq.
[64] "Mahi" – Silib yox edən.
[65] "Haşir" – Bir yerə toplayan.

Aqibəm".[66] Bu adlardan başqa: ***Muxtar*** (seçilmiş), ***Mustafa*** (təmizlənmiş), ***Şəfi*** (şəfaət edən), ***Muşəffə*** (şəfaət etdirilən), ***Sadiqul-Məsduq*** (doğru söyləyən və sözü doğrulanan) İbn Məsud ψ rəvayət edir ki, doğru sözlü və sözü doğrulanan Peyğəmbər ρ buyurdu…"[67], ***Fatih*** (fəth edən), ***Qusam*** (toplayan, birləşdirən, mükəmməl), ***Muqaffi*** (özündən əvvəl gələn Peyğəmbərlərin izini silən, sonuncu mənasındadır), ***Nəbiyut-Tövbə*** (tövbə Peyğəmbəri), ***Bəşir*** (itaət edəni müjdələyən, asi olanı cəza ilə qorxudan), ***Rauf*** (çox şəfqətli), ***Rahim*** (çox mərhəmətli). "Qurani-Kərimdə keçən adlardan: ***Şahid, Mubəşşir*** (müjdələyən), ***Rahmə*** (rəhmət), ***Nimə*** (nemət), ***Hadi*** (doğru yola yönəldən), ***Əmin*** (etibarlı). Qureyş onu Peyğəmbərlik verilməmişdən qabaq da bu adla çağırırdı, ***Muzəmmil*** (örtüyünə bürünən), ***Mudəssir*** (paltarına bürünən), ***Dailallah*** (Allaha dəvət edən) və s. İbn Dihyə Σ deyir ki: "Peyğəmbərin ρ adlarının sayı Uca Allahın adlarının sayı qədər doxsan doqquzdur".[68] İmam Zəhəbi Σ deyir: "Onun adları arasında ***Dahuq*** (gülər üz) və ***Kattal*** (çox savaşan) adları da vardır". Əli ψ deyir ki: "Allah onun üstünlüyünü ortaya qoymaq üçün ona Öz adından törəmə bir ad qoydu: "Ərşin sahibinin adı ***Mahmud***, onun adı isə ***Muhəmməd".***[69]

Allah onu aydınlıq, doğru yola dəvət etmək üçün göndərdi. Onun risalətini inkar etmək Allaha dil uzatmaq, hətta Allahı rədd və inkar etməkdir. Səvban ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Şübhəsiz ki, mənim ümmətimdən otuza yaxın yalançı çıxacaq. Onların hər birisi bir Peyğəmbər olduğunu iddia edəcəkdir. Mən isə Peyğəmbərlərin sonuncusuyam. Məndən sonra Peyğəmbər yoxdur".[70] O, insanlar içərsində Allahdan ən çox qorxandır. Peyğəmbər ρ buyurdu: "Sizin Allahdan ən çox qorxanınız və onun sərhədlərini ən yaxşı biləniniz də mənəm".[71] Allah onu insanlar arasından sevib seçmiş və Özünə yaxın bilmişdir. Peyğəmbər ρ buyurdu: "Allah İbrahimi dost etdiyi kimi məni də özünə dost etdi".[72] ***"Allah və Onun Peyğəmbəri bir işi hökm etdiyi zaman heç bir mömin kişiyə və qadına öz işlərində başqa yol seçmək yaraşmaz. Allah və Onun Peyğəmbərinə asi olan şəxs şübhəsiz ki, haqq yoldan açıq-aydın azmışdır".*** *(əl-Əhzab 36).*

Heç şübhəsiz ki, ona tabe olan hər kəs təqva sahibidir: ***"Aralarında hökm vermək üçün Allahın və Onun Peyğəmbərinin yanına çağrıldıqları zaman möminlərin sözü ancaq eşitdik və itaət etdik deməkdən ibarətdir. Nicat tapanlar da məhz onlardır".*** *(ən-Nur 51).*

---

[66] "Aqib" – sonuncu. əl-Buxari, Muslim.
[67] əl-Buxari, Muslim.
[68] İbn Həcər "əl-Fəth" 6/ 643, 644.
[69] Zəhəbi "Siyər" 2/ 10: Bu adlar üçün Səhih Muslimə bax: 2354,2355.
[70] əl-Buxari, Muslim, Əbu Davud 4252, Əhməd 5/278.
[71] əl-Buxari, Ənəs İbn Məlikin rəvayəti ilə.
[72] Muslim.

# "MUHƏMMƏDƏN RƏSULULLAH" ρ KƏLMƏSİNİN ŞƏRTLƏRİ

***Lə iləhə illəlləh*** kəlməsinin şərtləri olduğu kimi Muhəmmədən Rəsulullah - kəlməsinin də yeddi şərti var. Bu şərtlərin hər birinə əməl olunmadıqca, onların ifadə etdiyi mənaları Quran və Sünnəyə uyğun olaraq dolğun, düzgün başa düşülmədikcə, bu kəlmənin söylənilməsi heç bir kəsə fayda verməyəcəkdir. Aşağıda qeyd edəcəyimiz bu şərtlər Quran və Sünnəyə uyğun olaraq möhtərəm İslam alimləri tərəfindən qeyd olunmuşdu.

**1.** Peyğəmbərin ρ Allahın Rəsulu olduğunu etiraf etməli və qəlbən ona etiqad etməli: ***"Möminlər yalnız Allaha iman gətirən,*** *(iman gətirdikdən)* ***sonra heç bir şəkk-şübhəyə düşməyənlərdir".*** *(əl-Hucurat 15).*

**2.** Muhəmmədən Rəsulullah ρ kəlməsini dili ilə söyləməli və etiraf etməli: ***"Bunlar*** *(bu söylənilənlər)* ***Allahın ayələridir ki, onları sənə doğru-düzgün bildiririk".*** *(əl-Bəqərə 252).*

**3.** Peyğəmbərə ρ tabe olmaq, buyurduqlarını yerinə yetirmək və qadağalarından çəkilmək: ***"De ki: "Əgər Allahı sevirsinizsə mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızın üstünü örtüb sizi bağışlasın. Allah bağışlayan və mərhəmətlidir".*** *(Ali-İmran 31).* Allah öz sevgisini Peyğəmbərə ρ itaətə bağlamışdır. Allahın sevgisini qazanmaq istəyən Peyğəmbərin ρ sünnəsinə tabe olmalıdır.

**4.** Peyğəmbərin ρ verdiyi bütün xəbərləri təsdiq etmək (əmr, qadağalar, keçmişə və gələcəyə dair verdiyi qeybi xəbərlər): ***"Peyğəmbər sizə nə verirsə onu götürün, nəyi qadağan edirsə ondan əl çəkin. Allahdan qorxun. Həqiqətən, Allahın cəzası çox şiddətlidir".*** *(əl-Həşr 7).*

**5.** Peyğəmbəri ρ özündən, malından və cəmi insanlardan çox sevmək: ***"Peyğəmbər möminlərə onların özlərindən daha da yaxındır".*** *(əl-Əhzab 6).* Ənəs ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Sizdən biriniz məni valideyinlərindən, övladlarından və cəmi insanlardan çox sevmədikcə imanı kamil olmaz".[73]

**6.** Peyğəmbərin ρ sözünü yaradılmışların sözlərindən üstün tutmaq və onun sünnəsinə əməl etmək: ***"Ey iman gətirənlər!*** *(Sözləriniz və əməllərinizlə)* ***Allahın və Onun Peyğəmbərinin qabağına keçməyin".*** *(əl-Hucurat 1).*

**7.** Peyğəmbərə ρ hörmət və ehtiram göstərmək: ***"Həqiqətən, Biz səni şahid, müjdəçi və xəbərdarlıq edən elçi kimi göndərmişik. Biz belə etdik ki, siz Allaha və Onun Elçisinə iman gətirəsiniz, ona kömək edəsiniz, onun hörmətini saxlayasınız və gecə-gündüz Allahı tərifləyəsiniz".*** *(əl-Fəth 8-9).*

---

[73] əl-Buxari, Muslim.

# İSLAMI POZAN ŞƏRTLƏR

***Nəvəqid – Nəqidə*** – bir şeyi pozan, o şeyi etibarsız edən və s. deməkdir. İnsan bu kimi şeyləri zarafat, ciddi və ya qorxu altında edərsə – *məcbur edilmədən* – kafir olar. Nə üçün Şeyx on şərt ilə kifayətlənmişdir? Çünki, insanların ən çox məruz qaldıqları da bu on şərtdir. Lakin bundan da başqa İslamı pozan bir çox əməllər və sözlər vardır. Alimlər İslamdan çıxaran şeylər barəsində ixtilaf emişlər. Bəziləri İslamdan çıxaran əməl və sözlərin səksənə yaxın maddə olduğunu söyləmişlər.

**1)** İbadətdə Allaha şərik qoşmaq. İnsanların ən çox şirk qoşduqları Uluhiyyət tövhididir: *"**Şübhə yoxdur ki, Allah Özünə şərik qoşanları əfv etməz, amma istədiyi şəxsin bundan başqa olan günahlarını bağışlayar…**" (ən-Nisa 48). "**Allah ona şərik qoşmağı bağışlamaz. Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar". (ən-**Nisa 116). "**Allaha şərik qoşana Allah Cənnəti haram edər. Onun düşəcəyi yer Cəhənnəmdir. Zalımların heç bir köməkçisi yoxdur". (əl-Maidə 72).*** Cabir ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim Allahın hüzuruna Ona heç bir şeyi şərik qoşmadan gələrsə, Cənnətə düşər. (Başqa rəvayədə: Allaha şərik qoşmadan ölən) kim də Ona hər hansı bir şeyi şərik qoşaraq Onun hüzuruna gələrsə, Cəhənnəmə düşər".[74]

**2)** Bir kimsəni özü ilə Allah arasında vasitəçi etmək, ona sığınmaq, ondan kömək diləmək, onlara arxalanmaq. Bu da insanı küfrə salır. Bununla o, kimsə Allahdan qeyrisinə ibadət etmiş olur.

**3)** Müşrikləri kafir saymamaq, onların küfründə şübhə etmək və onların yollarının doğru olduğuna inanmaq – *Allah Qorusun* – insanı kafir edir. Burada müşrik deyildikdə əsli müşrik olanlar qəsd olunur. Buddistlər, ateistlər və s. İbn Həzm Σ deyir ki: "Alimlər icma ediblər ki, Yəhudi və Nəsranilər kafirdirlər. Lakin onların ixtilafı Yəhudi və Nəsranilərin müşrik olub-olmadığındadır".[75] İbn Teymiyyədən Σ Kitab Əhlinin müşrik olması barəsində soruşduqda, o belə cavab verdi: "Dinləri tərəfdən müşrik deyillər. Lakin dində şirk etdiklərinə görə müşrikdirlər". Bu şərti təkfirçilər müsəlmanların üzərinə tətbiq edərək deyirlər ki: "Kafirə kafir deməyənin özü kafirdir". Lakin Muhəmməd ibn Abdul-Vahhab Σ bu şərtdə Yəhudi və Nəsraniləri nəzərdə tutur. Bu günlərdə heç bir Yəhudiyə, heç bir Nəsraniyə şəkk edilməməlidir ki, onlar kafirdirlər. Onlar isə, kafir və müşriklərə (yəni əsli kafir, müşrik) olan qaydanı, mövcud olan müsəlmanlara tətbiq edirlər.

**4)** Kim etiqad etsə ki, dünyəvi hökmlər və ya (bir kimsənin yolu, hökmü) Peyğəmbərin Σ yolundan daha yaxşıdır, bir kimsənin hökmü onun hökmündən daha yaxşıdır, həmçinin Tağutların hökmünü onun hökmündən üstün görər, hğmçinin, hər

---

[74] Muslim 93.
[75] Məratibul-İcma.

kim Allahın endirdiyi hökmdən başqa bir hökmü halal görərsə, Allahın hökmündən daha yaxşı olduğunu söyləyərsə, kafir olur.

**5)** Allah Rəsulunun ρ gətirdiyi bir şeyə əməl etsə də belə, bu əmələ nifrət edən kafir olur. Çünki, bu sahibini Cəhənnəmin ən alt təbəqəsinə salan münafiqlikdir: ***"Əlbəttə münafiqlərin yeri Cəhənnəmin ən alt təbəqəsidir".*** *(ən-Nisa 145-146).*

**6)** Dindən zəruri bilinən bir şeylə, onun savabı və ya günahı (cəzası) ilə zarafat etmək küfrdür: *"(Ya Muhəmməd! Təbuk döyüşünə gedərkən səni lağa qoyan)* ***münafiqlərdən*** *(nə üçün belə etdiklərini)* ***soruşsan: "Biz ancaq söhbət edib zarafatlaşır, əylənirdik"- deyə cavab verərlər. De ki: "Allaha, Onun ayələrinə və Peyğəmbərinə istehzamı edirsiniz?*** *(Əbəs yerə)* ***üzr istəməyin. Siz iman gətirdikdən sonra artıq kafir oldunuz. Aranızdan bir qismini bağışlasaq da, digər qismini günahkar olduğu üçün əzaba düçar edəcəyik".*** *(ət-Tövbə 65-66).*

**7)** Sehr etmək. Kim sehr edər və sehr edilməsinə razı olarsa kafir olar. Sarf və Atf da bura daxildir. Yəni bir-birinə sevdirmək və ya nifrət etdirmək: ***"Şeytanların kimə nazil olduqlarını sizə xəbər verimmi? Onlar hər bir günahkara, yalançıya nazil olur".*** *(əş-Şuəra 221-222).* ***"Sehirbaz isə harda olursa-olsun mətləbinə çatmaz".*** *(Ta ha 69).* ***"Sehrbazlar*** *(dünya və axirətdə)* ***nicat tapmazlar".*** *(Yunus 77).*

**8)** Müsəlmanların əleyhinə olub müşriklərə (kafirlərə) kömək etmək. Kafirlərə olunan hər bir köməyin İslamdan çıxartması barəsində alimlər ixtilaf etmişlər? Saleh Əli Şeyx – *Allah onu qorusun* – deyir: "Kim niyyətində (qəsdli) olaraq müsəlmanlara qalib gəlmələri üçün müşriklərə kömək edirsə kafirdir. Kim niyyəti olmadan hər hansı bir (dünya) səbəbinə görə onlara kömək edirsə kafir deyildir". Dörd məzhəb imamı, İbn Teymiyyə, İbn Qeyyim Σ müsəlmanlara qarşı (niyyəti) olmadan kafirlərə kömək edəni kafir saymamışlar. Həmçinin, İmam Təhavi Σ bu məsələdə icmanın olduğunu da gətirir. Peyğəmbər ρ Məkkəyə döyüşsüz və müqavimətsiz girmək istəyirdi. Lakin Bədrdə iştirak edən müsəlmanlardan biri Hatib ibn Əbi Bəltəa ψ Məkkədə olan müşriklərdən bir qrupuna Peyğəmbərin ψ Mədinədən çıxması haqda bir qadın vasitəsilə məktub göndərir. Peyğəmbər ρ Əlini, Zubeyri və Miqdadı M bu qadının ardı ilə göndərdi. Səhabələr məktubu götürərək Peyğəmbər ρ yanına gəldilər. Peyğəmbər ρ buyurdu: "Ey Hatib, bu nədir?" Hatib dedi: "Ey Allahın Rəsulu! Mənim üstümə qəzəblənməkdə tələsmə, sənə başa salaram. Bilirsiniz ki, Qureyş arasında qohum-əqrabası olmayan birisiyəm. Onlardan da deyiləm, qəribəm. Səninlə olan mühacirlərin də orada əqrabaları vardır ki, onların mallarını və ailələrini qoruyurlar. Lakin mənim malımı və ailəmi orada qoruyacaq bir kimsə yoxdur. Ona görə də onlardan ailəmin qorunması üçün təminat almaq istədim. Yoxsa bu işi kafir olduğumdan, dindən döndüyümdən, İslama girdikdən sonra küfrə riza göstərdiyimdən dolayı etməmişəm. Belə bir şey ağlımdan belə keçməyib". Peyğəmbər ρ: "Bu adam sizə doğru söylədi"- deyə buyurdu. Ömər: "Ya Rəszulullah! Artıq o, Allaha,

verilmir. Ona görə də o cahillərin ən cahilidir. Nəyə görə? Çünki, o, Allahın yaratdıqlarından birini Allaha bənzər, oxşar, şərik tutmuşdur. Bu da cahilliyin ən uca nöqtəsidir. Həmçinin, də ən böyük zülmdür. Bununla bərabər müşrik insan Rəbbinə zülm etmir. Yalnız zülmü özünə etmiş olur. əl-Həris əl-Əşari ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Allah Yəhyə ibn Zəkəriyyəyə υ beş kəlməni, bunlarla əməl etməsini və onlara əməl etmələrini Bəni İsrailə söyləməsini əmr etdi. Lakin Yəhyə bu sözü söyləməyi unutdu (gecikdi). İsa υ ona dedi: "Allah sənə beş kəlimə öyrədib onlarla əməl etməyini və Bəni İsrailə də onlarla əməl etmələrini əmr etməyini söylədi. Ya sən bunları onlara əmr edəcəksən, ya da mən bunu onlara söyləyəcəyəm". Yəhyə: "(Ey mənim qardaşım!) Onlara (məndən öncə) sən əmr etsən yerə batırılmağımdan və ya əzab edilməyimdən qorxuram – deyib xalqı Beytul-Məqdisə topladı. Məscid ağzına kimi doldu. (Allaha həmd etdikdən sonra) Allah mənə beş kəlimə öyrətdi və onlarla əməl etməyimi və sizə də əməl etməyinizi mənə əmr etdi. ***Birincisi*** – Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın. Allaha şərik qoşanın misalı: Bir nəfər öz malından (ən yaxşı malından) qızıl və ya gümüş müqabilində bir kölə alır və ona: "Bu mənim evim, bu da işim. Çalış (qazandığını) mənə ödə! Kölə çalışar, lakin qazancını ağasından başqasına ödəyir. Kölənin belə etməsinə kim razı olar? ***İkincisi*** – Eyni şəkildə Allah sizə namazı da əmr etdi. Namaz qılarkən sağa-sola baxmayın. Çünki Allah Üzünü namaz qılanın üzünə yönəldər. O, sağa-sola baxmadıqca, Allah da ona baxmağa (davam edər). ***Üçüncüsü*** – Allah sizə oruc tutmağı əmr etdi. Bunun misalı bu insanın misalına bənzəyər: O, bir qrup cəmaatın içərisindədir. Onunla bərabər (çantasında) misk vardır. Hər kəs (camaatda olan) onun miskinin iyindən xoşlanar. Oruclunun (ağzından hasil olan) qoxu Allah qatında miskin iyindən də xoşdur. ***Dördüncüsü*** – Allah sizə sədəqə verməyi əmr etdi. Bunun misalı da bu adamın misalına bənzəyir: Düşmənləri onu əsir edib əllərini də boynuna bağlamış, boynunu vurmaq üçün cəllada təslim etmişlər. Adam deyir: "Mən bütün malımı verərək özümü azad etmək istəyirəm" və özünü fidyə olaraq azad edir. ***Beşincisi*** – Allah sizi Onu zikr etmənizi də əmr etdi. Bunun da misalı arxasınca düşməni düşən bir kimsənin misalıdır. Bu adam möhkəm bir qalanın içərisinə girərək düşməndən özünü qoruyur. Qul da belədir. Şeytana qarşı özünü yalnız Allahı zikr etmək vasitəsilə qoruya bilər". Peyğəmbər ρ buyurdu: "Mən də sizə beş şeyi əmr edirəm. Allah onları mənə də əmr etdi. Camaat (olmaq), dinləmək, itaət etmək, cihad və hicrət. Çünki, kim camaatdan bir qarış ayrılarsa, İslamın boyunbağısını çıxararaq atmışdır. Camaata yenidən qayıdarsa o başqa. Kim cahiliyyə döyüşü aparарsa (cahiliyyə sistemlərini müdafiə edərsə) Cəhənnəmlikdir. Bir nəfər soruşdu: "Ey Allahın Rəsulu! O, kimsə namaz qılıb, oruc tutsa da?" Peyğəmbər ρ buyurdu: "Bəli,

namaz qılıb, oruc tutsa da belə. Siz müsəlman olaraq Allahın çağırışını (öndə) tutun. Çünki, O, sizə müsəlman, mömin və Allahın qulları adını vermişdir”.[120]

[120] ət-Tirmizi 2863,3102, Əhməd 16042, əl-Albani səhih demişdir.

# ŞİRK

Şirk nədir? ***İttixazu Şərik - İttixazu Niddən*** – şərik götürmək deməkdir. ***Əşrakə -*** Kimisə öz işində köməkçi (şərik) götürmək deməkdir. ***Tasviyyətu Ğeyrilləhi billəh fil əmri və fi Xasaisilləh – Şirk*** – Allahın layiq olduğu bir işdə bir kimsəni Allah ilə bərabər (eyni) tutmaqdır. Şirk böyük və kiçik olaraq iki qismə bölünür: 1) Böyük şirk İslam dinindən çıxardan şirkdir. Böyük şirk zahiri və batini olaraq iki qismə bölünür: a) Zahiri - Bütlərə, qəbirlərə ibadət edənlərin şirki. b) Batini - Şeyx və övliyalara təvəkkül edənlər, münafiqlərin şirki və küfrü. 2) Kiçik şirk İslam dairəsindən çıxartmayan şirkdir. Kiçik şirk zahiri və batini olaraq iki qismə bölünür: a) Zahiri - Allahdan qeyrisinə and içən, amulet, ovsun, tilsim, bilərzik və s. taxan. b) Batini – riyadır. Riyanı isə iki qismə bölmək olar: a) Böyük riya. Münafiqlərin riyası. ***"Münafiqlər Allahı aldatmağa çalışırlar. Halbuki əslində Allah onları aldadır. Onlar namaza durduqları zaman tənbəlliklə qalxar, özlərini xalqa göstərərlər və Allahı da olduqca az yad edərlər".*** *(ən-Nisa 142).* b) Kiçik riya – əgər namazı göstəriş üçün qılarsa, bu Tövhid əhlində də ola bilər. Şirki üç qismə bölənlər də doğru söyləmişlər: **1)** Böyük şirk. **2)** Kiçik şirk. **3)** Gizli şirk.

Şirk və Şirkət kəlmələri iki varlığın bir yerə gəlməsi, ortaq olması, birinin digəriylə birləşməsi mənasına gəlir. Allaha şirk qoşmaq Ona mülkündə və ya ibadətdə ortaq olan bir varlığın olduğunu qəbul etmək mənasına gəlir. Bunu edən isə müşrik adlanır.[121] Tövhidin şirklə olan savaşı Nuhun υ qövmünü bütlərdən çəkindirib sadəcə Allaha ibadətə dəvət etdiyi gündən bəri davam etməkdədir. Nuhdan υ sonra da Rəsullar gəldilər və göndərildikləri toplumları yalnız Allaha ibadət etməyə, tapındıqları şeylərin ibadətə layiq olmadıqlarını onlara başa saldılar. Bu haqq ilə batil arasında olan savaş Muhəmməd Peyğəmbər ρ gəlincəyə qədər davam etdi. Allah Rəsulu ona Peyğəmbərlik verilməmişdən əvvəl ***Sadiqul Əmin*** – doğru və güvənilən olaraq tanınmasına baxmayaraq qövmünü Tövhidə, yalnız Allaha qul olmağa dəvət etdikdə yalançı, sehirbaz və məcnun adlanaraq təqsirləndirildi. Bu hal bütün toplumları, ümmətləri şirkdən çəkindirərək tövhid əqidəsinə çağıran hər bir Peyğəmbərin qarşılaşdığı bir haldır. Bu mübarizə hər zaman mövcud olmuşdur: ***"Şübhə yoxdur ki, Allah özünə şərik qoşanları əfv etməz. Lakin istədiyi şəxsə bundan başqa olan günahlarını bağışlayar. Allaha şərik qoşan şəxs əlbəttə ki, böyük günah etmişdir".*** *(ən-Nisa 72).* Bu ayədən aydın olur ki, şirk ən böyük günahdır. Ayəyə əsasən bir qrup alimlər deyirlər ki: Burada həm kiçik, həm də böyük şirk qəsd olunur. Kiçik şirkin bağışlanıb bağışlanmamasında alimlər arasında ixtilaf vardır. Ona görə də hər ikisi də bağışlanmayacaqdır. İbn Teymiyyə, İbn Qeyyim, Muhəmməd ibn Abdul-Vahhab – *Allah Onlardan Razı Olsun* - bu rəydədirlər. ***Allah Özünə şərik qoşanları əfv etməz –***

[121] "Qamusul-Muhit" Kəf babı, Sin fəsli s. 1240.

sözü ümumidir, hər növ şirki əhatə edir. Digər qrup alimlər isə: Ümumi olsa da xüsusilə - böyük şirk qəsd olunur. Böyük şirk bağışlanılmır, Kiçik şirk isə Allahın istəyi altındadır. Ona görə də insan "kiçikdir" deyib arxayın olmamalıdır. İki qrupdan hansından doğru olduğunu isə Allah bilir. Uca Allah bildirir ki, O tövbə etməyənlərə şirki bağışlamır: ***"Allaha şərik qoşana Allah Cənnəti haram edər. Onun düşəcəyi yer Cəhənnəmdir. Zalımların heç bir köməkçisi yoxdur".*** *(əl-Maidə 72).* ***"Allah ona şərik qoşmağı əsla bağışlamaz. Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar. Allaha şərik qoşan şübhəsiz ki, çox azmışdır".*** *(ən-Nisa 116).* Allaha şərik qoşaraq ölən kimsə əbədi olaraq Cəhənnəmdə qalacaqdır: ***"Şübhəsiz ki, Kitab əhli və müşriklərdən kafir olanlar Cəhənnəm atəşində əbədi olaraq qalacaqlar. Onlar insanların ən şərliləridirlər".*** *(əl-Bəyyinə 6).* Bu haramların ən böyüyüdür. ***Şirk*** – Allaha zatında, sifətlərində, hökmündə, ibadət və mülkündə şəriki olduğuna inanmaq və bunu mənimsəməkdir. Buna görə də Allah yanında dəyəri müqayisə edilməyəcək qədər böyük olan şirkdən qorxumalıdır. Çünki, bu ən murdar və qəddar haqsızlıqdır, aləmlərin Rəbbinin haqqını itirməkdir, Onun haqqını tapdalamaqdır. Ona müraciət etməli olduqları halda başqasını Onunla eyniləşdirərək Ona şərik qoşurlar. İmanın ziddi küfr olduğu kimi, şirkin də ziddi Tövhiddir: ***"Göyləri və yeri xəlq edən, zülmətləri və nuru yaradan Allaha həmd olsun! Sonra kafir olanlar yenə də öz Rəbbinə tay tutarlar".*** *(əl-Ənam 1).* ***"Məgər heç bir şeyi yaratmağa qadir olmayıb özləri yaradılanımı şərik qoşarlar? Halbuki bu bütlər nə onlara, nə də özlərinə bir kömək edə bilər".*** *(əl-Əraf 191,192).* Ən pis bənzətməkdə gücsüz və kasıbı, zənginə və hər şeyə qadirə bənzətməkdir. İbrahim υ dua edərək deyir: ***"…Məni və övladlarımı bütlərə tapınmaqdan uzaq elə!"*** *(İbrahim 35).* Əgər möminlərin imamı və Allahın sevimlisi şirkə düşməkdən qorxurdusa, deməli bütün müsəlmanlar Onun qarşısında qorxu hissi keçirməlidirlər. Bundan sonra kim əmin ola bilər: ***"Ey Rəbbim! Onlar*** *(bütlər)* ***həqiqətən çox insanı*** *(haqq yoldan)* ***azdırıblar. İndi kim arxamca gəlsə o, şübhəsiz ki, məndəndir. Kim mənə qarşı çıxsa sən bağışlayan, rəhm edənsən!".*** *(İbrahim 36).* ***"Bir zaman İbrahim öz atasına və qövmünə demişdi: "Mən sizin ibadət etdiklərinizdən uzağam. Yalnız məni yaradandan başqa! Şübhəsiz ki, O məni doğru yola yönəldəcəkdir".*** *(əz-Zuxruf 26-27).* İbrahimin υ bu sözləri özündə inkar və isbatı əhatə edən şəhadət kəlməsidir. *Lə İləhə* - ***Mən sizin ibadət etdiklərinizdən uzağam*** – sözlərinə uyğundur. *İlləllah* - ***Yalnız məni yaradandan başqa!*** – sözlərinə uyğundur. Sonra isə: ***"O bunu*** *("lə ilahə illəllah" kəlməsini)* ***öz nəsli arasında daimi qalacaq bir kəlimə etdi ki, bəlkə doğru yola qayıtsınlar".*** *(əz-Zuxruf 28).* ***"…Məni və övladlarımı bütlərə tapınmaqdan uzaq elə!"*** *(İbrahim 35).* ***Sanam – Əsnəm*** Allahdan qeyri ibadət olunan surəti olan bir şeydir. İnsan surəti, heyvan surəti, heykəl, büt (insan və heyvan), günəş, ay və s. ***Vasan – Avsan*** surəti olmayan qəbir, ruh, övliya, xaç və s.

İbn Məsud ψ rəvayət edir: "Kim Muhəmmədin ρ üzərində möhürü olan vəsiyyətini görmək istəyirsə uca Allahın: ***"De ki: "Gəlin Rəbbinizin sizə nələri haram etdiyini deyim: Ona heç bir şeyi şərik qoşmayın…"*** kəlamından ***"…Bu şübhəsiz ki, Mənim doğru yolumdur…"*** *(əl-Ənam 101-103)* kəlamınadək oxusun".[122] Muaz ibn Cəbəl ψ rəvayət edir ki, bir dəfə Peyğəmbər ρ ilə birlikdə yol gedərkən ulağa minib məni də tərkinə almışdı. O, mənə dedi: "Ey Muaz, bilirsənmi Allahın öz bəndələri və bəndələrin Allah üzərində haqqı nədir?" Dedim: "Onu Allah və Onun Rəsulu daha yaxşı bilir". Peyğəmbər ρ buyurdu: "Allahın bəndələr üzərində haqqı odur ki, onlar Ona itaət etsinlər və Ona heç bir şeyi şərik qoşmasınlar. Bəndələrin Allah üzərində haqqı odur ki, Ona heç bir şeyi şərik qoşmayana əzab verməsin". Dedim: "Ya Rəsulullah! Bu şad xəbəri insanlara çatdırımmı?" Peyğəmbər ρ buyurdu: "Xeyr, onlar bu müjdəyə arxayın olub yaxşı işlərdən uzaqlaşarlar".[123] Ənəs ibn Məlik ψ rəvayət edir ki, Allah Elçisi ρ demişdir: "Allah buyurur: "Ey Adəm oğlu! Nə qədər ki, sən Mənə dua edib Mənə ümid bəsləyirsən, sənin nələr etdiyinə baxmayaraq səni bağışlayaram. Ey Adəm oğlu! Əgər sənin günahların göyün buludlarına qədər çatsa, sonra Məndən bağışlanma diləsən, Mən səni bağışlayaram. Ey Adəm oğlu! Əgər sən Mənim hüzuruma yer boyda günahla Mənə heç bir şeyi şərik qoşmadan gəlsən, Mən də yer boyda bağışlanma ilə səni qarşılayaram".[124] İbn Məsud ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim Allahla yanaşı başqa birisinə dua edərək ölərsə Cəhənnəmə düşər"[125]. Cabir ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim Allahın hüzuruna Ona heç bir şeyi şərik qoşmadan gedərsə Cənnətə düşər (Başqa rəvayətdə: Allaha şərik qoşmadan ölən), kim də Ona hər hansı bir şeyi şərik qoşaraq Onun hüzuruna gedərsə Cəhənnəmə düşər". [126] Müsəlman bir kimsə şirkin bütün növlərindən qaçaraq Allaha heç bir şeyi şərik qoşmursa, ibadətlərinin heç birini Allahdan qeyrisinə yönəltmirsə istər mələk, istər Peyğəmbər, istəq cinlər, ruhlar, istər daş, ağac və s. olsun belə bir kimsə Cənətə girəcəkdir. Çünki, Allah belə bir kimsəyə Öz rəhmətindən Cənnəti vəd vermişdir. Yox əgər əməl və sözlərində Allaha şərik qoşarsa istər böyük, istər kiçik, istər gizli şirk buna görə Cəhənnəm əzabı vardır. Əbədi olaraq Cəhənnəmdə qalacaq, yoxsa müəyyən bir vaxt orada qalacaq bu isə şirkin növündən aslı olaraq müəyyən ediləcəkdir. Əgər böyük şirk qoşaraq tövbə etmədən dünyasını dəyişərsə - *Allah Qorusun* – Cəhənnəmdə əbədi qalaraq, oradan heç bir zaman çıxmayacaqdır. Böyük şirk həddinə çatmayıb kiçik şirk və ya gizli şirk edərək tövbə etmədən ölərsə - *Allah Qorusun* – müddəti Allaha bəlli olan bir vaxt

---

[122] Əbu Davud 4596, ət-Tirmizi 2640, 3072, İbn Məcə 3991, İbn Hibban 6247, əl-Həkim 10,144, əl-Albani səhih deyib.
[123] əl-Buxari 13/ 300, Muslim 30.
[124] ət-Tirmizi 3540, 3885. əl-Albani səhih olduğunu qeyd etmişdir.
[125] əl-Buxari 4497, Əhməd 1/ 462, 464.
[126] Muslim 93, Əhməd 3/ 325, 344, 374, 391.

Cəhənnəmdə olacaqdır. Müddəti bitəndən sonra oradan çıxacaqdır. Çünki, Tövhid əhli olmuşdur.

# ŞİRKUL ƏKBƏR - BÖYÜK ŞİRK

əs-Sədi Σ böyük şirkin tərifini belə vermişdir: “Şirk - insanın hər hansı bir ibadət növünü və ya ibadət sayıla biləcək hər hansı bir şeyi Allahdan başqa bir varlıq üçün etməsidir. Allah və Onun Rəsulunun ρ əmr etdiyi bütün etiqad, söz və əməllərin Allah üçün edilməsi Tövhid, iman və ixlas olaraq adlandırıldığı halda, bunların Allahdan başqa bir varlıq üçün edilməsinə şirk və küfr deyilir”.[127] Allaha şərik qoşmaq həm əməllərdə, həm sözlərdə, həm də niyyətlərdə olur. Buna həmçinin əməllərdə, sözlərdə, niyyətlərdə, iradə də şirk də deyilir. Əməllərdə şirkə misal olaraq: Allahdan qeyrisinə səcdə etmək, Allahın evindən başqa evi təvaf etmək, Allahdan qeyrisinə qurban kəsmək və s. Sözlərdə şirkə misal olaraq: Allahdan qeyrisinə dua etmək və s. Niyyətlərdə şirkə gəlincə isə: Allahdan qeyrisindən Allahdan qorxduğun kimi qorxmaq, Allahdan qeyrisini Allahı sevdiyin kimi sevmək və s daxildir.

***"Allaha üz tutub Ona şərik qoşmayın. Allaha şərik qoşan göydən yerə düşüb quşların diddiyi, küləklərin sovuraraq apardığı və uzaqlara atdığı kimidir".*** *(əl-Həcc 31)*. Şirk ən böyük zülmdür. İbn Məsud ψ rəvayət edir ki: ***"İman gətirib, imanlarını zülmlə qarışdırmayanlar əmin-amanlıqdadırlar. Haqq yola yönəlmişlər də onlardır".*** *(əl-Ənam 82)* ayəsi nazil olduqda, bu ayə səhabələrə çox ağır gəldi və onlar dedilər: "Ya Rəsulullah! Bizdən kim özünə zülm etmir?" Peyğəmbər ρ: "Bu sizin fikirləşdiyiniz deyildir"- buyuraraq bu ayəni oxudu: “Bir zaman Loğman oğluna nəsihət verərək demişdir: ***“Oğlum, Allaha şərik qoşma! Həqiqətən də şirk ən böyük zülümdür”.*** *(Loğman 13)*[128]. ***"Bu Allahın haqq yoludur. Bəndələrindən istədiyini ona yönəldər. Əgər onlar Allaha şərik qoşsaydılar əməlləri puça çıxardı".*** (əl-Ənam 88). ***"Sənə və səndən əvvəlkilərə belə vəhy olunmuşdur. Allaha şərik qoşsan bütün əməllərin puça çıxacaq və mütləq ziyan çəkənlərdən olacaqsan".*** *(əz-Zumər 65)*. ***"…Müşriklərdən olmayın".*** *(əl-Ənam 14, Yunus 105, əl-Qəsəs 87)*. Əbu Bəkrə ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: “Sizə böyük günahların ən böyüyündən xəbər verimmi?”- deyib, bu sözü üç dəfə təkrar etdi. Səhabələr: "Bəli, ya Rəsulallah!"- dedilər. Peyğəmbər ρ buyurdu: "Allaha şərik qoşmaq və ana-ataya üsyan etmək". Peyğəmbər ρ uzanmış halda durub oturdu və: “Yalan söz, yalan şahidlik!”- deyərək bu sözləri o, qədər təkrar etdi ki, (öz-özümə) kaş ki, susaydı dedim”.[129] Abdullah ψ rəvayət edir ki, Peyğəmbərdən ρ Allah qatında hansı günahın böyük olması haqda soruşdum? O: "Səni yaratmış olduğu

---

[127] "Qavlus-Sədid fi Məqasidit-Tövhid" s. 31, 54.
[128] əl-Buxari 6/ 281.
[129] əl-Buxari 2654, Muslim 87.

halda Allaha şərik qoşmaq"- deyə buyurdu. Dedim: “Sonra hansıdır?” O: "Sənin yeməyinə şərik olmasın deyə öz uşağını öldürmək"- deyə buyurdu. Dedim: “Sonra hansıdır?” O: "Qonşunun xanımı ilə zina etmək"- deyə buyurdu və Allah bu ayələri nazil etdi: ***"Onlar Allahla yanaşı başqa bir tanrıya ibadət etməz, Allahın haram buyurduğu cana nahaq yerə qəsd etməz, zina etməzlər. Hər kəs bunu etsə cəzasını çəkər".*** *(əl-Furqan 68)*[130]. ***"Kasıblıq üzündən uşaqlarınızı öldürməyin. Sizin də, onların da ruzisini biz verəcəyik".*** *(əl-Ənam 152).* Ənəs ψ rəvayət edir ki, Peyğəmbər ρ böyük günahlar haqqında buyurdu: "Allaha şərik qoşmaq, ana-ataya əziyyət vermək, adam öldürmək və yalan danışmaq (yalan şahidlik)".[131] Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Özünüzü yeddi həlak edici günahdan qoruyun". Səhabələr: "Ya Rəsulullah! Onlar hansılardır?"- deyə soruşdular. Peyğəmbər ρ: "Allaha şərik qoşmaq, sehrlə məşğul olmaq, haqqı olmadan Allahın haram etdiyi insanı öldürmək, sələm (faiz) almaq, yetim malını yemək, döyüş günü meydandan qaçmaq, isмətli, namuslu qadınları namussuzluqda ittiham edərək böhtan atmaq".[132] Teysələ ibn Məyyas rəvayət edir ki, “Mən Nəcdatlarla[133] həmrəy idim. Bir gün böyük günahlardan hesab etdiyim bir günahı işlətdim, sonra da bunu ibn Ömərə N dedim. İbn Ömər N: “Nədir onlar?”- deyə soruşdu. Mən dedim: “Filan, filan (işləri görmüşəm)”. O dedi: “Bunlar ki, böyük günahlardan deyil. Böyük günahlar doqquzdur; Allaha şərik qoşmaq, adam öldürmək, cihaddan qaçmaq, ismətli qadına böhtan atmaq, sələm yemək, yetimin malını yemək, məsciddə günah işlətmək, (dini) məsxərəyə qoymaq və valideynlərin üzünə ağ olub onları ağlatmaq”. (Sonra) ibn Ömər N mənə dedi: “Cəhənnəm odundan çəkinib Cənnətə girmək istəyirsənmi?” Mən: “Bəli, vallahi ki, (istəyirəm)”- deyə cavab verdim. O soruşdu: “Valideynin sağdırmı?” Dedim ki: “Yalnız anam yanımdadır!” O dedi: “Allaha and olsun ki, əgər onunla mülayim danışsan və ona yemək-içmək versən, böyük günahlardan çəkinsən, mütləq Cənnətə girəcəksən”.[134]

## RÜBUBİYYƏT TÖVHİDİNDƏ ŞİRK

Bu bir kimsənin Allahdan başqa yaradan, ruzi verən, dirildən, öldürən və bu kimi ilahi sifətlərə malik olmasına inanmasıdır. ***Rububiyyə*** – Rəbb sözündəndir. Lüğətdə – ***Mürəbbi -*** tərbiyə edici, ***Malik -*** mülk və iqtidar sahibi, ***Seyyid -*** ağa, ***Mudəbbir -***

---

[130] Muslim 86.
[131] Muslim 88.
[132] əl-Buxari 5/294, Muslim 89, Əbu Davud 2874, ən-Nəsai 6/257.
[133] Xaricilərdən olan Nəcdat ibn Amrın tərəfdarlarının adıdır.
[134] əl-Buxari "Ədəbul Mufrad" 8. əl-Albani səhih deyib.

yönəldən, düzüb qoşan, ***Vəli*** **-** idarəçi, ***Munim*** **-** neymət verici, ***Mutəmmim*** **-** tamamlayan və s. mənaları ifadə edir.[135]

***İstilahi Mənası*** – hər bir şeyin Rəbbinin və mütləq Malikin Allah olduğuna, ortağının olmadığına, tək yaradıcı O olduğuna, bütün kainatı idarə edən, qullarını yaradıb onları ruziləndirən, həyat verən və canlarını alanın O olduğuna qəti olaraq inanmaq, Allahın qəza və qədərinə, zatında vəhdaniyyətinə, yəni bir və tək olduğuna inanmaq deməkdir: ***"Həmd olsun Allaha aləmlərin Rəbbinə".*** *(əl-Fatihə 1).* ***"Aləmlərin Rəbbi olan Allah nə qədər uca, nə qədər böyükdür".*** *(əl-Əraf 54).* ***"Hökm Əlində olan Allah nə qədər uca, nə qədər uludur. O, hər şeyə qadirdir!"*** *(əl-Mulk 1).* ***"Yer üzündə nə varsa, hamısını sizin üçün yaradan, sonra səmaya üz tutaraq onu yeddi qat göy halında düzəldib nizama salan odur. O, hər şeyi biləndir!"*** *(əl-Bəqərə 29).* ***"Göyləri və yeri xəlq edən, zülmətləri və nuru yaradan Allaha həmd olsun".*** *(əl-Ənam 1).* ***"O, göylərin, yerin və onların arasında olanların Rəbbidir! Elə isə yalnız Ona ibadət et və Ona ibadətdə səbirli ol! Heç Ona oxşarını tanıyırsanmı?!"*** *(Məryam 65).*

Tövhidin bu növünü Məkkə dövrünün müşrükləri də belə qəbul edirdilər. Onlar bilirdilər ki, hər bir şeyi yoxdan var edən, ruzi verən, öldürən, dirildən, tədbir edən Uca və Böyük olan Allahdır; ***"De ki, sizə göylərdən və yerdən ruzi verən kimdir, qulaqlara və gözlərə sahib olan kimdir, ölüdən diri, diridən də ölü çıxaran kimdir, hər işi düzüb qoşan, səhmana salan kimdir. Onlar Allahdır deyəcəklər. Bəs onda Allahdan qorxmursunuz? O, sizin həqiqi Rəbbiniz olan Allahdır. Haqdan sonra ancaq azmaq gəlir. Elə isə necə üz döndərirsiniz?"*** *(Yunus 31-32)* ***"De: "Əgər bilirsinizsə, deyin görüm yer və onun üstündə olanlar kimindir?" Onlar: "Allahındır!"– deyəcəklər. De: "Bəs düşünüb ibrət almayacaqsınız?" De: "Yeddi göyün Rəbbi və əzəmətli Ərşin Rəbbi kimdir?" Onlar: "Allahdır!"– deyəcəklər. De: "Bəs qorxmursunuz?" De: "Əgər bilirsinizsə, deyin görüm hər şeyin hökmü əlində olan, himayə edən, Özünün isə himayəyə ehtiyacı olmayan kimdir?" Onlar: "Allahdır!"– deyəcəklər. De: "Bəs necə olur ki, aldanırsınız?"*** *(əl-Muminun 84-89).* ***"Həqiqətən əgər sən müşriklərdən "Göyləri və yeri kim yaratmışdır?"- deyə soruşsan, onlar mütləq "Allah!"- deyə cavab verəcəklər. De ki, həmd olsun Allaha!"*** *( Loğman 25).* ***"De: "Göylərin və yerin Rəbbi kimdir?" De: "Allahdır!" De: "Siz Onu qoyub özlərinə nə bir fayda, nə də bir zərər verməyə qadir olmayanlarımı özünüzə dost tutursunuz?" De: "Korla görən eyni ola bilərmi? Yaxud zülmətlə nur eyni ola bilərmi?" Yoxsa onlar Allaha, Onun yaratdığı kimi yaradan şəriklər tapdılar və bu yaradılış onlara bənzər göründü? De: "Hər şeyi yaradan Allahdır. O Təkdir, hər şeyə Qalib gələndir".*** *(ər-Rəd 16).* ***"Əgər sən onlardan: "Göyləri və yeri yaradan, günəşi və ayı ram edən kimdir?"– deyə soruşsan, onlar mütləq: "Allahdır!"– deyəcəklər. Onlar necə də haqdan döndərilirlər!"*** *(əl-Ənkəbut 61).* ***"Əgər sən onlardan: "Göydən yağış***

[135] İbn Mənzur "Lisanul Ərəb" 1/399.

***nazil edib onunla yeri quruduqdan sonra canlandıran kimdir?"– deyə soruşsan, onlar mütləq: "Allahdır!"– deyəcəklər. De: "Həmd olsun Allaha!" Lakin onların çoxu bunu başa düşmür".*** *(əl-Ənkəbut 63).* ***"De: "Həmd olsun Allaha, salam olsun Onun seçdiyi qullarına! Allah yaxşıdır, yoxsa Ona şərik qoşduqlarınız? Göyləri və yeri yaradan, sizin üçün göydən yağmur endirən kimdir? Biz onunla gözəl bağçalar saldıq. Halbuki siz onların ağaclarını da böyüdə bilməzdiniz. Heç Allahla yanaşı başqa bir məbudmu var? Xeyr, onlar haqdan yayınan adamlardır. Yeri məskən edən, arasından çaylar axıdan, üzərində möhkəm duran dağlar yaradan və iki dənizin arasında maneə qoyan kimdir? Heç Allahla yanaşı başqa bir məbudmu var? Xeyr, onların əksəriyyəti bunu bilmirlər. Darda qalan kimsə yalvardığı zaman ona cavab verən, şəri sovuşduran və sizi yer üzünün varisləri edən kimdir? Heç Allahla yanaşı başqa bir məbudmu var? Siz necə də az düşünürsünüz? Qurunun və dənizin qaranlıqlarında sizə doğru yol göstərən, küləkləri Öz mərhəməti önündə yağışdan qabaq müjdəçi kimi göndərən kimdir? Heç Allahla yanaşı başqa bir məbudmu var? Allah onların qoşduqları şəriklərdən ucadır. Məxluqatı əvvəldən yaradan, sonra onu yenidən diriltdən, sizə göydən və yerdən ruzi verən kimdir? Heç Allahla yanaşı başqa bir məbudmu var?" De: "Əgər doğru deyirsinizsə, dəlilinizi gətirin".*** *(ən-Nəml 59-64).* Subhənəllah! Allahu Əkbər! Əlhəmdulilləh! ***"Göyləri və yeri yaradan Allaha şəkk etməkmi olar?...".*** *(İbrahim 10).* ***"De: "Allah hər şeyin Rəbbi olduğu halda, mən Ondan başqa tanrımı axtaracağam?"*** *(əl-Ənam 164).* Gördüyünüz kimi, bu şeyləri müşriklər də belə rədd etmirdilər. Bunun belə olmasına səbəb qulların qəlbləri fitrətdən yeganə Rəbb olanı qəbul edəcək şəkildə yaradılmış olmalarıdır. Lakin onlar yenə də Allaha şəriklər qoşurlar. Yəni sizlər belə bir inanca sahib olduğunuza görə Allahdan qorxmanız, Ona heç bir şeyi şərik qoşmamağınız, bir və tək olaraq yalnız Ona ibadət etmənizi də tələb edir. Necə olur ki, bütün bunları qəbul edən bir kimsə Allahdan qeyrisinə ibadət edir? Lakin Peyğəmbər ibadət xüsusunda Allahı, Tövhidi qəbul etməyən bu müşriklərlə döyüşmüş, hətta tək başına Allahın yaradıcı olduğunu qəbul etməklə birlikdə onların qanlarının və mallarının halal olduğun bildirmişdir. Çünki onlar Uca Allaha ibadət etmir, ibadəti ixlasla yalnız Ona aid etmirdilər. Çünki bu sadəcə Rububiyyətin qəbul edilməsidir. Bərabərində Uluhiyyəti qəbul edib bir və tək olaraq Allaha ibadət edilmədikcə Rububiyyətin qəbul edilməsinin faydası yoxdur. Bunu bilin ki, Rububiyyəti qəbul etmək, Uluhiyyəti qəbul etməyi vacib edir, uluhiyyəti qəbul etməkdə eyni zamanda Rububiyyəti qəbul etməyi əhatə edir. 1) Rububiyyətin qəbul edilməsi bağlayıcı bir qəbuldur. Belə ki, Rububiyyətin qəbul edilməsi Rəbb deyə qəbul etdiyi kimsənin Uluhiyyətini də qəbul etməsi üçün bir dəlildir. Çünki Tək olan yaradıcı, bütün işləri düzüb-qoşan, hət bir şeyin hökmü əlində olan yalnız Uca Allahdırsa o, halda ibadətin də Ona edilməsi lazımdır, başqasına deyil. 2) Uluhiyyətin qəbulu Rububiyyətin də qəbulunu əhatə edər. Çünki Tək olan yaradıcı, bütün işləri

düzüb-qoşan olduğuna inanılan o, Uca Rəbbindən başqa heç bir kimsə İlah olaraq qəbul edilməz.

***"Onların çoxu ancaq şərik qoşaraq Allaha iman gətirir".*** *(Yusuf 106).* İbn Abbas ψ deyir ki: "Onların imanı ondan ibarətdir ki, əgər onlardan soruşsan "göyü, yeri, dağları kim yaratmışdır?" Onlar: "Allah"- deyərlər. Bununla yanaşı onlar Allaha şərik qoşardılar". İkrimə ψ deyir ki: "Əgər onlardan soruşsan "sizi, göyləri, yerləri kim yaratmışdır?" Onlar: "Allah"- deyərlər. Bax onların imanı bundan ibarət idi. Lakin onlar tək olan Allaha ibadət etməzdilər". Mucahid Σ deyir ki: "Onların iman etdikləri sozləri: "Allah bizi yaratmış, bizi ruziləndirmiş, bizi öldürən (dirildəndir)". Bu onların imanı idi. Lakin ibadətdə onlar Allaha şəriklər qoşardılar". Abdur-Rahmən ibn Zeyd ibn Asim Σ deyir ki: "Allaha şərik qoşanlar içərisində elə bir kimsə yoxdur ki, Allaha iman etmiş olmasın. Allahın – Rəbb olduğunu, Yaradan olduğunu, Ruzi verən olduğunu bilməsin. Lakin buna baxmayaraq onlar Allaha şəriklər qoşurlar. Məgər İbrahimin υ sözünü eşitmədin: ***"O dedi: "Siz nəyə ibadət etdiyinizi görürsünüzmü – həm siz, həm də ulu babalarınız? Aləmlərin Rəbbindən başqa, onların hamısı mənim düşmənimdir".*** *(əş-Şuəra 75-77).* Heç şübhəsiz ki, onlar aləmlərin Rəbbi ilə yanaşı başqa ilahlara da ibadət edirdilər. Müşriklr arasında elə bir kimsə yoxdur ki, Ona inanmış olmasın. Məgər Ərəbləri necə Təlbiyə (Həcc zamanı söylənilən dua) etdiyini eşitməmisən? Onlar: "Mən Sənin qarşındayam, Ey Rəbbim! Mən Sənin qarşındayam, Mən Sənin qarşındayam, Sənin şərikin yoxdur Sənə məxsus olanlardan başqa. Onlara sahib olan Sənsən, onlar isə heç bir şeyə sahib deyillər".[136] ***"İndi siz də Allaha** (Onun heç bir oxşarı və bənzəri olmadığını) **bilə-bilə şəriklər qoşmayın!"*** *(əl-Bəqərə 22).* İbn Abbas ψ deyir ki: "Allahdan başqa yedirdən, içirdən heç bir Rəbbiniz olmadığını bildiyiniz halda, heç bir zərər və fayda verə bilməyən şeyləri Allaha şərik qoşmayın. Peyğəmbərin ρ sizi Tövhidə dəvət etdiyinin haqq və heç bir şübhə olmadığı sizə məlumdur".[137] Qatədə Σ deyir: "Siz göyləri və yerləri (və onlar arasında olan hər bir şeyi) Allahın yaratdığını bildiyiniz halda yenə də Ona şərik qoşursunuz".[138] İbn Qeyyim Σ deyir: ***"Göyləri və yeri yaradan, zülmətləri və nuru var edən Allaha həmd olsun! Bu dəlillərdən sonra kafir olanlar hələ də bütləri öz Rəbbinə tay tuturlar".*** *(əl-Ənam 1).* İbn Abbas ψ deyir: "Allah buyurdu: "Onlar Mənim Rəbbliyimi və Rəhmətimi qəbul etdikləri halda, xəlq etdiyim daşları və bütləri Mənə tay tuturlar".[139]

Muhəmməd ibn Abdul-Vahhab Σ deyir: "Bizim günümüzdə şirk edən kimsələr Peyğəmbərin ρ dövründə olan müşriklərdən beş cəhətdən pisdir: **1)** Qüreyş müşrikləri (ərəblər) öz bütlərinə rahatçılıqda yaxınlaşıb dua edərdilər. Çətinlikdə isə Allaha dua edərdilər. Günümüzdə olan müşriklər isə həm rahatçılıqda, həm də

[136] Camiul-Bəyan 8/ 77-79.
[137] İbn Cərir "Təfsir" 1/ 164.
[138] İbn Cərir "Təfsir" 1/ 164.
[139] İbn Qeyyim "İğasətul-Ləhfan" 2/ 226.

çətinlikdə öz pirlərinə, övliyalarına ibadət edirlər. **2)** Əbu Ləhəbin və Əbu Cəhlin dövründə olan müşriklərin ibadət etdikləri qəbir sahibləri saleh kimsələr idi. Məs: Lat, Uzza və ya Xristianların ibadət etdikləri İsa υ peyğəmbər idi. Günümüzdə Allahdan qeyrisinə ibadət edənlər isi saleh olmayan və ya saleh olduğu məlum olmayanlara ibadət edirlər. **3)** Ərəb müşrikləri deyirdilər ki: "Rububiyyət bütünlüklə Allaha məxsusdur". Günümüzdə Allahdan qeyrisinə ibadət edənlər deyirlər ki: "Yer üzünü - dənizi, suyu, dağları, Qütbləri (şeyxlər), imamlar idarə edirlər. **4)** Müşriklər ***Lə İləhə İlləllah*** kəlməsinin mənasını çox gözəl bilib başa düşürdülər. Peyğəmbər ρ onları dəvət etdikdə onlar: ***"O, bütün məbudları bir məbudmu etdi? Həqiqətən, bu, əcaib bir şeydir".*** *(Sad 5).* İndikilər desələr də başa düşmürlər (İxvanul Muslimin – camaatının liderlərindən biri Seyyid Qutub Lə İləhə İlləllahın – mənasını bilmirdi, qaldı ki cahil cəmaat). **5)** Qureyş müşrikləri Rahmən İsmindən başqa (Onlar deyirdilər ki: Rahmən Yəməndən olan sehrbazdır ki, Peyğəmbəri öyrədir) Allahın İsim və Sifətlərini inkar etmirdilər. İndiki özünü müsəlman sayan Əşarilər, Mətrudilər, bütün İsimləri inkar edirlər".[140] Kim yalnız desə ***Lə İləhə -*** Allahsızdır, kim yalnız təsdiq edərsə ***İlləllah*** – müşrikdir, kim həm inkar, həm də təsdiq edirəsə ***Muvahhiddir***.

Həmçinin də ruzinin artması, bərəkətin çoxalması kimi şeyləri də qəbr sahiblərindən istəmək Allaha rububiyyətində şərik qoşmaqdır. Çünki, ruzini verən də Allahdır; ***"Mən onlardan ruzi istəmirəm, mən onlardan məni yedirtmələrini də istəmirəm! Şübhəsiz ki, ruzi verən də, yenilməz qüvvət və hikmət sahibi olan Allahdır".*** *(əz-Zariyyat 57-58).* ***"De ki, göylərdən və yerdən sizə ruzi verən kimdir?*** *(əgər onlar sənə bilmirik deyə cavab versələr)* ***de ki, Allahdır. Elə isə doğru yolda olan, yaxud açıq-aşkar azan bizik, yoxsa siz".*** *(Səba 24).* ***"Sizi yaradan, sonra sizə ruzi verən, sizi öldürən və daha sonra*** *(Qiyamət günü)* ***diriləndən məhz Allahdır. Şəriklərinizin içərisində bunlardan heç olmasa birini edən varmı?"*** *(ər-Rum 40).* Əbu Abdur-Rahmən Abdullah ibn Məsud ψ rəvayət edir ki, doğru sözlü və doğru sözü təsdiq olunan Rəsulullah ρ buyurdu: "Sizdən hər birinizin yaradılışı onun anasının qarnında qırx gün nütfə[141] şəklində olaraq bir yerə gətirilir. Sonra bu müddət qədər aləqa[142] şəklində olur. Sonra yenə bu müddət qədər mudğa[143] şəklində olur. Sonra ona bir mələk göndərilir, mələk ona ruh üflədikdən sonra dörd xüsusiyəti yazmaqla əmr olunur. Ruzisini, əcəlini, əməlini, bədbəxt və ya xoşbəxt olacağını".[144] Allahın bizi ruziləndirməsində əqli dəlilə gəlincə; biz yemək yeyərək və içərək yaşaya bilərik. Yeyəcək və içəcəyi də Allah yaratmışdır; ***"Bəs əkdiyiniz toxuma nə deyirsiniz? Onu bitirən sizsiniz, yoxsa biz? Əgər biz istəsəydik, onu bir saman çöpünə döndərər, siz də mat-məəttəl qalıb: "Biz***

---

[140] "Qavaidul-Ərbəə".

[141] ***Nütfə*** – məni mənasındadır. Nütfə bəzən də saf su adlanır.

[142] ***Aləqa*** – laxtalanmış qan, ziyil deməkdir. ***"O, insanı laxtalanmış qandan yaratdı".*** *(əl-Ələq 2).*

[143] ***Mudğa*** – çeynənilmiş ət parçasına oxşadığı üçün bu ad verilmişdir.

[144] əl-Buxari, Muslim.

***ziyana uğramış, bəlkə də məhrum olmuş kimsələrik"- deyərsiniz? Bəs içdiyiniz suya nə deyirsiniz? Onu buluddan endirən sizsiniz, yoxsa biz? Əgər istəsəydik, onu acı bir su edərdik. Elə isə niyə şükr etmirsiniz?"*** *(əl-Vaqiə 63-70).*

Həmçinin də Allahdan başqa yaradan olmasına inanmaqda Allaha rububiyyətində şirk qoşmaqdır. ***"Yoxsa sizi əbəs yerə yaratdığımızı və hüzurumuza qaytarılmayacağınızı güman edirsiniz".*** *(əl-Muminun 115).* ***"Məgər insan elə güman edir ki, başlı-başına buraxılacaq. Məgər o, tökülən bir qətrə nütfə deyildimi? Sonra laxtalanmış qan oldu və Allah onu yaradıb surət verdi. Sonra da ondan bir kişi, biri qadın olmaqla iki cift yaratdı. Elə isə O - Allah ölüləri diriltməyə qadir deyildirmi?"*** *(əl-Qiyamət 36-40).* O, ölüləri diriltdikdən sonra da dirildəndir, diriltdikdən əvvəl də dirildəndir. Hər şey ona möhtacdır. Hər işin sonu ona qayıdacaqdır. O, heç bir şeyə ehtiyacı olmayandır. Allah heç kimsəni yaratmazdan əvvəl də Rububiyyət sifətlərinə sahib idi. Allah yaratdıqlarını onlar öldükdən sonra da onları yoxdan yaratdığı kimi elə də dirildəcəkdir. O, yaratdıqlarını yaradandan sonra Yaradan olduğu kimi, onları yaratmadan əvvəl də Yaradan idi.

# ULUHİYYƏT TÖVHİDİNDƏ ŞİRK

***Tövhid - İləhiyyə, Uluhiyyə -*** bu ibadət Tövhididir. Buna həmçinin ibadətdə Tövhid də deyilir. Allah, təzim (ucaltma) əməllərini Özünə xas qılmışdır. Buna ibadət deyilir. İbadət isə Allahın I sevdiyi və razı qaldığı bütün zahiri və batini əməlləri, sözləri və niyyətləri əhatə edir. Bu ibadətlərlə Allaha yaxınlaşan və bütün bunları yalnız Allaha yönəldən, xas edən kimsə Muvahhid adlanır. Bu ibadətləri Allahla yanaşı başqa birisinə yönəldən, xas edən müşrik adlanır. ***Uluhiyyə - Təalləhə*** sözündən götürülüb. ***Təalləhə -*** əbədə deməkdir. ***Əlləhə - Yuəllihu*** – ibadət deməkdir. Yalnız Allaha ibadət edilməli, boyun əyilməli, mütləq olaraq sadəcə Ona itaət olunmalıdır. Kim olursa olsun - rəsul, mələk, cin, övliya, seyyid, daş, ağac və s. Allaha ibadətdə şərik qoşulmamalıdır. Namaz, oruc, zəkat, həcc, dua, istianə (yardım diləmək), nəzir, qurban, təvəkkül, ümid, qorxu, sevgi və s. zahiri və batini ibadətlərdən heç biri Ondan başqasına edilməməlidir.[145] Allaha həm qorxu, həm ümid, həm də sevgi ilə ibadət olunmalıdır; ***"Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik".*** *(əl-Fatihə 4).* ***"Kim Allahla yanaşı, haqqında özünün heç bir dəlili olmadığı başqa bir məbuda ibadət edərsə, onun cəzasını Rəbbi Özü verəcəkdir".*** *(əl-Muminun 117).* ***"Rəbbi yalnız ona ibadət etməyi buyurmuşdu".*** *(əl-İsra 23).* ***"Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın".*** *(ən-Nisa 36).*

***Bu Tövhidin Həyata Keçməsi Üçün İki Yol Vardır:*** **1.** İbadətləri qullardan hər hansı birinə deyil, yalnız Allaha xas etməli, Allaha məxsus olan isim və sifətləri qullara

[145] İbn Mənzur "Lisanul Ərəb" 1/399.

məxsus etməməlidir. Mömin yalnız Allaha ibadət edər, Allahdan başqası üçün əsla namaz qılmaz, səcdə etməz, yalvarıb-yaxarmaz, Allahdan başqasına and içməz, nəzir verməz və Allahdan başqasına təvəkkül etməz. **2.** İbadətin, Allahın əmrlərinə itaətə sövq etməsi, qadağalarından çəkinməsi və Peyğəmbərin ρ Sünnəsinə uyğun olması gərəkdir. Tövhidi-Uluhiyyənin ən vacib ünsuru, insanın tam mənada Kitab və Sünnəyə təslim olmasıdır.

Allaha ibadət, itaət və əmrlərinə boyun əyməklə olur. Buna görə də Rəbb kimdirsə məbud da Odur. Məbud isə ibadət olunmağa layiq olan kimsə deməkdir və ya ibadətə layiq olduğu üçün Ona ibadət olunan deməkdir. Burada məqsəd ibadət olunan hər kəs Rəbbdir demək deyil. Allahdan başqa ibadət olunan ilahlar ilə o, ilahlara ibadət edənlərin, Allahdan başqa Rəbb etdikləri varlıqlar əslində Rəbb deyil, çünki, Rəbb yaradan, hər şeyə mütləq məxsus olan və bütün işləri idarə edib, düzüb qoşandır; ***"O, göylərin və yerin, onların arasında olan hər şeyin Rəbbidir! Yalnız Ona ibadət et və Onun ibadətinə səbrli ol! Heç ona bənzərini görüsənmi?"*** *(Məryəm 65).*

Allahdan qeyri ibadət olunanlar heç bir xeyrin gəlməsinə və ya bəlanın uzaqlaşdırılmasına belə maneçilik törədə bilməzlər; ***"De ki: "Elə isə bir söyləyin görək, əgər Allah mənə bir zərər toxundurmaq istəsə, sizin Allahdan qeyri ibadət etdikləriniz Onun zərərini aradan qaldıra bilərlərmi?" Yaxud: "Əgər Allah mənə bir mərhəmət əta etmək istəsə, onlar Onun mərhəmətinə mane ola bilərlərmi?" De ki: "Mənə təkcə Allah kifayət edər".*** *(əz-Zumər 38).* ***"Əgər Allah sənə bir zərər yetirsə, səni ondan Allahdan başqa heç kəs qurtara bilməz. Əgər Allah sənə bir xeyir diləsə, heç kəs Onun nemətinə maneçilik edə bilməz".*** *(Yunus 107).*

Onların ilah etdikləri bu varlılıqlar Uluhiyytdən heç bir xüsusiyyətə malik deyillər. Çünki, onlar yaradılmış varlıqlardır. Özləri bir şey yaratmamışlar, onlara ibadət edənlərə zərrə qədər fayda verə və onlara gələn bəlanı aradan qaldıra bilməzlər. Həmçinin, onlara həyat verə və öldürə bilməzlər; ***"Müşriklər isə Onu qoyub heç bir şey yarada bilməyən, əksinə özləri yaradılan, özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən, diriltməyə, öldürməyə və yenidən diriltməyə gücləri çatmayan bütləri özlərinə ilah qəbul etdilər".*** *(əl-Furqan 3).*

Uluhiyyət Tövhidi bütün Peyğəmbərlərin çağırdığı Tövhiddir. Əvvəlki ümmətlərin məhv olmasına səbəb də elə bu Tövhidin inkarı olmuşdur. Baxın, Allah Nuhun υ qövmi haqqında belə buyurur: ***"Və** (öz tabeçiliyində olanlara)* ***dedilər: "Öz tanrılarınızı tərk etməyin,*** *(xüsusi ilə)* ***Vəddi, Suvaı, Yəğusu, Yəuqu və Nəsri atmayın".*** *(Nuh 23).* İbn Abbas ψ rəvayət edir ki, bunlar Nuhun υ qövmünün əməlisaleh insanları idilər. Onlar öldükdən sonra şeytan onların yaşadığı qövmün insanlarına vəsvəsə edir ki, onların toplandıqları yerlərdə heykəllərini ucaltsınlar və onların adlarını həmin heykəllərə versinlər. Onlar da deyilən kimi etdilər. (Heykəlləri)

düzəldən nəsil ölüb gedənə qədər onlara ibadət olunmadı. (Uzun müddət keçdikdən sonara) elm unudulduqda o, heykəllərə ibadət etməyə başladılar.[146]

Həqiqətən də bu belədir. Biz bu hadisələri indiki günümüzdə də görə bilərik. Nə qədər əməlisaleh insanlar var ki, öldükdən sonra onların qəbirləri üstündə pirlər, məscidlər, ibadətgahlar tikilir. Uzun zaman keçdikdən sonra insanların o, qəbirlərin üstünə gəlib onlardan kömək dilədiklərini görürük. Lakin insan bir şeyi unutmamalıdır ki, sıxıntı, kədər, bəla gələndə insan o ibadət etdiklərini unudaraq, əllərini göyə açıb Allaha dua edir; ***"İnsana bir sıxıntı üz verən zaman - uzananda da, oturanda da, ayaq üstə də bizə dua edər. Lakin onu sıxıntıdan qurtardıqda ondan ötrü bizə heç dua etməmiş çıxıb gedər".*** *(Yunus 12).* ***"De ki: "Mənə deyə bilərsinizmi? Sizə Allahın əzabı gəlsə və ya qiyamət başınızın üstünüm alsa Allahdan başqasına dua edib yalvaracaqsınız? Əgər doğru danışan adamlarsınızsa*** *(deyin görək)**. Xeyr, yalnız Allaha dua edib yalvaracaqsınız. O, əgər istəsə yalvardığınız bəlanı aradan qaldırar. Siz də Ona şərik qoşduğunuz bütləri unudarsınız".*** *(əl-Ənam 40-41).* Bəli, Allah bu bəlaları uzaqlaşdırdıqdan, sovuşdurduqdan sonra onlar yenə də Allahı unudub Ona şərik qoşarlar; ***"Müşriklər gəmiyə mindikləri zaman ancaq Allaha dua edərlər. Sağ-salamat quruya çıxdıqları zaman yenə də*** *(Allaha)* ***şərik qoşarlar".*** *(əl-Ənkəbut 65).* ***"Sizi suda və quruda gəzdirən Odur. Siz gəmidə olduğunuz, gəmilər gözəl bir külək vasitəsilə içərisində olanları apardığı, onlar da sevindikləri vaxt birdən fırtına qopub dalğalar hər tərəfdən gəmilərin üzərinə hücum etdikdə və müsafirlər dalğaların onları bürüdüyünü*** *(həlak edəcəyini)* ***başa düşdükdə sidqi-ürəkdən Allahın dininə sarılaraq Ona belə dua edərlər: "Əgər bizi bu təhlükədən qurtarsan Sənə şükr edənlərdən olarıq. Onları xilas edincə yer üzündə haqsız yerə zülm etməyə, azğınlığa başladılar. Ey insanlar! Etdiyiniz zülm, haqsızlıq fani dünya malı kimi öz əleyhinizədir. Sonra hüzurumuza qaytarılacaqsınız. Biz də nə etdiklərinizi sizə xəbər verəcəyik".*** *(Yunus 22-23).* İmranın ψ atası Hüseyn müşrik bir insan idi. Öz tayfasında çox hörmətli ağsaqqallardan biri sayılırdı. Qureyşlilər onun yanına gəlib ondan nəsihət istəyib deyirlər ki, bəs Muhəmməd ρ bizim bütləri təhqir edib deyir ki, onlar sizə nə bir xeyir, nə də bir zərər verə bilməz. Ondan xahiş edirlər ki, Muhəmmədin ρ yanına gedib ondan belə danışmamasını nəsihət etsin. Hüseyn onların xahişini nəzərə alıb Peyğəmbərin ρ yanına yollanır. Peyğəmbər ρ onu çox gözəl qarşılayıb oturmaq üçün yer göstərir. O, ona göstərilən yerdə əyləşib Peyğəmbərdən ρ soruşur: "Ya Muhəmməd! Doğrudurmu ki, sən bizim bütləri təhqir edirsən?" Peyğəmbər ρ onun sualını çox gözəl şəkildə belə sualla cavablandıraraq soruşur: "Ya Hüseyn, nə qədər İlaha ibadət edirsən?" O, isə cavabında: "Birinə göydə, yeddisinə yerdə"- söyləyir. Peyğəmbər ρ onun bu cavabından sonra soruşur: "Yaxşı, sənə qəflətən bəla gəldikdə kimə müraciət edirsən?" O, deyir: "Yalnız göydəkinə". Onda Peyğəmbər ρ növbəti

[146] əl-Buxari 4920.

sualı verir: "Bəs nə üçün gələn bəladan səni Qoruyana, sənə istədiklərini verənə (səni Yaradana) yerdəkiləri şərik qoşursan?" Hüseyn fikirləşir ki, doğrudan da Muhəmməd ρ düz deyir. Doğrudan da göydə olan Allah kifayət etdiyi halda yerdəki bütləri, daşları vasitəçi etmək, şərik qoşmaq ağla batan iş deyil. Lakin burada onun diqqətini çəkən və xoşuna gələn bir hal da Muhəmmədin ρ fikirlərində dünya mənfəətindən uzaq, sırf Allah qorxusu, ixlas, hikmət, mülayimlilik və insanpərvərliyin olması idi. O, dərhal şəhadət gətirərək müsəlman oldu. Yanında oturan Qureyşlilər isə Muhəmmədin ρ onu iki cümlə ilə yoluna gətirdiyindən heyrətlərini gizlədə bilmirdilər. Peyğəmbər ρ səhabələrinə tapşırır ki, onu evinə qədər ötürsünlər. İmran ibn Hüseyn ψ qalxıb atasının başından və əllərindən öpür. Peyğəmbər ρ isə onun ardınca baxıb deyir: "Baxın, kafir kimi gəldi, müsəlman olaraq getdi".[147] Bəs nə üçün Allah və Onun Rəsulu onları müşrik adlandırmışdı? Onlar qəbir yanına yaxınlaşaraq düşünürdülər ki, "mən günahkaram, bir başa Allahadan istəyə bilmərəm? Mən çalışmalıyam ki, ölmüş salehlərin razılığını qazanım ki, onlar da məndən ötrü şəfaət istəsin". Beləliklə də qurban, nəzir, dua və s. etməyə başlayırdılar. Günümüzdə olan müsəlmanların saleh saydıqları kimsələrin qəbirlərində etdiklərini Qureyş müşriklərinin etdikləri ilə müqayisə etdikdə görəcəksiniz ki, eynilə eyni şeyi edirlər? Biz Allahı qəbul edirik, sadəcə biz bu salehlərlə Allaha yaxınlaşmağa yol axtarırıq. Allah Qurani-Kərimdə Ona belə bir yolla yaxınlaşmağı axtaranlar barəsində buyurur: ***"Doğrusu, əsl din ancaq Allaha məxsusdur. Allahı qoyub başqalarını özlərinə dost tutanlar: "Biz, onlara ancaq bizi Allaha daha çox yaxınlaşdırsınlar deyə ibadət edirik"– deyirlər. Əlbəttə ki, Allah ziddiyyətə düşdükləri şeylər barəsində onların arasında Öz hökmünü verəcəkdir. Şübhəsiz ki, Allah yalançı və kafirləri doğru yola yönəltməz".*** *(əz-Zumər 3).* Sufilər deyirlər ki: "Ey Rəbbim! Mən səndən Peyğəmbərinin sənin yanında olan ***Cah*** **-** məqamı, hörməti ilə istəyirəm". Allahdan istəsə də şəriətin qoymadığı yolla bunu etdiyi üçün bidətdir. Şeytanın şirkə aparan addımları necə də təhlükəlidir. Ona görə də Sələflər deyərdilər: "Şeytan sənə doxsan doqquz xeyir qapısını açar, lakin yüzüncü şər qapısını açmaqla səni həlak edər". ***"Onlar Allahı qoyub özlərinə nə bir zərər, nə də bir fayda verə bilənlərə ibadət edir və: "Onlar Allah yanında bizim şəfaətçilərimizdir!"– deyirlər. De: "Yoxsa Allaha göylərdə və yerdə bilmədiyi bir şeyimi xəbər verirsiniz?" Allah onların qoşduqları şəriklərdən uzaqdır və ucadır".*** *(Yunus 18).*

Özünü müsəlman sayan hər bir kəs Allahın təkliyini qəbul edib, ondan qeyrisinə ibadət etməklə Allahın əzabından canını qurtaracağını zənn etməsin. Çünki, İslam dininin başı, sonu, içi və çölü də Uluhiyyət Tövhididir. Peyğəmbərlərin ilk və son çağırışı da budur. Bunun üçün Pəyğəmbərlər göndərilmiş, kitablar endirilmiş, cihad məqsədi ilə qılınclar çəkilmiş, möminlər ilə kafirlər, Cənnət ilə Cəhənnəm əhli bir-

[147] İbn Həcər "İsabə" 2/ 87.

birindən ayrılmışdır. "Allahdan başqa ibadətə layiq heç bir ilah yoxdur" kəlməsinin mənası da elə budur; ***"Səndən əvvəl elə bir elçi göndərməmişik ki, ona: "Məndən başqa heç bir məbud yoxdur, Mənə ibadət edin!"– deyə vəhy etməyək".*** *(əl-Ənbiya 25).* ***"Mən cinləri və insanlaı yalnız mənə ibadət etmək üçün yaratdım".*** *(əz-Zariyat 56).*
O, halda ibadət Allaha edilərsə səhih olar. Allah Rububiyyəti qəbul edən müşriklərə bu Tövhidin fayda vermədiyini, əksinə Qurani-Kərimdə onları mömin yox kafir olaraq adlandırmışdı. Əgər bir kimsə Rububiyyəti, İsim və Sifətlərin Tövhidini qəbul edib, lakin bununla bərabər qəbrin yanına gedib və qəbrə yönəlib o, qəbir sahibinə ibadət etsə və ya ona yaxınlaşmaq məqsədi ilə bir qurban kəssə, belə bir kimsə müşrik və kafirdir. Əbədi Cəhənnəmlikdir. Rəsulullah ρ da onlara qarşı qılınc qaldırmış, onların canlarını və mallarını halal saymışdır; ***"De: "Həqiqətən, Rəbbim məni doğru yola, həqiqi dinə, hənif İbrahimin dininə yönəltdi. O heç vaxt müşriklərdən olmamışdı". De: "Şübhəsiz ki, mənim namazım da, qurbanım da, həyatım da, ölümüm də aləmlərin Rəbbi Allah üçündür!"*** *(əl-Ənam 161-162).*

Möhtərəm oxucularımız! Allaha ibadət edin, Ona heç bir şeyi şərik qoşmayın, öz əməllərinizi, işlərinizi puça çıxartmayın. Allah Öz qullarına Ona ibadət və itaət etməyi əmr edir. Ona itaət etdiklərinə görə onlara bol qarşılıq verəcəyini vəd etmişdi. Ona üsyan edilməsini qadağan etmiş, bundan ötrü onları cəzalandıracağını xəbər vermişdi; ***"Bunlar Allahın sərhədləridir.*** *(hökümləridir)* ***Hər kəs Allaha və Onun Peyğəmbərinə itaət edərsə, Allah onu ağacları altından çaylar axan Cənnətlərə əbədi olaraq daxil edər ki, bu da böyük uğur və qurtuluşdur. Hər kəs Allaha və Onun Peyğəmbərinə itaət etməyib Onun sərhədlərini aşarsa, Allah da onu həmişəlik Cəhənnəmə daxil edər. Onu rüsvayedici əzab gözləyir".*** *(ən-Nisa 13-14).*

## İSİM VƏ SİFƏTLƏR TÖVHİDİNDƏ ŞİRK

**1.** Allahın I isimlərini bütlərə qoymaq. əl-Lat, əl-Uzza və Manat [148] ərəb bütpərəstlərinin əsas bütləri idi. əl-Lata - Səqif qəbiləsi, əl-Uzzaya - Qureyş və Bəni Kinanə qəbilələri, Manata - Bəni Hilal, Əus və Xəzrəc qəbilələri ibadət edirdilər. Allahın əl-İlah adını, əl-Lat adı ilə dəyişərək öz bütlərinə qoymuşlar.

***əl-Lat – Ta*** – hərfinin şəddəsiz oxunduğu zaman Taif şəhərində ağ dağın adı idi. Səqif qəbiləsindən olanlar bu bütləri ilə fəxr edirdilər. İbn Hişam Σ deyir: "Peyğəmbərin ρ əmri ilə Muğirə ibn Şöbə və Əbu Sufyan ibn Hərb N onu yandırıb dağıdırlar. Sonralar isə onun yerində Məscid tikirlər". [149] ***Ta*** – hərfinin şəddəli

[148] İbn Cərir ət-Təbəri, Sufyan əs-Surinin, Mənsura istinadla Mucahiddən etdiyi rəvayətdə Mucahid: ***"Bir deyin görək Lat və Uzza nəyə qadirdir"-*** ayəsinin şərhində deyir: "O (Lat, Uzza) həmişə onlar üçün sıyıq bişirərdi, öləndən sonra isə onun qəbrini ziyarət etməyə başladılar". İbn Abbas N deyir ki: "O, ziyarətçilər üçün sıyıq hazırlayardı".

[149] İbn Hişam 1/ 85-86, İbn Kəsir "əl-Bidayə vən-Nihəyə" 5/ 32, İbn Məcə 743, Əbu Davud 450, İbn Qeyyim "Zədul-Məad" 3/ 499.

oxunduğu zaman ***Lattə -*** hacılara su daşıyan saleh bir kimsənin adıdır. Bu kişi öldükdən sonra insanlar onun qəbri ətrafında toplaşaraq onu şişirtdilər, sonda isə ona ibadət etməyə başladılar.

***əl-Əziz -*** adını, əl-Uzza – ***Əazzu -*** əzəmətli adı ilə dəyişdilər. İbn Cərir Σ deyir: "Məkkə ilə Taif arasında, Nəxl adlanan yerdə ağac adı idi". İbn Hişam Σ deyir: "Məkkənin fəthi günü Xalid ibn Valid ψ oranı dağıdır. Xalid ψ oranı dağıtdıqdan sonra Peyğəmbərin ρ yanına gəlir. Peyğəmbər ρ: "Qayıt ora, çünki sən heç bir şey etməmisən"- deyə buyurur. Xalid ψ ora qayıtdıqda keşikçilər dağa tərəf qaçaraq: "Ey Uzza! Ey Uzza!"- deyə qışqırmağa başladılar. Xalid ψ bütün yanına yaxınlaşdıqda saçları üzərinə tökülmüş lüt bir qadın gördü. Qılıncı ilə vurub onu öldürdü və Peyğəmbərin ρ yanına qayıdaraq başına gələnləri danışdı. Peyğəmbər ρ: "O, Uzza idi!"- deyə buyurdu".[150]

***əl-Mənnan -*** adını, əl-Manat – qan axıdılan yer deməkdir. Mina da bu addan götrülüb. Cahiliyyədə orada çoxlu qurbanlar kəsilirdi. Cahiliyyə müşrikləri elə zənn edirdilər ki, onların bütləri hansısa bir zərər vermək gücünə sahibdilər. Buna görə də onlar üçün qurbanlar kəsir, nəzir deyirdilər. Məkkə ilə Mədinə arasında, Hudeydə adlanan yerin adı idi. Aişə O deyir: "Əli ψ Məkkənin fəthi günü oranı dağıdır".[151] ***"Bir deyin görək Lat və Uzza nəyə qadirdir. Digəri üçüncüsü olan Manat da həmçinin… O, bütlər sizin və atalarınızın qoyduqları adlardan başqa bir şey deyildir. Allah onlara dair bir dəlil endirməmişdir".*** *(ən-Nəcm 19-23).* ***"Allahdan başqa ibadət etdikləriniz sizin və atalarınızın qoyduğu adlardan başqa bir şey deyildir. Allah isə heç bir dəlil endirməmişdir. Hökm ancaq Allahındır. O, sizi yalnız Onun özünə ibadət etməyə çağırır".*** *(Yusuf 40).*

**2.** Allaha I layiq olmayan adı vermək. Məs: Yəhudi və xristianların dediyi kimi Ata, oğul və bizim dilimizdə işlənən "o kişiyə qurban olum" və s. ***"Şübhəsiz ki, Allah Məryəm oğlu Məsihdir"– deyənlər artıq kafir oldular. Məsih isə demişdir: "Ey İsrail oğulları! Rəbbim və Rəbbiniz olan Allaha ibadət edin!"*** *(əl-Maidə 72).*

**3.** Allaha I naqis sifətlər vermək. Məs: Yəhudilər və Xristianlar dedilər ki, Allah xəsisdir, göyləri və yeri xəlq etdikdən sonra dincəldi və s. ***"Yəhudilər dedilər: "Allahın Əli bağlıdır!" Onların öz əlləri bağlandı və dedikləri sözə görə lənətə gəldilər. Əksinə, Onun hər iki Əli açıqdır və O, Öz lütfündən istədiyi kimi sərf edir".*** *(əl-Maidə 64).* ***"O, nə mürgü nə də yuxu bilər".*** *(əl-Bəqərə 255).* Finhas adlı bir yəhudi Əbu Bəkr ψ onu İslama dəvət etdikdə demişdir: "Allaha and olsun ki, ey Əbu Bəkr! Biz fəqir (kasıb) olmadığımızdan Allaha ehtiyacımız yoxdur. O, isə fəqir birisidir. Əgər möhtac olmayan bir varlıq olmasaydı bizdən borc tələb etməzdi". ***"Allah kasıbdır, biz isə varlıyıq!"– deyənlərin sözünü Allah eşitdi. Biz onların dediklərini və haqsız olaraq***

---

[150] İbn Kəsir 7/ 429-430, ən-Nəsai "Sunənul-Kubra", "Tuxfa əl-Əşraf" 4/ 235.

[151] əl-Buxari.

***peyğəmbərləri öldürmələrini yazacaq və onlara deyəcəyik: "Dadın yandırıb-yaxan Odun əzabını!"*** *(Ali İmran 181)".*[152] Allah bütün bu deyilənlərdən uca və uzaqdır.

**4.** Allahın I Sifətlərinə keyfiyyət isnad edib, Onun Sifətlərini Allahın yaratdıqlarına bənzədən – Müşəbbihlər (bənzədənlər). Bunlar müşriklərdən də pisdirlər. Müşriklər yerdəkiləri Allaha şərik qoşurlar, müşəbbihlər (bənzədənlər) isə Allahı yaratdıqlarına bənzədirlər; ***"Allah ona aid etdikləri sifətlərdən uzaqdır".*** *(əs-Saffət 159).* ***"Ona bənzər heç bir şey yoxdur. O, (hər şeyi) eşidəndir,*** *(hər şeyi)* ***görəndir!".*** *(əş-Şura 11).* ***"Heç yaradan*** *(Allah)* ***yaratmayana bənzəyərmi?! Məgər düşünmürsünüz?!".*** *(ən-Nəhl 17).* ***"O, göylərin və yerin, onların arasında olan hər şeyin Rəbbidir! Yalnız Ona ibadət et və Onun ibadətinə səbirli ol! Heç*** *(Allahın özündən başqa)* ***Ona bənzərini*** *(Onun adını daşıyan başqa birisini)* ***görmüsənmi?*** *(Müşriklər öz bütlərinə tanrı, ilahi desələr də, heç zaman onlara Allah adını verməzlər)".* *(Məryəm 65).*

**5.** Allahın I İsim və Sifətlərini qismən və ya tamamilə inkar edən – ***Muattila***. Onların iddialarına görə Allahın İsim və Sifətlərini qəbul etmək Allahı yaratdıqlarına bənzətmək deməkdir. Bunlar da iki qismdirlər. **1)** Allahın İsimlərini qəbul edərək mənasız olduğunu qeyd edirlər. Bütün bunlara ***Sifəti Səlbiyyə*** – Uca Allahın zatına və varlığına yaraşmayan, uca Allah haqqında mümkün olmayan vəsflərdir. ***Səlb Etmək*** – qaldırmaq, uzaqlaşdırmaq mənasındadır. Bunlar da ***Sifəti Səlbiyyə*** və ***Sifəti Subutiyyə***[153] başlıqları altında sayılan on dört sifətin ziddidir. Bunlar ***Adəm*** (yoxluq), ***Hudus*** (sonradan var olmaq), ***Fəna*** (varlığının sonu olması, bəlli bir müddətdən sonra yox olub getməsi), ***Təaddüt*** (ortağı, şəriki, köməkçiləri olması), ***Muşabəhət*** (sonradan yaradılmış bir şeyə bənzəməsi, bənzəri və oxşarı olması), başqalarına möhtac olmaq, ölü və ya cansız olmaq, ***Cahil*** (elmsiz, biliksiz), ***Aciz*** (gücsüz olmaq), iradəsiz olmaq, görməmək, kor olmaq, eşitməmək, kar olmaq, danışmamaq, yaratmamaq. **2)** Bütün İsim və Sifətləri inkar edənlər. Əvvəla bütün bunlar batil fikirlərdir. Çünki Allah Qurani-Kərimdə bir çox ayələrdə İsim və Sifətlərinin olduğunu buyurduğu halda, digər ayələrdə heç bir şeyin İsim və Sifətlərində ona bənzəmədiyini buyurmuşdu. Əgər bu İsim və Sifətləri qəbul etmək, onu yaratdıqlarına bənzətməyi irəli sürmüş olsaydı, Allahın ayələrinin bir qisminin digərini yalanladığını qəbul etməli olardıq. Allahın ***Səmi*** – (eşidən) olduğunu bilirik. Eşitmək isə məna etibarı ilə səsləri qəbul (idrak) etmək deməkdir. Lakin Allahın eşitməsinin həqiqi mənası bizim tərəfimizdən bilinməzdir. Çünki biz iki şəxs gördükdə: Bu ikisinin insanlıq xüsusiyətləri olan eşitmək, görmək və danışmaq kimi xüsusiyətlərinin eyni olduğunu fikirləşmirik. Məs: İnsanın ayağı, əli olduğu kimi hər hansısa bir heyvanın da əli, ayağı vardır. İnsanın da

---

[152] İbn Cərir ət-Təbəri təfsir kitabında. Sənədi zəifdir.

[153] ***Sifəti Səlbiyyə*** – Qidəm (qədimlik), Bəqa (əbədilik), Vahdəniyyə, Muxalifə Lil-Xəlq Vəl-Həvədis, Ğinə (Qiyamu Bin-Nəs). ***Sifəti Subutiyyə*** – Uca Allahın zatına yaraşan və zatından ayrılmayan, əzəli və əbədi olan vacib sifətlərdir. Allah bu sifətlərlə əzəldən bəri vəsflənmişdir. Bu sifətlərin heç biri sonradan qazanılmış sifətlər deyildir. Bu sifətlər – Həyat, Elm, İradə, Qüdrət, Bəsir, Səmi, Kəlam, Təkvin (yoxdan var etməsi).

gücü var, heyvanında, İnsanında eşitmə, görmə orqanı var, heyvanında. Bu sifətlər eyni adı daşıyırlar. Lakin keyfiyyət və forma cəhətdən bir-birindən çox fərqlənirlər. Bundan da belə bir nəticə çıxır ki, adların eyni olması, onların keyfiyyət və formalarının eyni olması demək deyildir. Çarpayının üstünə istiva etmək ilə dəvənin üstünə istiva etmək arasında fərqlər vardır. Bütün bunlar yaradılanlar arasında fərqli olduğu halda, Yaradıcı (Allah) ilə yaradılan (məxluq) arasında belə bir fərq daha açıq və daha böyükdür. Allah Öz sifətləri barəsində bizə xəbər vermişdir, lakin onların forma və keyfiyəti barəsində bir xəbər yoxdur. Sən nə qədər onları təsəvvür etməyə çalışsan Allah daha Uca və Böyükdür. Bütün bunlar da vacib edir ki, Müsəlman bir kimsə nə qəlbi, nə dili, nə də qələmi ilə Allahı təsəvvür etməyə çalışmasın.

**6.** İnsanlar arasında olan bəzi müraciətlər; Məs: Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ demişdir: "Sizdən heç kəs (köləyə): "Rəbbinə yemək ver", "Rəbbinə dəstəmaz almağa kömək et", "Rəbbinə su ver"– deməsin; qoy: "mənim ağam", "mənim himayədarım"– desin. Habelə heç kəs: "qulum", "kənizim"– deməsin; qoy: "oğlum", "qızım", "ay uşaq"– desin[154]"[155].

Bu şirk iki növdür: **1)** Məbud – ibadət olunanla (Allahın İsimləri, Sifətləri və Felləri) bağlı olan şirk. Bu şirk özü də iki növə bölünür. **1)** İnkar (Tətil) şirki. Bu da şirkin ən pis növüdür. Fironun şirki kimi; ***"Firon dedi: "Aləmlərin Rəbbi nədir?*** *(Nə cür şeydir?)****".*** *(əş-Şuəra 23).* ***"Firon dedi: "Ey Haman! Mənim üçün bir uca qala tik ki, bəlkə yollara çatım – göylərin yollarına çatım və Musanın məbudunu görüm. Həqiqətən, mən onu yalançı sayıram!" Firona pis əməli beləcə gözəl göstərildi və o, yoldan çıxarıldı. Fironun hiyləsi uğursuz oldu.*** *(əl-Mumin 36-37).*

Şirklə inkarçı (tətilçi) yanaşı olan bir şeydir və biri digərini tələb edir. Hər bir şirk qoşan insan inkar (tətil) edəndir və hər bir inkar edən (tətilçi) də müşrikdir. Lakin şirkin özündə inkarın əsli yoxdur. Bəzən də görürsən ki, müşrik insan Allahın yaradan olduğunu, Allahın sifətlərini etiraf edir. Lakin Allahın tövhid haqqını inkar edir. Şirkin əsası inkardır. Bu da üç qismdir. **1)** Bu yaradılan şeylərin yaradıcısının olmamasını qeyd etmək. Allahın varlığını, eyni zamanda Yaradanın mövcudluğunu inkar edən kommunistlər. Onlar deyirlər ki: "Allah yoxdur, hər şey maddidir. Hər bir şey öz-özünə yaranıb və təbiətdən yaradılıb". **2)** Allahın kamil İsimlərini, Sifətlərini və fellərini inkar etmək. Cəhmiyyəliləri bura misal gətirmək olar. **3)** Allaha davranışda olan inkardır ki, insan Tövhidin həqiqətini yerinə yetirmir. Məs: ***Vəhdətul-Vucud*** – onlar deyirlər ki, "Xaliq (Yaradan) və məxluq (yaradılan) yoxdur. Onların hər ikisi də bir şeydir və gördüyün hər bir şey Allahdır". Rəbbin mövcudluğunu etiraf edə-edə kainat işlərini idarə edən övliyalardan olan müqəddəslərin mövcudluğunu iddia etmək. Bəzi sufilərin dedikləri ki, "Allah öz məxluqatına hülul edir". Sufi İbn

---

[154] Bütün bunlar kölə ilə ağa arasındakı müraciətlərə aiddir.

[155] əl-Buxari 2552, Muslim 2249, Əbu Davud 4975, ən-Nəsai 10070.

Arabi deyir ki: "Rəbb bəndədir, bəndə Rəbdir. Kaş ki, mənim şerim haqqı deyərdi". Bəziləri ifrata vararaq: "İt də, donuz da bizim tanrımızdır. Allah kilsə rahibindən başqa bir şey deyildir". Həllac deyir ki: “Mən Oyam, O da mən”[156] Sufilər Peyğəmbərə ρ qeyb haqqında mütləq bilik şamil edib: "Ey qeybin ən böyük bilicisi! Biz sənə pənah gətirdik! Ey qəlblərə şəfa verən, biz sənə xeyir-duamızı yetirdik!" Buseyri öz "Burdə" qəsidəsində deyir ki: "Dünyanın xeyri də, zərəri də sənin səxavətindəndir. Çətin anlarda səndən başqa sığınacağım heç kəs yoxdur, əgər bu çağırışımda mənim əlimdən tuta bilməyəcəksənsə həlakıma hökm ver, dünya və onu əyalı sənin səxavətindəndir, Lövhi-Məhfuz və onu yazan qələmin elmi sənin biliyindəndir”. ***Həmçinin*** - Ateistlərin şirki də bura daxildir. **2.** Ona ibadətdə, davranışda (müamələdə) olan şirk (Allahla yanaşı başqa bir ilah qəbul etmək) daxildir. Belə bir kimsə hər nə qədər Allahı zatında, Sifətlərində və Fellərində heç bir şəriki olmamasına inansa da davranışda (müamələdə) şirk qoşmuşdur. Allahın İsim və Sifətlərini, Rəbliyini inkar və rədd etmədən Allah ilə yanaşı başqa ilah qəbul edən Nəsranilərin şirki kimi. Onlar Allahın Rububiyyətini, İsim və Sifətlərini inkar etmirlər. İsa υ və onun anasını ilah sayırlar. ***Həmçinin*** - bura Qədəriyyələrin şirki də daxildir. Belə ki, onlar deyirlər: “Hər bir şey Allahın I istəyi olmadan yaranır”. Bu – o, kəslərdir ki, qulun iradəsini və seçim qabiliyyətini israr etməkdə həddi aşaraq, nəticədə Allahın istəyini və qədərini inkar etmişlər. Onlar deyirlər: "Qulun əməlləri Allah tərəfindən yaradılmayıb, təmamilə insanın özündən aslıdır". Qulun qüdrət və iradəsi ilə öz əməllərinin yaradıcısı olduğunu irəli sürmüşlər. Bununla da Allahdan başqa iki yaradıcı olduğunu qəbul etmişlər. Peyğəmbər ρ onları: "Bu ümmətin məcusiləri"- deyə adlandırmışdır. Çünki, məcusilər şeytanın şəri və pisi yaratdığına inanaraq, Allah ilə birlikdə onun bir başqa yaradıcı olduğunu iddia edirlər. Bu qrup da qulları Allah ilə birlikdə yaradıcı olaraq qəbul etmişlər. İbn Ömər ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Qədəriyyə bu ümmətin məcusiləridir. Xəstələnsələr onları ziyarətə getməyin, ölsələr cənazələrində iştirak etməyin". [157] ***Həmçinin* -** bura Nəmrudun şirki də daxildir; ***“Allahın verdiyi hakimiyyətə görə İbrahim ilə Rəbbi***

---

[156] ***Hululiyyə*** – Allahın I Zatıyla hər yerdə olduğunu qeyd edənlərdir. Onlar Allah I ***Məiyyə*** – Birlikdə, bərabər olmaq sifətində həddi aşaraq Allahın ona yaxın olan (əl-Mukərrəbun) şəxslərə hulul etdiyini (yəni nüfuz etmək, girmək, iki şeyin bir şeymiş kimi birləşməsini) irəli sürən batil firqədir. Onlara görə kim nəfsini itaətlə tərbiyə edər, dünya ləzzətlərinə və şəhvətlərinə səbr edərsə Allaha yaxın olanların (əl-Mukərrəbun) məqamına yüksəlir. Sonra o, bəşəriyyət sifətlərindən təmizləinincəyə qədər, saflaşmaya və saflaşmış olanların dərəcəsinə yüksəlməyə davam edəcəkdir. Saflaşma əsnasında bəşəriyyətdən bir parça da belə qalmadıqda İsa ibn Məryəmə hulul edən Allahın ruhu ona da hulul edir. O, zaman istədiyi kimi olan şeydən başqasını diləməz və əməllərinin tamamı Allahın feli olur, sonunda da Allaha birləşərək, Allah olur!? Abdul-Qahir əl-Bağdadiyyənin bölümünə görə 11 qurupdur. Bunlar: Hululiyyə, Səbəiyyə, Bəyaniyyə, Cənahiyyə, Hatabiyyə, Şurayiyyə, Nəmiriyyə, Rizamiyyə, Muqannaiyyə, Hulmaniyyə, Həllaciyə və Azafira. Hululiyyə eyni zamanda müşəbbihlərin (bənzədənlərin) həddi aşanlarıdır. Rafizilər içərsində də Allahın imamlara Hulul etdiyini deyənlər də vardır. Bax: "Məqalətul-İslamiyyə" 1/ 81-82, "Fərq Beynəl-Firaq" s. 198, 205.

[157] Əbu Davud "Aunul-Məbud" 12/ 452, əl-Albani "Səhihul-Cəmi" 5039, "Şərhu Təhaviyyə" s 273 həsən hədis.

***barəsində höcətləşən kəsin əhvalatını bilmirsənmi? İbrahim: "Mənim Rəbbim həm dirildir, həm də öldürür!"– dedikdə padşah: "Mən də həm dirildir, həm də öldürürəm!"– demişdi. İbrahim: "Allah günəşi məşriqdən gətirir. Sən də onu məğribdən gətir!"– dedikdə, o kafir çaşıb qalmışdı. Allah zalım qövmü doğru yola yönəltməz".*** *(əl-Bəqərə 258).* Bu insan artıq özünü öldürməkdə və diriltməkdə Allaha şərik qoşmuşdur. Onda İbrahim υ onu başqa bir dəlillə bağlayır. Artıq kafir susdu və bağlandı. Həmçinin də bura ulduzları, bürcləri şərik qoşanlar daxildir. Məs; oğlaq, buğa və s. bürclər. Onları bu aləmdə işləri düzüb-qoşan Rəblər qəbul etmişlər. Həmçinin günəşə, oda ibadət edənlərin də şirki bura daxildir.

# DUADA ŞİRK

Xəstəliklərdən şəfa, müsibətdən qorunmaq, ruzinin genişliyi, övlad diləməkdə və s. kimi ancaq Allahın qadir olduğu xüsuslarda istər peyğəmbər olsun, istər alim olsun, istər övliya olsun, istər saleh bir qul olsun (ya filankəsin cəddi, ya filankəsin ruhu) deyərək məxluqdan istəmək və Allaha edilən duada onları vasitəçi etmək duada şirk sayılır. Dua da ibadət olduğu üçün digər ibadətlər kimi yalnız Allaha edilməlidir. Allaha ibadətdə heç bir şey, heç bir kimsə şərik olunmaz.

Şeyx Useymin Σ "Kəşfuş-Şubuhət" kitabının şərhində deyir: "Dua iki növdür:

**1.** Savabı ümüd edərək, cəzasından qorxaraq dua edilənə ibadət niyyətilə edilən ibadət duası. İbadət duası isə qulun dua etdiyi zatın savabını istəyərək və onun cəzasından qorxaraq dua ilə ibadətə yönəlməsi deməkdir. Bunun Allahdan qeyrisinə edilməsi doğru deyildir. Allahdan qeyrisinə edilməsi dindən çıxardan böyük bir şirkdir; ***"Mənə dua edin, Mən də sizə cavab verim. Həqiqətən, Mənə ibadət etməyə təkəbbür göstərənlər Cəhənnəmə zəlil olaraq girəcəklər".*** *(əl-Mumin 60).* Rəsulullah ρ buyurdu: "Dua ibadətdir".[158] Rəsulullah Σ buyurdu: "Allaha dua edin və əmin olun ki, O sizə cavab verəcəkdir".[159] Rəsulullah Σ buyurdu: "Allah Ondan istəməyənə qəzəblənir".[160]

**2.** İstək duası – Bu da istək və ya ehtiyacların qarşılanması üçün edilən duadır. Bu da üç qismdir. **1)** Uca Allaha dua etmək. Bu uca Allaha olan bir ibadətdir. Allahdan başqa heç bir kimsənin yerinə yetirməyə gücü çatmadığı hər hansı bir şeyi Allahdan başqasına dua edərək istəyən bir kimsə, dua etdiyi istər diri olsun, istər də ölü olsun müşrik və kafir olur. **2)** Həyatda olan bir kimsədən gücü çata biləcəyi şeyləri istəyərək dua etmək. Məs: "Ey filankəs mənə su ver"- demək kimi. ***Fayda*** – Saleh olduğunu bildiyin bir insanın yanına gedərək ondan sənin üçün Allaha dua etməsini

---

[158] əl-Buxari "Ədəbul Mufrad" 714. əl-Albani səhih deyib.
[159] ət-Tirmizi 3474.
[160] əl-Buxari "Ədəbul Mufrad" 658, ət-Tirmizi 3770, İbn Məcə 3827. əl-Albani həsən deyib.

istəməyində bir qəbahət yoxdur. Bu doğrudur. Lakin bir kimsənin bunu adət halına gətirməməsi lazımdır. Saleh bir kimsə gördüyü hər dəfə Mənim üçün Allaha dua et – deməməlidir. Çünki belə etmək Sələfin adəti deyildir. Digər tərəfdən belə bir hal başqasının duasına bel bağlamağa gətirib çıxarır. İnsan Rəbbinə dua edəcək olarsa bu onun üçün daha xeyirlidir. O, özünü Allaha yaxınlaşdıracaq bir ibadət etmiş olar. Həmçinin özü dua etdiyi zaman duanın əcrini də almış olar. Həmçinin zərərin dəf edilməsində, xeyrin hasil olmasında da Allaha güvənmiş olur. Lakin başqasından dua etməyi tələb edən kimsədə bu şeylər olmur. Bəlkə də ona daha çox bağlanır, nəinki Allaha. Bu da təhlükəli bir haldır[161]. **3)** Ölü və hal-hazırda olmayan (qeybdə) olan bir kimsədən bu kimi şeyləri istəmək. Bu da şirkdir. Çünki, ölü və qeybdə olan bir kimsənin bu kimi şeyləri yerinə yetirmək imkanı yoxdur. Bu istəklə bir kimsəyə dua etməsi o, varlığın kainatda hansısa bir gücə sahib olduğuna inandığını göstərir. Buna görə də o kimsə müşrik birisidir.

İndi isə gəlin baxaq görək ki, Allah Ondan qeyrisinə dua edənlər haqqında nə buyurur: ***"Allahdan savayı çağırdıqlarınız da sizin kimi qullardır. Əgər doğru deyirsinizsə, çağırın onları, sizə cavab versinlər".*** *(əl-Əraf 194).* ***Subhənəllah!*** Allah bizə buyurur ki, Allahdan qeyri dua etdikləriniz də sizin kimi insanlardır. Sizin kimi yeyirlər, içirlər, gəzirlər, evlənirlər, işləyirlər və ölürlər. Onlar da ehtiyac vaxtı övlad dilədikdə, şəfa istədikdə, müsibət anında əllərini göyə tərəf qaldıraraq Allaha dua edərirlər. Onlar da hər bir şeydə sizin kimi Allaha möhtac idilər. Əgər möhtac olmasaydılar əvvəlcə özlərinə xəstələnməmək və ölməmək üçün kömək edərdilər; ***"Ondan savayı çağırdıqlarınız nə sizə yardım edə bilər, nə də özlərinə köməkçi ola bilərlər".*** *(əl-Əraf 197).* Gördünüzmü! Sizin Allahdan qeyri dua etdikləriniz nə sizə, nə də özlərinə kömək edə bilərlər; ***"Allahdan başqa sənə nə bir xeyir, nə də bir zərər verə bilənə dua etmə. Əgər belə etsən özünə zülm edənlərdən olarsan".*** *(Yunus 105).* ***"Haqq çağırış yalnız Onadır. Müşriklərin Ondan başqa çağırdıqları isə, onlara heç bir şeylə cavab vermirlər. Onlar ağzına su çatsın deyə uzaqdan iki ovcunu suya açan kimsəyə bənzəyirlər. Halbuki o kimsə suyu ovuclayıb içməyincə su onun ağzına çatan deyildir. Doğrusu, kafirlərin duası azğınlıqdan başqa bir şey deyildir".*** *(ər-Rəd 14).* Allah I bu ayədə istisna qoymadı ki, siz peyğəmbərdən, seyyiddən, övliyadan və ya filankəsin cəddinə, ruhuna və ya ağaca, daşa, pirə dua edərək kömək diləsəniz sizin duanıza cavab veriləcəkdir. Allah buyurur: ***"Haqq çağırış yalnız Onadır. Müşriklərin Ondan başqa çağırdıqları isə, onlara heç bir şeylə cavab vermirlər".*** Allah Ondan qeyrisinə dua edənlərin halını bizə misal olaraq başa salır ki, biz qullar bunu daha yaxşı başa düşək. ***Onlar ağzına su çatsın deyə uzaqdan iki ovcunu suya açan kimsəyə bənzəyirlər".*** Elə bil ki, sən evlənməmisən, lakin övlad olmasını istəyirsən (gözləyirsən). Məgər bu mümkündür? Əlbəttə ki, yox. Eynilə qəbir ətrafında duraraq

---

[161] Şeyx Useymin "Kəşfu Şubuhət".

qəbir sahibindən istəyənin halı da belədir. Hətta bəzən görürsən ki, Allahdan qeyrisinə dua edənlər qəbrin ətrafında yalvararaq, göz yaşı tökərək ağlayırlar. Halbuki, Allah üçün bəlkə də heç bir dəfə də olsun göz yaşı tökməyiblər.

***Dua İbadətdir*** – Çünki, dua özündə Tövhidin üç qismini də əhatə edir. O, kəs ki, Allahı çağırır və Allahdan qeyrisini çağırmır artıq o, kimsə ibadətin bütün növlərini yerinə yetirmişdir. O, insan bilir ki, Allah onun Rəbbidir və onun istədiyini yalnız Rəbbi verəcəkdir. Əgər ruzi istəyirsə etiraf edir ki, Allah ruzi verəndir. Əgər şəfa istəyirsə bilir ki, Allahın əş-Şəfi ismi vardır və şəfanı da yalnız O, verəcəkdir. Bu da Rububiyyət tövhididir. Bununla o insan Allahın ad və sifətlərini də etiraf edir. Etiraf edir ki, Allah eşidir. Dua edən insan bilir ki, Allah əs-Səmi eşidəndir. İstənilən yerdə, vəziyyətdə və şəraitdə onu görür və eşidir. Allah onun etdiyi duanı ona verməyə qadirdir. Allah onun duasına cavab verir. Bununla bərabər qətiyyətlə, təzim edərək Allahdan istəyir. Əgər o insan bisəydi ki, Allah onu eşitmir və ona cavab verməyəcəkdir, onda o, Allaha dua etməzdi. Buradan da Allahdan qeyrisini çağırmaq, Allahdan qeyrisindən Peyğəmbərdən ρ, övliyadan, seyyiddən, pirdən, ocaqdan, daşdan, ağacdan qəbr sahibindən istəmək şirk olur. Nəyə görə? Çünki, o insan dua etdikdə o qəbr sahibinin eşitdiyinə etiqad edir. Əgər etiqad edirsə deməli Allaha xas olan sifətlərdən birini o kimsəyə vermiş olur. Allaha xas olan sifətlərdən birini məxluqa vermək də şirkdir. Buna görə də Allahdan qeyrisinə dua böyük şirkdir və insanı İslamdan çıxardaraq bütün yaxşı əməllərini puç edir. Çünki, sən dua etdikdə artıq o, ölən şəxsin sənə ruzi verə bilməsinə, sənin dualarını eşitməsinə və sənə cavab verməsinə inanaraq bunu edirsən. Artıq insan tək olan Allaha dua edərsə, o kimsə Allahın Rəbb olmasını, Rububiyyətini, İsim və Sifətlərini də etiqad etmiş olur. Uluhiyyətə gəldikdə isə Allahın qarşısında zəlil olmaqla, özünün möhtac olduğunu bildirməklə, yalvarmaqla, Allahı çağırmaqla artıq Uluhiyyət tövhidini etiqad etmiş olur. Buna görə də dua ən böyük ibadətdir və bu duanı Allahdan başqasına yönəltmək olmaz. ***“Allahı qoyub Qiyamət gününədək özünə cavab verə bilməyən əşyalara yalvaran kimsədən daha çox azmış kim ola bilər? Halbuki o bütlər onların yalvarışından xəbərsizdirlər. İnsanlar bir yerə toplanılacaqları zaman bütlər onlara düşmən kəsiləcək və onların ibadətini inkar edəcəklər”.*** *(əl-Əhqaf 5-6).* ***“Darda qalan kimsə yalvardığı zaman ona cavab verən, şəri sovuşduran və sizi yer üzünün varisləri edən kimdir? Heç Allahla yanaşı başqa bir məbudmu var? Siz necə də az düşünürsünüz”.*** *(ən-Nəml 62).*

Belə bir sual verə bilərsiniz ki, “məgər o ölən insanlar saleh qullar deyillər? Allaha ibadətlərilə yaxınlaşan övliyalar deyillər?” Bəli, bu kimi şeyləri biz də inkar etmirik. Biz də deyirik ki, onlar əməli saleh qullar olublar. Sağ ikən onların yanlarına xəstə gələn insanlar üçün əllərini qaldıraraq Allaha dua edərdilər və Allah da onların dualarını qəbul edərək xəstəyə şəfa verirdi. Lakin bütün bunlar onların sağlığında

mümkün idi. Artıq öldükdən sonra onların əməl dəftərləri bağlanmışdır. Artıq onların sizin dualarınıza ehtiyacı vardır. Baxın – Allah öz şərəfli, yer üzərində insanlar içərisində ən hörmətli və Allaha ən sevimli olan qulları haqqında nə buyurur. Allah onları insanların ən şərfliləri, hörmətliləri olduqlarını qeyd etməklə yanaşı onların bütün yaradılmışlar kimi Allahın qulu olduqlarını da qeyd edir; ***"Aləmləri xəbərdar etməsindən ötrü Öz quluna Furqanı*** *(Quranı)* ***nazil edən Allah necə də xeyirxahdır!"*** *(əl-Furqan 1).* ***"O,*** *(Məryəm oğlu İsa)* ***ancaq nemət verdiyimiz və İsrail oğullarına ibrət dərsi etdiyimiz bir quldur".*** *(əz-Zuxruf 59).* ***"Nə İsa Məsih Allahın qulu olmağı özünə ar bilər, nə də Allaha yaxın olan mələklər. Allah Ona ibadət etməyi özlərinə ar bilənlərin və təkəbbürlük göstərənlərin hamısını Öz hüzuruna toplayacaqdır".*** *(ən-Nisa 172).* Bəli, xəstəlik, ölüm, yemək və içmək kimi şeylərə ehtiyac duyduğunuz kimi onlar da bu kimi şeylərə ehtiyac duyurlar; ***"Məni yaradan və məni doru yola yönəldən Odur! Məni yedirdən də, içirdən də Odur! Xəstələndiyim zaman mənə yalnız O şəfa verir. Məni öldürəcək sonra dirildəcək də Odur və Qiyamət günü xətamı bağışlayacağına ümüd etdiyim də Odur!"*** *(əş-Şuəra 78-82).* Aişə O rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Əgər sənə desələr Muhəmməd sabah nə olduğunu bilir, inanma".[162] İbn Məsud ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Mən ancaq sizin kimi bir insanam. Unutduğunuz kimi unuduram. Unutduğum zaman yadıma salın".[163] Həmçinin də şəhadət kəlməsinn mənası da buna dəlalət edir: "Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq heç bir haqq ilah yoxdur və Muhəmməd Onun qulu və Rəsuludur". Gördüyünüz kimi əvvəlcə biz onu qul, sonra rəsul adlandırdıq. Buna görə də onları Allahın onlar haqqında buyurduğundan artıq vəsf etmək, şişirtmək olmaz. Onlar Allahın quludurlar, onlara ibadət olunmaz. Peyğəmbərlərin Rububiyyətdə, kainatın idarə edilməsində və ya ibadətdə haqq sahibi olduğuna heç bir şəkildə inanmamalıyıq. Əksinə onlar quldular, onlara ibadət edilməz və onlar rəsuldurlar. Onlar, Allahın istədiyindən artıq nə özünə, nə də hər hansı bir kimsəyə nə fayda, nə də zərər vermək gücünə malik deyillər; ***"De ki: "Mən sizə demirəm ki, mənim yanımda Allahın xəzinələri vardır. Mən qeybi də bilmirəm və sizə də demirəm ki, mən mələyəm. Mən özümə gələn vəhyə tabe oluram". De ki: "Kor görənlə bir olurmu? Məgər düşünmürsünüz!"*** *(əl-Ənam 50).* ***"Peyğəmbərləri onlara cavab olaraq demişdilər: "Biz də sizin kimi adi bir insanıq. Lakin Allah öz bəndələrindən dilədiyinə nemət bəxş edər. Allahın izni olmadan biz sizə heç bir dəlil gətirə bilmərik".*** *(İbrahim 11).* ***"De ki: "Mən də sizin kimi ancaq bir insanam. Mənə vəhy olunur ki, sizin tanrınız yalnız tək olan Allahdır. Kim Rəbbi ilə qarşılaşacağına ümüd bəsləyirsə yaxşı iş görsün və Rəbbinə etdiyi ibadətdə heç kəsi şərik qoşmasın".*** *(əl-Kəhf 110).* Ona əmr edilən şeylərə tabe olan bir əmirdirlər; ***"De ki: "Mən sizə nə bir***

[162] əl-Buxari.
[163] əl-Buxari, Muslim.

***zərər, nə də bir xeyir vermək qüdrətinə malik deyiləm!" De ki: "Məni Allahdan heç kəs qurtara bilməz və mən Ondan başqa heç bir sığınacaq tapa bilmərəm!"*** *(əl-Cinn 21-22).* ***"De: "Mən Allahın istədiyindən başqa özümə nə bir fayda, nə də bir zərər yetirməyə qadir deyiləm. Əgər qeybi bilsəydim, əlbəttə, özüm üçün xeyir artırardım və mənə pislik toxunmazdı. Mən sadəcə, iman gətirən bir qövm üçün qorxudan və müjdələyənəm".*** *(əl-Əraf 188).* Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Məni Xristianların Məryəm oğlu İsanı υ tərif etdikləri kimi tərif etməyin. Mən sadəcə bir qulam, deyin "Allahın qulu və rəsulu". Məni tərif etməkdə həddi aşmayın. Məni Allahın layiq bildiyi dərəcədən artıq yüksəltməyin. Rəbbim məni necə vəsf edibsə elə də vəsf edin".[164] Beləliklə, bizə aydın oldu ki, nə Pyğəmbərlər, nə Allahın Rəsulu, nə də ondan daha aşağı mərtəbədə olan yaradılmışlardan heç biri ibadətə layiq deyildir. İbadət ancaq bir və tək olan Allaha edilir. Qiyamət günü isə Allaha şərik qoşduqlarınız sizin şirkinizi danacaqlar; ***"Sizin Ondan qeyri dua etdikləriniz bir çəyirdək qabığına da sahib deyillər. Əgər siz onlara dua etsəniz onlar sizin dualarınızı eşitməzlər. Eşitsələr də belə cavab verməzlər. Özləri də Qiyamət günü sizin şərik qoşduqlarınızı danacaqlar. Heç kəs sizə hər şeydən xəbərdar olan Allah kimi xəbər verə bilməz".*** *(Fatir 13-14).* ***"O gün Allah onları və onların Allahdan başqa sitayiş etdiklərinin hamısını məhşər ayağında cəm edərək deyəcək: "Mənim bu qullarımı haqq yoldan sizmi azdırdınız, yoxsa onlar özləri azdılar?" Onlar deyəcəklər: "Sən pak və müqəddəssən! Sənin əvəzinə özümüzə başqa himayədarlar götürmək bizə yaraşmaz. Lakin Sən onlara və atalarına o qədər firavanlıq nəsib etdin ki, axırda Zikri də yaddan çıxartdılar və məhvə məhkum olunmuş bir zümrəyə çevrildilər".*** *(əl-Furqan 17-18).* ***"Şübhəsiz ki, Allah Məryəm oğlu Məsihdir"– deyənlər artıq kafir oldular. Məsih isə demişdir: "Ey İsrail oğulları! Rəbbim və Rəbbiniz olan Allaha ibadət edin! Həqiqətən də, Allaha şərik qoşan kimsəyə, Allah Cənnəti haram etmiş və onun sığınacağı yer Oddur. Zalımlara kömək edən olmayacaqdır".*** *(əl-Maidə 72).* ***"Allah deyəcəkdir: "Ey Məryəm oğlu İsa! Sənmi insanlara: "Allahı qoyub məni və anamı iki məbud qəbul edin!"– demişdin?" İsa deyəcək: "Sən pak və müqəddəssən! Haqqım olmayan bir şeyi demək mənə yaraşmaz. Əgər bunu demiş olsaydım, əlbəttə, Sən onu bilərdin. Sən mənim qəlbimdə olanları bilirsən, mən isə Sənin Özündə olanları bilmirəm. Şübhəsiz ki, qeybləri bilən Sənsən! Mən onlara ancaq Sənin mənə əmr etdiyini: "Mənim də Rəbbim, sizin də Rəbbiniz olan Allaha ibadət edin!"– demişəm. Nə qədər ki, onların arasında idim, mən onlara şahid idim. Sən məni onların arasından götürdükdən sonra isə onlara nəzarət edən Özün oldun. Sən hər şeyə Şahidsən".*** *(əl-Maidə 116-117).* Əbu Səid əl-Xudri τ rəvayət etmişdir ki, Peyğəmbərin ρ dövründə bir dəstə adam Peyğəmbərə ρ dedi: "Ya Rəsulullah, Qiyamət günü Rəbbimizi görə biləcəyikmi?" Peyğəmbər ρ dedi: "Bəli, məgər sizə

---

[164] əl-Buxari 3445, Əhməd 23,24, əd-Dərimi 2784, İbn Hibban 6239, Əbu Yəla 153.

günortaüstü, gün işığının qabağını bulud örtmədiyi bir vaxtda günəşi görməyinizə nəsə mane olurmu?" Onlar: "Xeyr!"– dedilər. (Peyğəmbər ρ) soruşdu: "Məgər sizə on dördüncü gecədə, ay işığının qabağını bulud örtmədiyi bir vaxtda ayı görməyinizə nəsə mane olurmu?" Onlar: "Xeyr!"– dedilər. Peyğəmbər ρ buyurdu: "Bu ikisini görməyə sizə heç bir şey mane olmadığı kimi, qüdrətli və əzəmətli Allahı da Qiyamət günü beləcə, görəcəksiniz. Qiyamət günü yetişdiyi zaman carçı səsləyib deyəcək: "Hər bir ümmət nəyə ibadət edirdisə, qoy onun ardınca getsin!" Bundan sonra Allahdan qeyrisinə – bütlərə və dikinə qoyulmuş daşlara ibadət edən elə bir kimsə qalmayacaq ki, Cəhənnəm oduna düşməsin. Axırda isə ancaq Allaha ibadət edənlər, – xeyirxah, yaxud günahkar adamlar, – habelə Kitab əhlindən (peyğəmbərlərinə sadiq qalmış kimsələr) qalacaqdır. (O vaxt) yəhudiləri çağırıb onlardan soruşacaqlar ki: "Siz nəyə ibadət edirdiniz?" Onlar deyəcəklər: "Biz Allahın oğlu Üzeyirə ibadət edirdik." Onlara deyiləcək: "Yalan danışırsınız, Allah Özünə nə zövcə, nə də övlad götürmüşdür. (Bir deyin görək) siz nə istəyirsiniz?" Onlar deyəcəklər: "Susamışıq, ey Rəbbimiz, bizə su ver." (Onda onlara Cəhənnəm) göstəriləcək (və deyiləcək): "(Bundan) içmək istəmirsinizmi?" Onlar ilğıma bənzər, alovlanan atəşin (kənarına) toplanacaq və Cəhənnəmə düşəcəklər. Sonra xristianları çağırıb onlardan soruşacaqlar ki: "Siz nəyə ibadət edirdiniz?" Onlar deyəcəklər: "Biz Allahın oğlu Məsihə[165] ibadət edirdik". Onlara deyiləcək: "Yalan danışırsınız, Allah Özünə nə zövcə, nə də övlad götürmüşdür". Sonra onlardan: "Siz nə istəyirsiniz?"– deyə soruşulacaq və beləliklə də, əvvəlkilərin başına gələnlər onların da başına gələcəkdir. Nəhayət, ancaq Allaha ibadət edən kimsələr – xeyirxah, yaxud günahkar adamlar qaldıqda, aləmlərin Rəbbi onların yanına bildikləri ən yaxın surətdə[166] gələcək. Sonra onlara deyiləcək: "Nə gözləyirsiniz?! Qoy hər bir ümmət ibadət etdiyi (məbudun) ardınca getsin!" Onlar deyəcəklər: "Biz dünyada ikən insanlara ehtiyacımız ola-ola onlardan ayrıldıq, əsla onlarla birlikdə olmadıq. İndi isə biz ibadət etdiyimiz Rəbbimizi gözləyirik". Onda Allah buyuracaq: "Mən sizin Rəbbinizəm!" Onlar iki və ya üç dəfə: "Biz heç nəyi Allaha şərik qoşmuruq!"- deyəcəklər".[167] ***"Yəhudilər: "Üzeyr Allahın oğludur"– dedilər. Xaçpərəstlər də: "Məsih Allahın oğludur"– dedilər. Bu onların ağızlarından çıxan sözlərdir. Bu, daha əvvəlki kafirlərin sözlərinə oxşayır. Allah onları məhv etsin! Gör necə də haqdan döndərilirlər"!"*** *(ət-Tövbə 30).*

Görün Məsih İsa υ Xristianların ibadətindən necə də imtina edir. Sənin buyurduqlarını onlara çatdırıb dedim ki, mənim də sizin də Rəbbiniz olan Allaha ibadət edin. Allah bilir ki, Məsih özünə ibadət etməyi onlara əmr etməmişdir. Buna heç bir zaman razılıq verməmişdir. Lakin Allah bu ayələrlə bəşəriyyətə bəyan edir ki,

---

[165] Burada Məryəm oğlu İsa υ nəzərdə tutulur.

[166] Yəni Allahın isim və sifətlərinə dair Quran və sünnədə varid olan dəlillərdən bildikləri vəsflərə uyğun surətdə gələcək.

[167] əl-Buxari 4581.

Peyğəmbərlərdən heç kəsə ibadət etmək olmaz. Əgər Peyğəmbərlərə ibadət etmək olmazsa, bəs onda onlardan fəzilətcə aşağı olan imam, seyyid, övliya, daş, ağacdan, qəbr sahiblərinə necə ibadət etmək olar? Yollarını azmışlar Allahın öz Peyğəmbərinə bu sözləri buyurduğunu oxumurlarmı: ***"Allah sənə bir zərər yetirmiş olsa səni ondan Allahdan başqa heç kəs qurtara bilməz".*** *(Yunus 107).* Əgər Allah Peyğəmbərin özünə bir zərər yetiribsə o, özünü bundan qoruya bilməz. Bəs onda Peyğəmbərdən sonra gələn imam, övliya başqasına baş verən zərəri necə dəf edə bilər?

***İbadət*** – İnsanların əksəriyyəti ibadət deyildikdə yalnız namaz başa düşürlər. Ona görə də görürsən ki, etiraz edərək deyirlər ki, biz onlara namaz (ibadət) etmirik? Lakin bu səhf bir fikirdir. Çünki, ibadətin mənası genişdir. Zəlillik, qulluq, itaətkarlıq deməkdir. Alimlər ibadət kəliməsinə bir çox təriflər vermişdilər. Lakin ən gözəl tərifi İbn Teymiyyə Σ deyir: "Bura Allahın sevdiyi və razı qaldığı zahiri və batini hər bir söz və əməl (namaz, oruc, dua, qurban, nəzir, məhəbbət, qorxu, niyyət və s.) daxildir". İbadət üç şeylə olur: Dil - Qəlb - Əməl və bu ibadətlər üç şeyin üzərində qurulur: Məhəbbət - Ümüd - Qorxu. ***İbadət*** – Toqifidir. Yəni, insanların istək və ağılları ilə deyil, Allah və Onun Rəsulu ρ tərəfindən təyin edilir; ***"O, sizə mələkləri və peyğəmbərləri özünüzə Rəbb qəbul etməyi əmr etməz. O, sizə müsəlman olduqdan sonra, özünüzü Allaha təslim etdikdən sonra kafir olmağı heç əmr edərmi".*** *(Ali İmran 80).* ***Subhənəllah!*** Heç Allah bizə müsəlman olduqdan sonra imamlara, övliyara, pirlərə, qəbir sahiblərinə ibadət etməyi əmr edərmi? Həqəqətən də bu ayələrdə ağıl sahibləri, düşünən insanlar üçün ibrətlər vardır.

***"Ey insanlar! Çəkilən məsələ qulaq asın. Dua edilən Allahdan başqa qeyriləri hamılıqla toplansalar belə bir milçək də yarada bilməzlər. Əgər milçək onlardan bir şeyi aparsa onlar onu geri qaytara bilməzlər. İstəyən də aciz, istənilən də".*** *(əl-Həcc 73).* ***"Sizin Ondan qeyri dua etdikləriniz bir çəyirdək qabığına da sahib deyillər. Əgər siz onlara dua etsəniz onlar sizin dualarınızı eşitməzlər. Eşitsələr də belə cavab verməzlər".*** *(Fatir 13-14).* ***"Dua edilən Allahdan qeyriləri heç bir şey yarada bilməzlər. Onlar özləri yaradılıblar. Onlar ölüdürlər, diri deyillər və nə vaxt diriləcəklərini də bilmirlər".*** *(ən-Nəhl 21).* ***"Onlar Allahı qoyub, yalnız qadın adlarını daşıyan bütlərə yalvarır və yalnız üsyankar şeytana sitayiş edirlər. Allah şeytana lənət etdi. O isə dedi: "Mən Sənin qullarından müəyyən bir qismini hökmən ələ alacağam".*** *(ən-Nisa 117-118).* Bəli, bu da şeytanın vədidir və şeytan da Allahın qullarından bir qismini Allahdan qeyrisinə dua etməyə yönəldərək alır. Lakin biz Allahın Kitabını oxusaq və Peyğəmbərin ρ sünnəsinə tabe olsaq bu azğın şeytanın yoluna heç vaxt düşmərik.

# QƏBİR ZİYARƏTLƏRİ

Böyük səadətin, dünya və axirətdə kəramətin ancaq Peyğəmbərin ρ yolu ilə getməklə mümkün olduğu məlumdur. Lakin şeytan insan üçün açıq-aydın bir düşməndir. Min cür hiylələri ilə Adəm övladlarını doğru yoldan azdırmağa, onları böyük günahlara düşməyə çağırır ki, Cəhənnəm əhlindən olsunlar. Şeytanın insanı sürüklədiyi fitnələrin başında qəbir fitnəsi gəlir. Şeytanın bu hiyləsi nəticəsində insanlar Allahdan başqa rəblər qəbul etdilər. Onların qəbirlərinə tapınaraq onları bütləşdirdilər. Qəbirlərin üzərində heykəllər düzəldərək orada yatanların surətlərini üzərlərinə çəkdilər. Ölmüş vəlilərin ehtiyaclara cavab verdiyinə, sıxıntıları apardığına inanmaq, onlardan yardım və kömək diləməyə başladılar. Bəziləri hətta ayağa qalxanda, oturanda, büdrəyəndə, çətinlikdə, sıxıntıda və s. müqəddəs saydığı insanların adlarını dilinə gətirərək onlardan kömək istəyir. "Ya Muhəmməd", "Ya Əli", "Ya Hüseyn" və s. ***"Allahdan başqa ibadət etdiyiniz bütlər də sizin kimi bəndələrdir".*** *(əl-Əraf 194).* Bəziləri qəbirlərin ətrafında Kəbəyə təvaf edildiyi kimi təvaf edir, bəziləri də sürünərək təvaf edirlər. Əllərini qəbirlərə sürtür, onların ocaqlarını öpür, təmizləyir, oranın toz-torpağını üzünə, bədəninə sürtür. Qəbir gördükdə boynunu bükür, səcdə edir, özünü qəbirin yanında aşağı sayaraq zəlil olur, xəstəsinin şəfa tapması, uşağının olması ya da bir işinin asanlıqla baş verməsi üçün istək və arzularını bildirərək: "Ey ağam! Uzaqdan gəlmişəm, ümüdlərimi boşa çıxarma" deyərək zəlil kimi yalvarır; ***"Allahı qoyub Qiyamətədək özünə cavab verə bilməyən bütlərə ibadət edən kimsədən daha çox haqq yoldan azmış kim ola bilər? Halbuki bu bütlər onların ibadətindən xəbərsizdilər".*** *(əl-Əhqaf 5).* Bəziləri saleh olduğunu zənn etdiyi insanlar üçün oruc tutmaq,[168] onların və ya qəbirlərinin qarşısında namaz qılarkən Allahın qarşısında durduğundan da daha şiddətli xuşu ilə durması və göz yaşı axıtması, çox uzaq məsafələrdən onların evlərinə doğru yönəlmək, həccə gedir kimi o, kimsələri görmək üçün səfərə çıxmaq, o kimsənin adını Təlbiyyə (Ləbbeyk) söylənilən kimi çəkmək, o kimsələrə qurban kəsib, nəzir vermək, onların evlərinə Kəbənin üzərinə örtük salındığı kimi örtük salmaq[169] və qapısı ağzında qiyamda durmaq, dua və istiğasə ilə dünya və axirət istəklərinin yerinə yetirilməsi üçün onlara yönəlmək, o kimsənin yaşadığı evin daşlarından öpmək,

---

[168] Salehlərin adına oruc tutmaq Hindistanda ortaya çıxmış bir bidətdir. Bu orucun da bəlli bir ədəbi, əhkamı, niyyəti və iftar vaxtı vardır. Müəyyən günlərdə tutulur. Bu oruc ilə salehlərə təvəssül və istiğasə edilərək onlardan ehtiyaclarının getməsini diləyərlər. "Hənəfi alimlərinə görə şirk və səbəbləri" Muhəmməd. ibn Abdur-Rahman əl-Humeyyis səh. 37.

[169] Həmçinin də qəbirlərin üzərinə örtüklər, çadırlar salaraq insanları inandırmağa çalışırlar ki, hər il bunu dəyişirik və bizə arası kəsilməyən ruzi gəlir, xəstəliklərdən şəfa tapırıq, ruzinin və salamatçılığın gəlməsinə səbəbdir, hər cür pislikləri dəf edir, bütün qorxulardan əmin oluruq söyləyərək insanları zəlalətə sürükləyirlər. İnsanlar da bu qədər asanlıqla əldə ediləcək savaba görə malını bu yolda bolluca sərf edirlər. "Hənəfi alimlərinə görə şirk və səbəbləri" Muhəmməd ibn Abdur-Rahmən əl-Humeyyis səh. 39.

divarına özünü sürtərək pərdələrindən asılmaq, orada təzim və ibadət məqsədi ilə qəndillər yandırmaq, Kəbə xidmətçilərinin etdikləri kimi saleh saydığı kimsələrin evlərini süpürmək, təmizləmək, döşəmək, oraya gələnlərə su vermək, orada qüsl və dəstəmaz almaq üçün yerlər hazırlamaq, onun quyusunun suyundan bərəkət tapmaq niyyətilə içmək və o suyu yaymaq, suyu ora gəlməyənlərə aparmaq, o zatın yanından çıxarkən arxasını arxa-arxaya yeriyərək oradan çıxmaq, orada özünü ağır aparmaq, əxlaqlı olmaq, o ərazidə ov ovlamamaq, ağac qırmamaq, otunu qoparmamaq, oranı ucaltmaq, əzəmətləşdirmək üçün aləmə car çəkib insanları ora dəvət etmək. Bəziləri qəbirlərin yanında saçlarını qırxır, özləri ilə bu kimi ziyarətgahlara (pirlərə, türbələrə, məzarlara) "Həcc edərkən yerinə yetiriləcək ibadətlər" adlı kitablar da gətirirlər. Bütün bu əməlləri edən kimsələr şirkə düşmüşlər ki, bu da ibadətdə şirk sayılır.

Bu böyük xəstəliyi ilk olaraq Nuhun υ qövmündə görürük. Allah, Nuhun υ qövmü haqqında belə buyurur: ***"Və özlərinə tabe olanlara dedilər: "Öz məbudlarınızı tərk etməyin; Vəddi, Suvaı, Yəğusu, Yəuqu və Nəsri tərk etməyin!".*** *(Nuh 23).* İbn Abbas ψ rəvayət edir ki, bunlar Nuhun υ qövmünün əməlisaleh insanları idilər. Onlar öldükdən sonra şeytan onların yaşadığı qövmün insanlarına onların toplandıqları yerlərdə heykəllərini ucaltmağı və onların adlarını həmin heykəllərə verməyi vəsvəsə etdi. Onlar da deyilən kimi etdilər. (Heykəlləri) düzəldən nəsil ölüb gedənə qədər onlara ibadət olunmadı. (Uzun müddət keçdikdən sonara) elm unudulduqda o, heykəllərə ibadət etməyə başladılar.[170] İbn Qeyyim Σ deyir: "Nuhun υ qövmündə olan bu kimsələr öldükdən sonar qövmü qəbirlərinə gələrək ora bağlandılar. Daha sonra onların surətlərini çəkdilər. Uzun bir zaman keçdikdən sonra bu kimsələrə ibadət etməyə başladılar". Buna səbəb, onların Rəblərinin Kitabı və nəbilərinin sünnəsindən uzaqlaşdıqları üçün öz ağıllarına və nəfsi istəklərinə uyması idi. Sıratal-Mustəqimdən ayrıldıqca təkzibə başladılar. Allah və Onun Rəsulunun hökmünün önünə keçdilər. Beləcə də nəsildən-nəsilə zəlalətə düşdülər. İxtilaf edib firqələrə böləndülər. İbn Teymiyyə Σ deyir: "Kim nübuvvət cizgisindən ayrılarsa şirkə və digər günahlar içərisinə düşər. İnsanların inanclarında şirk yox idi. Adəm υ və uşaqları Allahı tövhid etmək inancı üzərində idilər. İnsanlar tək bir ümmət idilər sonra ixtilafa düşdülər; ***"İnsanlar vahid bir ümmət idilər, sonra ixtilafa düşdülər".*** *(Yunus 19)". "**İnsanlar tək bir ümmət idilər".** (əl-Bəqərə 213).* İbn Abbas ψ deyir: "Adəm ilə Nuh υ arasında altı əsr (Başqa rəvayətdə: on əsr) vardır. Bu dövürdə yaşayan insanların hamısı da Allahın şəriəti üzərində idilər. Onların hamısı İslam dinində idilər. Daha sonra ixtilafa düşdülər. Rəsulların şəriətlərinə tabe olmağı tərk etdikləri üçün şirkə düşdülər. Allah da müjdələyən və qoxudan Rəsullar göndərdi. Göndərilən ilk Rəsul isə Nuh υ idi".[171]

---

[170] əl-Buxari 4920.
[171] İbn Kəsir 1/ 250, Məcmuul Fətava 20/ 106.

Bütlərə tapınmaq belə başladı. O, zaman onlar qəbirlərə dəvət etmək və qəbir əhlinin surətlərini çəkməklə iki fitnəyə düşdülər. Aişə O rəvayət edir ki, Ummu Sələmə (və Ummu Həbibə) O, Peyğəmbərə ρ Həbəşistanda gördüyü Mariya adlı bir kilsə haqqında xəbər verdi. Onlar bu kilsənin gözəlliyindən və kilsədəki rəsmlərdən danışdılar. (Başqa rəvayətdə: orda İsanın peyğəmbərin υ surətini görürlər). Orada gördüklərini söylədikdən sonra, Peyğəmbər ρ buyurdu: "Onlar özlərindən olan saleh bir qul və ya saleh bir kimsə öldükdə qəbri üzərində məscid tikir və üzərində (sənin söylədiyin) kimi surətlərini çəkərdilər. Onlar Allah qatında məxluqların ən şərliləridirlər".[172]

***Məscid*** – Allaha ibadət edilən yerlər sayılır. Bu başlıq Allaha saleh bir kimsənin qəbrində ibadət etmək və ya qəbr sahibinə ibadət etmək barəsindədir. Peyğəmbərin ρ bu ümmətə rəhmətindən, ona şirkə aparan bütün yolları bəyan etməsidir. Həm dəvətinin əvvəlində, həm də ölüm anında belə şirkdən çəkindirməsidir. Şirkin öz yolları vardır ki, tövhidi qorumaq üçün bu qapıları bağlamaq lazımdır. Bu hədisə əsasən Xristian kilsələri saleh kimsələrin qəbirləri üzərində tikilirdi. Xristianlar saleh saydıqları kimsənin şəkilini çəkərək insanların bu saleh kimsəni ucaldaraq Allaha ibadət etməsi üçün qəbri üzərindən asardılar. Peyğəmbər ρ Ummu Sələməyə O başa saldı ki, bu kimsələr Allah dərgahında ən şərli insanlardır. Onlar kimlərdir? Salehlərin qəbirləri üzərində məscidlər tikərək onları ucaldanlar və onların surətlərini çəkənlərdir. Onlar iki fitnəni birləşdirmişlər: ***Fitnətul-Qubur***, ***Fitnətul-Sura***. Bununla da onlar ən şərli məxluqdurlardır. Bu bizim üçün bir hədədir ki, salehlərin qəbirləri üzərində ibadətgah tikilməsin. Qəbr olan məsciddə səcdə edənin halı budursa, onda qəbrə səcdə edənin halı necə olar?

Hədisdə onların ibadət etmələri barəsində heç bir söz deyilmir. Onlar sadəcə şəkillərini çəkib onları ucaldardılar. Lakin bu iki əməl insanları dinlərində fitnəyə məruz qoyduğu üçün qadağan edilmişdir. Qəbirləri məscid halına gətirməyin üç halı vardır: **1)** Əgər bir kimsə səcdəni qəbrin qarşısında edirsə; Bu növ ən çox yayılmış və çirkin bir əməldir. İbn Həcər Σ deyir: "Bu hədis saleh kimsələrin qəbirləri üzərində məscid inşa etməyi və Xristianların etdiyi kimi onlara bu salehlərin surətini çəkməyin haram olduğunu göstərir. Bunların hər birinin haram olmasında şübhə yoxdur. Həm Adəm oğullarının rəsmlərini çəkmək, həm də qəbir üzərində məscid ucaltmaq haramdır. Bərəkət və şəfaətlərini ummaq üçün Peyğəmbərlərin və salehlərin rəsmlərini çəkmək İslama görə haramdır. Bu bütlərə tapınmağa bənzəyir. Peyğəmbər ρ onların Qiyamət günü Allah qatında insanların ən şərliləri olacağını bildirmişdir. Seyr etmək, təsəlli tapmaq, vaxt keçirmək, əylənmək üçün rəsm çəkmək haramdır. Bu böyük günahlardandır. Rəsm çəkənlər Qiyamət günü ən şiddətli əzaba məruz qalanlar olacaqlar. Çünki, Allahdan başqa heç kimsənin etməyə qadir olmadığı

[172] əl-Buxari 1/ 416, H. 1341, Muslim 528, ən-Nəsai 1/ 115, Əhməd 6/ 51.

Allahın fellərindən bənzərini etməyə qalxan bir zalımdır. Zatı, sifətləri və fellərində Ona bənzər heç bir şey yoxdur".[173] İbn Məsud ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Ən şərli insanlar Qiyamət qopduğu vaxt həyatda olanlar və qəbirləri məscid halına gətirən kimsələrdir".[174] **2)** Əgər insan qəbirin qarşısında duraraq namaz qılırsa; Üzü ilə qəbirə tərəf yönələrək, alçalmış, zəlil bir şəkildə qəbirləri məscid halına gətirmişdir. Peyğəmbər ρ qəbirlərə doğru namaz qılmağı qadağan etmişdir. Peyğəmbər ρ buyurdu: "Heç bir qəbirə doğru namaz qılmayın və heç bir qəbirin üzərində namaz qılmayın".[175] Ənəs ψ rəvayət edir ki, Peyğəmbər ρ qəbirlərə doğru namaz qılmağı qadağan etmişdir".[176] **3)** Əgər bir kimsə qəbiri məscid edirsə və ya qəbiri məscidin içinə salırsa artıq qəbirləri məscid halına gətirmişdir. Kitab Əhli öz Peyğəmbərlərini dəfn etdikdən sonra üzərlərində ibadətgah inşa edərdilər. Artıq Allah Rəsulu ρ peyğəmbərlərin qəbirlərini səcdəgaha çevirənləri lənətləmişdir. Əgər qəbrləri səcdəgaha çevirənlər lənətlənmişsə onda onlara bir başa ibadət edənlərin, dua edənlərin, kömək istəyənlərin, şəfa, övlad istəyənləri, ora gedərək qurban kəsənlərin halı necə olacaqdır. Cündəb ibn Abdullah əl-Bəcəli ψ rəvayət edir ki, Peyğəmbər ρ ölümündən beş gün qabaq buyurdu: "Nə badə məndən sonra əvvəlkilər kimi Peyğəmbərlərin qəbirlərini ibadətgaha çevirəsiniz. Mən bunu sizə qadağan edirəm".[177] Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Allahummə! Mənim qəbrimi ibadət olunan büt (vasan) etmə. Öz Peyğəmbərlərinin qəbirlərini məscidlərə (ibadət olunan yerə) çevirən bir qövmə Allahın şiddətli əzabı gələr".[178] İbn Abul-Bərr ψ deyir: "Mənim qəbrimi namaz qılınan, səcdə edilən və beləcə ona ibadət edilən bir büt halına gətirməyin. Çünki, Allah bu cür iş edənlərə şiddətli qəzəb edər. Peyğəmbər ρ isə səhabələrini və ümmətini əvvəlkilərin etdikləri kimi Peyğəmbərlərinin qəbirlərinə doğru namaz qılan, oraları qiblə və məscid edən digər ümmətlərin etdikləri pis işdən çəkindirmişdir. Çünki, bütpərəstlər səcdə etdikləri və ucaltdıqları bütlərinə qarşı belə hərəkət edirlər. Bu da ən böyük şirkdir. Peyğəmbər ρ bu işin Allahı nə qədər qəzəbləndirdiyini və Onun razı olmadığı işlərdən bir iş olduğunu bildirir. Çünki ümmətinin də əvvəlki ümmətlərin yolunu izləməsindən qorxurdu. O, həm Kitab Əhlinə, həm də kafirlərə müxalif olmağı sevərdi. Ümmətinin isə onlara tabe olmasından qorxurdu. Peyğəmbərin ρ bu sözlərinə diqqət edin: "Həqiqətən siz əvvəlkilərin (sünnəsi – yolu) adət-ənənələri ilə gedəcəksiniz. Hər bir şeydə onlara qarış-qarış oxşamağa çalışacaqsınız. O, dərəcəyə qədər ki, onlardan biri kərtənkələ yuvasına girsə belə siz də onun ardınca girəcəksiniz". Biz: "Ya Rəsulullah!

---

[173] İbn Həcər "Fəthul-Bəri".
[174] İbn Xuzeymə "Sahih" 1/ 92, İbn Hibban 340, 341, Əhməd 3844, 4143, Əbu Yala "Musnəd" 257/ a.
[175] ət-Tabərani "Mucəmul-Kəbir" 3/ 145, 150, əl-Buxari "Tarixus-Sağir" 163.
[176] İbn Hibban 343.
[177] Muslim 532.
[178] İmam Məlik, Əhməd 7352, İbn Sad 2/ 241-242, Əbu Yala "Musnəd" 312/ a, Əbu Nuaym "Hilyə" 6/ 317.

Sən Yəhudi və Xristianları (Başqa rəvayətdə: Farslar və Rumluları) nəzərdə tutursan?"- deyə soruşduq. Peyğəmbər ρ buyurdu: "Onlardan başqa kimlər olacaq".[179]

Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Allah Yəhudilərə lənət etsin! Onlar Peyğəmbərlərinin qəbrlərini məscid halına gətirdilər".[180] Aişə O rəvayət edir ki, Peyğəmbər ρ (vəfatından öncə) xəstələndiyi vaxt buyurdu: "Allah yəhudilərə və xristianlara lənət etsin! Çünki, onlar Peyğəmbərlərinin qəbirlərini ibadətgaha (məscidlərə) çeviriblər".[181] Aişə O deyir: "Əgər belə omasaydı Peyğəmbərin ρ qəbri çölə çıxardılardı. Yalnız onun qəbrinin məscid halına gətirilməsindən qorxurduq"[182]. Aişə O ilə, İbn Abbas ψ rəvayət edir ki, Peyğəmbər ρ ölümü yaxınlaşdığı vaxt üzünü Hamisanın ucuyla örtür və sonra örtüyü üzündən qaldıraraq buyurardı: "Allah yəhudilərə və xristianlara lənət etsin! Çünki, onlar Peyğəmbərlərinin qəbirlərini ibadətgaha (məscidlərə) çeviriblər". Aişə O deyir ki: "(O, bu sözləriylə) onların etdiklərinin bənzərini etməkdən bizi çəkindirirdi".[183] Əbu Ubeydə ibn Cərrah ψ rəvayət edir ki, Peyğəmbərin ρ son söylədiyi sözlər bunlardı: "Hicaz əhalisi ilə Nəcran əhalisi arasında olan Yəhudiləri ərəb yarmadasından çıxardın. Bunu da bilin ki, insanların ən şərliləri Peyğəmbərlərinin qəbirlərini məscid halına gətirənlərdir".[184] Hafiz İrakli Σ deyir: "Əgər bir kimsə içində dəfn edilmə qəsdi ilə bir məscid tikərsə bu lənətin içərisinə girər. Məsciddə dəfn edilmək haramdır".[185] İbn Qeyyim Σ "Nuniyyədə" deyir: "Peyğəmbərin ρ duasına Allah cavab verdi və onun qəbri ibadət olunan yerə çevrilmədi. Onun qəbri üç qat divarla qorundu və heç birində də içəri

---

[179] əl-Buxari, Muslim, İbn Həcər "Fəthul-Bəri" 65/ 90/ b.

[180] əl-Buxari 2/ 422, Muslim, Əbu Davud 2/ 71, Əhməd 2/ 284, 366, 453, 518.

[181] əl-Buxari 4443, Muslim 529.

[182] Aişənin O sözləri açıq bir şəkildə Peyğəmbərin ρ evində dəfn edilməsinin səbəbini ortaya qoyur. Bu da irəlidə qəbir üzərində məscid tikən kimsələrin önündə yolu bağlamaqdır. Məqsəd Peyğəmbərin ρ qəbrini məscid etməmək idi. Aişə O deyir: "Səhabələr Peyğəmbərin ρ harada dəfn edilməsi barəsində ixtilaf etdilər". Biri: "Onu namaz qıldığı yerdə dəfn edək"- dedi. Əbu Bəkr ψ: "Onu ibadət edilən bir büt halına gətirməkdən Allaha sığınırıq"- dedi. Digərləri: "Onu mühacir qardaşlarımızın yanında Bəqidə dəfn edək"- dedi. Əbu Bəkr ψ: "Biz Peyğəmbərin ρ qəbrinin Bəqidə olmasından narahat olarıq. İnsanlar bu vaxt onun Allah qatında məqamına sığınaraq dua edərlər"- dedi. Halbuki, Allahın haqqı Peyğəmbərin ρ haqqının üstündədir. Əgər onu çolə çıxarsaq Allahın haqqını zay etmiş olarıq. Əgər ona verdiyimiz sözü yerinə yetirməsək Peyğəmbərin ρ qəbrinə də xəyanət etmiş olarıq"- dedi. Səhabələr: "Bəs onda nə edək, ya Əbu Bəkr?"- dedilər. O: "Peyğəmbərlər öldükləri yerdə dəfn edilirlər"- dedi. Bundan sonra: "Sən sözü qəbul edilən və hörmət edilən birisisən"- dedilər. Sonra yatağının yanında bir çizgi çəkdilər. Əli, Abbas, Fadl və ailə xalqı M onu götürdülər. Digərləri isə yatağının olduğu yerdə məzar qazmağa başladılar". ***Fayda -*** burada bir məsələ də vardır ki, Peyğəmbərin ρ evində dəfn edilməsi başqalarının da evində dəfn edilməsi üçün dəlil deyildir. Çünki, dəfn qəbristanlıqda edilməlidir. İbn Urva "Qavakibud-Dərar" adlı əsərində 88/ 1 təfsir 548-də deyir: "Müsəlmanların qəbristanlıqda dəfn edilməsi Əbu Abdullah (İmam Əhməd) tərəfindən evlərində dəfn edilməsindən daha bəyənilən bir xüsusdur. Çünki ölən kimsənin həyatda qalan mirasçıları olan kimsələrə daha az zərər verər və qəbristan axirət məskənlərinə daha çox bənzəyər. Burada dəfn edilənlər üçün daha çox dua edilir. Səhabələr, tabiinlər və onlardan sonra gələnlər də qəbristanlıqda dəfn edilmişlər".

[183] əl-Buxari 1/ 422, 6/ 386, 8/ 116, Muslim 2/ 67, ən-Nəsai 1/ 115, Əhməd 1/ 218, 6/ 34, 229, 275, əd-Dərimi 1/ 326.

[184] Əhməd 1691, 1694, ət-Tahavi "Müşkilul Əsar" 4/ 13, əl-Heysəmi "Məcmuuz-Zəvaid" 5/ 325.

[185] əl-Munəvi "Fəyzul-Qadir" 5/ 274.

daxil olmaq üçün qapı yoxdu. Mümkün deyil daxil olmaq, qəbirə sürtünmək. İndi isə dəmir hasar ilə də örtüblər".

Müxaliflər deyirlər: "O məscid ki, orada qəbir vardır, orada edilən ibadət qəbir olmayan məsciddə edilən ibadətdən əfzəldir. Vallahi! Kim qəbir olan məscidə gedərək Allaha dua etməsə, Allahdan istəməsə iman etmiş olmaz, müsəlman olmaz". ***Subhənəllah!*** Nə Peyğəmbər ρ bu barədə danışmış, nə səhabələrinə bunu öyrətmiş, nə də səhabələr belə bir şeyi etmişlər. Görəsən, bu müxaliflər bütün bunları haradan götürüblər? Əgər bu əməl məşhur bir iş olsaydı heç olmasa alimlər bu barədə danışardılar. Vallahi, heç fiqh kitablarında bu barədə danışılmayıb. Səhih və Sünən kitablarında Cənazə bölümü açılıb. Cənazəni yumaq, kəfənləmək, namazını qılmaq, dəfn mərasimi necə olmalıdır bu barədə danışılmış, lakin bu sufilərin qəbirləri ucaltmaq, orada ibadətgah tikmək, belə yerlərə səfərlər etmək barəsində heç bir hədis və fiqh kitablarında danışılmamışdır. Belə bir şeylər mühüm məsələ olsaydı alimlər bu barədə danışardılar. Lakin əksinə bunun qadağan olunması barəsində danışıblar. Müxaliflər bu yerlərdə dəfn olunan salehlər barəsində, onların kəraməti, möcüzələri barəsində bir çox hekayələr danışırlar. Məqsədləri isə Allahdan qeyri ibadət olunan yerlərə insanları cəlb etməkdir. ***Subhənəllah!*** Deyirlər ki: "Bütün Avropa ölkələrini gəzdim, lakin heç bir yerdə dərdimə şəfa tapmadım. Bir gün bura gəlməklə sağaldım". ***Allahu Əkbər!*** Onda, görəsən bu qədər xəstəxanalar nəyə lazımdır? Onlar öz əməllərini tövhid sayırlar. Kimsə onlara bu əməllərini qadağan etdiyi zaman onu başa düşməməzlikdə, hörmətsizlikdə ittiham edirlər. İnsanları Tövhidə dəvət edirsən, deyirlər ki: "Vəhhabisən", insanları Cihadı Sünnə ilə etməyə dəvət edirsən, deyirlər ki: "Cihadı inkar edirsən", Zikri Sünnə ilə etməyə dəvət edirsən deyirlər ki: "Zikri inkar edirsən". Onları Uca və Böyük olan Allaha dəvət etdiyi zaman, onlar insanları Cəhənnəmə çağırırlar. Vallahi, insanları Tövhidə dəvət edən, şirkdən çəkindirən kimsə yer üzündə ən gözəl kimsədir.

Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Evlərinizi qəbir yerinə, qəbrimi də bayram yerinə çevirməyin. Mənim üçün Allahdan xeyir-dua istəyin (salavat). Harda olsanız sizin xeyir-duanız (salavatınız) mənə çatar".[186] Əli ibn Huseyn Σ rəvayət edir ki, bir nəfər Peyğəmbərin ρ qəbrinin yanına gələrək dua etməyə başladı. Əli ibn Huseyn Σ onu çağırıb dedi: "Mən sənə atamdan eşitdiyim, onun da Peyğəmbərdən ρ eşitdiyi bir hədisi danışacağam: "Qəbrimi bayram yerinə, evlərinizi də qəbir yerinə çevirməyin. Mənə salavat göndərin. Harada olsanız sizin salavatınız mənə çatacaqdır".[187] Qəbri bütün qəbirlərin ən üstünü və ən fəzilətlisi olduğu halda bayram yerinə çevrilməsi Peyğəmbər ρ tərəfindən qadağan edilirsə, digərləri üçün bu daha da mühümdür. Qəbristanlıqları bayram yerləri etmək İslamdan əvvəl edilən

---

[186] Əbu Davud 2042, Əhməd 2/ 367, İsmayıl əl-Qazi "Fadl əs-Salət alən Nəbi" səh. 20, əl-Albani səhih demişdir.

[187] Əbu Yala 465, əl-Buxari "Tarixul-Kəbir" 1, 2/ 186, İsmayıl əl-Qazi "Fadlus-Salət alən-Nəbi" səh. 30.

bayramlardandır. Hər il müəyyən vaxtlarda qəbirləri ziyarət edib oralarda ibadət edərdilər. İslamın gəlməsilə bunlar qadağan edildi. İbn Teymiyyə Σ deyir ki: "Mən bu əməli icazə verən heç kəsi tanımıram. Çünki, bu təntənələr keçirməyin bir növüdür. Əksinə hədis onu göstərir ki, Peyğəmbərin ρ məscidində namaz qılmağa gedərkən onun məzarını salamlamaq üçün ziyarət etmək şəriətə görə qadağan edilmişdir. Səhabələr və onların davamçıları Peyğəmbərin ρ məscidini ziyarət edir, namaz qılıb qurtardıqda ya oturar, ya da çıxardılar. Onlar onun məzarını salamlamaq üçün ziyarət etməzdilər. Çünki bilirdilər ki, onun üçün salavat gətirmək daha yaxşıdır". ***"Allahın elçisini öz aranızda bir-birinizi çağırdığınız kimi çağırmayın".*** *(ən-Nur 63).* Peyğəmbər ρ buyurdu: "Kim mənə bir dəfə salavat gətirərsə, Allah ona on dəfə salavat deyər".[188] Peyğəmbər ρ buyurdu: "Qəbrimi bayram edilən yerə çevirməyin. Mənə salavat gətirin. Harda olsanız sizin salavatınız mənə çatacaqdır".[189] Peyğəmbər ρ buyurdu: "Həqiqətən də yer üzündə Allahın mələkləri vardır ki, mənim ümmətimin mənə göndərdikləri salavatı mənə çatdırırlar".[190] Peyğəmbər ρ buyurdu: "Mənə salavat deyəndə Allah mənə ruh verir ki, mən də o, kimsəyə salam deyim".[191] Peyğəmbər ρ buyurdu: "Ya Əli! Ən xəsis insan bilirsənmi kimdir?" Əli ψ dedi: "Allah və Onun Rəsulu daha gözəl bilir". Peyğəmbər ρ buyurdu: "Mənim adım çəkiləndə mənə salavat gətirməyən kimsədir".[192] Ənəs ψ rəvayət edir ki, Peyğəmbər ρ bir gün minbərə çıxdı və buyurdu: "Amin! Amin! Amin!" Səhabələr: "Bu nədir, ya Rəsulullah!"- deyə soruşdular. Peyğəmbər ρ buyurdu: "Cəbrail mənim yanıma gələrək dedi: "Sənin adın çəkildiyi vaxt sənə salavat gətirməyənin burnu yerlə sürtünsün…".[193] Bununla da aydın oldu ki, salam və salavat ona istənilən yerdən çatır. Salavatınızın Peyğəmbərin ρ qəbrinə çatması uzaq və yaxın olmanıza görə deyildir. Bir şeyi də yadda saxlamaq lazımdır ki, salavat yalnız Peyğəmbər ρ üçündür.[194]

Peyğəmbər ρ buyurdu: "Evlərinizi qəbir yerinə çevirməyin…"- sözünü zikr etmişdir ki, bu da nafilə ibadətlərə aiddir. Onların evlərdə qılınması daha uyğundur və beləliklə də qəbir yerinə bənzəməsin deyə bir əmirdir. Digər tərəfdən də qəbir yerlərində ibadət etməkdən də çəkindirir. İbn Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Namazlarınızın bir qismini evlərinizdə qılın. Evlərinizi qəbristanlığa çevirməyin".[195] Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Evlərinizi

---

188 Muslim.
189 Əbu Davud, Əhməd.
190 ən-Nəsai.
191 Əbu Davud.
192 ət-Tirmizi.
193 əl-Buxari, Muslim.
194 Salavatın bir neçə forması varid olmuşdur ki, bunlardan: "Allahım! İbrahimə və İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi, Muhəmmədə və Muhəmmədin ailəsinə də xeyir-dua ver! Şübhəsiz ki, Sən tərifəlayiqsən, Sən şöhrətlisən! (Başqa rəvayətdə: Allahın! İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi, Muhəmmədə, onun zövcələrinə və nəslinə (Əhli Beytinə) də xeyir-dua ver!)" əl-Buxari "Fəthul Bəri" 6/407, Muslim 1/306.
195 Muslim 777.

qəbristanlığa çevirməyin. Şübhəsiz ki, şeytan Bəqərə surəsi oxunan evdən qaçar".[196] Zeyd ibn Sabit ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Ey insanlar evlərinizdə namaz qılın. Çünki, fərz namazlarından sonra ən fəzilətli namaz bir kimsənin evində qıldığı namazıdır".[197] Cabir ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Sizdən biriniz namazını məsciddə qıldıqdan sonra namazlarından bir hissəsini evi üçün ayırsın. Çünki, Allah namazı səbəbilə evində xeyir yaradır".[198]

## QƏBİRLƏRİ HƏR İL MÜƏYYƏN VAXTLARDA ZİYARƏT EDƏRƏK BAYRAM YERLƏRİNƏ ÇEVİRMƏYİN FƏSADLARI

Qəbri uzaqdan gördükdə həmin yeri yıxılaraq öpmələri, başlarını açaraq çığırmağa başlamaları, nə yaratmağa, nə də diriltməyə qüdrəti olmayandan imdad diləyərək fəryadla səslərini yüksəltmələri - bununla da həcc edən birindən daha çox savab qazandıqlarını düşünmələri bura daxildir. Həmçinin, qəbrə çatdıqda orada iki rükət namaz qılmaları, səcdə edərək ölüdən lütf və riza diləmələri, səslərini Allah üçün deyil, şeytan üçün yüksəltmələri, ehtiyacın götürülməsini, sıxıntıların qaldırılmasını, xəstəlikdən şəfa, yoxsulluqdan zənginlik, sonsuzluqdan övlad istənilməsi də bura daxildir. Yenə həmçinin, yanaqlarını qəbrin üzərinə qoyaraq kömək istəmələri, öpmələri, qəbirin ətrafını sürünərək təvaf etmələri, saçlarını kəsmələri, qurbanlarını və nəzirlərini vermələri sonda isə "Allah bizə də, sizə də bol savab versin!" – deyərək bir-birilərini təbrik, arxasını qəbirə tərəf çevirmədən oranı tərk etmələri bura daxildir.

Peyğəmbərin ρ qəbirlər haqqında sünnəsini araşdıran, onun bu mövzuda əmir və qadağalarını, səhabə və onlara ən gözəl bir şəkildə tabe olanların yolunu bilən və insanların bu gün etdiklərinin şahidi olan kimsə arada böyük ziddiyətin olduğunun şahidi ola bilər. Çünki, Peyğəmbər ρ qəbrin yanında namaz qılmağı qadağan etdiyi halda onlar qılırlar, qəbirləri məscid etməyi qadağan etdiyi halda onlar qəbir üzərində məscid tikirlər və ya ölünün vəsiyyəti ilə (və ya vəsiyyəti olmadan) onu orada (məscidin həyətində) dəfn edirlər. Qəbirlər üzərində şam (qəndil) yandırmağı qadağan etdiyi halda onlar yandırırlar, qəbirlərin yerlə bir edilməsini əmr etdiyi halda onlar müxalif olaraq yüksəldirlər, üzərinə yazı yazılmasını qadağan etdiyi halda üzərinə yazılar yazır (ayə, hədis, şer və s). Peyğəmbər ρ buyurdu: "(Ziyarət məqsədi ilə) yalnız üç məscid üçün səfərə çıxmaq olar. Məscidul-Həram (Məkkə), mənim məscidim (Mədinə) və əl-Əqsa məscidi (Qüds)".[199] Lakin Peyğəmbərin ρ bu əmrinə də müxalif olaraq istədikləri yeri ziyarət etmək məqsədilə səfər edirlər.

---

[196] Muslim 780.
[197] Muslim 731.
[198] Muslim 778.
[199] əl-Buxari 3/57, 1189, Muslim 1379, ən-Nəsai 3/ 114, Əhməd 6/ 7 və 397, Məlik 827.

Hər bir kəs bilməlidir ki, şirk zülmlərin zülmü, çirkin şeylərin ən çirkini və münkərlərin münkəri olduğundan Allahın pis və şiddətlə qarşıladığı işlərin başında gəlir. Buna görə də Allah şirk əhli üçün dünyada və axirətdə cəzalar qoymuş, şirki əsla bağışlamayacağını və müşriklərin də nəcis olduğunu bildirmişdir, qurban və digər kəsdiklərinin yeyilməsini haram etmiş, onlarla evlənməyi və onlarla dostluq etməyi qadağan etmiş, onları mələklər, Peyğəmbərlər və bütün möminlər üçün düşmən etmişdir; ***"İbrahim və onunla birlikdə olanlar*** *(möminlər)* ***sizin üçün gözəl örnəkdir. O, zaman onlar öz qövmünə belə demişlər: "Şübhəsiz ki, bizim sizinlə və sizin Allahdan başqa ibadət etdiklərinizlə heç bir əlaqəmiz yoxdur. Biz sizin dininizi inkar edirik. Siz bir olan Allaha iman gətirməyincə bizimlə sizin aranızda həmişə ədavət və nifrət olacaqdır!"*** *(əl-Mumtəhinə 4).* Peyğəmbər ρ buyurdu: "Uca və Böyük olan Allah İslamı qəbul etmiş müşrikin əməllərini, o, müşrikləri tərk edib müəlmanlara qoşulmayınca qəbul etməz".[200] Onların mal və qadınları Tövhid əhli üçün halal edilmişdir. Nə üçün şirk ən böyük zülmdür? Çünki, sən şirk qoşmaqla birbaşa Allahın haqqına girmiş olursan. Allahın Rububiyyət, Uluhiyyət haqqına girmiş olursan. Adi bu dünyada olan insanlar şərikliyi qəbul etmirlər. İstəmirlər ki, kimsə onlara mallarında, dövlətlərində, pullarında, hansısa bir ticarətdə şərik olsunlar. Bu şərikliyə tez özündən çıxır və qəzəblənirlər. Lakin Allaha özü kimi bir zəlil, aciz, ehtiyacı olanı şərik qoşur və bundan heç qəlbi də ağrımır və elə zənn edir ki, bu ona bağışlanacaqdır. Onlar Allah haqqında çox pis bir zənnə qapanıblar; ***"Allahı haqqı ilə təqdir etmədilər…".*** *(əl-Həcc 74).* Başqasını Allaha şərik qoşub sonra da: "Allaha qurban olum"- deyən, Ondan qorxduğunu söyləyən Allahı haqqı ilə tövhid etmiş olarmı?

Qəbirpərəstlər insanları haqq yoldan çıxartmaq, zəlalətə sürükləmək üçün bir çox əfsanələr də uydururlar ki, guya filankəs qəbrlərdən sıxıntıdan qurtarmaq üçün kömək istəmiş və o, sıxıntıdan qurtulmuşdur, filan kişi müsibətdən qurtarmaq üçün qəbr sahibinə dua etmiş və bu müsibətdən qurtarmışdı, kimsə neçə illər övlad azsusunda olmuş və qəbr sahibindən övlad istəmiş onun övladı olmuşdur və s. bu kimi hekayələr onlarda çox olur. İnsan nəfsi ehtiyaclarının ödənilməsi və sıxıntıların qaldırılması üçün çox düşkündür. Xüsusən də çox sıxıntı içərisində olan kimsə hər yola baş vurur. Çətinlikdə olan insana şeytan vəsvəsə verərək: "Görürəsn ki, neçə ildir ki, sənin övladın olmur. Lakin filankəs filan pirə gedən kimi övladı oldu" və ya "Görürsən ki, Allaha dua edirsən heç sağalmırsan, lakin filankəs filan pirə gedib orada dua edən kimi və ya (pir) üçün qurban kəsən kimi sağaldı"- deyərək insanların qəlblərinə şübhə salır. Aciz insanda şeytanın hiyləsinə aldanaraq dərhal Allahdan qeyrisinə ibadət olunan yerlərə meyl edir. Oraya gedərək aciz, sınmış, qırılmış, yazıq bir şəkildə, hər şeydən əli üzülmüş bir şəkildə qəbr sahibinə boyun əyərək dua edir.

[200] ən-Nəsai, əl-Albani "Səhih Silsilə" 3515.

Uca Allah I da Ondan uzaqlaşanı daha da uzaqlaşdırar. Necə ki, Allah Qurani-Kərimdə buyurur: ***"Hər kəs doğru yol ona bəlli olduqdan sonra Peyğəmbərə qarşı çıxsa və möminlərin yolundan başqa bir yolla getsə, onu üz tutduğu yola yönəldər və Cəhənnəmdə yandırarıq. Ora nə pis dönüş yeridir".*** *(ən-Nisa 115).* ***"Biz onları tovlayıb bilmədikləri bir yöndən tədricən əzaba sürükləyirik".*** *(əl-Qələm 44).* Buna görə də Allah pirə gedən, Allahdan qeyrisindən şəfa və digər şeylər uman insana istədiyini verir. Lakin Allahın şəfa və digər şeyləri verməsi o insan üçün bir imtahandır. Bu cahil, insan duasının qəbul olunmasında qəbrin rolu olduğunu zənn edir və bununla da zəlalətini artırır.

# QƏBRİSTANLIQDA QURAN OXUMAQ

əl-Albani Σ "Əhkəmul-Cənaiz" kitabında (səh. 241-242) deyir: "Qəbir ziyarəti əsnasında Quran oxumağa gəldikdə isə bu barədə nə Sünnədə, nə də şəriətimizdə heç bir dəlil varid olmamışdır. Əgər belə bir şey şəriətdə bildirilmiş olsaydı Peyğəmbər ρ bunu edər və səhabələrinə də bunu öyrədərdi. Peyğəmbərin ρ sevimli zövcəsi Aişə O ondan qəbristanlığı ziyarət etdikdə nə demək barəsində soruşduqda Peyğəmbər ρ ona qəbir əhlini salamlamağı və onlar üçün dua etməyi bildirmiş, lakin nə Fatihə surəsini oxumağı, nə də Qurandan hər hansı başqa bir surəni oxumağı ona tövsiyə etməmişdir. Əgər bu haqda Allah tərəfindən bir şey vəhy olunsaydı sössüz ki, Peyğəmbər ρ onu gizlətməyib bəyan edərdi". Dörd məzhəb və alimlərin cəminə görə qəbristanlıqda Quran oxumaq qadağandır. Necə olur ki, özlərini Hənəfi sayanlar Quran oxuyurlar. Halbuku, Əbu Hənifə Σ bunu qadağan edib. İmam Əhməddən Σ soruşurlar: "Qəbristanlıqda hansı ayəni oxuyaq". Şeyx deyir: "Mən belə bir ayə bilmirəm ki, orada oxunsun". Yenə də soruşurlar: "Bir kimsə Quranı götürür və qohumunu ziyarət üçün qəbristanlığa gedir ki, Quran oxusun". Şeyx deyir: "Bidətdir". Qəbristanlıqda Quran oxumaq bidətdir. İmam Şafii Σ deyir ki: "Ölülər onlar üçün oxunan Qurandan heç bir mükafat almırlar".[201] İbn Teymiyyə Σ deyir: "İmam Şafii Σ ölülər üzərində Quran oxumağı bidət sayardı".[202] İmam Məlik Σ deyir: "Mən bu əməli edən bir kimsə tanımıram. Məlumdur ki, Peyğəmbərin ρ səhabələri, saleh sələflərdən heç kəs bu əməli etməmişdir".[203] İbn Qeyyim Σ "Zədul-Məad" kitabında deyir: "Qəbirin ətrafında əyləşmək, qəbir sahibi ilə danışmaq, onun üçün Quran oxumaq, qəbirdə ona verilən suallara cavab olaraq ona verilən sualların cavablarını ona diqtə etmək və s. əməllər dinlə heç bir əlaqəsi olmayan bidətlərdir". Peyğəmbər ρ buyurdu: "Öz evlərinizi qəbiristanlığa çevirməyin! Şeytan Bəqərə surəsi

[201] Təfsir İbn Kəsir 4/ 258.
[202] "İqtida" 182.
[203] "əl-İhtiyaratul-İlmiyyə". 53.

oxunan evdən uzaqdır".[204] Bu hədis onu göstərir ki, qəbiristanlıqlar Quran oxumaq yeri deyildir. Buna görə də Peyğəmbər ρ insanları evlərində Quran oxumağa sövq etmiş və Quran oxunmayan evləri qəbristanlığa bənzətmişdir".

Məqil ibn Yəsər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Ölüm ayağında olan kimsələrin üzərində Yəsin surəsini oxuyun".[205] Bu hədis İslam alimləri tərəfindən zəif qəbul edilmişdir. Hətta səhih olsaydı da belə hədisdə Peyğəmbər ρ ölüm ayağında olan kimsələrin yanında Yəsin surəsinin oxunmasını əmr edir. Çünki, ölüm ayağında olan kimsələrin yanında xeyirli söhbətlər etmək, onlara ***Lə İləhə İlləllah*** kəliməsini təlqin etmək Peyğəmbərin ρ dilindən bizə səhih hədislər vasitəsilə çatmışdır. ***Həmçinin*** – "Qəbiristanlıq yanından keçən və ***Qul Huvəllahu Əhəd*** surəsini on bir dəfə oxuyub sonra da əcrini ölülərə bağışlayan kimsəyə ölülərin sayı qədər mükafat verilər"- şəkilində rəvayət edilən hədisə gəldikdə: Bu batil və uydurma bir hədisdir".[206] Çünki, Qurani-Kərim yalnız dirilərin onu oxuyub ibrət almarından ötrü nazil olmuşdur. Qəbrdə olanlara isə artıq biz haqqı eşitdirə bilmərik; "***Kor ilə görən eyni olmaz, zülmətlə nur da eyni olmaz, kölgə ilə isti də eyni olmaz, dirilərlə ölülər də eyni deyillər. Şübhəsiz ki, Allah dilədiyinə*** *(ayələrini)* ***eşitdirər. Sən isə*** *(Ya Peyğəmbər!)* ***qəbrlərdə olanlara*** *(haqqı)* ***eşitdirən deyilsən".*** *(Fatir 19-22).* Artıq dünyasını dəyişən kimsənin əməl dəftəri bağlanmışdır. Əgər o, bu dünyada onu yaradan Rəbbinə bir dəfə də olsun belə səcdə etməmişdirsə, onun üçün Qurani-Kərimdən istənilən surəni də oxusan ona heç bir köməyi olmayacaqdır. Ənəs ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Ölənin arxasıyca üç şey gedər. Ailəsi, malı və əməli. İkisi geri dönər. Biri isə onunla qalar. Ailəsi və malı geri dönər, əməli isə yanında qalar".[207]

# QƏBİRLƏRLƏ BAĞLI BƏZİ QADAĞALAR

***Həmçinin*** **-** Qəbirlər üzərində ibadətgah tikməyi, qəbristanlıqda və qəbirə doğru namaz qılmağı Peyğəmbər ρ qadağan edib. Əbu Səid əl-Xudri ψ rəvayət edir ki, Peyğəmbər ρ qəbirlərin üzərinə bina tikməyi, onların üzərinə oturmağı və ya onların üzərində namaz qılınmasını qadağan etmişdir".[208] Peyğəmbər ρ buyurdu: "Heç bir qəbirə doğru namaz qılmayın və heç bir qəbirin üzərində namaz qılmayın".[209] Ənəs ψ rəvayət edir ki, Peyğəmbər ρ qəbirlərə doğru namaz qılmağı qadağan etmişdir".[210] İbn Həcər Heytəmi Σ deyir: "Qəbrin məscid halına gətirilməsi - onun üzərində və ya ona

---

[204] Muslim 780.
[205] Əbu Davud 3121, ən-Nəsai, əl-Albani "Zəif hədislər" 5861, 5961, "Mişkət" 1622.
[206] Əbu Muhəmməd əl-Həllal "Qiraəti aləl Qubur" 201/2, Suyuti "Zeylul Əhədisil Movdua", əl-Albani "Uydurma".
[207] əl-Buxari 6514.
[208] Əbu Yala "Musnəd" 66/ b, əl-Heysəmi "Məcmauz-Zəvaid" 3/ 61.
[209] ət-Tabərani "Mucəmul-Kəbir" 3/ 145, 150, əl-Buxari "Tarixus-Sağir" 163.
[210] İbn Hibban 343.

doğru namaz qılmaq deməkdir".[211] Sənani Σ deyir: "Qəbirləri məscid halına gətirmək - onlara doğru namaz qılmaq, yaxud da onların üzərində namaz qılmaq mənasından da daha geniş mənaları əhatə edir".[212] Amr ibn Dinar ψ qəbirlər arasında namz qılmaq haqqında soruşulduqda rəvayət etdi ki, Peyğəmbər ρ buyurmuşdur: "İsrail oğulları peyğəmbərlərinin qəbirlərini məscid halına gətirmişdilər. Bu səbəblə də Allah onlara lənət etdi".[213] Peyğəmbər ρ buyurdu: "Qəbirlər üzərində oturmayın və onlara doğru namaz qılmayın".[214] Ənəs ψ rəvayət edir ki, mən bir gün qəbirin yanında namaz qılırdım. Ömər ψ məni gördü və dedi: "Qəbirdən uzaq dur! Qəbirdən uzaq dur!"[215] Cabir ψ rəvayət edir ki, Peyğəmbər ρ qəbirləri əhəngləməyi, üzərinə oturmağı və üzərinə bina tikməyi qadağan etmişdir.[216] Qəbirlər üzərində məscid tikilməsinin qadağan edilməsi - orada namaz qılmanın da qadağan edilməsini bu çərçivəyə daxil edir. Çünki, vasitənin qadağan edilməsi, onunla qəsd edilənə çatmaq istənilənin də qadağan edilməsini əhatə edir. Məs: Din içki satmağı qadağan etmişdirsə, onu içmək qadağanı da bu çərçivəyə daxildir.

***Qəbir Olan Məsciddə Namaz*** – İki yolla olur: **1)** Qəbir olur, sonradan üzərinə Məscid tikilir. **2)** Məscid olur, sonradan ölünü gətirib orada dəfn edirlər. Peyğəmbər ρ qəbirlər üzərində ibadətgah tikməyi qadağan edib. Həmçinin, qəbristanlıqda namaz qılmağı və qəbirə doğru namaz qılmağı da haram etmişdir. Kim bilə-bilə belə etsə namazı batildir və namzını yenidən qılmalıdır. Ona günah yazılır. Bu rəydə olanlar bunlardır: İbn Həzm, İbn Teymiyyə, İmam Əhməd, Şovkani, İbn Bəzz, Useymin, əl-Albani M. İmam Əbu Hənifə, İmam Şafii, İmam Məlik M deyirlər ki: "Namazı səhih olsa da belə günah qazanır". Kim ki, qəbir olan məsciddə namaz qılarsa qadağandır və qəbul deyildir. Məscidin istənilən tərəfində qəbir olarsa orada namaz qılmaq olmaz. İnsanlar isə belə şeylərə çox səhlənkar yanaşırlar. Belə yerləri bəzəyir, təmir edib abadlaşdırırlar. Bu isə şirkə aparan yoldur. Məscidi Allaha ibadət etmək üçün qəbir edən lənətlənmişdir. İbn Teymiyyə Σ deyir: "Müsəlman alimləri məzarlar üzərində məscidlər tikməyi qadağan ediblər. Məzarlara and verməyi, məzarlara hədiyyə aparmağı, pul verməyi, heyvan kəsməyi qadağan ediblər. Bütün bu əhdlər günahdır. Həmçinin də heç bir sələf alimi demir ki, məzarlarda namaz qılmaq, dua oxumaq, qurban kəsmək başqa yerlərdən daha yaxşıdır". İbn Teymiyyə Σ deyir: "Heç bir məsciddə ölünün dəfn edilməsi doğru deyildir. Əgər məscid dəfndən öncə salınıbsa ya qəbir yerlə bir edilir, ya da ölü oradan çıxardılaraq başqa yerə basdırılır. Məscid qəbirdən sonra inşa edilmişsə ya məscid ya da qəbir sökülür. Çünki, qəbir

---

[211] "Zəvacir" 1/ 121.

[212] "Sublus-Səlam" 1/ 214.

[213] Abdur-Razzaq 1591.

[214] Muslim 3/ 62, Əbu Davud 1/ 71, ən-Nəsai 1/124, ət-Tirmizi 2/ 154, əl-Beyhəqi 3/ 435, Əhməd 4/ 135.

[215] Əbu Həsən Dinəvəri, Emali Əbil-Həsən Qəzvinin məclislərindən bəzilərinin yer aldığı bir cuzdə səhih bir isnad ilə rəvayət etmişdir. əl-Buxari Muallaq olaraq "Fəthul-Bəri" 1/ 437, Abdur-Razzaq "Musənnəf" 1/ 404, 1581.

[216] Muslim 3/ 62, ət-Tirmizi 2/ 155, Əhməd 3/ 339 ,399.

üzərindəki məsciddə nə fərz, nə də nafilə namazlar qılınır. Bu qadağan edilmişdir".[217] Şeyx İbn Bəzz Σ deyir: "Məsciddə məzar varsa, məzar namaz qılanların arxasında, qarşısında, sağında və ya solunda olmasından aslı olmayaraq orada namaz qılmaq düzgün deyildir". İbn Bəzz Σ deyir: "İnsan bilsədə-bilməsədə belə namazı batildir". əl-Albani Σ deyir: "Başqa məscid ola-ola gedib qəbir olan məsciddə namaz qılarsa namazı batildir". Şeyx Useymin Σ deyir: "Əgər məscid qəbir üzərində tikilibsə bu məsciddə namaz qadağandır. Yox əgər əksinə olubsa namaz bu məsciddə səhihdir". Bu məscidi dağıtmaq lazımdır, əksi olarsa qəbir çxarılıb qəbristanlıqda dəfn edilməlidir. Əgər başqa yerdə qılmağa imkan yoxdursa onda zərurətdən orada qıla bilərsən və qəbir də səninlə qiblə arasında olmamalıdır".

Allahdan qeyrisinə ibadət edənlərə isə bu qədər yer üzü bəs etmir. Qəbirlərə, pirlərə gedərək önündə necə alçaldıqlarını, təmiz ürəkdən ibadət etdiklərini, boyun əydiklərini görə bilərsiniz. Heç Allahın evlərində bu cür ibadət etmirlər. Onların əksəriyyəti isə məzarların yanında etdikləri duaların və yalvarmalarının xeyrini gözləyirlər. Buna görə də Peyğəmbər ρ qəbristanlıqda namaz qılmağı qadağan etmişdir. Əbu Səid əl-Xudri ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Hamam (ayaq yolundan) və qəbristanlıqdan başqa yer üzü mənim üçün məscid edildi".[218] Cabir ibn Abdullah əl-Ənsari ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Məndən əvvəl heç bir kəsə (peyğəmbərə) verilməyən beş şey mənə verilmişdir; Yer üzü mənim üçün təmiz və məscid edildi. Buna görə də namaz vaxtı çatmış hər kim olursa-olsun olduğu yerdə namazını qıla bilər…".[219] Huzeyfə ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "İnsanlar üzərinə üç şeylə əmr olunduq; namazda səflərimiz mələklərin səfləri kimi edildi, bütün yer üzü bizə məscid qılındı və yerin torpağı su tapılmadıqda bizə təmizlik vasitəsi edildi".[220] Peyğəmbər ρ qəbristanlıqda namaz qılmağı onun murdarlığına görə deyil, şirkin murdarlığına görə qadağan etmişdir. Çünki, şirkə aparan yol əsasən məzarların yanında ibadət etməkdən başlayır. İmam Şafii Σ "əl-Umm" adlı əsərində (1/ 246) deyir: "Mən qəbir üzərində məscid tikilməsini və ya dülzəldilməmiş halda üzərində namaz qılınmasını, yaxud da qəbirə doğru namaz qılınmasını məkruh (haram) görürəm. Əgər bir kimsə qəbirə doğru namaz qılarsa namazını qılmış olur, lakin çox pis bir iş etmiş olur".[221] Şeyx Aliyul-Kari "Mirqatul-Məfatin Şərhu Mişkətul-Məsabih" (1/ 456) deyir: "Onlara lənət edilməsinin səbəbi, ya onların ucaltmaq üçün peyğəmbərlərin qəbirlərinə doğru səcdə etmələridir ki, bu isə

---

[217] Fətava 1/ 107, 192.

[218] Əhməd 3/ 83-96, Əbu Davud 492, ət-Tirmizi 317, İbn Məcə H. 745, əl-Albani "Səhihul-Cəmi" 2767.

[219] Muslim 521.

[220] Muslim 522.

[221] Burada məkruhdan qəsd edilən haramdır. Çünki: "Əgər bir kimsə qəbirə doğru namaz qılarsa namzını qılmış olur, lakin çox pis bir iş etmiş olur" sözü haram etdi mənasındadır. Quran üslubunda da pislik ***Seyyiə*** deməkdir. Allah uşaqlarınızı öldürməyi, zinaya yaxınlaşmağı, can almağı və s. şeyləri qadağan etdikdən sonra buyurur: ***"Bütün bunlar Rəbbinin dərgahında bəyənilməyən*** *(məkruh)**, pis şeylərdir".*** *(əl-İsra 23, 33, 36-38).*

açıq-aydın bir şirkdir, ya da onların uca Allah üçün namaz qılmağı peyğəmbərlərin dəfn edildikləri yerdə tikmələri və onların qəbirləri üzərində səcdə edib namaz qılarkən qəbirlərinə yönəlmələridir. Beləliklə onlar uca Allaha ibadət edərkən peyğəmbərləri ucaltmaqda həddi aşmış olurlar. Gizli şirk deyilən budur. Çünki, bunda Allahın izin vermədiyi şəkildə hər hansısa bir yaradılışa təzim vardır. Peyğəmbər ρ bunu ümmətinə ya Yəhudi adətlərinə bənzədiyinə görə, ya da gizli şirk olduğuna görə qadağan etmişdir".

***Həmçinin*** - Qəbristanlqda Cənazə Namazı Qılmaq Olarmı? İmam Əhməd Σ deyir: "Cənazə namazları xaric qəbirlər arasında namaz qılınmaz". Nəfi Σ deyir: "Aişə ilə Ummu Sələmənin O cənazə namazlarını Bəqinin ortasında qıldıq. O, gün İmam Əbu Hureyra ψ idi. İbn Ömər ψ da orada idi".[222] Ənəs ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Bir qəbir üzərinə (cənazə) namazı qıldı". Əbu Hureyra ψ rəvayət edir ki, bir zənci qadın məscidi süpürürdü. Bir gün Peyğəmbər ρ onu görmədi. "Nə oldu?"- deyə soruşdu. Səhabələr: "O, öldü"- deyə cavab verdilər. Peyğəmbər ρ buyurdu: "Mənə xəbər vermək lazım deyildi? Qəbrini mənə göstərin". Qəbir ona göstərildikdə o, da bu qadının qəbri üzərində (cənazə) namaz qıldı və dedi: "Bu qəbirlərin içi zülmətlə doludur. Allah qıldığım namazla oranı işıqlandırır". [223] Lakin bir qrup alimlər qəbristanlıqda cənazə namazını belə şirkə aparan yol olduğu üçün qılmağı qadağan etmişlər. əl-Albani Σ deyir: "Cənazə namazını qəbirlər arasında qılmaq caiz deyildir. Peyğəmbər ρ qəbirlər arasında cənazəyə namaz qılmağı qadağan etmişdir". [224] *Doğrusunu Allah Bilir!*

***Həmçinin*** - qəbirlərin əhənglənməsi, onların üzərlərinin yazılması, başqa yerdən torpaq gətirərək ora qatılmasını Peyğəmbər ρ qadağan etmişdir. Abdullah ibn Cabir ψ rəvayət edir ki, Peyğəmbər ρ qəbirləri əhəngləməyi, üzərinə yazılar yazmağı və torpaq əlavə etməyi qadağan etmişdir".[225]

***Həmçinin*** - qəbirlərin yerlə bir olması və ya zaman keçdikcə o, qəbirlərin itməsi. Buna görə də Peyğəmbər ρ Əlini ψ hündür, ucaldılmış qəbirləri dağıdaraq yerlə bir etməsini əmr etmişidr. Əbu Həyyac əl-Əsədi deyir ki, Əli ψ dedi: "Peyğəmbərin ρ məni göndərdiyilə səni göndərimmi? Silmədiyin bir surət, yerlə bir etmədiyin yüksəldilmiş bir qəbir qalmasın".[226] Sumamə ibn Şufeyy rəvayət edir ki, biz Fudalə ibn Ubeydin ψ rəhbərliyi altında Rum ərazisində Rodos adasında idik. Bir qardaşımız vəfat etdi. Bunun üzərinə Fudalə ibn Ubeyd onun dəfn edilməsini və qəbrinin

---

[222] İbn Rəcəb "Fəthul-Bəri", "Qavakibud-Dərari" 65/ 81/ 1-2, Abdur-Razzaq "Musənnəf" 1/ 407/ 1594.
[223] Muslim 956.
[224] əl-Albani "Cənazə Əhkamı".
[225] Əbu Davud 3226, ət-Tirmizi 1052, İbn Məcə 1563, əl-Albani "Səhihul-Cəmi" 6841-6843.
[226] Muslim 969, Əbu Davud 32184, ət-Tirmizi 1049.

dümdüz edilməsini əmr etdi. Qəbir yerlə bir edildi. Bunun ardından Fudalə ψ dedi: "Peyğəmbəri ρ qəbrin yerlə bir edilməsini əmr edərkən eşitdim".[227]

***Həmçinin*** - qəbirlər üzərində oturmaq, onlara ayaq basmaq, orada ehtiyacı ödəmək qadağan edilmişdir. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Sizdən birinizin bir od parçası üzərində oturaraq paltarını yandırması və odun dərisinə qədər çatması onun üçün bir qəbrin üzərinə oturmaqdan daha xeyirlidir". [228] Peyğəmbər ρ buyurdu: "Od parçasının və ya qılıncın üstündə yeriməyim və yaxud da ayaqqabılarımın ayağıma tikilməsi mənə bir müsəlmanın qəbri üstündə yeriməkdən daha sevimlidir". [229] Peyğəmbər ρ buyurdu: "Qəbrlərin arasında təbii ehtiyacını ödəyənlə bunu bazarın ortasında edənin ikisi də mənim üçün eynidir".[230] Bəşir ibn Xasasiyə ψ rəvayət edir ki, Peyğəmbər ψ qəbrlərin arasında ayaqqabı ilə gəzən bir şəxsi görərək buyurdu: "Ey dəri ayaqqabıların sahibi! Çıxart onları".[231] Aişə O rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Ölmüş insanın sümüklərini sındırmaq, eynilə diri insanın sümüklərini sındırmaq kimidir".[232]

***Həmçinin*** - Peyğəmbər ρ buyurdu: "(Ziyarət məqsədi ilə) Yalnız üç məscid üçün səfərə çıxmaq olar. Məscidul-Həram (Məkkə), mənim məscidim (Mədinə) və əl-Əqsa məscidi (Qüds)".[233] Üç məsciddən başqa yerlər üçün səyahətə çıxmaq şirkə düşmək səbəblərindəndir. Əbu Hureyra ψ Tur dağına getdiyi zaman Bəsrə ibn Əbu Bəsrə əl-Ğifari ilə qarşılaşdı. Bəsrə: "Haradan gəlirsən?"- deyə soruşdu. Əbu Hureyra: "Tur dağından"- deyə cavab verdi. Bəsrə: "Əgər ora çıxmamışdan qabaq səni görsəydim bunu etməyə imkan verməzdim. Çünki, Peyğəmbərin ρ belə buyurduğunu eşitdim: "Miniyə ancaq üç məscidə getmək üçün minilir…".[234] Bu üç yerdən başqa digər yerlərə getmək üçün nəzir etmək olmaz. Hətta Peyğəmbərin ρ qəbrini ziyarət etmək məqsədilə də çıxmaq olmaz. Lakin bu üç məscidə getməyi nəzir etmisənsə getməlisən. Əgər buna görə Mədinəyə gedilmirsə, Peyğəmbərin ρ qəbrini ziyarət etmək müstəhəbdir. [235] Təqiyuddin əs-Sabuni on dördə yaxın dəlil gətirir ki, Peyğəmbərin ρ qəbrini ziyarət etmək olar. Bu hədislərdən; Peyğəmbər ρ buyurdu: "Kim məni öləndən sonra ziyarət edərsə, sanki sağlığımda ziyarət etmiş kimidir (mən o, kimsəyə şəfaətçi olaram)". Lakin bütün hədislər ya zəif ya da uydurmadır. İbn Teymiyyə Σ deyir: "Alimlər bu hədislərin zəif olmasında itifaq ediblər. Nə sünən sahibləri, nə də alimlər bu hədislərin heç birini zikr etməyiblər". İmam Məlik Σ

---

[227] Muslim 968.
[228] Muslim 2/ 667.
[229] İbn Məcə 1/ 499, əl-Albani səhih demişdir.
[230] İbn Məcə 1/ 499, əl-Albani səhih demişdir.
[231] Səhuh Əbu Davud 3230, əl-Albani "Cənazə Əhkamları" səh. 173.
[232] Buluq əl-Məram 563.
[233] əl-Buxari 3/ 57, 1189, Muslim 1379, ən-Nəsai 3/ 114, Əhməd 6/ 7 və 397, Məlik 827.
[234] Məlik 1/ 109, Əhməd 6/ 7/ 397, əl-Albani "Səhih Sünən ən-Nəsai" 1/ 309.
[235] İbn Teymiyyə "Məcmuul-Fətava" 27/ 26.

yanında kim desəydi ki: "Mən Peyğəmbərin ρ qəbrini ziyarət etdim". Bu söz onun xoşuna gəlməzdi". Səhabələrdən heç kəs digər ölkələrdən Peyğəmbərin ρ qəbrini ziyarət məqsədilə gəlməzdilər. Əksinə Peyğəmbər ρ buyurdu: "Evlərinizi qəbir yerinə, qəbrimi də bayram yerinə çevirməyin. Mənim üçün Allahdan xeyir-dua istəyin (salavat). Harda olsanız sizin xeyir-duanız (salavatınız) mənə çatar". [236] ***Həmçinin*** **-** Peyğəmbərin ρ qəbrinə doğru duraraq dua etmək. Bu da şəriətimiz tərəfdən qadağan edilmişdir. Lakin qəbrinə doğru duraraq salam vermək icazəlidir. Lakin Əbu Hənifə Σ bunu da qadağan edərdi.[237]

***Həmçinin* - Ölülər Salamı Eşidirmi Və Ya Cavab Verirlərmi** – İbn Teymiyyə Σ deyir: "Bu məsələdə iki rəy vardır: **1)** Eşitmirlər, hətta salamı da; ***"Şübhəsiz ki, Allah istədiyinə haqqı eşitdirir. Sən isə qəbirlərdə olanlara eşitdirə bilməzsən".*** *(Fatir 22).* Peyğəmbərin ρ qəbristanlığa girərkən öyrətdiyi dua: ***"əs-Sələmu aleykum əhləd-diyəri minəl-muminiynə vəl-muslimiyn və innə inşəallahu bikum ləhiqunə və yərhəmullahul-mustəqdimiynə minnə vəl-mustə'xiriynə. Əsəlullahə lənə və ləkumul-afiyətə -*** Ey (bu) diyarın mömin və müsəlman sakinləri! Sizə salam olsun! Allah istəsə biz də sizə qovuşacağıq. Allah bizdən əvvəl gedənlərə və qalanlara rəhmət etsin! Allahdan özümüzə və sizə salamatlıq diləyirəm!"[238] **2)** Eşidirlər. Lakin bu o, demək deyil ki, onlar hər bir şeyi eşidirlər. Eşitsələr də belə cavab vermək iqtidarında deyillər; ***"...Əgər siz onlara dua etsəniz onlar sizin dualarınızı eşitməzlər. Eşitsələr də belə cavab verməzlər. Özləri də Qiyamət günü sizin şərik qoşduqlarınızı danacaqlar. Heç kəs sizə hər şeydən xəbərdar olan Allah kimi xəbər verə bilməz".*** *(Fatir 13-14).* Bəra ibn Azib ψ rəvayət edir ki, bir gün Peyğəmbər ρ ilə birlikdə ənsarlardan birini dəfn etmək üçün qəbristanlığa yollandıq. Biz qəbrə yaxınlaşdıq, oranı hələ də qazırdılar. Peyğəmbər ρ üzünü Məkkəyə tərəf çevirərək oturdu. Biz də onun yanında sükut içərisində oturduq. O, əlində olan çubuq ilə yerə bir neçə dəfə vurduqdan sonra başını səmaya qaldırıb iki və ya üç dəfə: "Qəbr əzabından qorunmaq üçün Allaha sığının!"- dedi və sözünə davam edərək: "...Mələklər nəfsi torpağa qaytardıqdan sonra qul yaxınlarının dönüb geri getdikləri zaman ayaq səslərini eşidir...".[239] Peyğəmbər ρ Bədr döyüşündə öldürülən kafirlərin cəsədləri üzərində duraraq buyurdu: "Biz həqiqətən də Rəbbimizin bizə vəd etdiyinin haqq olduğunu gördük. Bəs siz necə Rəbbinizin sizə vəd etdiyinin haqq olduğunu gördünüzmü?" Peyğəmbərin ρ arxasında dayanmış Ömər dedi: "Ey Allahın Rəsulu! Sən cansız cəsədlərəmi xitab edirsən?" Peyğəmbər ρ: "Muhəmmədin canı Əlində Olana and olsun ki, siz mənim dediklərimi onlardan daha yaxşı eşidə bilməzsiniz! Lakin onlar cavab verməyə qadir deyillər". Onlar sizdən pis eşitmirlər (indi, bu an). Alimlər deyir ki: "Eşitsələr də belə

---

[236] Əbu Davud 2042, Əhməd 2/ 367, əl-Albani səhih deyib.
[237] "Məcmuul-Fətava 27/ 79".
[238] Muslim 2/ 671.
[239] əl-Albani "Əhkəmul Cənaiz" s. 202, Əhməd 4/ 287, 295-296, Əbu Davud 4753.

sənə cavab verə bilməzlər. Həmçinin eşitsələr də Allah onlara müəyyən şeyləri eşitdirir. Sanki sən iflic olmuş bir kimsədən su istəyirsən. Səni eşitsədə sənə vermək iqtidarında deyildir. Həmçinin, adi insanlar bunu anlaya bilməzlər ki, o eşidir yoxsa eşitmir. Çünki, səhabələrə Peyğəmbər ρ xəbər vermişdi. Həmçinin eşitsələr də belə müxaliflərin dediyi kimi: "Evində oturub yüz-min kilometr məsafədən çağırsan eşidəcəklər". Bu artıq ölülərə Allahın sifətlərini verməkdir. Adi insan müəyyən məsafədən sonra eşitmir, qaldı ki, iki metr yerin dərinliyində olan çürümüş cəsəd. ***Həmçinin*** – müxtəlif dillərdə olan müraciətləri anlamazlar, bunları təsdiq etmək ki, onlar anlayırlar, bu artıq onlara ilahi keyfiyyətləri verməkdir". Peyğəmbərin ρ qəbri başında duraraq hər bir millət öz dilində ona müraciət edir, elə zənn edirlər ki, onları eşidir və başa düşür; ***"Qiyamət gününə qədər ona cavab verə bilməyən Allahdan qeyrisinə müraciət edəndən də artıq yolunu azmış kim ola bilər! Bunlar isə onların müraciətini eşidə bilməzlər. İnsanlar bir yerə toplandıqda bunlar onlara düşmən kəsiləcəklər, onların ibadətlərini inkar edəcəklər".*** *(əl-Əhqaf 5-6).* İnsan ölünü nə üçün çağırır? **1)** Etiqad edir ki, eşidir. **2)** Etiqad edir ki, onun istəyini (ruzi, övlad) verə bilər.

***Həmçinin*** – Qadınların qəbristanlıqları tez-tez ziyarət etmələri, orada şam yandırmaları qadağan edilmişdir. Əbu Səid ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Sizə qəbir ziyarətlərini qadağan etmişdim. İndi isə kim ziyarət etmək istəyirsə ziyarət etsin. Lakin çirkin söz söyləməsin".[240] əl-Albani Σ deyir: "Bunun içərisinə qadınlar da daxil olan ümumi icazədir. Müstəhəblik baxımından kişi və qadınlar da eynidir. Çünki, Peyğəmbərin ρ qadağan etməsi həm kişilərə, həm də qadınlara aid idi". Abdullah ibn Muleykə rəvayət edir ki: Aişə O bir gün qəbristanlıqdan gəlirdi". Mən: "Ey möminlərin anası, haradan gəlirsən?"- deyə soruşdum. O: "Qardaşım Abdur-Rahmən ibn Əbu Bəkrin qəbrini (ziyarətdən)"- dedi. Mən dedim: "Məgər Peyğəmbər ρ qəbirləri ziyarət etməyi qadağan etməmişdirmi?" O: "Bəli, sonra onları ziyarət etməyi əmr etdi"- dedi".[241] Aişə O rəvayət edir ki: "Sizə Peyğəmbərdən ρ və özümdən danışımmı?" Biz: "Bəli!"- dedik. AişəO: "Peyğəmbər ρ mənim növbəm olan gecə yanıma gəldi. Gələn kimi də ridasını yerə qoydu, ayaqqabılarını çıxarıb ayaqlarının yanında qoydu. İzarının bir tərəfini açıb döşəyin üstünə sərərək uzandı. Sonra mənim yuxuya gedəcəyimi zənn etdiyi ana qədər gözləyərək sakitcə libasını götürdü. Qapını yavaşca açaraq evdən çıxdı və onu sakitcə örtdü. Paltarımı başımdan keçirərək büründüm, izarımı da geyinib onun ardınca getdim. Nəhayət Peyğəmbər ρ Bəqi qəbristanlığına çataraq, ayaq üstə bir xeyli duraraq əllərini üç dəfə yuxarı qaldırdı. Sonra geriyə döndü və mən də döndüm. O, sürətlə gedirdi, mən də surəti artırdım. O, qaçmağa başladı, mən də qaçdım. Axırda mən ondan irəli keçib evə girdim. Mən yatana yaxın o da evə daxil oldu və: "Ey Aişə, nə olub tənginəfəssən?"- deyə soruşdu.

---

[240] Əhməd 3/ 38, əl-Heysəmi 3/ 57, ən-Nəsai 4/89.

[241] əl-Həkim 1/ 376, əl-Beyhəqi 4/ 78, əl-Albani "Cənazə".

Mən: "Bir şey olmayıb"- dedim. O: "Ya nə olduğunu mənə deyəcəksən, ya da Lütfkar, Xəbər verən Allah mənə onsuz da xəbər verəcəkdir"- deyə buyurdu. Mən: "Ey Allahın Rəsulu! Atam-anam sənə fəda olsun"- dedim və əhvalatı ona danışdım. O: "Önümdə gördüyüm insan qaraltısı sənmi idin?"- deyə soruşdu. "Bəli"- dedim. Buna görə də məni köksümdən bir dəfə itələdi və bu hərəkəti ilə məni sarsıtdı. Sonra: "Allah və Onun Peyğəmbərinin sənə zülm edəcəyinimi zənn etdin?"- deyə soruşdu. "Bəli"- dedim. Aişə O: "İnsanların gizlətdiyi hər şeyi Allah bilirmi?"- deyə soruşdum. O: "Bəli"- dedi".[242] Ənəs ibn Malik τ rəvayət edir ki, (bir dəfə) Peyğəmbər ρ bir qəbrin başında durub ağlayan qadının yanından keçərkən (ona) buyurdu ki: "Allahdan qorx və səbir et!" Qadın onun kim olduğunu bilməyib dedi: "Əl çək məndən! Mənim başıma gələn müsibət sənin başına gəlməyib." Qadına: "Bu, Peyğəmbər ρ idi"– dedilər. Bundan sonra o, Peyğəmbərin ρ qapısının yanına gəldi, lakin orada gözətçilərə rast gəlmədi. Qadın (üzrxahlıq edib): "Mən səni tanımamışam"– dedi. Peyğəmbər ρ buyurdu: "İlk sarsıntı anında səbir etmək lazım idi!"[243]

Şeyx əl-Albani Σ deyir: "Qadınların qəbirləri tez-tez ziyarət etmələri caiz deyildir. Çünki, bu onların fəryad etmək, mərsiyə demək və s. şəriətə zidd olan əməllərin edilməsinə gətirib çıxarır".

İbn Abbas ψ rəvayət edir ki, Peyğəmbər ρ qəbirləri ziyarət edən qadınlara, onları məscidlər edənlərə və şam yandıranlara lənət etmişdir".[244] Peyğəmbərin ρ, haqqında lənət oxuduğu şey böyük günahlardan sayılır. Əbu Muhəmməd Məqdisi Σ deyir: "Qəbirlərdə şam yandırmaq mübah olsaydı, Peyğəmbər ρ bunu edənə lənət etməzdi. Çünki, bu əməldə qəbirləri, bütləri ucaltma, təzim vardır. Həmçinin də malı zay etmək də vardır". Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ Qəbirləri tez-tez ziyarət edən qadınları lənətləyib".[245] Ummu Atiyyə O deyir: "Biz qadınlara cənazələri təqib etmək qadağan olundu. Cənazə arxasından getmək bizim üzərimizə fərz edilmədi".[246]

## QƏBİR ZİYARƏTİ VƏ ONUN FAYDALARI

***Qəbir Ziyarəti İki Növdür:***

**1.** Şəri ziyarət. Bu ziyarət Peyğəmbərin ρ izin verdiyi şəkildə edilən ziyarətdir. Bundan da gözlənilən məqsəd iki cürdür. **1)** Ziyarət edənə aiddir ki, bu da öyüd və

---

[242] Muslim 974/ 103, ən-Nəsai 3973, Əhməd 6/ 221, əl-Albani "Cənaiz" 231.
[243] əl-Buxari 1283, Muslim 926.
[244] ən-Nəsai 4/94-95, Əbu Davud 3236, ət-Tirmizi 320, İbn Məcə 1575, İbn Hibban 2169, əl-Hakim 1384, əl-Albani "Zəif" 225.
[245] Əhməd 2/337, ət-Tirmizi 1056, İbn Məcə 1576.
[246] Muslim 938.

ibrət almasıdır. **2)** Qəbirdəkilərə aiddir ki, bu da ziyarət edən kimsənin onlara salam verməsi və onlara dua etməsidir.

**2.** Bidət olan ziyarət. Bu da qəbirlərin yanında namaz qılmaq, onların ətrafında dolanmaq, qəbrləri öpmək, torpağını götürmək, şam yandırmaq, qəbir sahiblərindən kömək istəmək və s. bu kimi şəriətimizin qadağan etdiyi şeylərdir. Buna görə də ziyarətçi sünnəyə tabe olmalı və əmr ediləndən kənara çıxmamalıdır. Özünə və ölən kimsəyə yaxşılıq etdiyini düşünərək bu sərhəddi keçməməlidir. Bureydə ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Sizə qəbirləri ziyarət etməyi qadağan etmişdim. Artıq onları ziyarət edin…".[247] Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Anam üçün istiğfar diləməkdən ötrü Rəbbimdən izin istədim, mənə izin vermədi. Qəbrini ziyarət etmək üçün Rəbbimdən izin istədim, mənə izin verdi. Siz də qəbirləri ziyarət edin. Çünki, qəbir ziyarəti ölümü xatırladır".[248] Əbu Səid ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Sizə qəbir ziyarətlərini qadağan etmişdim. İndi isə kim ziyarət etmək istəyərsə ziyarət etsin. Lakin çirkin söz söyləməsin".[249] Peyğəmbər ρ qəbristanlığa girdikdə bu duanı edərdi: "Ey bu diyarın mömin və müsəlman sakinləri! Sizə salam olsun! Allah istəsə (İnşəallah) biz də sizə qovuşacağıq. (Allah bizdən əvvəl gedənlərə və qalanlara rəhmət etsin). Allahdan özümüzə və sizə salamatlıq diliyirəm".[250] Keçən hədislərdən də göründüyü kimi Peyğəmbərin ρ qəbristanlıqları ziyarət etməsində məqsədi həm ziyarət edənin özünə, həm də ölüyə bir yaxşılıq, xeyir olduğunu bildirməsidir. Ziyarət edənin özünə xeyir etməsi ölünün vəziyyətindən ibrət alması və axirəti xatırlamasıdır. Çünki, insanların dünya işlərinə başları qarışdığından (kimisi var-dövlət dalıyca qaçır, kimisi şan-şöhrət, kimisi vəzifə və s.) Allahı unudurlar. Allah, yalnız xəstəlik və ölüm anlarında yadlarına düşür. Buna görə də qəbirləri ziyarət etmək insana ölümü, axirəti xatırladır. Ağıllı insan bir az da olsa düşünür ki, bu gün mən kimisə çiynimdə daşıyaraq qəbir evinə yola salıram, sabah isə məni kimsə çiynində daşıyacaqdır. Özünü ölmüş insanın yerində düşünərək: "Görəsən o, gələn mələklərin suallarına cavab verə bildimi? Ondan soruşanda ki, "Rəbbin kimdir? Dinin nədir? Peyğəmbərin kimdir?"- suallarına "M… Bilmirəm"- deyərək mızıldanmadımı? Görəsən o, cavab verə bildimi? Qəbri Cənnət baxçalarından bir baxçamı oldu, yoxsa Cəhənnəm atəşindən bir çuxur?" Orada durduqca bunları düşünəcək və ibrət alacaqdır. Ölüyə xeyiri isə Allahdan onun üçün rəhmət, məğfirət və afiyət diləməkdir. Osman ibn Auf ψ rəvayət edir ki, Peyğəmbər ρ ölünü dəfn etdikdən sonra başı üstündə duraraq buyurardı: "Qardaşınız üçün Allahdan məğfirət və sabitlik diləyin, çünki o, bu an sorğu-sualdadır".[251] Sufyan əs-

[247] Muslim 977.

[248] Muslim 976.

[249] Əhməd 3/38, Heysəmi 3/57, ən-Nəsai 4/89.

[250] Muslim 2/671, İbn Məcə 1/494.

[251] Əbu Davud 3221, əl-Hakim 1/ 370, əl-Albani səhih demişdir.

Sauridən Σ edilən rəvayətdə deyilir: "Ölüdən “Rəbbin kimdir?”- deyə soruşulduqda, şeytan ona bir şəkildə görünərək və özünə işarə edərək: “Mən sənin Rəbbinəm” deyir”.[252] Peyğəmbər ρ buyurdu: "Allahım! Onu bağışla, ona rəhm et, ona salamatlıq ver, onu əfv et, onu gözəl tərzdə qarşıla, onun yerini geniş et! Onu su, qar və dolu ilə yu! Ağ paltarı kirdən təmizlədiyin kimi onu da günahlardan təmizlə! Ona evinin əvəzinə daha xeyirli ev ver, ailəsinin əvəzinə daha xeyirli ailə, zövcəsinin əvəzinə daha xeyirli zövcə ver! Onu Cənnətə daxil et! Onu qəbir əzabından qoru!"[253] Peyğəmbər ρ buyurdu: "Allahım! Dirimizi və ölümüzü, burada olanımız və olmayanımızı, kiçiyimizi və böyüyümüzü, kişimizi və qadınımızı bağışla! Allahım! Bizdən kimi öldürsən mömin kimi öldür! Allahım! Onun əcrindən bizi məhrum etmə və ondan sonra bizi azdırma!"[254]

## MÜXALİFLƏRİN GƏTİRDİYİ BƏZİ ŞÜBHƏLƏR VƏ ONLARA VERİLƏN CAVABLAR

Batil olan bir şeyi bir kimsə dəlil deyə irəli sürərsə mütləq Qurani-Kərimdə onu yox edən və dəyərsiz olduğunu sübut edən bir buyuruq vardır; *"(Ya Muhəmməd!)* ***Müşriklər sənin yanına gəlib elə bir misal çəkməzlər ki, Biz sənə onun doğru cavabını*** *(verməyək)* ***və*** *(onların gətirdikləri misallardan)* ***izahatca daha yaxşısını gətirməyək".*** *(əl-Furqan 33).* Yəni onlar səninlə mübahisə etmək və haqqı batilə qarışdırmaq üçün sənə bir dəlil gətirsələr, mütləq Biz sənə haqqı gətirər və daha gözəl açıqlama veririk. Buna görə də Qurani-Kərimdə Uca Allahın bu müşriklərin və başqalarının suallarına çox ətraflı cavab verdiyini görürük. Hətta batil olan bir şeyin lehinə Kitab və Sünnədən səhih bir dəlil gətirərsə, heç şübhəsiz ki, bu dəlil onun əleyhinədir. İbn Teymiyyə Σ "Dəru Təarudin-Naqli vəl-Aqli" adlı əsərinin müqəddiməsində deyir: "Bir bidətçi və ya batil bir əqidənin sahibi öz batilini sübut etmək üçün Kitab və Sünnədən bir dəlil irəli sürərsə, heç şübhəsiz ki, bu dəlil onun lehinə yox, əleyhinə olur".

Lakin burada diqqət ediləsi bir xüsus da vardır ki, o da: Bir kimsə qarşı tərəfin dəlilini bilmədən və o, dəlili çürütməyə, ona qarşılıq verməyə hazır olmadan heç bir kimsəylə mübahisəyə girişməməlidir. Çünki, kamil bir bilik sahibi olmadan belə bir mübahisəyə girişən kimsə Allahın istədiyi müstəsna olmaqla məğlub olar. Necə ki, düşmən ilə savaş meydanına silah və sürsatsız girdiyin kimi.

***Birinci Şübhə Və Cavabı -*** *"(Nəhayət əshabi-kəhf öldükdən sonra kafirlər)* ***dedilər: "Onların üstündə bir bina tikin. Rəbbi*** *(onların öldüyünü, yaxud yenidən yuxuya getdiyini və nəyə etiqad etdiyini)* ***daha yaxşı bilir. Əshəbi-Kəhf haqqındakı mübahisədə***

---

[252] Zəif əsər.

[253] Muslim 2/ 663.

[254] İbn Məcə 1/ 480, "Səhih İbn Məcə" 1/ 251.

***qalib gələnlər isə: Onların** (məzarı) **üstündə bir məscid tikəcəyik – dedilər".** (əl-Kəhf 21).* Bu şübhəyə cavabımız odur ki: Bizdən öncəkilərin şəriəti bir çox dəlillərlə sübut olunur ki, bizim şəriətimiz deyildir. Peyğəmbər ρ buyurdu: "Mənə daha öncə heç bir Peyğəmbərə verilməyən beş xüsusiyyət verilmişdir. Hər bir Peyğəmbər müəyyən bir qövmə göndərilib, mən isə hamıya göndərilmiş Peyğəmbərəm".[255] Əgər ayə qəbir üzərində məscid tikməyin caiz olduğunu, bizdən öncəkilərin şəriəti olduğunu bildirsə də belə, ayədəki hökmü götürməməliyik; ***"Onların** (məzarı) **üstündə bir məscid tikəcəyik"*** deyənlərin mömin olduqlarına dair bir dəlil yoxdur. İbn Cəririn Σ bunu söyləyənlər haqqında iki rəyi vardır: **1.** Bunlar onların arasında olan müsəlman kimsələrdir. **2.** Onların arasında olan müşriklərdir. Doğrusunu isə ən yaxşı bilən Allahdır.[256] Peyğəmbər ρ buyurdu: "Allah yəhudi və xristianlara lənət etsin. Çünki, onlar Peyğəmbərlərinin qəbirlərini ibadətgaha çeviriblər"[257] və s. bu qəbildən olan hədislər onu göstərir ki, bizim şəriətimizdə bu qadağan edilmişdir. Peyğəmbər ρ bu sözlərilə onların etdiklərindən bizi çəkindirir. Ömərin ψ dövründə İraqda Daniel Peyğəmbərin qəbri tapıldıqda, bunun xalqdan gizlədilməsini və qəbrin yanında tapılan bəzi döyüşlərin yazısı olan parçanın da basdırılmasını əmr etdiyi rəvayət edilir. Peyğəmbərin ρ məscidləri qəbirlərə çevirənlərə lənət etdiyini gördün. Əslində bu hədisdən bizdən öncəkilərin şəriətində də bunun qadağan edildiyi aydındır. Yoxsa Peyğəmbər ρ onların şəriətində bu icazəli olsaydı yəhudi və xristianları lənətləməzdi. Bu cür dəlil gətirmək din olaraq sadəcə Quranla kifayətlənən, sünnəyə zərrə qədər də dəyər verməyən kimsələrə məxsusdur. Peyğəmbər ρ buyurdu: "Bunu da bilin ki, mənə Quran və onunla birlikdə onun misli verilmişdir. Bunu da bilin ki, Allahın Rəsulunun haram etdiyi, Allahın haram etdiyi kimidir".[258] Necə ola bilər ki, Allah onları Peyğəmbərinin ρ diliylə lənətlədiyi halda, onların etdiklərini rədd etməsin. Bu ayəni dəlil gətirənlər, eynilə Süleymanın υ əmrinə verilən cinlərlə əlaqəli olan Allahın buyurduğu: ***"Onlar Süleyman üçün nə istəsə – məbəd, uca qəsrlər, heykəllər, böyük hovuzlara bənzər çanaqlar və yerindən tərpənməyən iri qazanlar düzəldirdilər".*** *(Səba 13)* - ayəsini heykəl və büt düzəltməyin caiz olduğuna dəlil gətirirlər. Heykəl və rəsm (surət) çəkməyi haram edən səhih hədislərin əksinə bu ayəni dəlil gətirirlər. Halbuki, Peyğəmbərin ρ hədislərinə inanan müsəlman bunu etməz.

***İkinci Şübhə Və Cavabı -*** Peyğəmbərin ρ qəbri günümüzdə görüldüyü kimi məscidində olmasıdır. Bu haram bir iş olsaydı orada dəfn edilməzdi. Buna cavab olaraq deyirik ki: Günümüzdə bu nə qədər belə görünsə də, səhabələrin dövründə bu belə deyildi. Çünki, Peyğəmbər ρ vəfat etdikdə səhabələr onu məscidinin yan tərəfində olan evində dəfn etdilər. Məscid ilə onun evini, arada qapısı olan divar

---

[255] əl-Buxari, Muslim.
[256] İbnul Covzi "Zədul Məsir" 5/123.
[257] əl-Buxari, Muslim.
[258] əl-Albani "Mişkət" 163.

ayırırdı. Peyğəmbər ρ sağlığında ikən bu qapıdan çıxıb məscidə gedərdi. Səhabələrin onu evində dəfn etmələrinə səbəb nə idi? Biz bunu yuxarıda Aişənin O hədisində də qeyd etdik ki, onlardan sonra kiminsə onun qəbrini məscid etməsinlər deyə belə etdilər. Bu mövzuda elm əhli arasında heç bir fikir ayrılığı yoxdur. Peyğəmbərin ρ dəfn edildiyi yer ilə Aişənin O qaldığı yerin arasını hörürlər. Əbu Bəkr ψ öldüyü zaman, o da Peyğəmbər ρ dəfn edildiyi otaqda dəfn edilir. Ömər ψ də öldüyü zaman Aişə O artıq öz evini tərk edir. Vəlid ibn Abdul-Məlikin dövründə məscid genişləndiyi zaman Peyğəmbərin ρ xanımlarına məxsus olan otaqlar sökülərək məscidə qatılır yalnız Aişənin O evindən başqa.[259] Sonra evi üç bucaq şəkilində daşla hörürlər. Artıq bu tikilidən öncə məsciddən iki divar ilə ayrılırdı. Sonuncu üçbucaq şəklində üçüncü divarı da hörürlər. Artıq heç kəs bundan sonra ora girə bilməzdi. İbn Qeyyim "Nuniyyədə" deyir: "Allah Peyğəmbərin ρ duasına cavab verdi və onun qəbri ibadət olunan yerə çevrilmədi. Qəbri üç qat divarla qorundu və heç birində də içəri daxil olmaq üçün qapı yoxdu. Daxil olmaq, qəbrə sürtünmək mümkün deyil. İndi isə dəmir hasar ilə də örtüblər". Ona görə də Peyğəmbərin ρ qəbri məsciddən deyildir. Müşriklərin etdiyində ya qəbrin üzərində məscid inşa edirlər, ya da məscid olur, sonra qəbri içinə salırlar. Lakin sual verək? Peyğəmbər ρ məsciddə dəfn olunub? Xeyr! Məscidi Peyğəmbərin ρ evi üzərində tikiblər? Xeyr!

Hafiz ibn Muhəmməd ibn Abdul-Hadi "Sərimul-Munki"də (səh. 136) deyir: "Artıq o vaxt səhabələrdən heç kəs yox idi. Ən son vəfat edən səhabə Cabir ibn Abdullah ψ olub ki, o da Abdul-Məlikin xilafəti dövründə vəfat etmişdir. Vəfat tarixi h. 78-ci, Vəlid isə h. 86-cı ilində xəlifə oldu, 96-çı ilində isə vəfat edib".[260] İbn Kəsir "Tarix"də (9/ 75) qeyd edir ki: "Söylənildiyinə görə Sad ibn Museyyib Aişənin O evinin, sanki o, qəbrin bir məscid edilməsindən qorxurmuş kimi məscidə qatılmasına qarşı çıxmışdı".

***Üçüncü Şübhə Və Cavabı -*** Peyğəmbərin ρ Hayf məscidində namaz qılmasıdır. Hədisdə bildirildiyinə görə orada yetmiş Peyğəmbərin qəbri vardır. ət-Təbərani "Mucəmul-Kəbir"də (3/ 204/ 2) deyir: "Bizə Abdan ibn Əhməd, İsa ibn Şazan, Əbu Həmməd ibn Dəlal, İbrahim ibn Tahman, o da Mənsurdan, o da Mucahiddən, o da İbn Ömərdən O mərfu olaraq rəvayət edir: "Hayf məscidində yetmiş Peyğəmbərin qəbri vardır". əl-Heysəmi "Məcma"da (3/ 298) rəvayət edir: "…Yetmiş Peyğəmbər basdırıldı". Cavab olaraq deyirik ki: Biz Peyğəmbərin ρ bu məsciddə namaz qılmasına şübhə etmirik. Şübhə edilən bu məqsciddə yetmiş Peyğəmbərin basdırılması məsələsidir ki, iki tərəfdən dəlil olmaz. **1)** Heç bir hədis alimi bu hədisə səhih

---

[259] İbn Cərir "Tarix" 5/ 222, İbn Kəsir "Tarix" 9/ 74-75.

[260] Bu məsələ ilə bağlı cahilcəsinə bir söz söyləyənlərdən biri: "Peyğəmbərin ρ məscidini Osman ψ genişlətdikdə bu məscidin içərisinə ondan olmayan şeyləri də saldı və üç qəbir də məscidin içərisində qaldı. Sələfdən heç bir kimsə isə bunu pis qarşılamadı". Cavab olaraq deyirik ki: "Osman ψ ona atılan bu böhtanın əksini etmişdir. O, Peyğəmbərin ρ məscidini genişlətdikdə ona işarə olunan hədislərə müxalif olmamışdır. Buna görə də məscidi Peyğəmbərin ρ xanımlarının evlərinin olduğu yerdən genişlətməmiş və bu evləri məscidə salmamışdır. Bu da ondan öncə Ömər ψ etdiyinin eynisidir". Belə bir kimsələr Sələfi Salihin əqidəsini bilmədiklərinə görə belə danışırlar.

hökmünü verməmişdir. Çünki, hədisin sənədində qərib hədisləri rəvayət edən ravilər vardır. Hədisin sənədində gələn İsa ibn Şazan qərib hədisləri rəvayət edəndir. İbn Hibban "Siqat"da (2/ 10) "qərib rəvayətlər edir"- demişdir. İbrahim ibn Tahman haqqında da İbn Ammar Məvsili demişdir: Hədisi zəif və muzdaribdir. əl-Albani Σ deyir: "Mən bu hədisin ravilərindən birinin qiraətində təhrifə düşərək "***Sallu***" (namaz qıldı) yerinə "***Qubra***" (basdırıldı) demiş olmasında şübhə edirəm. Çünki ət-Təbərani "Mucəmul-Kəbir"də (3/ 155/ 1) siqa (mötəbər, etibarlı) bir sənədlə rəvayət etmişdir: "Hayf məscidində yetmiş Peyğəmbər namaz qılmışdır…".[261] **2)** Hədisdə qəbirlərin Hayf məscidində görünməsinə açıq şəkildə işarə edən bir ifadə yoxdur. Əzraki "Tarihu Məkkə"də (səh. 406-410) Hayf məscidi haqqında bir neçə bölüm açmışdır. Heç birində orada olan qəbrlərin görünməsi haqqında xəbər verməmişdir. Bilinməlidir ki, şəriət də hökmləri zahirə görə verir. Sözü gedən məsciddə açıq, görünən qəbirlər olmadığına görə orada namaz qılmaqda heç bir xəta yoxdur. Çünki, orada olan qəbirlər yoxdur, görsənmirlər. Kimsə onların yerini tanımır. Hətta bu zəif hədis olmasaydı orada yetmiş qəbir olduğu heç kimsənin ağlına da belə gəlməzdi.

***Dördüncü Şübhə Və Cavabı -*** İsmailin υ və başqalarının qəbrinin Məscidul-Həramdakı Hicr adlanan yerdə olduğuna və oranın da namaz qılmaq üçün ən üstün yer sayılması. Cavab olaraq deyirik ki: Məscidul-Haramın məscidlərin ən üstünü və orada qılınan namazları yüz min namaz dəyərində olduğuna heç bir şübhə yoxdur. İsmailin υ və başqa Peyğəmbərlərin Məscidul-Haramda dəfn edildiklərinə dair bir səhih hədis belə yoxdur. Əksinə bu haqda rəvayət olunan hədislərin əksəriyyəti uydurma, zəif hədislərdir. Əzkəri "Əxbəru Məkkə"də (səh. 39, 219, 220) rəvayət etmişdir. Bu zəif rəvayətlərin də əksəriyətini bidətçilər götürərək qəbirlərə gedib orada ibadət etməyə dəlil gətirirlər. Şeys Aliyul-Kari "Mirqatul-Məfatih"də (1/ 456) deyir: "İsmailin υ qəbrinin şəkli Hisrdə, Hatim, Həcərul-Əsvədlə zəmzəm arasında yetmiş Peyğəmbərin qəbri vardır. Artıq bu qəbirlərin izləri qalmamışdır. Bunlar da dəlil gətirilməyə uyğun deyildir". Yuxarıda qeyd etdiyimiz kimi açıq görünən qəbirlər olmadığına görə heç bir problem yoxdur. Çünki, məlum olduğuna görə yerin özü həyatdakıların qəbridir; ***"Biz yeri dirilər və ölülər üçün toplanma yeri etmədikmi?"*** Şabi Σ deyir: "Yerin içi ölüləriniz, üstü isə diriləriniz üçündür".[262] Şair deyir: "Ey dostum! Bunlar hər tərəfi dolduran qəbirlərimizdir. Haradadır Ad qövmünün yaşadığı dönəmdəki qəbirlər. Yüngülcə ayağını bas yerə, mən yerin torpağının yalnız bu cəsədlərdən ibarət olduğunu zənn edirəm. Bacara bilirsənsə yavaş-yavaş havada yeri, qulların çürümüş sümüklərinin üzərindən basa-basa yerimə".

***Beşinci Şübhə Və Cavabı -*** İbn Abul-Bərr "əl-İtisab" adlı əsərində (4/ 21-23) rəvayət edir: "Əbu Cəndəl ibn Suheyl ibn Amr ψ Peyğəmbərin ρ dönəmində Əbu Bəsirin ψ

---

[261] Bu haqda geniş məlumat üçün bax: əl-Albani "İslamda qəbirçiliyin sakıncaları" hədis yayınları.
[262] əd-Dulabi 1/ 129.

qəbri üzərində bir məscid bina etmişdir". Bu hadisə Hudeybiyyə sülhü ərəfəsində baş vermişdir. Peyğəmbər ρ Mədinəyə gəldikdən sonra müsəlman olmuş qureyşli Əbu Bəsir (Utbə ibn Useyd əs-Səqafi) ψ onun yanına gəldi. Qureyş də onu qaytarmaq üçün iki nəfər göndərdi və onlar Peyğəmbərin ρ yanına gəlib: "Bizimlə bağladığın sülh müqaviləsinə görə Əbu Bəsiri ψ geri qaytarmalısan!"- deyə ona müraciət etdilər. O, Əbu Bəsiri ψ həmin iki kişiyə təhvil verdi. Onlar Əbu Bəsir ψ ilə Məkkəyə yola düşdülər və nəhayət gəlib Zul-Huleyfə adlanan yerə çatdılar. Burada onlar (xurcunlarındakı) xurmadan yemək üçün dayandılar. Əbu Bəsir ψ onlardan birinə (Xuneyn ibn Cabirə): "Ey filankəs, Allaha and olsun ki, sənin bu qılıncın çox gözəldir!"- dedi. Qılıncın sahibi onu qınından çıxardıb dedi: "Doğrudan da bu çox gözəl qılıncdır. Mən onu bir neçə dəfə təcrübədən keçirmişəm". Əbu Bəsir dedi: "Göstər görüm necə qılıncdır?" (Qılıncı ona göstərdikdə Əbu Bəsir ψ) fürsət tapıb qılıncı onun əlindən aldı və nəfəsi kəsilənə qədər qılıncla onu vurdu. O, birisi isə (Xuneysin mövlası) qaçıb Mədinəyə gəldi və tələsik məscidə daxil oldu. Peyğəmbər ρ onun vahimə içində yürüyə-yürüyə gəldiyini görüb: "Bu adam nədənsə qorxub!" deyə buyurdu. O, Peyğəmbərin ρ yanına gəlib dedi: "Allaha and olsun ki, yoldaşım öldürüldü! (Qorumasanız) Mən də öldürüləcəyəm!" Bu vaxt Əbu Bəsir ψ gəlib dedi: "Ey Allahın Rəsulu! Allaha and olsun ki, artıq O, sənə vədini yerinə yetirməyə yardım etdi və sən də məni müşriklərə təhvil verdin. Sonra isə Allah məni onların əlindən xilas etdi". Peyğəmbər ρ buyurdu: "Vay bunun anasının halına! Bu müharibə alovunu qızışdıran bir kimsədir. Əgər bir neçə nəfər də onunla həmrəy olsa (o, zaman müharibə alovu qızışacaq və sülh müqaviləsi pozulacaq)". Əbu Bəsir ψ bunu eşitdikdə onun yenidən müşriklərə qaytarılacağını başa düşdü və Mədinədən çıxıb dənizin sahilinə tərəf getdi. Sonra müşriklərdən canını qurtarmış Əbu Cəndəl ibn Suheyl ψ də gəlib ona qoşuldu. Daha sonra Məkkə müşriklərindən yaxa qurtaran hər bir müsülman ona qoşuldu və beləliklə də onlar qüvvətli bir dəstəyə çevrildilər. Vallahi onlar hər dəfə Qureyşin ticarət karvanının Şama yola düşdüyündən xəbər tutduqda, karvanın qabağını kəsər və onları öldürüb mallarını götürürdülər. Bu təhlükəni görən Qureyş öz tərəfindən bir nümayəndəni (Əbu Sufyan) Peyğəmbərin ρ yanına göndərdilər. Bu dəfə Qureyş Peyğəmbəri ρ Allaha and verib aralarında olan qohumluq əlaqələrinin hörmətinə görə (onların ticarət karvanlarını Əbu Bəsir ψ və onun cəmaatından qorumaq üçün) ona yalvardılar. Onlar Peyğəmbərə ρ: "Bundan sonra müsəlman olaraq Məkkədən hicrət etmiş hər bir şəxs əmin ola bilər ki, (geri gətirilməyəcəkdir)"- deyə xəbər göndərmişdilər. Peyğəmbər ρ səhabələrdən birini (bu xoş xəbəri çatdırmaq üçün) Əbu Bəsir və onun cəmaatının yanına göndərdi və Uca Allah bu ayəni nazil etdi: ***"Sizi onların üzərində qələbə çalmağa müvəffəq etdikdən sonra, Məkkə vadisində onların əlini sizdən, sizin də əlinizi onlardan çəkən Odur"-*** ayəsindən: ***"Kafirlər öz qəlbində təkəbbürlüyə – cahiliyyə lovğalığına qapıldıqları***

***zaman...".*** *(əl-Fəth 24-26).* Onalrın təkəbbür və təəssübü Hudeybiyyə müqaviləsinə *"Bismilləhir-Rahmənir-Rahim", "Muhəmmədən Rəsulullah*" sözlərini yazmaqdan imtina etmələri və həmin ili (hicrətin altıncı ilində) müsəlmanların Məkkəyə daxil olub Allahın evini ziyarət etməyə razılıq verməmələri idi.[263] Hədis əl-Buxari, Muslim və s. səhih və sünənlərdə: "Onun qəbri üzərində bir məscid bina etmişdir" cümləsi əlavə olunmadan rəvayət edilmişdir. Bu cümlə mudaldır, hətta münkər bir rəvayətdir.[264]

***Altinci Şübhə Və Cavabı -*** Qəlblərə şübhə salan bəziləri qeyd edirlər ki, qəbirlərin məscid halına gətirilməsində olan qadağa, ancaq qəbirdə olan kimsəyə görə fitnəyə (şirkə) düşmə qorxusuna bağlı bir şeydir. Artıq Tövhid möminlərin qəlblərində yerləşdiyinə görə bu fitnə ortadan qalxmışdır. Bu kimi şübhələr batil və əsli olmayan şübhələrdir. İbrahimdən υ sonra artıq kim əmin ola bilər. Nə qədər Tövhid əhli olsa da belə, heç kəs şirkə düşməyəcəyindən əmin ola bilməz. İbrahim υ dua edərək: ***"…Məni və övladlarımı bütlərə tapınmaqdan uzaq elə!"*** *(İbrahim 35).* Abdullah ibn Şurahbil ibn Həsən rəvayət edir: "Osmanın ψ qəbirləri dümdüz edilmə əmrini verdiyini gördüm. Ona: "Bu sənin qızın Ummu Əmrin qəbridir"- deyildi. O, yenə də onun düzəldilməsini əmr etdi".[265] Aliyyul-Kari "Mirqat"da (2/ 372) deyir: "Elm adamları "qəbrin bir qarış yüksəldilməsi müstəhəbdir". Əbu Burda ψ rəvayət edir ki, Əbu Musa ψ ölüm döşəyində ikən tövsiyə etdi: "Cənazəmi götürdükdə tez-tez yeriyin. Qəbrimə mənimlə torpağın arasına girəcək heç bir şey qoymayın. Qəbrimin üzərinə bina tikməyin. Ölümümə görə saçını qırxan, səsini yüksəldən və üst-başını cıran qadınlardan uzaq olduğuma sizi şahid tuturam". Yanında olanlar dedilər: "Bu haqda bir şeymi eşitdin?" O: "Bəli, Peyğəmbərdən ρ"- deyə cavab verdi".[266] Ənəs ψ qəbirlər arasında məscid tikilməsini məkruh (haram) görürdü.[267] Nəfi Σ rəvayət edir ki: "Ömər ψ bəzi kimsələrin altında beyət edilən ağaca gedib-gəldiklərini eşitdikdə o, ağacın kəsilməsini əmr etdi və ağac kəsildi".[268] Səhih odur ki, Nəfi Σ rəvayət edir: İbn Ömər ψ dedi: "(Hudeybiyyə sülhündən) sonrakı il təkrar oradan keçdikdə, altında beyət etdiyimiz ağacın hansı olduğu haqqında aramızdan iki nəfər də belə bir fikirə gələ bilmədi. Bu Allahın bir rəhməti idi". əl-Albani Σ deyir: "Artıq ağac onlar üçün gizli və tanınmaz hala gəlmişdi". Yenə əl-Buxaridə Səid ibn Museyyib atasından etdiyi rəvayəti gətirir ki: Tariq ibn Abdur-Rahman həccə getmək üçün yola çıxdı. "Yolda namaz qılan bir topluluqla rastlaşdım. Bu hansı məsciddir deyə soruşdum. Onlar: "Bu Peyğəmbərin ρ altında Ridvan beyəti etdiyi ağacdır"- dedilər. Səid ibn Museyybin yanına gələrək bunu ona danışdım. O, da gülərək: "Atam mənə

---

[263] əl-Buxari 2731, Muslim 1783.

[264] Bu haqda geniş məlumat üçün bax: əl-Albani "İslamda Qəbirçiliyin Sakıncaları" hədis yayınları.

[265] İbn Əbi Şeybə "Musənnəf" 4/ 138, Əbu Zura "Tarix" 66/ 2, 121/ 2.

[266] Əhməd 4/ 397.

[267] İbn Əbi Şeybə 2/185, Fəthul-Bəri 65/ 81/ 1 "əl-Kəvakib".

[268] İbn Əbi Şeybə (2/ 84/ 1) rəvayət etdi və ravilərin hər biri siqadır. Lakin Nəfi ilə Ömər ψ arasında kəsiklik vardır. Bu da hədisin zəif olduğunu göstərir.

Peyğəmbər ρ ilə bərabər ağac altında beyət edənlər arasında olduğunu, gələn il isə ora gəldikdə (beyət etdiyimiz ağacın hansı olduğunu) unutduq və onun hansı olduğunu tapa bilmədik"- deyə söylədi. (Başqa rəvayətdə: "Ağac bizə tanınmaz hala gəldi"). Səid: "Peyğəmbərin ρ səhabələri onu tanımadıqları halda sizmi tanıyacaqsınız? Siz mi daha yaxşı bilirsiniz?" deyə cavab verdi. İbn Ömərin ψ: "Bu Allah tərəfindən bir rəhmət oldu"- sözləri buna işarədir. O, ağacın onlar tərəfindən tanınmaması Allahın bir rəhməti idi".[269] əl-Albani Σ deyir: "On ilə əvvəl Uhud şəhidlərinin məzarlığının gün çıxan tərəfində divarın yanında gördüyüm bir ağac var idi. Ağacın üzərində bir çox bez parçalar bağlanmışdı. Sonra onu keçən il h. 1371, M. 1952-ci ildə həcc zamanı gördüm. Ağac kökündən kəsilmişdi. Allaha həmd olsun!"

İbn Ömər ψ Abdur-Rahmanın qəbri üzərində qurulmuş bir çadır gördü və dedi: "Ey uşaq! Bunu qaldır! Etdiyi əməl ona kölgə salar".[270] Əbu Hureyra ψ qəbrinin üzərinə çadır qurmamağı vəsiyyət etmişdir".[271] Muhəmməd ibn Kəb Σ deyir: "Bu qəbirlər üzərində olan çadırlar sonradan uydurulmuş şeylərdir". Səid ibn Museyyib Σ xəstələndiyi vaxt: "Öldüyüm zaman qəbrimin üzərinə çadır qurmayın".[272] Amr ibn Şurahbil Σ deyir: "Qəbrimi yüksəltməyin. Mühacirlərin bundan xoşlanmadıqlarını gördüm".[273] Muhammməd ibn İshaq "Məğazi"də rəvayət edir ki: Yunus ibn Bukeyr, Əbu Xalidə Xalidi ibn Dinar, Əbu Aliyəyə dedi: "Tustəri fəth etdiyimiz zaman Hurmuzun mal saxladığı evin başında yazı olan ölü bir bədənin uzanmış olduğu bir çarpayı tapdıq. Onu Ömər ibn Xattabın ψ yanına gətirdik. Kəbi çağırdı və o, yazını ərəbcəyə çevirdi. Mən ərəblərdən o, yazını oxuyan ilk insanam. Bu Daniel υ deyilən birisi idi. O, nə zaman ölmüşdür? dedim. Üç yüz ildir. Ondan dəyişən nədir. Başında bəzi saçlarından başqa heç bir şey dəyişilməmişdi. Belədir, çünkü Peyğəmbərlərin ətlərini torpaq çürütməz. İnsanlar ondan nə diləyərdilər? Göy üzü tutulduğu zaman onun cəsədini çıxararaq yağmur gözləyərdilər". Dedim: "Siz nə etdiniz?" Gündüz vaxtı bir-birindən ayrı on üç qəbir qazdıq, gecə olduqda isə onu birində dəfn etdik və qəbiri yerlə düz etdik ki, insanlar başa düşməyib sonradan gəlib qazmasınlar". Bu rəvayətdə mühacir və ənsarın etdiyinə bir baxın. Qəbri tapıb insanların bundan fitnəyə düşməsindən qorxaraq onu gizlətmək üçün nə qədər səy göstərirdilər. Günümüzdə qəbirləri ucaltmağa çağıranlar o, zaman bunları etsəydilər səhabələr onlarla qılıncları ilə vuruşardılar. Onları Allahdan qeyrisinə ibadət edənlər sayardılar. Qəbir başında dua etmək, namaz qılmaq bir sünnə, fəzilət və ya mübah bir əməl olsaydı bunu ən yaxşı bilən mühacir və ənsarlar olardılar və onlar da bunu özlərindən sonra gələnlərə bir sünnə olaraq qoyub gedərdilər. Onlar bu dini özlərindən sonra

---

[269] əl-Buxari "Cihad" 2958.

[270] əl-Buxari muallaq olaraq rəvayət edib 2/98.

[271] Abdur-Razzaq 3/418 N. 6129, İbn Əbi Şeybə 4/135, İbn Sad 4/338.

[272] İbn Sad 5/142.

[273] İbn Sad 6/108.

gələn zəlalət əhlindən daha yaxşı bilirdilər. Ətraflarında Peyğəmbərin ρ bir çox səhabələrinin qəbirləri olduğu halda onlardan heç biri bu Allaha daha yaxındır, bunun vasitəsilə Allaha yaxınlaşım deyə ora gedib əsla onlara dua etməmiş və onlardan yardım diləməmişdir. Bu haqda cüzi bir məlumat olsaydı belə bizə çatar və biz onu sizdən qabaq edərdik. Necə ola bilər ki, qəbir başında dua etmək və ya qəbir əhli vasitəsi ilə duada təvəssül etmək – bu qədər fəzilətli əməl olsun – sahabə, tabiin də bu cür fəzilətli əməldən bixəbər olsun. Ümmətin ən xeyirli üç dövrü: İbn Məsud ψ rəvayət edir ki, Peyğəmbərdən ρ: "Ümmətinin ən xeyirliləri kimlərdir?"- deyə soruşduqda, o buyurdu: "Mənim əsrimdəkilərdir. Sonra onları təqib edən (Tabiin) və yanə də onları təqib edən (Ətbəu Tabiin)"[274] - necə ola bilər ki, bu cür fəzilətdən cahil qalır, sonradan gələnlər isə elm və əməldə onları ötürlər. Hər bir xeyirdə yarışan, xeyirdə hər bir kəsdən irəli olan səhabələr, necə ola bilər ki, qəbir başında fəziləti bilə-bilə orada dua etməmələri əsla yaxşı qarşılanmaz. Deməli burada bir məsələ də ortaya çıxır ki, bu əməl nə məşhur bir əməldir, nə də haqqında bir izin vardır. Bu ancaq qəbirlərə ibadət edənlərin məşhur etdikləri bir əməldir. Allah bunu əmr etmədiyi kimi icazəli olması haqqında bir dəlil də endirməmişdir.

Marur ibn Suveyd Σ rəvayət edir ki, Ömər ψ ilə birlikdə Məkkə yolu üzərində sübh namazını qıldıq. Namzda Fil və Qureyş surələrini oxudu. Sonra insanları bir yerə gedərkən gördü və: "Bunlar hara belə gedirlər?"- deyə soruşdu. "Ey möminlərin əmiri! Peyğəmbərin ρ namaz qıldığı bir məscid var ora gedirlər"- deyildi. O dedi: "Sizdən öncəkilər də belə bir şeylə həlak oldular. Onlar Peyğəmbərlərinin izləri üzərinə düşərək oraları kilsə və məbədlər edərdilər. Bir namaz vaxtına yetişən namazını qılsın, başqa vaxtı isə keçib getsin və əhəmiyyət verməsin".[275] Səhabələr bu cür şeylərə qarşı da çıxırdılar. Əbu Vaqid əl-Leysi ψ rəvayət edir ki, Peyğəmbər ρ ilə birlikdə Məkkədən Huneynə tərəf yola çıxmışdıq. Biz, o vaxtlar təzə müsəlmanlardan idik və küfrdən yenicə çıxmışdıq. Müşriklərin üstündən silahlarını asdıqları böyük bir Sidr ağacı vardı. Onun ətrafında yığışaraq öz adət ən-ənələrini yerinə yetirir və o, ağacı "Zətu Ənvat" deyə çağırırdılar. Biz də bu böyük bir Sidr ağacının yanından keçdikdə: "Ey Allahı Rəsulu! Onların "Zətu Ənvatı" olduğu kimi bizim üçün də "Zətu Əənvat" düzəlt"- dedik. Peyğəmbər ρ dedi: "Allahu Əkbər! Şübhəsiz ki, bunlar hamısı keçmiş adət ən-ənələrdir. Nəfsim Əlində Olana and olsun ki, siz İsrail oğullarının Musadan istədikləri şeyin eynisini məndən istədiniz: ***"…Bizə onların sitayiş etdikləri bütlər kimi bir büt düzəlt!"*** *(əl-Əraf 138).* Həqiqətən siz əvvəlkilərin adət ən-ənəsi ilə gedəcəksiniz". [276] Ona ibadət edilməməsinə və ondan bir diləkdə olmamasına baxmayaraq sırf silah asmaq və altında ibadət etmək üçün bir ağac əkmək Allahdan

[274] Muslim 2533.
[275] İbn Əbi Şeybə 2/ 84/ 1, Abdur-Razzaq "Musənnəf" 2734.
[276] ət-Tirmizi 2180, Əhməd 5/ 218, əl-Albani səhih.

başqa bir ilah qəbul etmək sayılırsa, onda qəbirlərə ibadət etmək, orada dua etmək və qəbir əhlindən yardım istəmək nə sayılır? Allahın Rəsulunu ρ göndərdiyi ilə bu gün zəlalət və bidət əhlinin etdiklərini bilən bir kimsə onların arasında göylə yer arası qədər fərq olduğunu görə bilər.

***Yeddinci Şübhə Və Cavabı -*** Onlar deyirlər ki, bu ayələr bütlərə ibadət edənlər haqqında nazil olmuşdur. Siz saleh kimsələr haqqında nə cəsarətlə bütlər deyə cavab verirsiniz? Peyğəmbərləri nə cəsarətlə büt edirsiniz? Allahdan başqa ibadət olunan hər bir varlıq ona ibadət edən kimsənin məbudu və bütü olur. Yaxşı, bütlərə tapınan kimsə ilə Peyğəmbərlərə, övliyalara tapınan kimsə arasında fərq nədir? Çünki, bunlarn heç birisinin onlara ibadət edənlərə ən cüzi bir faydası da olmaz; ***"Ey iman gətirənlər! Şərab da, qumar da, bütlər də, fal oxları da şeytan əməlindən olan murdar bir şeydir. Bunlardan çəkinin ki, bəlkə nicat tapasınız".*** *(əl-Maidə 90).* ***Ənsab*** bütlər, ləfzi ***Nusub*** və ya ***Nasub*** kəliməsinin çoxluğudur və Allahdan başqa ibadət edilmək üçün ucaldılan hər bir şeyi əhatə edir. Bu bir ağac, bir daş, bir büt və ya bir qəbir də ola bilər. Bütlər Qurani-Kərimdə iki qismə bölünür: **1.** ***Ənsab*** – Forma və şəkili olan bütlərdir. Daş, ağac, şəkil, surət və s. Kitab Əhli olan yəhudi və xristianlar öz ibadət etdikləri ibadətgahları dəyişərək orada çoxlu surət, insan şəkilləri çəkməyə başladılar. İki qanadlı kişi və qadın, uşaq şəkilləri çəkməyə başladılar və dedilər ki, bunlar Peyğəmbərlər, mələklərdir. **2.** ***Əusən*** – Qurani-Kərimdə bütün adına deyilir. Lakin forma və şəkili olmayan bütlərə də Əusən deyilir. Kiminsə ruhu, kiminsə cəddi və s. Bu növ bütə Əusən deyilir. İbrahim υ öz qövmünə deyir ki: ***"Siz Allahdan qeyrisini özünüzə*** *(Əusən)* ***bütlər götürdünüz".*** Peyğəmbər ρ dua edərək deyərdi: "Ya Rəbbim! Mənim qəbrimi (Əusənə) ibadət olunan bütə döndərmə".

Bu sözləri söyləyən kimsə müşriklərin Rububiyyəti qəbul etdiyini, Uca Allahın hər şeyin Rəbbi, yaradıcısı və Maliki olduğunu qəbul etdiklərini bilir. Lakin müşriklər bu bütlərə onları Allaha daha çox yaxınlaşdırsınlar və onlara şəfaətçi olsunlar deyə ibadət edirdilər. Onlar o, bütə ibadət etmirdilər. O bütün timsalında saleh kimsəni nəzərdə tuturdular. Çünki, onlar üçün də o, büt deyil, nə vaxtsa yaşamış saleh bir kimsənin ruhu idi. Günümüzdə də qəbristanlığa gedərək qəbir sahibləri vasitəsilə Allaha yaxınlaşan: "Biz günahkar bəndələrik, onlar isə əməlisaleh insanlar olublar"- deyərək onların ruhları, Allah yanında olan məqamları vasitəsilə Allaha yaxınlaşan insanlar da eynilə o, müşriklərin etdikləri əməlləri və sözləri deyirlər. Bununla bərabər belə bir inanc onlara heç bir fayda vermədi; ***"Allahı qoyub özlərinə dost tutanlar: "Biz onlara bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!"- deyirlər.*** *(əz-Zumər 3).* ***"Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən bütlərə ibadət edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!"- deyirlər. De ki: "Allaha göylərdə və yerdə bilmədiyi bir şeyimi xəbər verirsiniz? Allah özünə şərik qoşulan bütlərdən uzaqdır və ucadır".*** *(Yunus 18).*

Belə bir sözləri işlədən kimsəyə sən də bu ayəni xatırlat: ***"Onların o, yalvardıqları da Rəblərinə hansı daha yaxın olacaq deyə yol axtarırlar".*** *(əl-İsra 57).* Beləliklə, müşriklərin bu şübhələrinə də cavab vermiş olduq. Belə bir bənzətmə doğru deyildir. Çünki, o müşriklər arasında vəlilərə və salehlərə ibadət edənlər də vardır. Onlar eyni şəkildə xristianların Məryəm oğlu Məsihə ibadət etdikləri kimi peyğəmbərlərə də ibadət edirdilər. Həmçinin, mələklərə də ibadət edənlər vardır; ***"O, gün onların hamısını həşr edəcək, sonra da mələklərə belə deyiləcək: Bunlarmı sizə ibadət edirdilər?*** *(Mələklər)* ***Sən pak və müqəddəssən. Bizim ixtiyar sahibimiz onlar deyil Sənsən! Xeyr,*** *(onlar bizə yox)* ***cinlərə*** *(şeytanlara)* ***ibadət edirdilər. Onların əksəriyyəti cinlərə iman gətirmişdilər – deyə cavab verəcəklər".*** *(Səbə 40-41).*

***Allahdan Qeyrisinə İbadət Edənlərin Gətirdikləri Üç Şübhə:*** **1.** Biz bütlərə ibadət etmirik, yalnız Allahın övliyalarına ibadət edirik. **2.** Biz ibadətdə onlara yönəlmirik, onları qəsd etmirik. Bizim məqsədimiz yalnız uca Allahdır. **3.** Biz onlara bizə fayda və zərər versinlər deyə ibadət etmirik. Fayda və zərər Allahın Əlindədir, onlar bizi ancaq Allaha yaxınlaşdırsınlar deyə, onların şəfaətinə nail olmaq üçün onlara yönəlirik. Biz Allaha şərik qoşmuruq.

Haqlarında Quran nazil olduğu müşriklər mələklərə, salehlərə, Lat və Uzzaya və başqa şeylərə ibadət etmirdilərmi? Sözsüz ki, bəli – deyiləcəkdir. Ona de ki: Müşriklərin həmin məxluqlara ibadətləri dua, qurban kəsmək, nəzir vermək, sığınmaq və buna bənzər ibadətlər deyildirmi? Çünki, onlar da Allahın qulları olduqlarını, Onun hakimiyyəti altında olduqlarını, işlərini səhmana salanın Allah olduğunu qəbul edirdilər. Bu varlılıqlara isə onların şəfaətini əldə etmək, onlarla Allaha yaxınlaşmaq üçün dua edib sığınırdılar.

Əgər bizə sual verilsə ki: Peyğəmbərə ρ şəfaət etmək verilmişdir. Mən də ondan Allahın verdiyindən istəyirəm? - ona belə cavab verərik; Allah Peyğəmbərə ρ şəfaəti vermişdir, lakin sənə də Allaha dua edərkən Ona şərik qoşmağı qadağan etmişdir; ***"Şübhəsiz ki, bütün məscidlər Allaha məxsusdur. Allahla yanaşı heç kəsə ibadət*** *(dua)* ***etməyin".*** *(əl-Cinn 18).* Allah Peyğəmbərə ρ şəfaət etmək əmrini verməklə yanaşı o ρ Allah izn vermədikcə şəfaət də etməz, Allahın razı olacağı kimsələrdən başqasına da şəfaət etməz. Müşrik olan bir kimsədən də əlbəttə ki, Allah razı olmaz və ona şəfaət də edilməz və sən də hardan biləsən ki, Allah səndən razıdır? ***"Onun razı olduğu kimsələrdən başqasına şəfaət etməzlər".*** *(əl-Ənbiya 28).*

Əgər o: "Mən Allaha şərik qoşmuram deyərsə, ona - yaxşı onda Allaha şərik qoşmaq nə deməkdir, bir məni başa sal? Allaha şərik qoşmaq bütlərə ibadət etməkdir deyərsə - onda ona de: Onda bütlərə ibadət etmək nə deməkdir (nə cür olur?), bunu da bir izah et? Əgər o kimsə Allahdan başqasına ibadət etmədiyini irəli sürərsə sən ona tək Allaha ibadət etmək nə mənasına gəlir - deyə soruş.

Çətin və müsibət anlarında insan Allahdan qeyri ibadət etdiklərini unudaraq Allaha dua edir və onu çağırır. ***“De: "Doğru danışanlarsınızsa, deyin görüm, əgər sizə Allahın əzabı gəlsə və ya həmin Saat sizi haqlayarsa, Allahdan başqasınımı çağıracaqsınız?" Xeyr! Siz yalnız Onu çağıracaqsınız. Əgər Allah istəsə, Ona uzaqlaşdırması haqqında yalvardığınız bəlanı aradan qaldırar və şərik qoşduğunuz şeyləri unudarsınız”.*** *(əl-Ənam 40-41).* ***"İnsana bir zərər toxunduqda tövbə edərək Rəbbinə yalvarar. Sonra Allah öz dərgahından ona bir nemət əta etsə, əvvəlcə kimə dua etmiş olduğunu unudar və*** *(xalqı)* ***Allahın yolundan çıxartmaq üçün Ona şəriklər qoşar. De ki: “Hələ küfrünlə bir müddət dövran sür. Şübhəsiz ki, sən Cəhənnəm əhlindənsən!"*** *(əz-Zumər 8).*

***Səkkizinci Şübhə Və Cavabı -*** Görürsən ki, biri on il Allahdan övlad itəyir. Ya Rəbbim, mənə övlad ver, Ya Rəbbim, mənə övlad ver. Lakin övladı olmur. Bundan sonra gedir hansısa pirdən istəyir və övladı olur. Övladın adını da qoyur pirverdi, pirqulu. Belə bir sual ortaya çıxır. Doğurdanmı ona övladı pir verdi? Cavab: on il verməyən və on birincı il verən də Allahın Özüdür. Allah hər bir bəndəsini imtahan edir; ***"İnsanlar yalnız iman gətirdik demələri ilə onlardan əl çəkib imtahan olunmayacaqlarınımı sanırlar? Biz onlardan əvvəlkiləri də imtahana çəkmişdik. Şübhəsiz ki, Allah düz danışanları da yalançıları da gözəl tanıyır".*** *(əl-Ənkəbut 2-3).* Kimə iman etdin? İlahın kimdir? Dində sabitsən? Yoxsa çətinliyə düşən kimi namazı tərk edirsən? O, kimsə dua edirdi. Onun duası eşidilirdi, yoxsa yox? Cavab olaraq deyirik ki: Allah zülmət bir gecədə, zülmət bir meşədə, qara daşın üzərində gəzən qara qarışqanın addımalını görür və ayaq səslərini eşidir. Yaxşı o, dua edənin on il etdiyi dua əbəs yerəmi idi? Xeyr, Eşidən və Görən yazırdı. Qulum Mənə dua etdi. Məndən övlad istəyirdi. Çünki, dua üç yerdən birinə gedər. Ya Allah onu qəbul edib cavab verər, ya dünyada ikən sənin başına gələcək bir bəlanı o dua vasitəsilə götürər, ya da duanı sənin lehinə axirətə saxlayar, bu dünyada isə itaətinə görə verər. Deməli dua əbəs yerə getmir. On il dua edən səbr etdikdən sonra ilahını dəyişir. Mənə belə Allah lazım deyil. O, mənə heç nə vermədi. Özünə başqa Rəbb seçərək: Ey filankəs! Mənə övlad ver və Allah da ona övlad verir. O da elə zənn edir ki, övladı Allah yox, məzh o qəbir sahibi vermişdir. Beləliklə də o, kimsə imtahandan çıxmış olmur və dünyasını da, axirətini də ziyana uğradanlardan olur; ***"İnsanlardan eləsi də vardır ki, Allaha şəkklə*** *(məqsədlə)* ***ibadət edərlər. Əgər ona bir xeyr toxunsa*** *(dini barəsində)* ***arxayın olar*** *(İslamdan möhkəm yapışar).* ***Yox əgər ona bir bəla, müsibət üz versə*** *(İslamdan üz döndərib)* ***yenə küfrə qayıdar. Beləsi dünyanı da əldən verər, axirəti də. Açıq-aşkar ziyan budur, bu! O, Allahı buraxıb özünə nə xeyir, nə də zərər verən bütlərə tapınır. Haqq yoldan azıb uzaq düşmək də budur! Özü də zərəri xeyrindən daha çox olana ibadət edər. O*** *(büt)* ***nə pis bir köməkçi, necə də pis bir yoldaşdır".*** *(əl-Həcc 11-13).* Qurani-Kərimdə qaydadır ki, ***Yəsəlunəkə*** – “soruşanda” sözü gəldikdə

***Qul*** – "de ki", sözü işlədilir. Məs: "***(****Ey Muhəmməd!)* ***Səndən qənimətlər barəsində soruşurlar. De ki: "Qənimətlər Allaha və Onun Peyğəmbərinə aiddir".*** *(ən-Ənfal 1).* ***"Səndən şərab və qumar haqqında soruşurlar. De ki:…".*** *(əl-Bəqərə 219). "(Ey Muhəmməd!)* ***Səndən heyz barəsində soruşurlar. De ki:…".*** *(əl-Bəqərə 222).* ***"Səndən yetimlər haqqında soruşurlar. De ki:…".*** *(əl-Bəqərə 220).* ***"Səndən nələrin halal olduğunu soruşurlar. De ki:…".*** *(əl-Maidə 4).* Lakin bu ayədə Allah istisna edərək Peyğəmbərə ρ gələn vəhydə "***De ki***" kəlməsini zikr etməmişdir. Ey Muhəmməd! Qullarım səndən mənim barəmdə soruşsalar mən onlara yaxınam. Ondan istəyənin duasını qəbul edərəm. Dua etmək üçün kiminsə qəbrinə, pirinə getmək lazım deyil; ***"Əgər bəndələrim səndən Mənim barəmdə soruşsalar Mən onlara yaxınam. Dua edən Məni çağırsa onun duasına cavab verərəm".*** *(əl-Bəqərə 185).* ***"Rəbbiniz buyurdu: "Mənə dua edin, mən də sizin dualarınızı qəbul edim!"*** *(əl-Mumin 60).* Allah demir ki, övliyaları çağırın, onlara dua edin və ya Mənim saleh bəndələrimdən kömək diləyin; ***"Müşriklər*** *(Allaha qoşduqları)* ***şəriklərini gördükdə: Ey Rəbbimiz! Bunlar bizim Səninlə yanaşı*** *(bizi Sənə yaxınlaşdırmaq məqsədilə)* ***ibadət etdiyimiz şəriklərimizdir – deyəcəklər. Bütlər də onlara: Siz yalançısınız!*** *(Biz sizi Allahı tərk edib bizə tapınmağa dəvət etməmişdik)* ***– deyə cavab verəcəklər".*** *(ən-Nəhl 86). "(Qiyamət günü)* ***hamı Allahın hüzurunda peyda olacaqdır. Zəiflər, acizlər*** *(iman gətirməyi)* ***özlərinə sığışdırmayan*** *(başçılarına)* ***deyəcəklər: "Biz sizə tabe idik. İndi Allahın əzabını, azacıq da olsa bizdən dəf edə bilərsinizmi?" Onlar belə cavab verəcəklər: "Əgər Allah bizə doğru yolu göstərsəydi, biz də sizə göstərərdik. İndi ağlayıb sızlasaq da, səbr etsək də, fərq etməz*** *(əzabdan xilas ola bilmərik).* ***Bizim üçün heç bir qurtuluş, heç bir sığınacaq yoxdur". İş bitdikdə*** *(Cənnətlilər Cənnətə, Cəhənnəmliklər Cəhənnəmə daxil olduqda)* ***Şeytan*** *(onu məzəmmət edən kafirlərə)* ***belə deyəcəkdir: Allah*** *(Peyğəmbərlər vasitəsilə)* ***sizə*** *(pis əməlləriniz görə Cəhənnəmə düşəcəyiniz barədə)* ***doğru vəd vermişdi. Mən də sizə vəd vermişdim. Amma sonra vədimə xilaf çıxdım. Əslində mənim sizin üzərinizdə heç bir hakimiyyətim yox idi. Lakin mən sizi*** *(günah etməyə, Allaha asi olmağa)* ***çağırdım, siz də mənə uydunuz. İndi məni yox, özünüzü qınayın. Nə mən sizin dadınıza çata bilərəm, nə də siz mənim dadıma. Mən öncə*** *(dünyada)* ***sizin məni Allaha şərik qoşmağınızı da inkar etmişdim. Həqiqətən zalimləri şiddətli bir əzab gözləyir".*** *(İbrahim 21-22).*

## QƏBİRPƏRƏSTLƏRİN AĞILLARINI BAŞLARINDAN ALAN ŞEY NƏDİR?

Tövhiddən üz çevirən bu sifəti istəsə də, istəməsə də belə müşrik və kafirdir. Sünnədən üz çevirən də yenə istəsə də, istəməsə də belə bidətçidir və zəlalət əhlidir. Səbəb: Allahın, Rəsulu ilə göndərdiyi həqiqətdən cahil olmalarıdır. Bütün bu cahil fikirlərin yaranmasına səbəb onların Allahın və Onun Rəsulunun ρ gətirdiklərinə arxa

çevirmələri, qıt, naqis ağıllarını işlətmələri, uydurma hədislərə, rəvayətlərə və heç bir əsası olmayan xalq hekayələrinə söykənmələridi. Həmçinin, “biz ata-babalarımızı bu cür görmüşük”, “filan şeyx, filan molla belə deyib”, xurafat və boş-boş sözlərə əsaslanmları və onları təqlid etmələridir. Qəbirpərəstlərin Rəsulullaha ρ iftira etdikləri uydurma hədislər də bu səbəblərdən biridir. "Hər bir şey sizə ağrı verdikdə qəbir əshabına sığının".[277] Qəbirpərəstlərin uydurduğu hekayələr ki, darlıq içində olan filankəs, filan kimsənin pirinə, ocağına getmiş və qurtulmuş və ya on il uşağı olmurdu, filankəsin pirinə getdikdən sonra uşağı olub və ya Sufyan əs-Səuri Σ deyir: "Dəməşq məscidində qılınan namaz otuz min namaza bərabərdi".[278]

Muhəmməd Cəmil Ziynu - *hafizahullah* - deyir: "Biz Peyğəmbərlərin möcüzələrini və övliyaların kəramətini inkar etmirik. Lakin biz onları Allaha şərik qoşulmasını, Allaha dua edildiyi kimi onlara da dua edilməsinə, onlara qurban və nəzir kəsilməsinə qarşı çıxırıq. Övliyaların qəbirlərinə o, qədər pul, qızıl sərf edildiyi halda elə kasıblar vardır ki, heç bir günlük yeməyi də yoxdur. Şair deyir ki: "Dirilərimizə bir dirhəm verilmir. Ölülərimizə isə miliyon sərf edilir". Allahdan qeyrisinə ibadət olunan yerlərin əksəriyyəti yalançılar və fırıldağçılar tərəfindən sərvət toplamaq məqsədilə tikilmiş yerlərdir. Buna iki misal çəkək: Tələbə yoldaşım mənə danışdı ki, bir sufi şeyxi evimizə gəlib anamdan yaşıl bayraq almaq üçün pul tələb etdi. Bu bayraq müəyyən bir küçədə vəli yaşayan evin nişanəsi olmalı idi. Anam ona pul verdi. O, yaşıl parça alıb bayraq düzəldir və onu divarınküncünə sancır. Camaata da car çəkir ki: "Burada Allahın övliyalarından biri olub. Mən onu yuxuda görmüşəm. (Mənə dedi ki, buranı ibadətgah et. İnsanlar burada şəfa tapacaqlar). Bu yolla sərvət tolamağa başlayır".

İki çox kasıb dost bir-birilə rastlaşır və hər ikisi də öz vəziyyətlərindən acı-acı danışırlar. Onlar eşidirlər ki, filan övliyanın qəbrinin üstünə insanlar axın-axın gələrək sərvət qoyurlar və belə qərara gəlirlər ki, bir vəli (övliya, seyyid) qəbri düzəltsinlər və bununla da pul qazansınlar. Dərə qazaraq bir eşşəyi tutub kəsərək onun içinə qoyurlar. Üstündə də bir qübbəli məzar düzəldirlər. Onların hər biri qəbir üstə oturaraq onu öpür, əl sürtür və gəlib gedənləri inandırmağa çalışırlar ki, bu filan övliyadır, sonsuz kəramət sahibidir. İstədiyinə şəfa, övlad və s. verir. Sözsüz ki, belə söhbətləri də şeytan camaat arasında tez yayır və insanlar da axışaraq bu ocağa, pirə gəlməyə başlayırlar. Ad da qoyurlar ki, filankəsin piri, filankəsin ocağı və s. ***"Allaha iftira yaxan, özünə heç bir vəhy olunmadığı halda mənə də vəhy olunmuşdur. Mən də Allahın nazil etdiyi kimi bir kitab endirəcəyəm deyən şəxsdən daha zalim kim ola bilər".*** *(əl-Ənam 93).* ***"Heç bir biliyi olmadan insanları azdırmaq üçün yalan uyduran***

[277] Uydurma bir hədisdir. İbn Teymiyyə "Təvəssül vəl-Vəsilə" s. 297.
[278] İbn Abidin "Əxbəru Duvəl" 1/ 41 zəif və uydurma.

***şəxsdən daha zalim kim ola bilər. Həqiqətən Allah zalimlər tayfasını düz yola yönəltməz".*** *(əl-Ənam 144).*

***Həmçinin*** **-** Muhəmməd ibn Dərvişi deyir ki: "Bir qrup kimsələr iddia edirlər ki, Livanda dağın ətəyində Nuhun υ qəbri vardır. Lakin məlumdur ki, bu söhbətlər 7-ci əsrdə üzə çıxıb". Dəməşqin şərq tərəfində Ubey ibn Kəbin ψ qəbrinin olduğunu da söyləyirlər. Lakin alimlər ittifaq ediblər ki, Ubey ibn Kəb ψ heç Suriyada olmayb. İstanbulda bir neçə səhabənin qəbrini olduğunu da iddia edirlər. Rəvayət olunur ki, Sultan yuxusunda görür ki, filan yerdə səhabələrin qəbri vardır və onlar da oranı məscid tikirlər. Hüseynin ψ qəbrinin Qahirədə, İraqda, Nəcəfdə olduğu da söylənilir. Misirdə olduğunu söyləyənlər isə Fatimilər olublar". Müxaliflər qəbrin olduğunu dörd üsulla təyin edirlər: **1)** Yuxuda görür. **2)** Zəif rəvayətə əsaslanırlar. **3)** O, yerdə qeyri-adi bir hadisə baş verir və deyirlər ki, burada salehlərin qəbri var. **4)** Oradan keçəndə qeyri-adi bir şey hiss edir məs: Ətir iyi və deyirlər ki: Burada salehlərin qəbri var. Göründüyü kimi bu dəlillər heç biri möhkəm, dəqiq dayağa söykənmir.

Qəbirpərəstlərdə bu cür hekayələr çoxdur və onlar Allahın yaratdıqları içində ən yalançı olanlardır. Şeytan qəbir başında dua etməyi, evdə, məsciddə və ya səhər vaxtlarında dua etməkdən daha sevimli göstərərək insana hiylə qurur. *Allah Qorusun!*

## BU BÜTLƏR SİZİN VƏ ATALARINIZIN QOYDUĞU ADLARDAN BAŞQA BİR ŞEY DEYİLDİR

***"Onlar sizin və atalarınızın qoyduqları adlardan başqa bir şey deyildir. Allah onlar haqqında heç bir dəlil nazil etməmişdir".*** *(ən-Nəcm 19-23).* Onlar Rəblərinin Kitabı və Nəbilərinin sünnəsindən uzaqlaşdıqları üçün öz ağıllarına və nəfsi istəklərinə uydular. Sıratal-Mustəqimdən ayrıldıqca azmağa başladılar. Allah və Onun Rəsulunun ρ hökmünün önünə keçdilər. Beləcə də nəsildən-nəsilə zəlalətə düşdülər. İxtilaf edib firqələrə bölündülər. İbn Teymiyyə Σ deyir ki: "Kim nübuvvət cizgisindən ayrılarsa şirkə və digər günahlar içərisinə düşər. İnsanların inanclarında şirk yox idi. Adəm υ və uşaqları Allahı tövhid etmək inancında idilər. İnsanlar tək bir ümmət idilər sonra ixtilafa düşdülər; ***"İnsanlar*** *(əvvəlcə)* ***ancaq tək bir ümmət idilər*** *(eyni bir dində idilər).* ***Sonra*** *(aralarında ixtilaf düşdüyü üçün)* ***ayrıldılar".*** *(Yunus 19).* ***"İnsanlar tək bir ümmət idilər".*** *(əl-Bəqərə 213).* İbn Abbas ψ deyir: "Adəm ilə Nuh υ arasında altı əsr (Başqa rəvayətdə: on əsr) vardır. Bu dövrdə yaşayan insanların hamısı da Allahın şəriətində idilər. Onların hamısı İslam dinində idilər. Daha sonra ixtilafa düşdülər. Rəsulların şəriətlərinə tabe olmağı tərk etdikləri üçün şirkə düşdülər. Allah da müjdələyən və qoxudan Rəsullar göndərdi. Göndərilən ilk Rəsul

isə Nuh υ idi".[279] Peyğəmbər υ Uca Rəbbindən buyurur: "Mən qullarımı həniflər (doğru inanc sahibləri) olaraq yaratdım. Lakin şeytanlar gələrək onları dinlərindən uzaqlaşdırdılar. Halal qıldığım şeyləri onlara haram qıldılar. Haqqında bir dəlil endirmədiyim şeyləri Mənə şirk qoşmalarını əmr etdilər".[280] Peyğəmbər ρ buyurdu: "Hər bir doğulan uşaq fitrət üzrə doğulur. Bundan sonra ana və atası (yəhudi isə) onu yəhudi, (xristian isə) onu Xristian, (məcusi isə) onu məcusi edirlər…". Bundan sonra Əbu Hureyra ψ dedi: İstəsəniz: ***"Sən bir hənif kimi üzünü dinə tərəf çevir! Allahın insanlara – xəlq etdiyi şüurlu məxluq kimi verdiyi fitrət budur. Allahın yaratdığını heç cür dəyişdirmək olmaz. Doğru din budur, lakin insanların çoxu bunu bilmir".*** *(ər-Rum 30).*[281] ***"Və** (öz tabeçiliyində olanlara)* ***dedilər: "Öz tanrılarınızı tərk etməyin,** (xüsusi ilə)* ***Vəddi, Suvaı, Yəğusu, Yəuqu və Nəsri atmayın".*** *(Nuh 23).* İbn Abbas ψ rəvayət edir ki, bunlar Nuhun υ qövmünün əməlisaleh insanları idilər. Onlar öldükdən sonra şeytan onların yaşadığı qövmün insanlarına vəsvəsə edir ki, onların toplandıqları yerlərdə heykəllərini ucaltsınlar və onların adlarını həmin heykəllərə versinlər. Onlar da deyilən kimi etdilər. (Heykəlləri) düzəldən nəsil ölüb gedənə qədər onlara ibadət olunmadı. (Uzun müddət keçdikdən sonara) elm unudulduqda o, heykəllərə ibadət etməyə başladılar.[282] Abd ibn Humeyd, Əbu Mutahhardan rəvayət edir ki, Əbu Cəfər (Bəkirin) yanında Yezid ibn Muhəlləbdən bəhs edildi. Əbu Cəfər: "O, Allahdan başqa ilk ibadət edilən yerdə öldürüldü"- dedi. Sonra Vədd haqqında danışdı. Vədd müsəlman bir kimsə idi və qövmü tərəfindən sevilirdi. O, ölüncə Babil torpaqlarında qəbrinin ətrafında toplandılar və onun ölümünə üzüldülər. İblis onların Vəddə üzüldüklərini gördükdə dedi: "Sizin buna çox üzüldüyünüzü görürəm. Sizin üçün onun bir surətini çəkməmi istəyirsinizmi? Beləcə o, sizin toplandığınız yerdə olacaq və onun sayəsində Vəddi xatırlayacaqsınız". Onlar da: "Bəli, çək"- dedilər. İblis onlara Vəddin bir surətini çəkdi. Onlar da onun surətini toplandıqları yerə qoydular və onu xatırlamağa başladılar. Onların Vəddi xatırladıqlarını gördükdə bu dəfə dedi: "Sizin hər birinizin evində belə bir heykəl düzəltməyimə nə deyirsiniz? Beləcə bundan sizin hər birinizin evində olacaq və onu xatırlayacaqsınız". Onlar: "Bəli, olar"- dedilər. Hər ev əhlinə onun kimi bir heykəl düzəltdi. Onlar da bu heykələ yönəldilər. Heykəl vasitəsilə Vəddi xatırlamağa başladılar. Onların uşaqları böyüdü. Atalarının bu heykəllə nə cür davrandıqlarını gördülər. Nəsillər çoxaldı. Onu xatırlamaq məsələsi unudulub getdi. Sonda isə onu Allahdan başqa ilah halına gətirdilər. Allahdan başqa yer üzündə ilk ibadət edilən şey Vəddin adı verilən Vədd bütüdür".[283] Bu cür kimsələr ölmüş insanlara göstərdikləri qayğını sağ olanlara göstərdiklərindən də çox edirlər.

---

[279] İbn Kəsir 1/ 250, Məcmuul-Fətava 20/ 106.
[280] Muslim 8/ 159, Əhməd 4/ 162, İbn Əsakir 15/ 328/ 1.
[281] əl-Buxari 11/ 418, Muslim 18/ 52, əl-Albani "İrva" 1220.
[282] əl-Buxari 4920.
[283] Durrul-Mənsur 6/ 269, İbn Urvə Hənbəli "Kəvakibu Dərari" 6/ 112/ 2.

Buna görə də şair deyir ki: "Ölülərə qibtə edirəm, kaş ki, onlara çəkilən xərc mənə çəkilərdi".

Allahın I isimlərini bütlərə qoymaq. əl-Lat,[284] əl-Uzza və Manat ərəb bütpərəstlərinin əsas bütləri idi. əl-Lata Səqif qəbiləsi, əl-Uzzaya Qureyş və Bəni Kinanə qəbilələri, Manata Bəni Hilal, Əus və Xəzrəc qəbilələri ibadət edirdilər. Allahın əl-İlah adını, əl-Lat adı ilə dəyişərək öz bütlərinə qoymuşdular. ***əl-Lat*** – Taif şəhərində ağ dağın adı idi. Səqif qəbiləsindən olanlar bu bütləri ilə fəxr edirdilər. İbn Hişam Σ deyir: "Peyğəmbərin ρ əmri ilə Muğirə ibn Şöbə və Əbu Sufyan ibn Hərb N onu yandırıb dağıdırlar. Sonralar isə onun yerində Məscid tikirlər".[285] ***əl-Əziz*** - adını, əl-Uzza ilə dəyişdirmişdilər. İbn Cərir Σ deyir: "Məkkə ilə Taif arasında, Nəxl adlanan yerdə ağac adı idi". İbn Hişam Σ deyir: "Məkkənin fəthi günü Xalid ibn Valid ψ oranı dağıdır. Xalid ψ oranı dağıtdıqdan sonra Peyğəmbərin ρ yanına gəlir. Peyğəmbər ρ: "Qayıt ora, çünki sən heç bir şey etməmisən"- deyə buyurur. Xalid ψ ora qayıtdıqda keşikçilər dağa tərəf qaçaraq: "Ey Uzza! Ey Uzza!"- deyə qışqırmağa başladılar. Xalid ψ bütün yanına yaxınlaşdıqda saçları üzərinə tökülmüş lüt bir qadın gördü. Qılıncı ilə vurub onu öldürdü və Peyğəmbərin ρ yanına qayıdaraq başına gələnləri danışdı. Peyğəmbər ρ: "O, Uzza idi!"- deyə buyurdu".[286] ***əl-Mənnan*** - adını, əl-Manat adı ilı dəyişdirmişdilər. Məkkə ilə Mədinə arasında, Hudeydə adlanan yerin adı idi. Aişə O deyir: "Əli ψ Məkkənin fəthi günü oranı dağıdır".[287] ***"Bir deyin görək Lat və Uzza nəyə qadirdir. Digəri üçüncüsü olan Manat da həmçinin… O, bütlər sizin və atalarınızın qoyduqları adlardan başqa bir şey deyildir. Allah onlara dair bir dəlil endirməmişdir".*** *(ən-Nəcm 19-23).* ***"Allahdan başqa ibadət etdikləriniz sizin və atalarnızın qoyduğu adlardan başqa bir şey deyildir. Allah isə heç bir dəlil endirməmişdir. Hökm ancaq Allahındır. O, sizi yalnız Onun özünə ibadət etməyə çağırır".*** *(Yusuf 40).*

Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Mən gördüm ki, Amr ibn Luhey bağırsaqlarını sürükləyərək Cəhənnəmdədir. O, kimsə İsmailin υ dinini dəyişdirən ilk kimsə idi. Bəzi ev heyvanlarını müqəddəsləşdirmək adətini o, gətirdi. ***"Bahirə, Saibə, Vəsilə və Haminin heç birisini Allah qanuni buyurmamışdır. Lakin kafirlər Allaha qarşı yalan uydururlar".*** *(əl-maidə 103).* İbn İshaq Σ deyir: "***Saibə*** – doqquz dənə erkək dəvə doğan dişi dəvənin adı idi. Ərəblər belə bir dəvənin üzərində oturmaz, onunla yük daşımaz, tükünü qırxmaz və onun südündən yalnız

[284] İbn Cərir ət-Təbəri Sufyan əs-Sourinin Mənsura istinadla Mucahiddən etdiyi rəvayətdə Mucahidin: ***"Bir deyin görək Lat və Uzza nəyə qadirdir"***- ayəsinin şərhində deyir ki: "O (Lat, Uzza), həmişə onlar üçün sıyıq bişirərdi, öləndən sonra isə onun qəbrini ziyarət etməyə başladılar". İbn Abbas N deyir ki: "O, ziyarətçilər üçün sıyıq hazırlayardı".

[285] İbn Hişam 1/ 85-86, İbn Kəsir "əl-Bidayə vən-Nihəyə" 5/ 32, İbn Məcə 743, Əbu Davud 450, İbn Qeyyim "Zədul-Məad" 3/ 499.

[286] İbn Kəsir 7/ 429-430, ən-Nəsai "Sunənul-Kubra", "Tuxfa əl-Əşraf" 4/ 235.

[287] əl-Buxari.

qonaq içə bilərdi. Əgər dəvə bu doqquz erkək dəvədən sonra bir dənə dişi doğardısa onu da anası ilə bərabər müqəddəsləşdirərdilər və ona ***Bahirə*** – Saibənin qızı deyərdilər. ***Vəsilə*** – qoyun idi. Beş hamiləlik müddətində doqquz dişi qoyun doğduğuna görə belə adlanırdı. ***Hami*** – erkək dəvə idi; ***"Onlar: "Bu mal-qaranın qarınlarındakı balalar kişilərimizə halal, qadınlarımıza isə haramdır"– deyirlər. Əgər o bala ölü doğularsa, hamısı onu yeməyə şərik olurlar. Allah onları bu vəsflərinə görə cəzalandıracaqdır. Həqiqətən, O, Müdrikdir, Biləndir".*** *(əl-Ənam 139)".*[288]

Əbu Vaqid əl-Leysi ψ rəvayət edir ki, Peyğəmbər ρ ilə birlikdə Məkkədən Huneynə tərəf yola çıxmışdıq. Biz, o vaxtlar təzə müsəlmanlardan idik və küfrdən yenicə çıxmışdıq. Müşriklərin üstündən silahlarını asdıqları böyük bir Sidr ağacı vardı. Onun ətrafında yığışaraq öz adət ən-ənələrini yerinə yetirir və o, ağacı "Zətu Ənvat" deyə çağırırdılar. Biz də bu böyük bir Sidr ağacının yanından keçdikdə: "Ey Allahı Rəsulu! Onların "Zətu Ənvatı" olduğu kimi bizim üçün də "Zətu Əənvat" düzəlt"- dedik. Peyğəmbər ρ dedi: "Allahu Əkbər! Şübhəsiz ki, bunlar hamısı keçmiş adət ən-ənələrdir. Nəfsim Əlində Olana and olsun ki, siz İsrail oğullarının Musadan istədikləri şeyin eynisini məndən istədiniz: ***"…Bizə onların sitayiş etdikləri bütlər kimi bir büt düzəlt!"*** *(əl-Əraf 138).* Həqiqətən siz əvvəlkilərin adət ən-ənəsi ilə gedəcəksiniz".[289] Gördüyünüz kimi günümüzdə də belə şeylərin şahidi ola bilərik. İnsanlar ölmüş kimsələrin adlarını pirlərə, ocaqlara qoyaraq "filankəsin piri", "filankəsin ocağı" və s. həmçinin dağlara, ağaclara da ad verərək oraları da Allahdan qeyrisinə ibadət olunan yerlərə çevirirlər; ***"O, bütlər sizin və atalarınızın qoyduqları adlardan başqa bir şey deyildir. Allah onlara dair bir dəlil endirməmişdir".*** Onlara - Allahdan qorxun! Belə yerlərə getməyin, Allaha ibadət edin, bir şey istədikdə Allahdan istəyin! deyildikdə hələ bir sənə: "Biz ata-babalarımızı bu yol üzrə görmüşük, sən dünənki uşaq, gəlmisən bizə İslamı öyrədirsən?!" ***Subhənəllah!*** Biz sizə İslamı öyrətmirik. İslam on dörd əsr bundan qabaq Allah və Onun Rəsulu ρ tərəfindən necə qoyulubsa, o cür də davam edir. İslamı dəyişən biz deyilik, sizsiniz. Öz ağıllarınıza uyğun şəkildə istədiyiniz kimi Allaha ibadət edirsiniz. Sizi doğru yola çağıranlara, Rəbbimiz tək olan Allahdır, Ona heç bir şeyi şərik qoşmayın - deyənlərə də dil uzadaraq: "Bunlar ağıllarını itirərək dəli olmuşlar. Onlara qulaq asmayın" deyərək hələ bir tənə də edirsiniz; ***"Cənnət əhli Od sakinlərini səsləyib deyəcəklər: "Biz Rəbbimizin bizə vəd etdiyinin doğru olduğunu gördük. Siz də Rəbbimizin sizə vəd etdiyinin doğru olduğunu gördünüzmü?" Onlar: "Bəli!"– deyəcəklər. Bu zaman onların arasında bir carçı səsləyib deyəcəkdir: "Allahın lənəti olsun zalımlara!"*** *(əl-Əraf 44).* ***"Həqiqətən günahkarlar iman gətirmiş kimsələrə*** *(dünyada)* ***gülürdülər.***

[288] əl-Buxari 4623, Muslim, Əhməd 2/257, İbn Hişam 1/76.
[289] ət-Tirmizi 2180, Əhməd 5/ 218, əl-Albani səhih.

***Möminlərin yanından keçərkən*** *(onları dolamaq məqsədi ilə)* ***bir-birinə göz-qaş edirdilər. Ailələrinin yanına qayıtdıqda isə*** *(onları doladıqları üçün)* ***kefləri kök qayıdardılar. Möminləri gördükdə: "Doğrusu bunlar*** *(haqq yoldan)* ***azanlardır!"- deyərdilər. Halbuki onlar möminlərə nəzarətçi göndərilməmişdilər. Bu gün isə möminlər kafirlərə güləcək-lər".*** *(əl-Mutəffifin 29-34).* Lakin biz Allahın qoyduğu qaydada, Peyğəmbərimizin ρ buyurduğu şəkildə Allaha ibadət edirik. Ata-babalarımızın qoyduğu şəkildə yox; ***"Onlara: "Allahın nazil etdiyinə tabe olun!"– deyildikdə, onlar: "Xeyr, biz atalarımızın tutduğu yolu tutacağıq!"– deyirlər. Bəs ataları bir şey anlamayıb doğru yola yönəlməyiblərsə necə?"*** *(əl-Bəqərə 170, əl-Maidə 104). "(Ya Muhəmməd!)* ***Biz səndən əvvəl hər hansı bir məmləkətə*** *(Allahın əzabı ilə)* ***qorxudan bir peyğəmbər göndərdiksə, onun naz-nemət içində yaşayan başçıları sadəcə olaraq: "Biz atalarımızı bir din üzərində gördük və biz də onların yolu ilə gedəcəyik"– deyirlər. Əgər sizə atalarınızın sitayiş etdiyini gördüyünüz dindən daha doğrusunu gətirmiş olsam necə? Yenə də atalarınızın yolunumu tutacaqsınız*** *(Biz sizinlə göndərilənləri inkar edirik – dedilər)****".*** *(əz-Zuxruf 23).* Siz ata-babalarınızın yolu ilə gedin, biz isə Allah və Onun Rəsulunun ρ yolu ilə gedəcəyik.

# MƏHƏBBƏTDƏ VƏ TƏZİMDƏ ŞİRK

***Məhəbbət*** - odur ki, insanı hərəkət etməyə məcbur edir. Dünyəvi bir şeyi sevən ona görə də hərəkət edəcəkdir. Elmi sevən ona da can atacaqdır, Allahı ibadət ilə sevən qorxu, ümüd ilə Allahın razılığını qazanmaq üçün çalışar. Allahın qadağalarından, qəzəbli olduğu şeylərdən qaçar, Peyğəmbəri ρ sevən isə onun sünnəsi ilə yaşayar, sünnəsi ilə əməl edər. Ona görə də bidətçi dedikdə ki: "Mən Peyğəmbəri ρ sevirəm" – o, yalançıdır. Peyğəmbəri ρ sevən onun dediklərini edər, bidət etməz. Allah və Onun Rəsuluna ρ olan sevgi hər şeydən irəlidə dayanmalıdır. İmanın şirinliyi bunları sevmədikcə dadılmaz. İman da bu iki şeylə kamil olar. Allah üçün sevir, çünki Allah sevməyi əmr edib, Allah üçün nifrət edir, çünki Allah onları sevməməyi əmr edib. Fovzan – *hafizahullah* - deyir: "Allah üçün kafirlərə nifrət nə deməkdir? Ona görə yox ki, sən onlarla döyüşürsən, ona görə yox ki, səndən nə isə alıblar, ona görə yox ki, sənə qaşı zülm olunub. Bu təbii bir nifrətdir. Allah səndən bu nifrəti tələb etmir. (Kimsə hər hansı bir insanı vursa, ona qarşı nifrət oyanacaqdır) Allahın tələb etdiyi nifrət onların Allaha şərik qoşmaları, Onun haqqını tapdaladıqlarına görədir". Onun nifrətə layiq olması Allahın qadağalarını etməsinə, əmrlərini isə tərk etdiyinə görə olur.

***Məhəbbətin Bir Neçə Növü Vardır***: Bunları bilmək və onların arasını ayırd etmək hər kəsə mühümdür. İnsanların çoxları da bu məhəbbətin aralarını ayırd edə bilmədiklərinə görə azmışlar. **1)** İbadət olan məhəbbət. Allahı I sevmək. Tövhidin əsli

və ruhu - bütün sevginin xalis bir şəkildə sırf Allah üçün olmasıdır. Allah sevgisi ilah və məbud olaraq Allahın qəbul edilməsinin təməlidir. Hətta sevgi ibadətin həqiqətidir. Qulun Rəbbinə olan sevgisi mükəmməl olmadıqca Tövhidi də mükəmməl olmaz. Mükəmməl bir sevgiyə sahib olmaq üçün Allah sevgisini bütün sevgilərin önündə və üstündə olması lazımdır. Bütün sevgilər üzərində Hakim olmalıdır. Bütün sevgilərin Onun sevgisinə tabe olması lazımdır. İbn Abbas N rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Rəbb olaraq Allahdan, din olaraq İslamdan və Rəsul olaraq Muhəmməddən razı olan kimsə imanın şirinliyini, tamını tapar".[290] **2)** Allahın sevdiklərini sevmək və Allah üçün sevmək (əməlləri, şəxsləri). İnsanı İslama salan və küfürdən çıxardan budur. Qul Allahın sevdiyi əməlləri və şəxsləri sevir, Allahın nifrət etdiyi əməllərə və şəxslərə nifrət edir. Allahın dost etdiklərini dost, Allahın düşmən etdiklərini də düşmən bilir. Beləcə qulun iman və Tövhidi kamil olur. İnsanlar içərisində Allaha ən sevimlisi bu məhəbbətdə ən güclü olandır. Yəni Allahın sevdiklərini sevən kimsədir. Onları nə üçün sevir? Çünki, onları sevməyi Allah əmr etmişdir. Əbu Hureyra ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Sizdən hər hansı bir kimsə məni uşaqlarından, valideyinlərindən və cəmi insanlardan çox sevmədikcə iman etmiş olmaz (bütün bunlardan sevimli olmadıqca)".[291] Abdullah ibn Hişam ψ rəvayət edir ki, Peyğəmbər ρ ilə birlikdə idik. Bu an Ömərin ψ əlini tutmuşdu. Ömər ψ: “Ey Allahın Rəsulu! Şübhəsiz mən səni öz nəfsimdən başqa hər şeydən çox sevirəm”- dedi. Peyğəmbər ρ: “Nəfsim əlində olana and olsun ki, öz nəfsindən də çox sevmədikcə (imanın kamil) olmaz”- deyə buyurdu. Ömər ψ: “Bu andan – *Allaha and olsun ki* – səni öz canımdan daha çox sevirəm”- dedi. Peyğəmbər ρ: “İndi oldu, Ey Ömər!”- deyə buyurdu. ***"Peyğəmbər möminlərə öz nəfislərindən də yaxındır".*** *(əl-Əhzab 6).*[292] İbn Abbas ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Kim Allah üçün sevər, Allah üçün nifrət edər, Allah üçün verər və Allah üçün qadağan edərsə imanı tamamlanmış olar".[293] İbn Abbas ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Allahın dostluğuna yalnız - Allah üçün sevən, Allah üçün nifrət edən, Allah üçün dost olan və Allah üçün düşmənlik edən nail ola bilər. Belə olmadıqca imanın dadını almış olmaz. İnsanlar arasında qardaşlıq yalnız dünya malına görə olmuşdur. Bu isə əhlinə heç bir fayda gətirməz".[294] **3)** Ehtiram, şəfqət, mərhəmət olan məhəbbət (böyüklərə, elm əhlinə) və s. Peyğəmbər ρ buyurdu: "Böyüklərimizə hörmət etməyən, kiçiklərimizə rəhm etməyən və alimlərimizin haqqını ödəməyən bizdən deyildir".[295] (Bəzi rəylərə

---

[290] Muslim 34.
[291] əl-Buxari 15, Muslim 44, İbnMəcə 67, əd-Dərimi 2741, Musnəd 3/ 207, 275, 278.
[292] əl-Buxari 6632.
[293] Əhməd 3/ 438, 440, Əbu Davud 4681, ət-Tirmizi 2521, əl-Albani "Səhih Hədislər Silsiləsi" 380, "Səhih Cəmius Səğir" 5965, "Mişkətul-Məsabih" 30, 31.
[294] ət-Tabərani “Mucəmul-Kəbir” 12/ 417, Əbu Nuaym “Hilyə” 1/ 312, İbn Mubarək “Zuhd” 337, İbn Əbi Dunyə “İhvan” 22, əl-Albani “Səhih” 1728.
[295] Əhməd 5/ 323, Mustədrək 1/ 211.

görə: Allah üçün sevmək. Bu da Allahın sevdiyi şeyləri sevməyə tabedir. İnsan Allah üçün sevmədikcə Allahın sevdiklərini sevmək düzgün olmaz). **4)** Təbii məhəbbət. Bu da insanın öz təbiətinə, fitrətinə meyl etdiyi şeyləri sevməsidir. Susuz insanın suyu, acmış insanın yeməyi, insanın öz övladlarını, yoldaşını, ata və anasını sevməsi və s. Bu sevgi növü ibadət, qorxu rəca deyildir. Dünyaya görədir. Bu kimi şeyləri sevməyə görə insan məzəmmət olunmur. Lakin nə vaxt məzəmmət olunur? Əgər bu kimi şeylər Allahı sevməkdən, zikr etməkdən yayındırarsa, sevgini Allahın sevgisi üstünə qoyarsa artıq büyük bir günah etmişdir; ***"Ey iman gətirənlər! Nə mal-dövlətiniz, nə də oğul-uşağınız sizi Allahın zikrindən yayındırmasın! Hər kəs bunu etsə beləlăəri əsl ziyana uğrayanlardır".*** *(əl-Munafiqun 9).* İbn Məsud ψ deyir: "Nə vaxt Quranda ***Yə Əyyuhəl-Ləzinə*** gəldisə diqqətli ol! Burada ya səni xeyirə çağıran əmr vardır, ya da səni şərdən çəkindirən qadağa vardır"; **"*O, kəslər ki, nə ticarət, nə alış-veriş onları Allahı zikr etməkdən, namaz qılmaqdan və zəkat verməkdən yayındırmaz".*** *(ən-Nur 37).* Bunların hər biri öz-özlüyündə ibadət deyildir, lakin Allah üçün edilərsə ibadət sayılar.

***Allahdan Qeyrisini Sevməkdə Olan Məhəbbət:*** Allahdan qeyrisini ibadət niyyətilə (Allahla birlikdə və ya Allah kimi sevmək) sevmək - müşriklərin öz bütlərini sevmələridir. Allahla bərabər öz bütlərini də sevirlər. Qəbir sahiblərinə ibadət etdikdənlərini görsən, sənə aydın olar ki, istənilənə çatmaq üçün qəbirlərə necə can atır, ibadət edir, oraları təmizləyir və qoruyurlar. Kim ibadət olan sevgini Allahdan qeyrisinə həsr edərsə artıq böyük şirk etmişdir. Bu da Allahın bağışlamadığı böyük şirkdir; ***"İnsanlardan elələri də vardır ki, Allahdan qeyrilərini Ona tay tutur, onları da Allahı sevdikləri kimi sevirlər. İman gətirənlərin isə Allaha olan sevgisi daha güclüdür. Kaş zülm edənlər əzabı gördükləri zaman bütün qüdrət və qüvvətin Allaha məxsus olduğunu və Allahın şiddətli əzab verdiyini görəydilər".*** *(Bəqərə 165).* ***"De ki: "Əgər atalarınız, oğullarınız, qardaşlarınız, övrətləriniz, qəbiləniz, qazandığınız mallar, kasad olmasından qorxduğunuz ticarət, xoşunuza gələn məskənlər sizə Allahdan, Onun Peyğəmbərindən və Allah yolunda cihad etməkdən əzizdirsə, Allahın əmri gəlincəyə qədər gözləyin. Allah fasiqləri doğru yola yönəltməz".*** *(ət-Tövbə 24).* *"(Ya Peyğəmbər!)* ***Allaha və axirət gününə inanan heç bir tayfanın Allaha və Onun Peyğəmbəri əleyhinə çıxanlarla – öz ataları, oğulları, qardaşları, yaxın qohumları olsalar belə – dostluq etdiyini görməzsən. Onlar elə kimsələrdir ki, Allah onların qəlblərinə iman yazmış və öz dərgahından onlara güc vermişdir. Allah onları altından çaylar axan Cənnətlərə daxil edəcəkdir. Onlar orada əbədi qalacaqlar. Allah onlardan, onlar da Allahdan razıdırlar. Onlar Allahın firqəsidirlər. Bilin ki, Allahın firqəsi məhz onlar, nicat tapıb əbədi səadətə qovuşanlardır".*** *(əl-Mücadələ 22).* ***"Onlar orada çənə-boğaz olub deyərlər: "Allaha and olsun ki, biz açıq-aydın azmışdıq! Çünki biz sizi aləmlərin Rəbbi ilə bərabər tutduq".*** *(əş-Şüəra 97).* Ayədən göründüyü

kimi onlar Allahı sevirdilər, lakin bununla yanaşı öz bütlərini də sevirdilər. Bəs öz bütlərini Allahdan daha çox sevən və öz bütlərindən başqa heç kəsi sevməyən kimsə barəsində nə demək olar? Hər bir şeyin əsasında məhəbbət vadır. Əgər bir kimsə hər hansısa bir bəlanın qaldırılması, ehtiyacın ödənilməsi üçün qəbirə doğru yönəlirsə deməli o, kimsəyə qarşı məhəbbəti vardır. Allahı sevən kimsə hər bir şeydə yalnız Allaha yönələr. Allaha qarşı məhəbbət odur ki, insanın qəlbində Allahdan qeyrisinə məhəbbət qalmır. Qəlbində nə qədər sevgi varsa Allaha yönəldir.

Onlar ilahlarını yaratmaqda, ruzi verməkdə, öldürməkdə, diriltməkdə, mülkdə, qadir olmaqda Allaha bərabər tutmayıblar. Onlar Allaha sevgidə, təzimdə bərabər tutublar. Sənin kimi aciz bir qul aləmlərin Rəbbi, hər şey Əlində olan ilə necə bərabər tutula bilər. Sənin kimi hər şeyə möhtac olan möhtacsıza (Allaha) bərabər tutula bilər. Məxluqu Allaha bərabər tutduğuna görə, bundan da daha böyük və çirkin bir zülm ola bilərmi; ***"Göyləri və yeri xəlq edən, zülmətləri və nuru yaradan Allaha həmd olsun!*** *(Bu qüdrəti gördükdən)* ***sonra kafir olanlar yenə*** *(bütləri)* ***öz Rəbbinə tay tutarlar".*** *(əl-Ənam 1).* Bu elə bir bərabərlikdir ki, ən böyük zülmü, çirkinliyi əhatə edir; ***"Ey iman gətirənlər! Sizdən hər kim dinindən dönsə, Allah onun əvəzinə Özünün sevdiyi və Onu sevən, möminlərə qarşı mülayim, kafirlərə qarşı isə sərt olan, Allah yolunda cihad edən və tənə edənin tənəsindən qorxmayan bir camaat gətirər. Bu, Allahın lütfüdür, onu istədiyinə verər. Allah hər şeyi Əhataedəndir, Biləndir".*** *(əl-Maidə 54).* Bu ayədə məhəbbətin dörd əlaməti qeyd olunmuşdur: **1)** Allah onları, onlar da Allahı sevərlər. **2)** Onlar möminlərə qarşı mülayim, kafirlərə qarşı sərt olarlar. **3)** Allah yolunda vuruşarlar. **4)** Heç kəsin tənəsindən qorxmazlar.

İnsanlar bir-birilərini dünya malına görə, hansısa bir vəzifəyə görə sevir və əlaqələr saxlayırlar. Bütün bunlar bitdikdə o, dostluq da bitəcəkdir. Yalnız Allah xatirinə olan dostluqdan başqa: ***"Müttəqilər müstəsna olmaqla, o gün dostlar bir-birinə düşmən kəsiləcəklər".*** *(əz-Zuxruf 67).* ***"Sizin haminiz ancaq Allah, Onun Peyğəmbəri və iman gətirənlərdir".*** *(əl-Maidə 55).*

***Dostluq İki Qismə Bölünür:*** **1.** Allahın bəndəsini Özünə dost tutması; ***"Allah Ona inananların dostudur. Onları zülmətdən çıxarıb işığa tərəf yönəldər. Kafirləri dostu isə şeytandır. Onları nurdan ayırıb zülmətə salarlar".*** *(əl-Bəqərə 257).* **2.** Bəndənin Allahı özünə dost tutması; ***"Hər kəs Allahı, Onun Peyğəmbərini və iman gətirənləi özünə dost tutsa, şübhəsiz ki, qələbə çalanlar məhz Allahın firqəsidir".*** *(əl-Maidə 56).*

## HƏQİQİ SEVGİ UCA SEVDİYİNİ TƏKLƏŞDİRMƏYİ TƏLƏB EDİR

Bunu bildikdən sonra insanın qəlbində Allahı sevməklə digər (surətlərə, şəkillərə) olan eşq bir yerdə olması heç vaxt mümkün deyil. Bunların ikisi də zidd olan bir

şeylərdir və heç vaxt birləşə bilməzlər. Mütləq bunların birisi digərini qəlbdən çıxarmalıdır. Əgər sənin qəlbində Allah sevgisi varsa, digər olan haram sevgilər sənin qəlbindən çıxmalıdır. Əgər bunlara sevgi varsa, onda sənin Allaha olan sevgin zəifləyir. Əgər bir kimsənin qəlbində Allah sevgisi olarsa, bu sevgi onu başqalarını sevməkdən yayındırır. Allahdan başqasını sevdikdə isə onu da Allah üçün sevir və ya Allahın sevgisinə bir vasitə olduğu üçün sevir. Buna görə də Allahdan qeyrisi müstəqil olaraq sevilmir. İnsanda həqiqi sevgi varsa, o, Allahı təkləşdirməyi tələb edir. Allahdan qeyrisini sevgidə Allaha şərik qoşmamağı tələb edir. Hətta insanlar arasında başqasını sevdiyinə görə qısqandığını görürsən. Onda insan başqasını (sevgidə) Allaha necə şərik qoşa bilər. Bu sevgi yalnız tək olan Allaha aiddir. Allahdan qeyrisini sevmək isə sahibi üçün bir əzab və bəladır. Buna görə Allah ümumən şirki, o cümlədən məhəbbətdə Ona şərik qoşanı bağışlamır. Bundan aşağı olanları isə istədiyinə bağışlayır. Bu kimi şeyləri sevmək insana daha mənfəətli olanı ötürür. Əksinə ondan elə bir şeyi ötürür ki, insanın xoşbəxtliyi, səadəti, həqiqi həyatı Onu sevməkdədir. Buna görə də bəndə bu iki sevgidən birini seçməlidir. Çünki, onların ikisi də bir qəlbdə yerləşə bilməz. Od ilə su kimi. Əgər bir kimsə Allaha sevgidən, Allaha zikrdən, Allahala qovuşmaq istəyindən üz döndərərsə, Allah da onu başqasını sevməklə imtahana çəkir və bununla ona dünyada əzab verir. Həmçinin, bərzəxdə və axirətdə də əzab verir. Ona bütləri sevməklə, xaçları, qadınları sevməklə imtahan edir. İnsan da sevdiyinin quludur. Əgər bir kimsənin ilahı Allah olmazsa, onun ilahı öz nəfsi-istəyi olar; *"**Nəfsini özünə tanrı edən və Allahın bilərəkdən yoldan çıxartdığı, qulağını və qəlbini möhürlədiyi, gözünə də pərdə çəkdiyi kimsəni gördünmü?**" (əl-Casiyə 23).*

## İBADƏTDƏ SEVGİ

İbadət nədir? İtaətkarlıqla yanaşı sevgidir və həmçinin sevdiyinin qarşısında zəlil olmaqdır. ***Təabbudun*** – itaətlə yanaşı sevmək, sevgi ilə yanaşı da insanın zəlil olması ibadətin xüsusiyyətidir. Əgər bir kimsə bir şeyi sevərsə artıq qəlbini ona yönəltmiş, qəlbi ona ibadət etmiş olar. ***Təabbud*** – sevginin ən axırıncı dərəcəsidir ki, buna da ***Tətəyyum*** deyilir. Sevginin birinci mərtəbəsinə qəlbi ilə (əlaqə) bağlanması olduğuna görə ***Ələqa*** – deyilir. İkinci dərəcəsi ***Sabəbə*** – qapanmaq adlanır. Çünki, qəlb artıq sevdiyinə qapanmışdır. Üçüncü dərəcəsi ***Ğaram*** – bir şeylə yanaşı olmaq. Sevginin qəlbdə daima (uzaqlaşmadan) olması. Buna görə də ərəb dilində borclu insana Ğarim deyilir. Borc sahibinin həmişə dalıyca düşdüyünə görə ona ğarim deyilir. Cəhənnəmin əzabı da Ğaramə (daimidir). Dördüncü dərəcəsi ***Eşq*** – bu isə sevgidə ifrata varmaqdır. Buna görə də Allah eşqlə vəsf olunmaz. Beşinci dərəcə ***Şövq*** – qəlbin sevdiyinə qarşı səfər etməsidir. Əmmar ibn Yasir ψ namaz qıldıqdan sonra dua edir:

"(Bu dua təşəhhüd ilə salamın arasında deyilir) Allahım! Mən Səndən qeybi bilməyinlə və məxluqat üzərində olan qüdrətinlə Səndən istəyirəm ki, həyat (yaşamaq) mənim üçün xeyirlidirsə məni yaşat, ölümüm xeyirlidirsə mənim canımı al. Allahım! Mən səndən qeyibdə və aşkarda Səndən qorxmağı diləyirəm. Səndən qəzəbdə və razı olduğun halda haqq kəliməni söyləməyi diləyirəm. Kasıblıqda da, varlılıqda da mötədil olmağı Səndən diləyirəm. Səndən qurtarmayan bir nemət diləyirəm. Səndən kəsilməyən sevinc, ölümdən sonra sərin bir yaşayış diləyirəm. Sənin camalına baxmağı diləyirəm. Səninlə görüşməyə şövq diləyirəm. Heç bir çətinliyə, fitnəyə düşmədən Allahım bizi iman zinəti ilə zinətləndir və bizi doğru yolda olub yol göstərənlərdən et!" Peyğəmbər ρ buyurdu: "Əgər bir kimsə Allah ilə görüşməyi sevərsə, Allah da onunla görüşməyi sevər". ***"Kim Allahla qarşılaşacağına ümid bəsləyirsə, qoy bilsin ki, Allahın müəyyənləşdirdiyi zaman hökmən gələcəkdir. O, Eşidəndir, Biləndir".*** *(əl-Ənkəbut 5).* Allah bilir ki, bu Allah dostlarını Allah ilə görüşməyi (şövqi) güclüdür, qəlbləri Allah ilə qovuşmasa sakitlik tapmayacaqdır Allah onlar üçün müəyyən bir vaxt təyin etdi ki, onların nəfsləri sakitləşsin. Kim Allah ilə qovuşmağı ümüd edirsə, həqiqətən Allahın təyin etdiyi vaxt gəlib çatacaqdır. Həqiqətən də ən gözəl yaşayış, bu sevənlərin şövq içində olanların yaşayışıdır. Həqiqətən də onların yaşayışı gözəl yaşayışdır. Qəlb üçün bu yaşayışdan daha xoş və gözəl yaşayış yoxdur. Bu da ayədə zikr olunan gözəl yaşayışdır; ***"Mömin olub yaxşı işlər görən kişi və qadına xoş həyat nəsib edəcək və etdikləri yaxşı əməllərə görə mükafatlarını verəcəyik".*** *(ən-Nəhl 97).* Burada həyat dedikdə möminlərlə kafirlər, yaxşı insanlarla pis insanlar arasında olan həyat qəsd olunmur. Çox vaxt görürsən ki, Allahın düşmənləri dünya həyatında (yemək, içmək və s. kimi şeylərdə) Allah dostlarından daha yaxşı yaşayırlar və üstün olurlar. Ona görə də bu ayədə qəsd olunan gözəl yaşayış başqa bir şeydir. Allah iman gətirib saleh əməl edən kimsəyə xoş həyat verməyə artıq zamin durmuşdur. Allah öz vədinə sadiqdir. Dərdləri toplaşaraq bir dərdi olan kimsədən gözəl yaşayışı olan kimsə ola bilərmi. Hansı ki, onun bütün dərdi bir olan Allahın razılığını qazanmaqdır. Qəlbi, fikri dağınıq, başqalarının razılığını qazanmağa yönəlməyib. O, artıq Allaha yönəlib. Artıq onun fikirləri, qəlbi Allaha yönəlib. Artıq Allahı sevmək, Onunla görüşmək, şövqün, istəyin olması, Onunla yaxınlaşaraq ünsiyyət tapmaq onun qəlbini bürümüşdür. Qəlbində olan fikrin başlanğıcı da bunun üzərində olur. Görürsən ki, susanda Allah üçün susur, danışanda Allah üçü danışır, baxanda da Allahla baxır (Allah onun baxışını qoruyur), tutanda da Allahla tutur, atdığı addımları da xeyirli yerlərə atır və Allahla hərəkət edir, Onunla yaşayır və Onunla da ölür. Əbu Hureyra ψ rəvayət edir ki, Allah Elçisi ρ demişdir: "Allah buyurur: "Kim Mənim dostumla düşmənçilik edərsə, Mən ona hərb elan edərəm. Qulumun Mənə sevimli olan və onun vasitəsilə Mənə yaxınlaşdığı ən gözəl əməl ona vacib buyurduğum əməllərdir. Qulum nafilə ibadətləri yerinə

yetirməklə Mənə o qədər yaxınlaşar ki, Mən onu sevərəm. Onu sevdiyim təqdirdə onun eşidən qulağı, görən gözü, tutan əli və yeriyən ayağı olaram. Məndən diləsə, ona dilədiyini verərəm, sığınacaq istəsə, ona sığınacaq verərəm. Mən görəcəyim bir işdə, ölmək istəməyən möminin canını aldıqda tərəddüd etdiyim kimi heç bir şeydə tərəddüd etmirəm. Çünki Mən ona yamanlıq etmək istəmirəm".[296] Bu hədis özündə məhəbbətin, Allah sevgisini qazanma səbəblərinin ikisini özündə əhatə etmişdir. Fərzləri yerinə yetirmək və həmçinin də nafilələri yerinə yetirmək. Allah bu hədisdə xəbər verir ki, Allaha yaxınlaşanların içərisindən ən çox sevdiyi fərz olan ibadətlə yaxınlaşanlardır. Bundan sonra isə nafilə ibadətlərlə yaxınlaşanlardır. İnsan nafilə ibadətlərin sayını o qədər çoxaldır ki, hətta Allahın sevdiyi bir insana çevrilir. Allahı sevmək onun qəlbində elə bir sevgi yaradır ki, artıq başqasını sevməkdən üz döndərir. Allahdan başqasına onun qəlbində yer qalmır. Şəkk yoxdur ki, belə bir insan eşidəndə Allahla eşidir (Allah onun qulağını qoruyur, eşitdikdə yalnız xeyirli şeylər eşidir), görəndə də Allahla görür (gözü yalnız xeyirli şeylərə yönəlir), tutanda da Allahla tutur (Allah onun əli ilə tutmasını da qoruyur), yeriyəndə də Allahla yeriyir (xeyirli yerlərə gedir). Daima özünü Allahın nəzarəti altında bilir. Bu hədisdə zikr olunan əsas qulaq, göz, əl və ayaqdır. Bu əzalar dərk etmək və əməl etmək əzalarıdır. Çünki, görmək və eşitmək qəlbə iradə və ikrah (nifrət) hissi gətirir və sonra bununla da əlini və ayağını işlədir. Əgər bəndənin görməsi də, eşitməsi də Allahla olarsa onun bu dərk etmək əzaları Allah tərəfindən qorunmuş olur. Həmçinin, o insan sevgisində də, nifrət etməsində də qorunmuş olur. O, işləri tutanda da, yeriyəndə də Allah üçün edər. Əgər o insanın qulağı, gözü qorunursa eyni ilə dili də qorunar. Çünki, yuxarıda qeyd etdiyimiz kimi qulaq, göz bunlar nə gətirirlərsə qəlbə gətirirlər. Dil isə qəlbin tərcüməçisidir. Qəlbdə olanları danışır. Allahın bu bərabərliyi də xüsusi bərabərlik adlanır.

## TƏTƏYYUM

Sevənin sevdiyinə itaət etməsi. Sevgi onu qul etdi deyilir. ***Təabbud*** – sözünün həqiqəti nədir? Sevdiyi üçün zəlil və itaətkar olmaq. Buradan da bu söz ***Tariqun Muabbədun*** – zəlilləşən yol, ayaqların tapdalanması ilə zəlilləşən yol yaranmışdır. Bəndəni sevgi, sevdiyini sevməklə itaətlə zəlil etmişdir. Bəndənin ən uca və şərəfli məqamı da ***Ubudiyyət*** – qulluq məqamıdır. Onun bundan da uca dərəcəsi yoxdur. Artıq Allah bəşəriyyətin ən əfzəli və şərəflisi olan Peyğəmbəri ρ ən şərəfli dərəcələrdə belə qulluqla vəsf etmişdir. Allah insanları özünə ibadət üçün yaratmışdır. Bu da Allahın qarşısında itaətkar və zəlil olmaqla məhəbbətin ən uca növüdür. İslamın da həqiqəti və İbrahimin υ dini də budur. Artıq İbrahimin υ dinindən üz döndərən səfeh

---

[296] əl-Buxari 6021, 6502.

insandır. Buna görə də Allah qatında bağışlanılmaz günah şirkdir. Allaha şirk qoşmağın əsası da məhəbbətdə Allaha şərik qoşmaqdır. Bu barədə “möminlərin Allaha olan sevgisi müşriklərin öz bütlərinə olan sevgisindən daha böyükdür” deyilmişdir. Çünki, Allaha şərik qoşanlar Allahı da sevirlər, şəriklərini də. Onlar Allahı sevsələr də belə şərik qoşduqlarına görə onların Allaha olan sevgisi azalmışdır. Allahı təkləşdirənlər isə Allaha olan sevgiləri xalis olduğu üçün möminlərin sevgiləri o şirk qoşanların sevgisindən daha ucadır. O şərikləri aləmlərin Rəbbinə bərabər tutmaq, məhəbbət tərəfdən bərabər tutmaq olmuşdur. Allahın bu yaratdıqlarını yaratmaqda əsas qəsdi bu məhəbbətin xalis Allaha olmasıdır. Buna görə də Allah özündən başqasını hami tutanları, şəfaətçi tutanları inkar etmişdir. Əgər bəndə tək Allahı dost tutarsa Allah onun üçün şəfaətçilər də hasil edər, həmçinin onunla mömin bəndələri arasında dostluq bağlayar və insanlar özləri də Allah üçün onun dostları olarlar. Qaldı ki, o şəxsə ki, Allahı qoyaraq özünə başqasını dost tuta. Haqq olan şəfaət də Tövhid ilə, Allahı təkləşdirməklə hasil olur. Şirk əhli ilə tövhid əhlinin ayrıldığı yer də elə budur. Allah dilədiyini doğru yola yönəldir. Burada qəsd olunan da odur ki, həqiqi qulluq Allaha şirk qoşmaqla hasil ola bilməz. Allah üçün sevmək isə qulluğun tələb etdiyi şeylərdəndir. Peyğəmbəri ρ insanın özündən, nəfsindən, valideyinlərindən, övladlarından və cəmi insanlardan da çox sevməsi, imanın onsuz tamamlanmadığı mühüm bir şeydir. Müstəqil olaraq tək Allah sevilir. Peyğəmbər ρ də Allahın Rəsulu ρ olduğuna görə sevilir. Bunlardan başqa olan digər sevgilər də bura daxildir. Bu sevgi də Allahı sevməyi tələb edən sevgidir. Əgər sən Allahı sevirsənsə sənin Allaha olan sevgin bunları sevməyi tələb edir.

## XULLƏ

Məhəbbətin kamilliyini tələb edir. Sevənin qəlbində sevdiyindən başqasına artıq yer qalmır. Bu elə bir dərəcədir ki, burada artıq heç bir şəriklərə yer qalmır. Bu da iki xəlilə xasdır. O zaman ki, İbrahim υ Allahdan övlad istədi, Allah da ona övlad bəxş etdi. Bu övlada olan sevgidə qəlbi ona bağlandı. Qəlbində bir pay da onun üçün ayırdı. Artıq Allah xəlilinin qəlbində Allahdan başqasına yer olduğuna görə qısqandı və əmr etdi ki, oğlunu qurban kəssin. Bu əmri yerinə yetirmək imtahan tərəfdən daha böyük olsun deyə bu əmr də yuxuda idi. Əsas qəsd uşağın kəsilməsi deyildi. Əsas qəsd qəlb Allah üçün xalis olsun deyə onu qəlbindən kəsmək üçün idi. Nə vaxt ki, İbrahim υ Allahın əmrini yerinə yetirməyə tələsdi Allaha olan sevgisini övlad sevgisindən üstün tutdu. Məqsəd də hasil olduqda kəsmək aradan qaldırıldı və onun əvəzinə qoç göndərildi.

Xullə məhəbbətin ən son dərəcəsidir. Xullə iki nəfərə aiddir. O da İbrahim υ və Muhəmmədir ρ. Kim deyirsə ki, məhəbbət xullədən daha üstündür bu onun elminin

və fəhminin daha aşağı olduğunu göstərir. Məhəbbətin ən yüksək dərəcəsi olan xəlillik dərəcəsinə Peyğəmbər ρ də çatmışdır. “Şübhəsiz Allah İbrahimi xəlil etdiyi kimi məni də xəlil etmişdi”.[297] Bu hədis “xəlil İbrahimə, məhəbbət isə Məhəmmədə aid bir məqamdır”- deyənlərin fikirlərini məhv edir. Çünki, məhəbbət digər insanlar haqqında da sabitdir; ***"Allah tövbə edənləri, təmiz və pak olanları sevər".*** *(əl-Bəqərə 222).* ***"Şübhəsiz ki, Allah müttəqiləri sevər".*** *(Ali İmran 76).* ***"Allah yaxşılıq edənləri sevər".*** *(Ali-İmran 134).* Beləliklə “xəlillik İbrahimə, həbiblik Muhəmmədə xasdır” söyləyənlərin sözlərinin tutarsız olduğu ortaya çıxdı. Əksinə xəlillik hər iksinə də aiddir, həbiblik isə ümumidir. Ola bilər ki, kimsə sizə belə bir hədis də gətirə bilər. Lakin bilin ki, bu hədis zəifdir. İbn Abbas ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "İbrahim Allahın Xəlilidir. Bunu da bilin ki, mən Allahın həbibiyəm və öyünmürəm".[298]

## BƏNDƏ SEVDİYİNİ ƏN UCA SEVDİYİ ÜÇÜN TƏRK EDİR

İnsan sevdiyi bir şeyi ondan da böyük istədiyi bir şey üçün tərk edir. Lakin az sevdiyini çox sevdiyi üçün tərk edir. İki əməldir. Biri az sevimlidir, digəri isə daha çox sevimlidir. Lakin az sevimli olanı çox sediyinə görə digərini ona görə tərk edir. Həmçinin insan bəzən xoşlamadığı şeyi də tərk edir.

Hər bir nəfs malı sevir. İnsanın təbiətində bu vardır. Buna görə də sədəqə vermək də nəfsə ağırdır. Lakin insan Allahı daha çox sevdiyinə görə bunu edir. İnsan malı sevir. Lakin Allahı daha çox sevdiyi üçün onu Allah rizası üçün çıxardır. Bu da onun imanının sadiqliyinə dəlalət edir. Əgər iman onda olmasaydı sədəqə çıxarmazdı. Həmçinin də bu ağlın xüsusiyyətlərindəndir ki, insan iki sevimlidən ən üstün sevdiyini seçsin və ya iki xoşlamadığı işdən daha yüngül olanı seçsin. Bu da sevginin və nifrətin güclü olmasının kamilliyindəndir. Bu da iki işlə kamilləşir (tamamlanır). **1)** İnsanın dərk etməsinin güclü olmasına görə. 2) Qəlbin şücaətinə görə.

İnsanın iki sevimli şeydən ən sevimlini etməməsinə və ya iki xoşlamadığı işdən daha yüngül olanı seçməməsinə səbəb iki şeyə görədir. O, şeyin nə dərəcədə sevimli olduğunu, üstün olduğunu dərk etmədiyinə görə və ya dərk edib lakin nəfsində, qəlbində olan acizliyinə görədir. Daha xeyirli və yararlı olanı üstün tutmağa qadir deyildir. Əgər insanın dərk etmək qabiliyyəti və qəlbində şücaət olarsa bununla o, kimsə səadətin səbəblərinə müvəffəq olar. İnsanlardan elələri də vardır ki, onun şəhvətinin gücü ağlının, imanının gücündən daha güclüdür. Şəhvəti ağlını üstələyir və bu zaman güclü zəifə qalib gəlir. Elələri də vardır ki, imanı şəhvətini üstələyib. Görürsən ki, həkim öz xəstəsini filan-filan yeməkləri yeməkdən çəkindirir. Lakin

---

[297] Muslim.

[298] ət-Tirmizi 3620 qərib hədis. Sənədi zəif.

insanın şəhvəti (nəfsi-istədiyi) ağlına güc gələrək o, yeməklərdən yeyir. Belə bir insanı şəxsiyyəti itən insan adlandırırlar. Qəlbi xəstə olanlar da belədir. Onlar da nəfsi istəklərinə görə xəstəliklərini artıran şeyləri üstün tuturlar. Şərin əsası da elə idrakı (dərk etməyin) aşağı olmasına və nəfsin zəif olmasına görədir. Xeyrin əsas mənbəyi isə idrakın kamil və nəfsin də güclü olmasındandır. Deməli sevgi və iradə hər bir şeyin mənbəyidir (əsasıdır). Hər bir tərk etməyin də əsası nifrət və xoşlamamaqdır. Bu iki şey sevgi və nifrət insanın xoşbəxtçiliyinin və bədbəxçiliyinin əsasıdır. İnsanın səadəti Allah üçün sevib nifrət etməyə görə buna bağlıdır. Həmçinin də insanın əməli onun sevgi və iradəsinin əməlinə bağlıdır.

Bəzən görürsən ki, insanlar ləzzət almağı qəsd edirlər. Lakin bu ləzzətin ardınca nə kimi ağrıların gəldiyini isə düşünmürlər. O, kimsə bilmədiyi yerdən nəfsinə ağrı gətirir. Elə zənn edir ki, onun hasil olması ilə ləzzət tapacaq. Elə şeylə qəlbinə şəfa gətirmək istəyir ki, onun ardınca qəlbinə sonsuz xəstəlik gəlir. Bu da baxışları qısa olanların fikirləridir. O kimsələr ki, baxışları yalnız bu dünyayadır. Dünyanı axirətdən üstün tutanların işi belədir. Onlar işi tuturlar ki, burada ləzzət vardır, lakin aqibətini fikirləşmirlər. Ağlın xüsusiyyəti isə aqibəti fikirləşəndir. İnsanların ən ağıllıları da axirəti (əbədi ləzzəti) bu fani dünya ləzzətindən üstün tutanlardır. Səfeh insan isə əbədi bir neməti dünyəvi şeylərə dəyişəndir. Dünyada olanlar isə tez qurtarandır. Sələflər deyirlər: "Mən ağıllı insanların səy etdikləri şeylər barəsində fikirləşdim. Fikirləşdim ki, ağıllı insanlar nə kimi şeylərə səy göstərirlər. Gördüm ki, bunların istəkləri birdir. Lakin əldə etmək yolları müxtəlifdir. Mən gördüm ki, onların hər biri dərdlərini, qəmlərini, kədərlərini uzaqlaşdırmaq üçün səy göstərirlər. Gördüm ki, kimisi bu dərd-qəmi özündən yemək-içməklə, kimisi ticarət və qazanmaqla. kimisi şəhvətini söndürməklə, kimisi evlənməklə, kimisi musiqi ilə, kimisi oyun, əyləncə ilə uzaqlaşdırır. Bunların tələb etdikləri ağıllı insanların istədikləri şeylərdir. Lakin bu yollardan heç biri onları o, istədikləri şeyə çatdırmır. Bunların çoxu o, şeyin ziddidir. Mən bu yolların içərisində o şeyə çatdıran yalnız bir əməl gördüm. Allaha yönəlmək, Allahın razılığını hər bir şeydən üstün tutmaq. O, şeylərdə ləzzət olsada onlar ani keçici şeylərdir. Yenə də bunların ardınca qəm-kədər, bədbəxtçilik gəlir. Əgər insan iman yolunu tutarsa, o, uca bir şeyi əldə edər. Əgər bəndə üçün bu iman hasil olarsa, demək hər bir şey onun üçün hasil olmuşdur. Əgər bu yoxa çıxarsa, onda hər bir şey də boş şeydir. İnsanı bu xoşbəxtçiliyə, səadətə çatdıran bu bir yoldur. Əgər insan bu şeyi yeməkdə, içməkdə, şəhvətdə axtararsa onda o, kimsə heyvandan heç bir şey ilə fərqlənmir. Hətta heyvan bu işlərdə ondan üstündür. Çünki, heyvandan çox yeyən, içən, yatan və həmçinin şəhvətdə də heyvandan çox məşğul olan yoxdur. İnsan mütləq fərqlənməlidir; ***"Mömin olub yaxşı işlər görən kişi və qadına xoş həyat nəsib edəcək və etdikləri yaxşı əməllərə görə mükafatlarını verəcəyik".*** *(ən-Nəhl 97).* Hamı xoş həyat axtarır. Kafir, fasiq, mömin və

s. Lakin Allah xoş həyatı imanda və saleh əməldə qoymuşdur. Belə bir insan xəstəlik anında da, müsibətdə də xoş həyat içindədir. Bu da yalnız möminə xasdır.

***Sevilən İki Qismdir:*** **1)** Öz-özlüyündə sevilən. **2)** Başqası üçün sevilən. Allahdan qeyri sevilən hər bir şey başqası üçün sevilən adlanır. Özlüyündə sevilən Allahdan başqa heç kəs yoxdur. Allahdır I ki, özlüyündə sevilir. Allahdan qeyri sevilən hər bir şey və ya hər bir kəs bu məhəbbətə tabedir. Allahın mələklərini, peyğəmbərlərini, salehlərini sevmək Allaha olan sevgiyə bağlıdır. Allahın tələb etdiyi sevgidir ki, əgər Allahı sevirsənsə mələklərini, peyğəmbərlərini də sevməlisən. Allahı sevmək onun sevdiyi şeyləri də sevməyi tələb edir. O şeylər özlüyündə müstəqil olaraq sevilmir. Allah sevir deyə sevirik. Bil ki, zatına görə sevilən yalnız tək olan Allahdır. İnsanda nifrət Allahın sevdiyi şeylərə zidd olduğuna görə artır. O şeylər ki, Allahın sevgisinə müxalifdir, Allah sevmir, nə qədər nifrət edirsə sən də bir o, qədər də ona nifrət etməlisən. Bir var fasiq müsəlman, bir də var kafir. Kafir nifrət olunmalıdır. Çünki, kafirdə sevilən bir yer yoxdur. Əksinə ona nifrət edilir. Fasiq müsəlmana isə onun asiliyinə görə nifrət edilir, imanına görə isə sevilir. Bu da düzgün və ədalətli bir tərəzidir ki, bununla dost və düşmən bilinir. Elə bir kimsə vardır ki, Allahın xoşlamadığını sevir, Allahın sevdiyini isə xoşlamır. Artıq bilirik ki, bu kimsə Allahın düşmənidir. Elə kimsələr də vardır ki, Allahın sevdiyini sevir, xoşlamadığını isə sevmir. Belə bir kimsə Allahın dostlarındandır. Allahın dostluğuna çatmaq da nədən ibarətdir? Allahın sevdiyi şeylərə müvafiq olmaq, onun qəzəbləndiyi şeylərə müxalif olmaq. İbn Teymiyyə Σ deyir: "Sevən və nifrət edilən üç yerə bölünür. **1)** Bütövlükdə sevilən mömin. **2)** Bütövlükdə nifrət edilən kafir. **3)** Yarı sevilən və nifrət edilən fasiq müsəlman.

***Allahdan Qeyri Sevilən Də İki Qismdir:*** **1)** Sevən sevdiyinə çatdığına görə ləzzət alır. **2)** Onunla ağrı çəkir lakin o, ağrıya sevdiyinə çatdığına görə dözür. Bunun da misalı xoşlamadığı dərmanı içən insana bənzəyir ki, dərman xoşuna gəlməsə də belə sonda şəfa olduğuna görə içir; *"(Allahın düşmənlərinə qarşı)* ***vuruşmaq xoşunuza gəlmədiyi halda, sizə vacib edildi. Bəzən xoşlamadığınız bir şey sizin üçün xeyirli, bəzən də xoşladığınız bir şey sizin üçün zərərli ola bilər.*** *(Onu)* ***Allah bilir, siz biməzsiniz".*** *(əl-Bəqərə 216).* Allah bu ayədə bizə xəbər verir ki, döyüşmək xoşunuza gələn bir şey deyildir. Lakin bu döyüşmək onlar üçün xeyirlidir. Nəyə görə? Daha mənfəətli, sevimli bir şeyə çatdırdığına görə. Nəfs isə daima rahatçılığı və arxayınçılığı sevir. Görürsən ki, dünyəvi işlərdə də insanlar onun ardıyca ləzzət gəldiyinə görə ağır və xoşagəlməz işlərə dözürlər. Hətta o ləzzət davamlı olmasa da belə. Buna görə də bu kimi işlər dörddür. **1.** Elə bir işdir ki, nəfs də xoşlamır və nəticəsi də xoşa gəlməzdir. **2.** Elə bir işdir ki, xoşa gəlməzdir lakin nəticəsi sevimli bir şeyə çatdırır. **3.** Elə bir işdir ki, həm xoşa gələndir, həm də nəticəsi də sevimli bir işə çatdırır. **4.** Elə bir işdir ki, xoşa gələndir, lakin nəticəsi isə xoşgəlmaz bir şeyə çatdırır.

Nəfsə gəldikdə nəfs özünə yaxın olanı istəyir (dünyəvi işləri). Ağıla və imana gəldikdə isə daha mənfəətli olanı və daha əbədi olanı üstün tutur. Qəlb də bunların ikisi arasındadır. Gah buna yönəlir, gah da digərinə. Ağıl və iman daima insanı ***Hayyə Aləl Fələh*** – xoşbəxçiliyə çağırır. Buna görə də insanda şəhvət gücləndiyi zaman nəfsinə deyir ki: "Ey nəfs səbr et! Bu çətinliklər müəyyən bir vaxtdır. Sonra qurtaracaqdır". Bu da ağıllı, imanı güclü olan insanın mövqeyidir.

## HƏR BİR ƏMƏLİN KÖKÜ VƏ QAYNAĞI MƏHƏBBƏTDİR (İSTƏR HAQQ, İSTƏR BATİL OLSUN)

Əgər hər bir əməlin kökü və qaynağı sevgidirsə, onda dini əməllərin də əsası Allah və Onun Rəsulunu ρ sevməkdir. Həmçinin də dini sözlərin də əsası Allah və Onun Rəsulunu ρ təsdiq etməkdir. İradə, istək Allah və Onun Rəsuluna olan sevginin kamilliyinə və ya insanda olan şübhələr təsdiqin kamilliyinə mane olur. Bu da insanın imanının əslinə ziddir. İmanı zəiflədir. İmanın əslinə, təsdiqin də kamilliyinə zidd olan iradə, istək güclənərsə artıq bu küfrə çevrilir. İnsanda olan qətiyyətə yorğunluq, zəiflik gətirir. İnsanın Allah üçün sevməsi yalnız nifrətlə kamilləşir. İnsanda tək sevgi deyil, həmçinin nifrət də olmalıdır. İbarihimin Allaha Xəlil olması du düşmənçiliyi həqiqi surətdə həyata keçirdikdən sonra ortaya çıxdı. Nə vaxt Allah üçün sevmək olur? Allahdan qeyri ibadət olunanları uzaqlaşdırmaqla, nifrət etməklə olur; ***"İbrahim və onunla birlikdə olanlar sizin üçün gözəl örnəkdir. O, zaman onlar öz qövmünə belə demişdilər: "Şübhəsiz bizim sizinlə və sizin Allahdan başqa ibadət etdiklərimizlə heç bir əlaqəmiz yoxdur. Biz sizin dininizi inkar edirik. Siz bir olan Allaha iman gətirməyincə bizimlə sizin aranızda həmişə ədavət və nifrət olacaqdır".*** *(əl-Mumtəhinə 4).* ***"İbrahim*** *(Lə İləhə İlləllah)* ***kəlməsini öz nəsli arasında həmişəlik qalan bir söz etdi. Bəlkə qayıdalar".*** *(əz-Zuxruf 28).* İbrahim υ Allah üçün sevməyi və Allahdan qeyri ibadət olunan hər bir şeydən uzaq olmağı özündən sonra bir kəlimə olaraq qoydu ki, özündən sonra gələn hər bir Peyğəmbər bunu götürsün və özündən sonrakılara ötürsün. Bu da ***Lə İlə İlləllah*** kəliməsidir. Bu da o kəlimədir ki, həniflərin imamı olan İbrahim υ Qiyamət gününə qədər buna tabe olanlara miras qoymuşdur. ***Lə İlə İlləllah*** elə bir kəlimədir ki, göylər və yerlər onunla durur. Bunun üçün Allah bütün məxluqatı yaratdı. Bunun üçün din qurulmuş və qiblə təyin edilmişdir. Cihad qılıncları bunun üçün qaldırılmışdır. Allahın bəndəsi üzərində xalis haqqıdır. Bu elə bir kəlimədir ki, qanı, malı, zürriyəti qoruyan bir kəlimədir. Bu kəlimə qəbir və Cəhənnəm əzabından qurtaran bir kəlimədir. Yalnız Cənnətə bu kəlimə ilə daxil olmaq olar. Kim bu kəndirdən yapışmasa, Allaha çata bilməz. Salamatçılıq diyarının açarıdır. Bu kəliməyə görə insanlar bədbəxtlərə və xoşbəxtlərə bölünmüşlər. Qəbul olunana və qovulana bölünmüşlər. Bununla küfr diyarı iman diyarından ayrılmışdır.

Nemət diyarı bədbəxçiliyin və alçağlığın diyarından seçilmişdir. Fərzi və sünnəni daşıyan əsas dayaq da elə budur. Kimin son kəliməsi ***Lə İləhə İlləllah*** olarsa Cənnətə daxil olar. Bu kəlimənin sirri Allahı təkləşdirməkdir: Sevgidə, qorxuda, ucaltmaqda, təzimdə, ümiddə, təvəkküldə, rəğbətdə, Allhdan qeyri sevilən hər bir şey Allahın məhəbbətinə tabe olaraq sevilir. Müstəqil olaraq sevilmir. Müstəqil olaraq yalnız Allah sevilir. Həmçinin də Allaha olan sevginin artmasında vasitə olduğuna görə sevilir. Ona yönəlmək, ondan istəmək (övlad, şəfa və s), Ona nəzir demək, Ona qurban kəsmək (filankəsin cəddi üçün, filankəsin pirinə yox), Ona tövbə etmək, Ona səcdə etmək, çətinlikdə də, sevincdə də Ondan istəmək. Yəni ***Lə İləhə İlləllah*** kəliməsini həqiqi surətdə həyata keçirmək budur. Buna görə də Allah həqiqi surətdə şəhadət gətirən insana Cəhənnəmi haram etmişdir.

İnsanlardan elələri də vardır ki, onların şəhadəti ölüdür, elələri də vardır ki, onların şəhadəti yuxuludur. Oyadanda oyanır. Elələrinin də şəhadəti durmağa daha yaxındır. İnsanın qəlbində olan şəhadət ruhun bədəndə olması kimidir. Elə ruh vardır ki, ölüdür, eləsi də vardır ki, xəstədir ölümə yaxındır. Elə ruh da vardır ki, həyata daha yaxındır. Elə ruh da vardır ki, sağdır və bədənin bütün xeyirlərini yerinə yetirir. Peyğəmbər ρ buyurdu: "Mən elə bir kəlimə bilirəm ki, hər hansı bir kimsə ölüm ayağında onu söyləyərsə onun ruhu üzərinə bir ruh verilər. Bu da ***Lə İləhə İlləllah*** kəliməsidir". Deməli ruhun həyatı onda olan o kəlimənin həyatına görədir. Bu kəlimə nə qədər güclü olarsa, ruh da bir qədər güclü olar. Bədənin həyatı onda olan ruha görədir. Hər kəs bu kəlimə üzrə ölərsə, o kimsə Cənnətdə gözəl nemətlər içərisində olar. İnsanın Allahı sevməsi, Ona qovuşmaq istəyi, Onunla ünsiyyətdə olmaq istəyi onun dünyadakı ruhunun Cənnətidir. Əgər bu sadalananlar bir kimsənin bu dünyada Cənnəti olarsa, şəkk yoxdur ki, Qiyamət günü də onun düşəcəyi yer Cənnətdir. Əgər bir kimsə bu kimi şeylərdən məhrum olarsa, şəkk yoxdur ki, Qiyamət günü də o, kimsə Cənnətə düşməkdən məhrum olar. Əbrarlar bu dünyada da Cənnətdədirlər, o dünyada da. Hətta bu dünya onlar üçün dar və sıxıntılı olsa da belə. Facirlər isə bu dünyada da Cəhənnəmdədirlər, o dünyada da. Bu dünya onlar üçün geniş və dəbdəbəli olsada belə. ***İnnəl Əbrara Ləfi Nəim Və İnnəl Fuccəra Ləfi Cəhim***

İxlaslı olan mömin bu dünyada insanlar içərisində xoş yaşayışı olan kimsədir. Ağıl tərəfdən də ən böyük nemət içində olan kimsədir. Hər tərəfdən də geniş qəlbi olan muxlis (ixlaslı) mömindir. Bu da axirət Cənnətindən əvvəl dünyada olan Cənnətdir. Çünki insan nəyi çox sevirsə onu da çox xatırlayır. Bil ki, qəlbində olan Allah sevgisi daha çox olsaydı, onu da çox xatırlayardın. Həmçinin də o ruh Allahdan qeyrisinə yönəldiyinə, qapandığına görə sərxoşluğuna qapanmış sərxoşun vəziyyətdindədir. Sərxoşun malı, uşaqları, ailəsi yansa da belə, o öz sərxoşluğuna qapandığına görə sevdiklərinin yandığını hiss etmir. Ayıldıqda, sərxoşluq pərdəsi ondan qalxdıqdan sonra o kimsə öz halını, ağrılarını bilib, dadır. İnsanın halı da belədir. Öləndə isə

ayılır və halını bilir. Onda da artıq əzab qat-qat olur. Müsibətə qərq olan insan bu müsibətin nə ilə əvəz olunmasını umur. Əgər insan müsibətə düçar olursa və onun müsibətinin heç bir əvəzi yoxdursa, onda onun halı necə olacaqdır. Çünki, axirət əzabı əvəz olunmazdır. Artıq insan o vaxtı ayılır və əzabının nə qədər şiddətli olduğunu bilir. Sələflər deyirlər: "İnsan yuxudadır, öləndə isə ayılacaqdır". Bu dünyada olan hər bir şeyin əvəzi vardır, lakin axirətdə olanların isə əvəzi yoxdur. Allahın haqqını zay etsə, onun heç bir əvəzi yoxdur. Ey Adəm övladı! Mən səni ibadət üçün yaratdım, oynama. Mənə itaət etsən məni taparsan. Sən məni tapsan hər bir şeyi taparsan. Məni ötürsən hər bir şeyi ötürərsən. Mən sənə hər bir şeydən də sevimliyəm".

## MƏHƏBBƏTİN MÜXTƏLİF NÖVLƏRİ

Məhəbbətin altında da müxtəlif növləri vardır; ***"Ey iman gətirənlər! Sizdən hər kim dinindən dönsə, Allah onun əvəzinə Özünün sevdiyi və Onu sevən, möminlərə qarşı mülayim, kafirlərə qarşı isə sərt olan, Allah yolunda cihad edən və tənə edənin tənəsindən qorxmayan bir camaat gətirər. Bu, Allahın lütfüdür, onu istədiyinə verər. Allah hər şeyi Əhataedəndir, Biləndir".*** *(əl-Maidə 54).* ***"İnsanlardan elələri də vardır ki, Allahdan qeyrilərini Ona tay tutur, onları da Allahı sevdikləri kimi sevirlər. İman gətirənlərin isə Allaha olan sevgisi daha güclüdür. Kaş zülm edənlər əzabı gördükləri zaman bütün qüdrət və qüvvətin Allaha məxsus olduğunu və Allahın şiddətli əzab verdiyini görəydilər".*** *(əl-Bəqərə 165).* Məzəmmət olunan məhəbbətin ən əzəmətlisi Allahla yanaşı başqa birisini Allah kimi sevməkdir ki, bu məhəbbətdə olan şirkdir. Bu elə bir məhəbbətdir ki, sevən insan sevdiyini Allahla yanaşı tutur. Allah kimi sevir. Bəyənilən məhəbbətin növlərindən ən əzəmətlisi isə Tək olan Allahı sevmək və sevdiklərini sevməkdir. Allahı və Allahın sevdiklərini sevmək səadətin, xoşbəxtliyin əsası və başıdır. İnsan əzabdan yalnız bununla qurtula bilər. Bu məzəmmət olunan məhəbbətdə olan şirk isə bədbəxtçiliyin əsasıdır. O kəslər ki, tək olan Allaha ibadət edir və Onu da sevirlər, onlar Cəhənnəmə daxil olmazlar, olsalar da belə orada əbədi qalmayacaqlar. Qurani-Kərim də bu məhəbbəti əmr etmək və bu məhəbbətin tələb etdiyi şeyləri əmr etmək üzrədir. Quran ayələri Allahla yanaşı başqasını sevməkdən çəkindirmişdir. Quran bu haqda təfsilatı ilə xəbər verərək həm Allahı sevənin, həm də Allahla yanaşı qeyrisini sevənin dünyada, bərzəxdə və axirətdə olacaq aqibəti barəsində xəbər vermişdir.

Peyğəmbərin ρ dəvətinin əsası Tək olan Allaha ibadət etməkdir. Elə bir ibadətdir ki, Allahı sevməyi kamil şəkildə özündə əhatə edən ibadət, həmçinin də Allah qarşısında kamil şəkildə itaətkar olmaq, zəlil olmaq və Allahı təzim etməkdir. Bunun da tələb etdiyi şeylər itaət və təqvadır. Əbu Hureyra ψ rəvayət edir ki, Rəsulullah ρ

buyurdu: "Sizdən hər hansı bir kimsə məni uşaqlarından, valideyinlərindən və cəmi insanlardan çox sevmədikcə iman etmiş olmaz (bütün bunlardan sevimli olmadıqca)".[299] Əgər bu sevgi Allahın Rəsulunu sevənin dərəcəsidirsə bəs onda Rəsulu ρ göndərəni sevməyin dərəcəsi necədir? Bəs Allahı sevmək nə cür olmalıdır? Allahı övladlarından, valideyinlərindən, cəmi insanlardan, qulağından, gözündən, nəfsindən də daha çox sevməlidir. Allah ona hər bir şeydən də sevimli olmalıdır. İnsan bir tərəfdən sevilə bilər. Digər tərəfdən isə sevilməyə də bilər. Lakin Allah yalnız zatına görə hər tərəfdən sevilir. Buna görə də Uluhiyyət yalnız Ona yönəlməlidir. Hər bir canlının iradəsi və sevgisi vardır. Hər bir canlının da özünə görə əməli vardır. Hər bir canlı hərəkət etdikdə onun hərəkətinin əsası (onu hərəkətə gətirən) sevgisi və iradəsidir. Bu kimi şeylərin aqibəti bütün bunlar onu yaradan üçün olarsa, o zaman yaxşı ola bilər. Necə ki, onun yaradılışı da tək olan Allahın[300] yaratması ilədir; ***"Əgər yerdə və göydə Allahdan başqa tanrılar olsaydı, onların ikisi də** (müvazinətdən çıxıb) **pozulardı. Ərşin sahibi olan Allah müşriklərin** (Ona) **aid etdikləri sifətlərdən tamamilə uzaqdır!"*** *(əl-Ənbiya 22).*

# MƏHƏBBƏTİN TƏSİRİ, ONA TABE OLAN ŞEYLƏR VƏ ƏHKAMLARI

---

[299] əl-Buxari 15, Muslim 44, İbn Məcə 67, əd-Dərimi 2741, Musnəd 3/ 207, 275, 278.

[300] Buna görə də Allah buyurur ki, yerlərdə və göylərdə Allahdan başqa ilahlar olsaydı onların nizamı pozulardı. Allah buyurur ki, onların ikisi də müvazinətini itirərək yox olardılar. Allah göyləri və yerləri pozulmuş halda da saxlaya bilər. Əgər onların məbudu tək olan Allah deyilsə, onlar düzgün şəkildə ola bilməz. Əgər aləmin, kainatın iki ilahı olsaydı, şəkk yoxdur ki, onların nizamı pozulardı. İki ilah olsaydı biri digərini məğlub etmək istəyərdi. Ona üstün olmaq istəyərdi. Özü tək ilah olamaq istəyərdi. Bu da Uluhiyyətin kamilliyinə ziddir. Əgər ilahlardan biri digərini məğlub edərsə tək ilah olar. Məğlub olan isə ilah sayılmır. Onlardan hər biri öz yaratdıqlarını ayırar, hər biri o, biri üzərində üstün olmağa çalışar. Əgər belə olarsa bu da göylərin və yerlərin arasında olanların işlərinin pozulmasını tələb edir. Necə ki, bunu biz dünyada da müşahidə edə bilərik. Bir dövlətin iki hökmdarı olarsa, bu da dövlətin pozulması deməkdir. İbn Qeyyim Σ deyir: "Düşmənlər heç vaxt İslama tamah göstərməyiblər. Yalnız o. vaxt ki, müsəlmanların padşahları çoxalıb, biri öz torpağını ayırdıqdan sonra düşmənlər tamah göstəriblər. Bir xəlifə olduqda isə tamah heç vaxt göstərməyiblər. Göylərin və yerlərin düz olması, saleh olması, bütün yaradılmışların işlərinin nizamlı şəkildə olması açıq-aydın dəlildir ki, Allahdan başqa ibadətə haqqı olan ilah yoxdur. Bütün mülk də Onundur. Dirildən də, öldürən də Odur. Yuxarıdan aşağıya doğru başlayaraq Allahdan qeyri bütün ilahlar batildir; ***"Allah heç bir övlad götürməmişdir. Onunla yanaşı heç bir tanrı yoxdur. Əgər belə olsaydı, onda hər bir tanrı əlahiddə öz yaratdıqları ilə gedər və onların bir qismi** (dünyadakı padşahlar kimi) **digərinə üstün olmağa çalışardı. Allah müşrikləri** (Ona) **aid etdikləri sifətlərdən tamamilə kənardır".*** *(əl-Muminun 91).* ***"Əgər yerdə və göydə Allahdan başqa tanrılar olsaydı, onların ikisi də** (müvzinətdən çıxıb) **pozulardı. Ərşin sahibi olan Allah müşriklərin** (Ona) **aid etdikləri sifətlərdən tamamilə uzaqdır!"*** *(əl-Ənbiya 21-22).* ***"Siz olduqca pis bir iş tutdunuz. Bundan az qaldı göylər parçalansın, yer yarılsın və dağlar yerindən qopub uçsun – Mərhəmətli Allaha övlad isnad etdiklərinə görə. Mərhəmətli Allaha özünə övlad götürmək yaraşmaz. Göylərdə və yerdə olanların hamısı Mərhəmətli Allahın hüzuruna ancaq bir qul kimi gələcək".*** *(Məryəm 89-93).* Allahdan qeyri ibadət etdiyiniz ilahlar da (Peyğəmbərlər, övliyalar, pirlər, seyyidlər) onlar da Mənim qullarımdır. Onlar da sizin kimi Mənim rəhmətimi umurlar və əzabımdan da qorxurlar. Belə olduğu halda nəyə görə Məni buraxaraq onlara ibadət edirsiniz.

İstər bəyənilən, istər məzəmmət olunan məhəbbət olsun onun da əhkamları və təsiri vardır. Xoşa gələn bəyənilən məhəbbət odur ki, sahibi üçün dünyada və axirətdə də mənfəət verən şeyi cəlb edir. Bu da səadətin ünvanı olan məhəbbətdir. Bunun ziddi də sahibi üçün dünyada və axirətdə də zərər verən şeyləri gətirir. Bu da bədbəxtçiliyin ünvanıdır. Ağıllı olan kəs özünü bədbəxt edən bir şeyi seçməz. Onun bu kimi şeyləri etməsi cəhalət və zülm tərəfdən olur. Bəzən özünə zərər verən, mənfəət verməyən şeyləri istəyir. Bu da insanın özünə olan zülmüdür. Belə bir kimsə ya sevdiyinin halını bilmir. Sevgisində olan zərərləri bilmədən onu sevir. Bu da öz nəfsi-istədiyinə bilmədən tabe olanın halıdır. Bəzən də bilir ki, bu sevgidə zərərlər vardır. Lakin nəfsi-istədiyini bilməsindən üstün tutur. Bəzən də onun məhəbbəti iki işdən yaranır: **1)** Fasiq etiqaddan. **2)** Məzəmmət olunan nəfsi-istəkdən. Bu da zənninə və nəfsi istəklərinə tabe olanın halıdır.

Məhəbbətin öz növü və ona tabe olanın da öz hökmü vardır. O, bəyənilən məhəbbət səadətdir. Xoşbəxtçiliyin ünvanıdır və ona tabe olan hər bir şeyin halıda belədir. Məzəmmət olunan məhəbbətin nəticələri onun sahibi üçün zərərlidir. Onu Rəbbindən uzaqlaşdıraraq xüsrana salır. Bu da hər bir itaətdən, günahdan yaranan hər bir şeyin nəticəsi də belədir. İtaətdən yaranan hər bir şey sahibi üçün Allaha yaxınlaşdıran bir əməldir. Günahdan. Acizlikdən və üsyandan törənən hər bir şey isə sahibi üçün bir xüsran və Allahdan uzaqlaşmaqdır. ***"Həqiqətən Allah yaxşı işlər görənlərin mükafatını zay etməz. Onların sərf etdikləri elə bir az-çox xərc, keçdikləri elə bir vadi olmaz ki, Allah*** *(Qiyamət günü)* ***əməllərinin qarşılığını daha gözəl versin deyə, əvəzində onlara*** *(savab)* ***yazılmamış olsun!".*** *(ət-Tövbə 120-121).* Onların itaətlərindən yaranan nəticə onlar üçün saleh əməl yazılır (Allah yolunda çıxdıqları səfərdə başlarına gələn hər bir çətinlikdə aclıq, susuzlu, yorğunluq onlar üçün savabdır). İkinci ayədə isə onların etdikləri saleh əməlin özü onlar üçün yazılır. Bunlar arasında fərq nədir? Birinci əməllər onların fellərindən deyildir. İtaətdən törənən bir şeydir. Buna görə də onlara saleh əməl olaraq yazılır. İkinci isə onların öz əməlləridir. Bu da onlara savab olaraq yazılır.

## MƏHƏBBƏT VƏ İRADƏ HƏR BİR DİNİN ƏSASIDIR

Məhəbbət hər bir əməlin əsası olduğu kimi, hər bir dinin də (istər haqq, istər batil olsun) əsasıdır. Çünki, dinin özü zahiri və batini əməllərdən ibarətdir. Hər bir əməlin də əsası iradə və məhəbbətdir. Din – itaət, əxlaq, səadət və adət deməkdir. İnsan itaətə daima əməl etdikcə din onun əxlaqına və adətinə çevrilir; ***"Doğrudan da sən böyük bir əxlaq sahibisən!".*** *(əl-Qələm 4).* Əxlaq din kimi təfsir edilmişdir. Həmçinin də zəlillik və itaətkarlıq mənaları da vardır. Həmçinin Allah Qiyamət gününü din günü adlandırır. Çünki, Allah o gün insanları əməllərinə görə hesaba çəkəcəkdir; ***"Madam***

***ki siz iddianıza görə haqq-hesab olunmayacaqsınız və doğru danışanlarsınız, onda, o canı geri qaytarın?"*** *(əl-Vaqiə 86-87).* Bu xitab ölüm anında olan kimsənin yanındakılara yönəlmişdir. Əgər siz zəlil olan qul deyilsinizsə, onun ruhunu geri bədəninə qaytarın. Həmçinin də əgər siz məğlub olan deyilsinizsə, qul deyilsinizsə, qiyamət günü hesaba çəkilməyəcəksinizsə, onun ruhunu qaytarın. Çünki, onlar Qiyamət gününü inkar edirdilər. Onlar dirilməyi, haqq-hesabı inkar etdiklərinə görə artıq Rəbblərinə küfr etdilər. Bununla da Allahın Rububiyyətini, qüdrətini, hikmətini inkar etmiş olurlar. Ya onlar etiraf etməlidirlər ki, onların üzərində mütləq hakim Allah vardır, hər bir şeyi idarə edən, istədiyi vaxt öldürən və dirildən, qadağa qoyan, cəza və savab verən Allahdır. Əgər bunları etiraf edirlərsə, dirilməyi də etiraf etməlidirlər. Əgər inkar etsələr onda etiraf etməlidirlər ki, onlar məhkum olunan qul deyillər, onları idarə edən Rəbləri yoxdur. Əgər belədirsə, onda onlar ölümü özlərindən uzaqlaşdıra bilirlərmi? Ruhu qərarlaşan yerinə qaytara bilirlərmi? Bu da onları ən güclü şəkildə aciz qoymaqdır. Görün onların acizliyi necə üzə çıxdı. Bu ayə Allahın Rububiyyətinə, təkliyinə, qulları üzərində mütləq hakim olmasına dəlalət edir.

***Din İkidir:*** **1.** Şəri din. **2.** Hesab dini. Bunların ikisi də Allaha məxsusdur. Hər ikisinin də əsası məhəbbətdir. Əgər Allah bir şeyi əmr edirsə, deməli Allah onu sevir, Allah bir şeyi qadağan edirsə, deməli o şeyi sevmir, ona nifrət edir. İbn Abbas ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Rəbb olaraq Allahdan, din olaraq İslamdan və Rəsul olaraq Muhəmməddən razı olan kimsə imanın şirinliyini tapar".[301] Bu din də məhəbbət üzərində qurulub. Həmçinin, Allahın cəza (haqq-hesab) dini də yaxşılıq edəni mükafatlandırmaq, pislik edəni cəzalandırmağı əhatə edir. Bütün bu işlərin hər biri Allaha sevimlidir. Çünki, bunlar Allahın ədaləti və fəzilətidir. Allah ədalətinə görə cəzalandırır, rəhmətinə görə mükafatlandırır. Bunlar Allahın kamil sifətləridir, Allah da öz sifətlərini sevir. Həmçinin də kim Allahın İsim və Sifətlərini sevirsə Allah da onu sevir. Bu dinin də hər biri Allahın düzgün yoludur. Əmr etməkdə də, qadağa qoymaqda da, savab verməkdə və cəzalandırmaqda da Allahın yolu haqdır; ***"Biz ancaq onu deyə bilərik ki, bəzi məbudlarımız səni bəlaya düçar edib". O dedi: "Həqiqətən, mən Allahı şahid çağırıram, siz də şahid olun ki, mən sizin şərik qoşduqlarınızdan uzağam. Ondan başqa tapındıqlarınızın hamısından uzağam. Hamılıqla mənə qarşı hiylə qurun və mənə heç möhlət də verməyin. Mən, Rəbbim və Rəbbiniz olan Allaha təvəkkül etdim. Elə bir canlı yoxdur ki, Allah onun kəkilindən tutmuş olmasın. Həqiqətən, Rəbbim ədalətlidir".*** *(Hud 54-56).* Hud Rəbbinin yaratmaqda, əmr verməkdə, savab və cəzalandırmaqda, hökm verməkdə, qədərdə haqq olduğunu bilirdi. Bütün insanlar qarşısında söyləyərək: "Siz şahid olun ki, mən sizin şirk qoşduqlarınızdan uzağam. Siz hamınız mənə hiylə qurun, sonra da möhlət də verməyin. Mənim Rəbbim olan, sizin də Rəbbiniz olan Allaha təvəkkül etdim. Hər

[301] Muslim 34.

bir şeyin ixtiyarı Onun Əlindədir. Mən başqasından necə qorxa bilərəm ki, onun da ixtiyarı Allahın Əlindədir. O, da Allahın hökmü altındadır". Ümumən Allahın idarəçiliyi adillikdən və fəzilətdən kənara çıxmır. Allah bir kimsəyə ruzi verərsə, ona ikram edərsə, onu qaldırarsa, onu müvəffəq edərsə bu Allahın fəziləti və rəhmidir. Bir kimsənin də ruzisinin qarşısını alarsa, onu alçaldarsa, zəlalətə salarsa, bədbəxt edərsə bu Allahın ədaləti və hikmətidir. Allah bunların ikisində də düz etmişdir.

## ALLAHA OLAN SEVGİNİ ARTIRMAĞIN YOLLARI

İbn Teymiyyə Σ Allaha qarşı olan sevgini artırmağın bir neçə yolunu göstərmişdir: **1.** Qurani-Kərimi oxuyub onun mənaları və məzmunu haqqında ***Tədəbbür*** – oxumaq, öyrənmək və başa düşmək. İbn Məsud ψ rəvayət edir ki: "Bizdən birimiz on ayə öyrəndikdən sonra, onların mənasını dərk edib əməl etmədikcə başqa ayə öyrənməzdik. Elmlə əməli birləşdirərdik".[302] **2.** Fərz əməllərlə yanaşı Allaha nafilə ibadətlərlə yaxınlaşmaq. Əbu Hureyra ψ rəvayət edir ki, Allah Elçisi ρ demişdir: "Allah buyurur: "Kim Mənim dostumla düşmənçilik edərsə, Mən ona hərb elan edərəm. Qulumun Mənə sevimli olan və onun vasitəsilə Mənə yaxınlaşdığı ən gözəl əməl ona vacib buyurduğum əməllərdir. Qulum nafilə ibadətləri yerinə yetirməklə Mənə o qədər yaxınlaşar ki, Mən onu sevərəm. Onu sevdiyim təqdirdə onun eşidən qulağı, görən gözü, tutan əli və yeriyən ayağı olaram. Məndən diləsə, ona dilədiyini verərəm, sığınacaq istəsə, ona sığınacaq verərəm. Mən görəcəyim bir işdə, ölmək istəməyən möminin canını aldıqda tərəddüd etdiyim kimi heç bir şeydə tərəddüd etmirəm. Çünki Mən ona yamanlıq etmək istəmirəm".[303] **3.** Hər bir vəziyyətdə Allahı dildə, qəlbdə və sözdə tərif etmək. Bəndənin sevgisinin dərəcəsi məhz bundan aslıdır. **4.** O, şeyə qarşı olan sevgiyə baxmayaraq öz sevdiklərini Allahın sevdiklərinin yanında ikinci plana qoymaq. **5.** Quran və Sünnədə keçən Allahın gözəl İsimlərini öyrənmək, onların mənalarını başa düşməkdə və onlarla ibadət etməkdə istəkli və həris olmaq. İbn Teymiyyə Σ deyir: "Mətləblərin ən ucası və qayələrin ən böyüyüdür. Nəfslərin bilmək istədikləri və yönəldikləri şeylərin içərisində ən şərəflisidir. Allahın İsim və Sifətlərini bilmək hidayətin əsasıdır". **6.** Qəlbin Allah qarşısında zəlil olması. **7.** Gecənin son üçdə birində Rəbbinin Kitabını oxuyaraq bağışlanma diləmək və tövbə etmək. **8.** Allahın verdiyi bütün gizli və aşkar nemətləri etiraf etmək; ***"Əgər şükür etsəniz sizə olan nemətimi artıracağam. Yox əgər nankorluq etsəniz mənim əzabım həqiqətən də şiddətlidir".*** *(İbrahim 7).* **9.** Qəlblə Allah arasına girən hər şeydən uzaqlaşmaq; ***"De ki: "Əgər atalarınız, oğullarınız, qardaşlarınız, övrətləriniz, qəbiləniz, qazandığınız mallar, kasad olmasından qorxduğunuz ticarət, xoşunuza***

[302] İbn Kəsir 1/ 2.
[303] əl-Buxari 6021, 6502.

***gələn məskənlər sizə Allahdan, Onun Peyğəmbərindən və Allah yolunda cihad etməkdən əzizdirsə, Allahın əmri gəlincəyə qədər gözləyin. Allah fasiqləri doğru yola yönəltməz".*** *(ət-Tövbə 24).* İbn Teymiyyə Σ deyir: "Allahın Rəsulunun ρ ardınca getməyib, onun əmrlərini başqa əmrlərdən üstün tutmayıb onu sevdiyini bəyan edənlər yalan danışırlar; ***"Allaha, Peyğəmbərinə iman gətirdik, itaət etdik – deyər, bundan sonra isə onlardan bir dəstə*** *(Peyğəmbərdən)* ***üz çevirər. Belələri mömin deyillər".*** *(ən-Nur 47).*

# MƏHƏBBƏTİN DƏRMANI

Belə bir bəlaya düşməyin səbəbi insanın cahilliyindən və qəlbinin Allahdan qafil olmasındandır. Ona vacib olan isə ilk əvvəl Rəbbinin təkliyini, qoyduğu yolları, ayələrini öyrənməkdir. Bundan sonra zahiri və batini ibadətləri yerinə yetirməkdir. Çünki, ibadət etdikcə qəlbi başqasının fikri ilə məşğul olmaqdan uzaqlaşır. Belə bir xəstəliyə düşənin ixlasdan yaxşı dərmanı yoxdur. Bu elə bir dərmandır ki, Allah bunu Öz Kitabında zikr etmişdir; ***"Qadın ona meyl etmişdi. Əgər Yusuf Rəbbinin dəlilini görməsəydi, o da ona meyl edərdi. Beləcə, Biz pisliyi və çirkin əməli ondan uzaqlaşdırdıq. Həqiqətən, o, Bizim seçilmiş qullarımızdandır".*** *(Yusuf 24).* Onun uzaqlaşmasına səbəb ixlası olmasıdır. Əgər insanın qəlbi xalis olar, əməlləri Allah üçün edərsə qəlbində eşq yerləşməz. Belə bir şeylər yalnız boş bir qəlbdə yer tapır. Şair deyir ki: "Onun istəyi mənim qəlbimdə Mən onu bilməzdən əvvəl yerləşdi. Boş qəlbə təsadüf etdi və orada da yerləşdi". Eşqə düşməkdə nə dini, nə də dünyəvi xeyirlər vardır. Əksinə dini və dünyəvi zərərlər vardır:

**1)** İnsan eşqə düşəndə məxluqun sevgisi ilə məşğul olur. Onu zikr etməklə qəlbini məşğul edir. Allah sevgisi və Allahı zikr etməkdən məhrum olur. Bunların hər ikisinin də bir qəlbdə cəmləşməsi mümkün deyil. Onlardan biri digərini mütləq məğlub etməlidir. Hansı güclü olarsa, o da qəlbdə yerləşər. **2)** Eşqə düşən insan qəlbində sevdiyinə görə əzab çəkir. Allahdan qeyrisini sevən şəxs mütləq onunla əzab çəkməlidir. Yer üzündə sevəndən bədbəxt bir kimsə yoxdur. Sən onu həmişə ağlayan görərsən. Ya ayrılmaq qorxusuna görə ağlayır, ya da darıxmaq qorxusu vardır. **3)** Aşiq insanın qəlbi sevdiyinin ovcundadır. Ona əzab verir. Lakin, o kimsə eşqdən məst olduğuna görə artıq müsübəti hiss etmir. Aşiqin eşqi bağlı olan bir əsirin eşqi kimidir. **4)** Eşqə düşən insan sevdiyi ilə məşğul olduğuna görə dini və dünyəvi xeyirləri ötürür. Bundan da zərərli bir şey yoxdur. Görəsən eşqə düşən insanın dini və dünyəvi xeyirlərdən uzaqlaşması nədən bilinir? Dini işlərdə qəlb bütünlüklə Allaha yönəlməlidir. Eşqə düşən insanın qəlbi isə dağınıq olduğu üçün Allaha tam şəkildə yönələ bilmir. Dünyəvi xeyirlərə gəldikdə isə bu xeyirlər də dini xeyirlərə tabedir. Əgər insan dini xeyirlərdən uzaqlaşarsa, şübhəsiz ki, dünyəvi xeyirdən də məhrum

olar. **5)** Dünya və axirət bəlaları eşqə düşənə daha yaxındır. Səbəbləri isə; qəlb hər dəfə eşqə düşənə yaxın olarsa, onunla əlaqəsi güclənərsə, bir o qədər də insan Allahdan uzaqlaşar. Allahdan ən uzaq düşən qəlb də eşqə düşən kimsənin qəlbidir. Əgər qəlb Allahdan uzaq düşərsə, bəlalar ona yaxınlaşar. Hər tərəfdən şeytan onu yaxalayar. Əgər bir kəsi düşməni ələ alarsa, hər bir bəlanı, müsibəti ona yönəldər. Bacardığı hər bir müsibəti ona toxundurar. Onda düşməni onda yerləşən o qəlbin halı necə olar. O, qəlbin səadəti, xoşbəxtçiliyi və sevinci yalnız Allaha yaxın olmaqdadır. **6)** Eşq qəlbdə çoxalarsa sahibinin zehnini də korlayır. İnsanda vəsvəsələrin artmasına səbəb olur. Bəzən də eşq insanı dəlilərin səviyyəsinə çatdırır. O, dəlilər ki, onların ağılları korlanıb və onlar ağılları ilə hərəkət etmirlər. İnsanda ən şərəfli şey də onun ağlıdır. İnsan ağlı ilə heyvandan fərqlənir və seçilir. İnsanın ağlı yoxa çıxarsa, o kimsə danışmayan heyvanın dərəcəsinə düşər. Bəzən də heyvanın halı ondan daha yaxşı olar. Məcnunun ağlını da belə bir eşq almışdır.

## QORXUDA ŞİRK

Qorxu və Xaşiyənin[304] yalnız Allaha yönəldilməsi, yaradılmışlara bu tərzdə qorxunun hiss edilməsi qadağandır. Töhidin tamamlanmasının bir şərti də yalnız Allahdan qorxu duymaqdır. Qorxunun səbəbindən asılı olaraq qorxu və xaşiyə bəzən ibadət, bəzən şirk, bəzən də təbii ola bilər.

***Qorxunun (Xofun) Dörd Növü Vardir:*** **1.** İbadət olan qorxu: Bu yalnız Vahid və şəriksiz Allaha olan qorxudur; ***"Şübhəsiz ki, Rəbbinin hüzurunda haqq-hesabdan qorxanı iki*** *(Ədn və Nəim)* ***Cənnət gözləyir.*** *(ər-Rahmən 46).* ***"Amma kim*** *(Qiyamət günü)* ***Rəbbinin hüzurunda durmaqdan qorxmuş və nəfsi-istəyinə şəhvəti qadağan etmişsə həqiqətən də onun yeri Cənnətdir".*** *(ən-Nəziət 40-41).* Allah öz mələklərini vəsf edərək buyurur: ***"Onlar öz fövqündə olan Allahdan qorxar və özlərinə buyurulanları edərlər".*** *(ən-Nəhl 50).* ***"Allahın risalətini təbliğ edənlər Ondan qorxar, Allahdan başqa heç kəsdən qorxmazlar. Allahın çəkdiyi haqq-hesab kifayətdir".*** *(əl-Əhzab 39).*

---

[304] ***Xaşiyə*** – qorxduğu kimsənin əzəmətinin və böyüklüyünün kamilliyini bilmə əsasında yaranan qorxudur; ***"Qulları arasında Allahdan ən çox alimlər qorxar".*** *(Fatir 28).* Yəni, Onun əzəmətinin və böyüklüyünün kamilliyini bilənlər qorxar. Buna görə də Xaşiyə Xofdan daha geniş, üstün mənanı əhatə edir. Həmçinin də xaşiyə yalnız alimlərdə olur. Misal olaraq bir kişi bir nəfərdən qorxur. Lakin onun ona gücü çatıb çatmayacağını bilmir. Bu xofdur. Lakin həm qorxur, həm də bilir ki, ona gücü çatacaq bu xaşiyədir. Mömin qul Allaha qorxu ilə ümid arasında olmalıdır. İtaət halında ümid üstün gəlməlidir ki, itaəti çoxaltsın və qəbulu ümid etsin. Bir günah edəcək olursa qorxu üstün gəlməlidir ki, o günahdan qaçıb cəzasından qurtara bilsin. Bir elm adamı deyir ki: Xəstəlik halında ümid tərəfi çoxalt. Sağlam olduqda isə qorxu tərəfi çoxalt. Çünki, xəstənin qəlbi qırıqdır, ruhu zəifdir. Bəlkə də əcəli yaxınlaşmışdır və öləcəkdir. O kimsə bu halı ilə uca Allaha gözəl zənn bəsləməlidir. Sağlığında isə uzun müddət həyatda qalmağı ümid etməkdədir və buna görə də belə bir haldan qurtula bilmək üçün qorxu tərəfi üstün olmalıdır. Bir rəyə görə də qorxu və ümid eyni olmalıdır ki, ümid Allahın məkrindən səni əminliyə salmasın, qorxu da Allahın rəhmətindən ümid kəsdirməsin.

**2.** Şirk olan qorxu: Bu bəndənin hər hansısa bir şeydən Allahdan qorxduğu kimi və daha artıq qorxmasıdır; *"(Ya Muhəmməd!)* ***O, şəxsləri görmürsənmi ki, onlara*** *(vaxtı ilə)* ***"Müharibədən əl çəkin, namaz qılın, zəkat verin!"- deyilmişdir. Onlara cihad etmək vacib olduqda isə içərilərindən bir qismi Allahdan qorxan kimi və ya daha artıq insanlardan qorxuya düşərək: "Ey Rəbbimiz! Cihad etməyi nə üçün bizə vacib etdin, nə olardı ki, bizi yaxın zamana qədər*** *(öz əcəlimiz çatana qədər)* ***yubadardın" dedilər. Onlara söylə ki, dünyanın ləzzəti və faydası azdır, lakin müttəqi üçün axirət daha xeyirlidir. Sizə*** *(müttəqilərə)* ***xurma çəyirdəyindən olan nazik tel qədər belə zülm olmayacaqdır".*** *(ən-Nisa 77).* Nuhun υ qövmündəkilər dedilər: ***"Biz ancaq bunu deyirik ki, bəzi tanrılarımız*** *(onlara tapınmağımızı qadağan etdiyinə görə)* ***sənə sədəmə*** *(xətər)* ***toxundurmuşdur*** *(ona görə də ağzına gələni danışırsan). (Hud)* ***belə cavab verdi: Allahı şahid tuturam və siz də şahid olun ki, mən sizin*** *(Rabbimizə)* ***qoşduğunuz şəriklərdən uzağam".*** *(Hud 54).* Bu qorxu məzarlara və bütlərə səcdə edənlərdə olur. Özləri qorxduqları üçün (filankəsin cəddi səni tutar, şəkkə etmə və s.) Yəni, qəbirdə olanların hər hansısa bir gücə sahib olmalarından qorxmaq, onların hansısa hadisələrin törədə bilməsindən və ya nemətin qarşısını ala bilməsindən qorxmaqdır. Tövhiddə sabit olanları bununla qorxudurlar. ***"Adamlar arasında elələri də vardır ki, biz Allaha iman gətirdik – deyər, Allah yolunda bir əziyyət gördükdə isə insanların fitnəsini***[305] ***Allahın əzabı kimi qəbul edər".*** *(əl-Ənkəbut 10).* Zahirinə baxsaq bu ayənin qorxu ilə heç bir əlaqəsi olmadığını düşünərik. Lakin bu belə deyildir. Çünki onlar insanların fitnəsini, ona verdikləri əzab-əziyyəti Allahın əzabı hesab edib və onların fitnəsindən Allahın əzabından qorxduğu kimi qorxdular. Buna görə də insanların dediklərini, insanların əmrlərini Allahın əmrindən üstün tutdular.

**3.** Asilik (haram) olan qorxu: Bu bəndənin bir insandan və ya bir qrup insandan qorxaraq fərz olanı tərk etməsi, onlardan qorxaraq harama yol verməsi və bunun da ikrah həddinə çatmasıdır. Çünki bir fərzi tərk etməyə və ya bir haramı etməyə səbəb təşkil edən hər bir şey haramdır. Məzhəbinin qorxusundan, insanların qorxusundan Allahın əmrlərini pozur, Sünnənin ziddi olan bidətlər edir. Bəzi alimlər bu növü kiçik şirk də saymışlar. ***"Sizi yalnız o, şeytan öz dostlarından olması ilə qorxudub çəkindirir. Amma siz onlardan qorxmayın! Əgər möminsinizsə Məndən qorxun*** *(Xof)****".*** *(Ali İmran 175). "(Ya Muhəmməd!)* ***Hara*** *(səfərə)* ***çıxsan*** *(namaz vaxtı)* ***üzünü Kəbə məscidinə tərəf çevir. Harada olsanız üzünüzü o, tərəfə döndərin ki, özlərinə zülm edənlərdən başqaları sizə irad tutmasınlar. Siz onlardan deyil Məndən qorxun ki, Mən də sizə olan nemətimi tamamlayım. Bəlkə onda siz haqq yolunu tapasınız".*** *(əl-Bəqərə 150).* ***"Onlardan qorxmayın, Məndən qorxun!".*** *(əl-Maidə 3).* ***"İnsanlardan qorxmayın, Məndən qorxun!".*** *(əl-Maidə 44).* Peyğəmbər ρ buyurdu: "Uca Allah Qiyamət günü öz bəndəsinə deyəcəkdir: "Sən günah gördükdə sənə onu düzəltməyə

---

[305] Qurani-Kərimdə fitnə əzab yerində də işlədilir.

nə mane oldu?". O: "Ey Rəbbim! Mən insanlardan qorxdum" deyəcəkdir. Allah: "Sən ilk öncə Məndən qorxmalısan" deyə buyurdu[306]. ***"Allahın məscidlərini yalnız Allaha, qiyamət gününə iman gətirən, namaz qılıb zəkat verən və Allahdan başqa heç kəsdən qorxmayan adamlar təmir edə bilərlər. Məhz onlar doğru yolu tapa bilənlərdən ola bilərlər".*** *(ət-Tövbə 18).* Aişənin O Muaviyəyə ψ nəsihət olaraq yazdığı məktubda ona Rəsulullahın ρ sözlərini çatdıraraq deyir ki, Rəsulullah ρ buyurdu: "Kim insanları qəzəbləndirərək Allahı razı salarsa, Allah da ondan razı olar və insanları da ondan razı edər (Başqa rəvayətdə: Onu insanlara möhtac etməz). Kim də Allahı qəzəbləndirərək insanları razı salmağa çalışarsa, Allah da ona qəzəblənər və insanları da onun üstünə qəzəbli olaraq salar (Başqa rəvayətdə: Onun işini insanlara həvalə edər)".[307] İmam Şafii Σ deyir: "İnsanları razı salmaq ağla sığmayan bir şeydir. O, halda sənin halını düzəldən işə bax. Ondan ayrılma və ondan başqa hər bir şeyi də kənara burax. Yaradılmışları razı salmaq nə sənin gücün dairəsində olan bir şeydir, nə də əmr olunan bir şeydir. Yaradanı razı salmaq isə güc yetrilə bilən və əmr olunan bir xüsusiyyətdir". Əbu Səid ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "İnsanda olan yəqinliyin zəifləməsinin səbəbi Allahı qəzəbləndirib, insanların razılığını axtarmaq, Allahın verdiyi ruziyə görə insanlara təşəkkür bildirmək, Allahın sənə vermədiyinə görə insanları məzəmmət etməkdir. Allah ruzisini nə tamahkarın tamahı gətirər, nə də nifrət edənin nifrəti uzaqlaşdıra bilər".[308] Bəzi insanlar elə zənn edirlər ki, ruzini verən filankəsdir. O şəxs olmasa maaşım verilməz, ac qalaram, acından ölərəm və ümidini ona bağlayır. Onun istədiyi, tamah etdiyi dünya və axirət Allahın Əlindədir. Ona görə də müsəlman bir kimsə Allahın qəzəbini hər bir şeydən üstün tutmalıdır. İnsanların sözündən, qınağından üstün tutmalıdır. İnsanların qəzəbini Allahın qəzəbindən üstün tutmamalıdır. Yəni: insanlardan qorxaraq Allahın qadağalarını etməməlidir. Çünki, o kimsə Allahdan razı qalıb, Allahın sevdiyi və razı qaldığı şeylərə itaətlə yönəlir. Çünkü, o, hər bir xeyirin Allahın Əlində olmasını bilməlidir. Allahın Rəbb olması ilə razı qalan insan məxluqdan ümidini üzmüşdür. O, bilir ki, ruzini verən Allahdır, lakin bunlar səbəblərdir. İbn Abbas ψ rəvayət edir ki, bir gün (minikdə) Peyğəmbərin ρ tərkində oturmuşdum. O, buyurdu: "Ey oğul! Mən sənə bir neçə kəlimə öyrədəcəm. Allahı qoru ki, Allah da səni qorusun. Allahı qoru ki, Onu öz qarşında tapasan. Bir şey dilədikdə, Allahdan dilə. Kömək istədikdə yenə də Allahdan kömək istə. Bunu da bil ki, əğər bütün insanlar sənə xeyir vermək üçün bir yerə yığışsalar, Allahın yazdığından artıq sənə heç bir xeyir verə bilməzlər. Bunu da bil ki, əğər sənə zərər vermək üçün bir yerə yığışsalar, Allahın yazdığından artıq sənə zərər verə bilməzlər. (Çünkü) qələmlər qaldırılmış, səhifələrin (mürəkkəbi)

---

[306] İbn Məcə 4008.

[307] İbn Hibban 276, əl-Qudamə "Musnədu Şihab" 499, 500, əl-Humeydi 1524, İbn Sad 1594, əl-Albani "Səhihul-Cəmi" 5886, 6097, "Səhih Silsilə" 2311.

[308] Əbu Nəim "Hilyə" 5/ 106, əl-Beyhəqi "İman" 203.

qurumuşdur".[309] Allahın verdiyi ruziyə görə başqalarına şükr edənlərin misalını Şeyx Useymin Σ belə izah edir: "Sən öz uşağına pul verirsən ki, apar bunu filankəsə ver. O, da pulu həmin kimsəyə verdikdə pulu alan o uşağı tərifləyir. Lakin pulu verəni unudur. Pulu verən uşağın atası, vasitə isə övladı idi. Bu da Allahın verdiyi ruzini başqaları ilə bağlayanların misalıdır. İkinci sinif insanlar isə Allahın vermədiyi şeylərə görə insanları qınayırlar. Buna da misal olaraq: Hər hansı bir şəxs Allah yolunda sədəqə paylayır və sənə çatanda sədəqə qurtarır və ya sənə vermir. Buna görə də onu məzəmmət edir. Bu da yəqinliyin zəifliyindəndir. Buna görə də qul (insan) hər bir işdə Allahın razılığını gözləməlidir". Ola bilər ki, ilk öncə insanlar ona hörmət etsinlər. Lakin çox keçməz ki, insanlar da ona nifrət edərlər, çünki insanların qəlbləri Allahın barmaqları arasındadır. İnsanlara təşəkkür etdikdə də Allahı heç vaxt unutma! Bil ki, insanlar yalnız səbəbdir. Bütün sənə gələn nemətlər Allahdandır.

**4.** Təbii qorxu: Bu insanın düşməndən, vəhşi heyvandan, atəşdən, suda boğulmaqdan və s. qorxmasıdır. Bunda da həddi aşmamaq şərti vadır; ***"Belə ki, Musa qorxaraq səhəri nigarançılıq içində qarşıladı. Bir də nə görsə yaxşıdır! Dünən ondan imdad diləyən kəs bu gün fəryad çəkib yenə onu köməyə çağırır. Musa ona dedi: "Sən doğurdan da açıq-aşkar bir azğınsan".*** *(əl-Qəsəs 18).* ***"Musa qorxu və intizar içində şəhərdən çıxıb: "Pərvərdigara! Məni bu zalım tayfanın əlindən qurtar"-! dedi"*** *(əl-Qəsəs 21).* ***"Qardaşım Harun dildə məndən daha bəlağətlidir. Onu da, dediklərimi təsdiqləyən bir köməkçi kimi mənimlə birlikdə göndər. Mən, həqiqətən də, onların məni yalançı sayacaqlarından qorxuram".*** *(əl-Qəsəs 34).* ***"Musa dedi: "Ey Rəbbim! Mən onlardan bir nəfəri öldürmüşəm, qorxuram ki, onlar da məni öldürərlər".*** *(əl-Qəsəs 33).* ***"Musa dedi: "Ey Rəbbim! Onların məni yalançı sayacaqlarından qorxuram!"*** *(əş-Şuəra 12).* Buna görə də Uca Allahdan qorxmaq - təriflənən bir şəkildə ola bildiyi kimi, tərifə layiq olmayan bir şəkildə də ola bilər. Tərifə layiq olan Allah qorxusu - əgər bir kimsə ilə Allaha üsyan arasına bir əngəl təşkil edərsə və o kimsənin fərzləri edib, haramları tərk etməyinə gətirib çıxardarsa bu qorxu təriflənməyə dəyər. Bu qayə əldə edilərsə qəlb rahatlıq tapar, Allahın neməti ilə sevinər, mükafatı umacaq hala gələr. Tərifə layiq olmayan qorxu isə qulu Allahın rəhmətindən ümid[310] kəsməyə gətirən qorxudur. O, vaxt qul həsrətlər çəkməyə başlayar və hətta ümüdsüzlüyü güclü olduğu üçün günah etməyə davam edər; ***"Rəbbindən*** *(Onu)* ***görmədikləri halda qorxanları isə bağışlanma və böyük bir mükafat gözləyir".*** *(əl-Mulk 12).* ***"O, kəslər ki,***

---

[309] ət-Tirmizi 2516, əl-Albani "Səhihul-Cəmi" 7834.

[310] ***Rəca*** – ümid, insanın əldə edilməsi ehtimal olan bir şeyi umması deməkdir. Bəzən əldə edilmə ehtimalı uzaq olan bir şey haqqında da işlədilir və bu yaxınmış kimi qəbul edilir. Zəlillik və boyun əyməyi əhatə edən bir rəca ancaq uca Allaha qarşı olur. Belə bir ümidin Allahdan başqasına bağlanması ümid edənin qəlbinin durumuna görə ya kiçik, ya da böyük şirkdir; ***"Artıq kim Rəbbinə qovuşmağı ümid edirsə saleh bir əməl etsin və Rəbbinə ibadətində heç kimi şərik qoşmasın".*** *(əl-Kəhf 110).* Bunu da bil ki, tərifə layiq olan rəca ancaq Uca Allaha itaət edib, bu itaətin savabını gözləyən ya da günahlardan tövbə edib, tövbəsinin qəbul olunmasını ümid edən kimsələr haqqında işlədilir. Əməlsiz bir ümid isə bir aldanmaqdan başqa bir şey deyildir. Şeyx Useymin "Üç Əsas" Xof və Rəca bölümü.

***nə ticarət, nə alış-veriş onlaı Allahı zikr etməkdən, namaz qılmaqdan və zəkat verməkdən yayındırmaz. Onlar qəlblərin və gözlərin haldan-hala düşəcəyi bir gündən qorxarlar".*** *(ən-Nur 37).* ***"Məgər axirətdən qorxan, Rəbbinə ümid bəsləyən, gah səcdəyə qapanıb, gah da ayaq üstə durub gecə saatlarını ibadət içində keçirən*** *(müti bəndə kafirlə birdirmi?)"****.*** *(əz-Zumər 9).*

# TƏVƏKKÜLDƏ ŞİRK

***Təvəkkül -*** böyük bir ibadətdir. Təvəkkülün həqiqəti insanın hər bir şeyin Allahın Əlində olmasını bilməsidir. Qul öz əməllərini Allaha təqdim etməli, qəlbi ilə ona yönəlməlidir ki, Allah da onun istədiyini yerinə yetirsin. Ona zərər verə biləcək şeylərə qarşı Allahdan yardım diləmək və bunu da etmək üçün Allahın ona verdiyi səbəbləri yerinə yetriməlidir. Şəriətdə təvəkkül əməllərin Allaha təqdim edilməsi və səbəbləri götürməkdir. Təvəkküldə səbəbləri buraxmaq şəri təvəkkülə ziddir. Bu səbəbləri götürüb Allaha təvəkkül etdikdən sonra nəticəni gözləmək lazımdır. Təvəkkül zamanı insanın həm Allaha arxalanması, həm də səbəblərdən yapışması mühümdür. Əgər tək Allaha təvəkkül edib səbəblərdən tutmazsa onda bu ağılda naqislik sayılır. Necə ola bilər ki, İnsan evində otursun və desin ki, mənə pul gələcək. Evlənməmiş desin ki, mənim uşağım olacaq və s. İkinci tərəfdən əgər insan Allaha təvəkkül etməyib tək səbəblərdən tutarsa bu da insanın Tövhidinin naqis olmasındandır. Peyğəmbər ρ də dəvəsini buraxaraq (heç kəs onu oğurlamaz və itməz deyərək) Allaha təvəkkül edən insana: "Dəvəni bağla, sonra Allaha təvəkkül et"- deyə buyurmuşdu. Həmçinin Peyğəmbər ρ özü döyüşə getdikdə Allaha təvəkkül edər, lakin bununla bərabər zirehini də geyinərdi. Eynilə Məkkədən Mədinəyə getdikdə Allaha təvəkkül edər, lakin yolu göstərmək üçü özü ilə bərabər bələdçi də götürərdi. Ömərin ψ dövründə bir qrup insanlar həccə gəlirlər. Lakin özləri ilə heç bir azuqə gətirmirlər. Ömər ψ onlardan bunun səbəbini soruşduqda onlar: “Biz Allaha təvəkkül edənlərik”- deyirlər. Ömər ψ dedi: "Siz Allaha təvəkkül edənlər deyilsiniz, siz özlərinə güvənənlərsiniz".

İbn Rəcəb Σ deyir: "***Təvəkkül*** – etimad etmək, həvalə etmək, acizliyi izhar etmək, başqasına etimad etməkdir. İstilahi mənası isə: "Qəlbin xeyirli şeyləri əldə etmək və zərərli şeyləri tərk etmək üçün sadiq formada Allaha etimad etməsi deməkdir". Şeyx Useymin Σ deyir: "***Təvəkkül -*** Sidq ürəkdən Allaha etimad etmək, mənfəətli şeyləri əldə etmək, zərərli şeyləri tərk etmək və Allahın əmr etdiyi səbəblərdən tutmaqdır". İmam Əhməddən Σ soruşduqda ki: "O kəslər ki, işləməyib evlərində oturaraq biz Allaha təvəkkül edirik deyirlər" onlar haqqında fikrin nədir?” O dedi: "Onlar bidətçidirlər"- deyə cavab verdi. Allaha təvəkkül dinin yarısı sayılır. Din isə yardım diləmək və ibadət etməkdir. Təvəkkül isə yardım istəmək, yönəlmək isə ibadət sayılır;

***"Yalnız Ona ibadət et və yalnız Ona təvəkkül elə".*** *(Hud 123).* ***"Əgər inanırsınızsa yalnız Allaha təvəkkül edin".*** *(əl-Maidə 23).* ***"Artıq möminlər yalnız Allaha təvəkkül etməlidirlər".*** *(Ali İmran 122).* ***"Kim Allaha təvəkkül edərsə Allah ona yetər".*** *(ət-Taləq 3).* ***"Ey Rəbbimiz! Biz sənə təvəkkül etdik və Sənə yönəldik. Son dönüş də Sənədir".*** *(əl-Mumtəhinə 4).* ***"Sən onlardan üz döndər və Allaha təvəkkül et. Vəkil olaraq Allah yetər".*** *(ən-Nisa 81).* ***"Allah təvəkkül edənləri sevər".*** *(Ali İmran 159).* ***"Allah bizə yollarımızı göstərdiyi halda, biz nə üçün Ona təvəkkül etməməliyik".*** *(İbrahim 12).* ***"Möminlər yalnız o kəslərdir ki, Allahın adı çəkildikdə*** *(onun heybət və əzəmətindən)* ***ürəkləri qorxudan titrəyər, Allahın ayələri oxunduğu zaman həmin ayələr onların imanlarını daha da artırar, onlar ancaq öz Rəblərinə təvəkkül edərlər. Namaz qilar və verdiyimiz ruzidən sərf edərlər".*** *(əl-Ənfal 2-3).* ***"Ona ibadət edin və yalnız Ona təvəkkül edin".*** *(Hud 123).* ***"Əgər Allaha iman gətirmişsinizsə və müsəlman olmuşsunuzsa, Ona təvəkkül edin!"*** *(Yunus 84).*

***Təvəkkül Dörd Növdür:*** **1.** Uca Allaha olan təvəkkül. Bu imanın kamilliyinin bir hissəsi və səmimi imanın əlamətlərindəndir. Təvəkkül olmazsa iman tamamlanmaz. **2.** Hansısa bir xeyirin əldə edilməsi və ya zərərin aradan qaldırılması üçün ölü bir kimsəyə güvənmək olan gizli təvəkkül. Bu böyük şirk olan təvəkküldür. İnsan yalnız Allahın ona kömək edə biləcəyi, yalnız Allahın gücü çatacağı bir şeydə kiməsə güvənir və axalanır, kiməsə təvəkkül edir. Bu da qəbirlərə ibadət edənlərdə çox olur. Qəbr sahiblərinə öz əməllərini ərz edirlər, dünya və axirət səadətini onlardan diləyirlər. Bu Allahın qadir olduğu bir şeyi Allahdan qeyrisindən istəməkdir. Abdullah ibn Ukeym ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim boynundan nə assa, ona təvəkkül etmiş olar".[311] İmam Əhməd Σ deyir: "Təvəkkül qəlbin əməlidir. Güclü iman tam təvəkkülə bağlıdır, təvəkkülün zəifliyi isə zəif imanın sübutudur. İnsan Allahdan qeyrisinə təvəkkül etdikdə aləmlərin Rəbbinə şərik qoşur". **3.** Allahın və insanların qadir olduqları bir şeyi yalnız insanlardan istəmək. Bu kiçik şirkdir. Məs: Bir kimsə xəstələnərsə və bu xəstəliyi əsnasında yalnız həkimə arxalanarsa bu kiçik şirkdir. Çünki, həkim sənin sağalmağın üçün bir səbəbdir. Şəfa verən isə Allahdır. ***Həmçinin*** - hər hansı bir şəxsə ruzin bu şəxsdən gəlir, sənə ruzini bu verir deyə təvəkkül etmək. Əgər ona təvəkkül edirsənsə, ona güvənirsənsə kiçik şirk sayılır. Təvəvkkül edənlərin seyyidi Peyğəmbərimiz Muhəmməd ρ yalnız Allaha təvəkkül edərdi. İnsan isə öz vəzifəsinə, öz müdürünə o qədər təvəkkül edir ki, ondan asılı olduğunu zənn edir. Zənn edir ki, bu iş olmasa acından ölərəm, mənim ruzim bu kimsənin əlindədir, həyatım bu işdən aslıdır və s. Bu kiçik şirkdir. Çünki, artıq buna qəlbi ilə bağlanıb. ***Həmçinin*** - bir kimsə vəzifəsinə arxayındır ki, mənə çörək verən budur. Bu olmasa acından ölərəm. Səbəbə bağlanmaq lazım deyildir. Allaha təvəkkül edənə, Allah kifayət edər. **4.** Allahın yaratdıqlarını bacardıqları işlərdə vəkil təyin

---

[311] Əhməd 4/ 211, ət-Tirmizi 2073.

etməklə təvəkkül etmək. Peyğəmbər ρ Həcc vaxtı qurban kəsmək üçün öz heyvanını Əliyə ψ həvalə etməsi, həmçinin də Hudeybiyyə sülhndə müşriklərə məktub yazdıqda bu işi ona həvalə etməsi və s. Ömər ψ deyir: "Əgər siz haqqı ilə Allaha təvəkkül etsəniz, Allah ac olaraq gedən və tox olaraq qayıdan quşa ruzi verdiyi kimi sizi də ruziləndirər".[312] Peyğəmbər ρ buyurdu: "Kim evindən çıxarkən Allahın adı ilə, Allaha təvəkkül etdim. Allahdan başqa güc və qüvvət sahibi yoxdur"- deyərsə ona: "Hidayət edildin, qorundun və himayə edildin"- deyilər. Bunun üzərinə şeytan digər bir şeytana: "Hidayətə yönələn, qorunan və himayə edilən bir kimsəni necə azdörüm?"- deyər".[313] İbn Abbas ψ rəvayət edir ki: "(İbrahim υ öz qövmünün bütlərini sındırdığı üçün qövmü tərəfindən həps edilir. Onun üçün böyük bir tonqal qalanır. Əmr edilərək onu yanar tonqala atırlar. Allah Cəbraili υ göndərir. Cəbrail υ onun yanına gələrək: "İstəyirsən səni bu bəladan qurtarım və qövmünü yerlə-yeksan edim"- dedi. İbrahim υ: "Allah mənə kifayət edər, Ona gözəl vəkildir"- deyə buyurdu. Bu zaman Allah oda əmr edir ki, od sərin və salamat olsun".[314] Allahın əmri ilə atəş İbrahim υ zərər toxundurmur"). İbrahim υ oda atıldıqda: "***Həsbunəllahu Və Ni'məl Vəkil*** – Allah bizə yetər. O, nə gözəl Vəkildir"- deyə buyurur. Eyni sözü Peyğəmbər ρ də (Uhud döyüşündə müşriklər dəstə yığıb gəldikdə, münafiqlər): "İnsanlar sizə qarşı ordu hazırladılar. Onlardan qorxun"- dedilər. Bu zaman onların imanları artdı və onlar: "Allah bizə yetər. O, nə gözəl vəkildir"- deyə buyurdular".[315]. Təvəkkülə daha bir misal olaraq İbrahimin υ yoldaşı Həcəri göstərmək olar. İbn Abbas ψ rəvayət edir ki, İbrahim υ İsmailinin υ anası (Həcəri) və hələ beşikdə olan oğlu İsmaili υ Kəbəyə gətirir. Onları məscidin üst tərəfində bitən böyük bir ağacın yanında buraxaraq geri dönür. Sonralar orada Zəm-Zəm suyu çıxmışdır. O, günlərdə Məkkədə su olmadığı kimi, heç bir kimsə də yox idi. (İbrahim) Onları orada buraxaraq yanlarında içi xurma ilə dolu bir kisə və bir də su ilə dolu tuluq qoyur. Sonra İbrahim υ (Şama) qayıtmaq üçün oradan çıxır. İsmailin υ anası (Həcər) onun ardınca düşərək: "Ey İbrahim! Bizi heç bir insan olmayan və heç bir şeyin olmadığı bir vadidə tək buraxıb hara gedirsən!"- deyə səslədi. (Həcər) Bu sözləri bir neçə dəfə təkrar etdi. Lakin (İbrahim) ona tərəf dönüb baxmadıqda, (Həcər): "Bunu sənə Allahmı əmr etdi!"- deyə soruşdu. (İbrahim): "Bəli!"- deyə cavab verdi. (Həcər): "Onda O, bizi tək buraxmaz!"- deyib geri

[312] ət-Tirmizi 2344.
[313] ət-Tirmizi 3426 "Səhih ət-Tirmizi" 3/ 151.
[314] Bəziləri qeyd edirlər ki, o zaman bütün dünya odları sərin olur. Lakin bu səhf fikirdir. Çünki, Allah orada müəyyən bir odun sərin olmasını əmr edir. Çünki, hər bir şey Onun əmrinə tabedir. Əgər Allah tək sərin ol! desəydi, od o, qədər sərin olardı ki İbrahimə υ təsir edərdi. Lakin Allah sərinliklə yanaşı salamat olmasını da əmr edir. Bəzi rəvayətlərdə gəlir ki, o zaman bütün heyvanlar İbrahimə υ kömək etmək üçün odun söndürülməsinə çalışırdılar. Yalnız sürünən olan kətənkələdən başqa. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim kərtənkələni bir zərbəyə öldürərsə ona yüz savab, kim ki, iki zərbəyə öldürərsə ona birincinin yarısı qədər, kim də üç zərbəyə öldürərsə ona da ikincinin yarısı qədər savab vardır". Muslim.
[315] əl-Buxari 4563, ən-Nəsai "Sunənul-Kubra" 10439, əl-Hakim 3167.

(İsmailin yanına) qayıtdı. İbrahim υ yoluna davam edərək *Səniyyə* adlanan bir təpəyə çatdı. (Onlar tərəfindən) görünməyən bir hündürlüyə qalxaraq üzünü Kəbəyə tərəf çevirdi və əllərini səmaya qaldıraraq Allaha dua etdi: ***"Ey Rəbbimiz! Mən nəslimdən bəzisini Sənin mühafizə olunan Evinin yaxınlığında, heç bir bitki olmayan bir vadidə sakin etdim. Ey Rəbbimiz! Onlar namaz qılsınlar deyə belə etdim. İnsanların bir qisminin qəlbini onlara meylli et və onlara növbənöv məhsullardan ruzi ver ki, bəlkə şükür etsinlər".*** *(İbrahim 37)".*[316] İbn Abbas ψ bizə Peyğəmbərdən ρ belə bir hədis nəql etmişdi: "Peyğəmbər ρ buyurmuşdu: "Mənə bütün ümmətlər göstərildi. Peyğəmbər gördüm ki, ətrafında çox kiçik bir camaat var idi. Peyğəmbər gördüm ki, ətrafında bir və ya iki nəfər var idi. Bir Peyğəmbər də gördüm ki, ətrafında bir nəfər də belə yox idi, birdən, mənə üzaqdan bir qaraltı göstərildi. Mən onları ümmətimdən zənn etdim". Mənə: "Bu Musanın υ qövmüdür"- dedilər. Sən üfüqə doğru bax! Mən baxdıqda bir də nə gördüm? Böyük bir qaraltı. Mənə yenidən: "Digər üfüqə doğru bax!"- deyildi. Yenə də böyük bir qaraltı gördüm. Mənə: "Bu sənin ümmətindir. Bunlar ilə bərabər yetmiş min nəfər hesabsız və əzabsız olaraq Cənnətə girəcəkdir" deyildi[317]. Peyğəmbər ρ bu xütbəsindən sonra qalxıb evinə girdi. Bunun ardından insanlar, hesabsız və əzabsız olaraq Cənnətə girəcək olan bu kimsələr haqqında müzakirəyə başladılar. Bəzisi: "Şübhəsiz ki, bunlar Peyğəmbərin ρ dost-yoldaşlarıdır". Bəziləri də: "Bəlkə onlar İslamda doğulan və Allaha şərik qoşmayanlardır" dedilər. Bunlardan başqa bəzi fikirlər irəli sürüldü. Bu vaxt Peyğəmbər ρ onların yanına gəldi və: "Haqqında müzakirə etdiyiniz şey nədir?" deyə buyurdu. Ona məsələni başa saldıqdan sonra Peyğəmbər ρ: "Cənnətə haqq-hesabsız girən möminlər, ovsun oxumazlar və tələb etdirməzlər. Təşəəüm, Tətəyyür etməzlər, dağlamaqla müalicə etmirlər və hər şeydə öz Rəblərinə təvəkkül edərlər" deyə buyurdu[318]. Bu vaxt Ukkaşə

---

[316] əl-Buxari 3364.

[317] Başqa rəvayətdə: "Hər 70 min ilə bərabər 70 min nəfər olacaqdır". İmam Əhməd, əl-Albani "Səhih Silsilə" 1486.

[318] ***Ovsun*** – ərəbcə ***Ruqiyyə*** Quranı şəfa məqsədilə oxumaqdır. İbn Teymiyyə Σ deyir: Peyğəmbər ρ ovsun oxumurlar sözünü deməyib. Bu söz unutqanlıq nəticəsində bu hədisə əlavə edilmişdir". Əksinə Ondan ovsun haqqında soruşduqda o, dedi ki: "Sizdən kim qardaşına faydalı ola bilərsə qoy bunu etsin" Muslim 2199, "Şirk olmayan ovsunda qorxulu heç nə yoxdur". Muslim 2200. Bundan başqa Cəbrail υ Peyğəmbərə ρ ovsun oxumuşdur. Muslim 2186. ***Həmçinin*** **-** Peyğəmbər ρ özü səhabələrə ovsun oxuyardı. əl-Buxari 10/ 177, Muslim 2194. Dağlamaq da ovsun kimi icazə verilib. Peyğəmbər ρ Ubey ibn Kəbin ψ yanına damarı kəsildiyinə görə əl-Hakimi göndərir ki, onu dağlasın. Muslim 2207. Peyğəmbər ρ buyurdu: "Şəfa üç şeydədir. Balda, qan almada və odla dağlamaqda. Lakin mən ümmətimə dağlamağı qadağan edirəm. Dağlama xoşuma gəlmir. əl-Buxari 10/ 116. İbn Qeyyim Σ deyir: "Dağlama haqqında hədislər dörd yerə bölünür. **1.** Peyğəmbərin ρ onu tətbiq etməsi. **2.** Onu bəyənməməsi. **3.** Bundan imtina edənləri tərifləməsi. **4.** Bunu qadağan etməsi. Tətəyyür - ərəblər quş uçuşu ilə səfərlərinin uğurlu olub-olmadığına inanırdılar. Bu əməl də şirkin bir növüdür. Cənnətə soğu-sualsız girənlər, bu kimi əməllərə deyil yalnız Allaha təvəkkül edərlər. Lakin bu, o demək deyil ki, onlar səbəblərdən götürmürlər. Əksinə səbəblərdən tutaraq təvəkkül edirlər. Vasitələrdən istifadə etmədən təvəkkül zəifləyir. Səbəblərdən istifadə etməyən elə zənn edir ki, təvəkküldə səbəblərdən imtina etmək təvəkkülü gücləndirir. Lakin bu səhf fikirdir. Onda xəstələndikdə də dərman içmə və de ki, mən Allaha təvəkkül edirəm. Çünki, Peyğəmbər ρ də buyurur: "Allah müalicəsini göndərmədiyi heç bir xəstəlik göndərməyib". əl-Buxari 10/ 113. "Hər bir xəstəliyin müalicəsi vardır və əgər dərman və xəstəlik üst-üstə düşərsə Allahın izni ilə sağalma başlayır". Muslim 2204. Usamə ibn Şərik ψ deyir: "Mən Peyğəmbərin ρ yanında idim. Bir qrup

ibn Mihsan ayağa qalxıb: "Məni də onlardan etməsi üçün Allaha dua et" dedi. Peyğəmbər ρ buyurdu: "Sən onlardansan". Onun ardınca başqa birisi qalxıb dedi: "Məni də onlardan etməsi üçün Allah dua et". Peyğəmbər ρ buyurdu: "Bu işdə Ukkaşə səndən qabağı düşdü".[319] Peyğəmbərin ρ zamanında iki qardaş var idi. Biri davamlı olaraq Peyğəmbərin ρ yanına gəlir və (ondan elm tələb edir, faydalanırdı). Digəri isə öz işləri ilə məşğul olurdu. İşləri ilə məşğul olan qardaş, qardaşının bu əməlindən (iş ilə məşğul olmamasından) xoşlanmayaraq Peyğəmbər ρ şikayət etdi. Peyğəmbər ρ: "Bəlkə də onun hörmətinə görə sənə də ruzi verilir".[320]

## ALLAHDAN QEYRİSİNƏ QURBAN KƏSİLMƏZ

***Zəbh*** – müəyyən bir şəkildə (iki boyun damarını kəsərək) qan axıtmaq məqsədilə canın çıxması deməkdir. ***Nəhr*** – bıçaq boğaza salınmaqla dəvənin kəsilməsinə deyilir. Quran və Sünnə dəlilləri qurbanın yalnız Allah üçün kəsilməsi xüsusda Onun rızasını qazanmağı açıq bir şəkildə bəyan etmişdir. Allah Qurani-Kərimdə bir çox yerlərdə namaz ilə Qurbanı yan-yana zikr etmişdir. Uca Allah üçün qurban kəsilməsi ən mühüm ibadət və ən üstün itaətlərdən sayıldığı sabit olduğuna görə bir başqası üçün qurban kəsmək bir kimsəni İslam dairəsindən çıxaran böyük şirkdir. Bu da bir neçə şəkildə olur. Saleh Əli Şeyx Σ "Şərh Kitabut-Tovhid"də deyir: "Qurban kəsmək dörd qismdir":

**1.** Qurbanlıq Allahın adı ilə və Allah üçün kəsilir. Bu xalis Tövhiddir. Həm Allah üçün kəsir, həm də Allahın adı ilə kəsir. Hər iki tərəfdən savab qazanır. Allahın adı ilə, təzim olaraq, Onun önündə zəlil olaraq və Ona yaxınlaşmaq məqsədilə ibadət olaraq kəsilən heyvan - belə bir ibadət Uca Allahın buyurduğu şəkildə sadəcə Allah üçün edilir; ***"Ona görə də** (bu nemətlərə şükür edərək) **Rəbbin üçün namaz qıl və qurban kəs!"*** *(əl-Kövsər 2).* ***"De: "Mənim namazım da, ibadətim də, həyatım və ölümüm də aləmlərin Rəbbi Allah üçündür! Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən ilk müsəlmanam!"*** *(əl-Ənam 162-163).* Bu ayələrin hər biri qurbanlığın ibadət olmasına dəlildir. İbadət isə yalnız Allah üçün edilməlidir. Allahın heç bir şəriki yoxdur ki, onun üçün qurban kəsilsin və namaz qılınsın. Yalnız Uca və Böyük olan Allah bütün bu ibadətlərə layiqdir. Allah namaz qılmağı və qurban kəsməyi əmr etmişdir. Çünki bu ibadətlər Allahın sevdiyi və razı qaldığı ibadətlərdir.

**2.** Qurbanlıq Allahın adı ilə, lakin Allah üçün kəsilmir. Bu Uluhiyyətdə şirkdir. ***Bismilləh*** deyir və lakin Allah üçün deyil, qəbr sahibinə, peyğəmbərə, salehə

---

bədəvi gələrək dedilər: "Ya Rəsulullah! Biz dərman qəbul edəkmi?" O: "Bəli, qəbul edin. Çünki, Allah böyük və qüdrətlidir. Müalicəsini göndərmədiyi heç bir xəstəlik yoxdur, birindən başqa"- deyə buyurdu. Onlar: "Bu hansı xəstəlikdirki?"- dedilər. O: "Bu qocalıqdır"- deyə buyurdu". Əhməd 4/ 278, Əbu Davud 3855, İbn Məcə 3436.

[319] əl-Buxari, Muslim.

[320] ət-Tirmizi 2346.

yaxınlaşmaq və s. məqsədlərlə. Bəzən də bu halları hansısa bir mərasimlərdə möhtəşəm bir qonağın, dövlət və idarə başçılarının qarşısında təzim olaraq kəsirlər. Bu da dinimiz tərəfindən qadağan edilmişdir; *"(Müşriklər)* ***Allah üçün Onun yaratdığı əkindən və davardan pay ayırıb öz*** *(batil)* ***inanclarına görə: "Bu, Allahın və bu da*** *(Allaha)* ***şərik qoşduğumuz bütlərin!"– dedilər. Onların bütləri üçün ayrılmış hissə Allaha çatmaz, Allah üçün ayrılmış hissə isə bütlərə çatardı. Onların verdikləri hökm necə də pisdir!"*** *(əl-Ənam 136).*

**3.** Qurbanlıq Allah üçün kəsilir, lakin Allahın adı ilə kəsilmir. Bu Rububiyyətdə şirkdir; ***"Üstündə Allahın adı çəkilməmiş heyvanların ətindən yeməyin. Bu, şübhəsiz ki, günahdır. Həqiqətən, şeytanlar öz dostlarına sizinlə mücadilə etmək üçün*** *(çirkin fikirlər və yaramaz əqidələr)* ***təlqin edirlər. Əgər onlara itaət etsəniz, şübhəsiz ki, siz də müşrik olarsınız".*** *(əl-Ənam 121).*

4. Nə Allahın adı ilə kəsilir, nə də Allah üçün. Bu da büstbütün şirkdir. Belə bir kimsə ikiqat şirkə düşmüş olur. Həm Rububiyyət Tövhidində, həm də Allahdan qeyrisindən kömək istiəməklə, yaxınlaşmaqla Uluhiyyət Tövhidində şirk edir. İbadət etdikləri Əhməd Bədəvi, Hüseyn və s. kimsələrin adlarını zikr edərək qurbanlar kəsirlər. Amir ibn Vəsilə deyir ki: "Bir dəfə Əli ibn Əbu Talibin ψ yanında idim. Bir kişi onun yanına gələrək soruşdu: "Peyğəmbər ρ sənə sirr olaraq bir şey deyibmi?" Əli ψ qəzəbli halda: "Peyğəmbər ρ gizli olaraq mənə heç bir şey deməyib. Yalnız bu dörd şeydən başqa". Kişi: "Ey Əmirəlmöminin, onlar nədir?"- deyə soruşdu. Əli ψ: "Peyğəmbər ρ buyurdu: "Allahdan qeyrisinə qurban kəsənə Allah lənət etsin, Ana-atasına lənət edənə Allah lənət etsn, Bidətçiyə (Başqa rəvayətdə: Günahkara) sığınacaq verənə Allah lənət etsin,[321] yer üzünün sərhədlərini (nişanələrini) dəyişənə Allah lənət etsin".[322] Bu da hədədir. Kim Allahdan qeyrisinə təzim və yaxınlaşmaq məqsədilə qurban kəsərsə, artıq lənətlənmişdir və Allahın rəhmətindən uzaq olar. ***Lənət*** – Allahın rəhmətindən və mərhəmətindən qovulmaqdır. Əgər bir günaha hədə, əzab, təhdid, lənət varsa bu günahın nə dərəcədə şiddətli olmasına dəlildir. Allahdan qeyrisinə qurban kəsən kimsə buna daha layiqdir. Çünki, belə bir kimsə Allahdan qeyrisinə qurban kəsməklə onu ucaltmış və əzəmətləndirmişdir. Ona görə də Peyğəmbər ρ günahları saymağa başladıqda ən böyüyündən başlayaraq kiçiyinə doğru düşdü. Bu da dəlildir ki, dəvət etdikdə şirkdən başlamaq lazımdır. Həmçinin, bu hədislərdə olan lənət ümumidir, xüsusi deyildir.

---

[321] Fovzan – *hafizahullah* - "İanatul Mustafit Şərh Kitabut-Tovhid"də (səh. 1/ 170) deyir ki: "Allah sığınacaq verənə *Muhdisən* – (şəriətdə qadağan olunan bir şeyi edənə deyilir) lənət edib və ya başqa rəvayətdə: Allah ***Muhdəsən -*** bidətçiyə sığınacaq verənə lənət edib, yəni bidətdən razı qalana, onu inkar etməyə qadir olduğu halda (görürsə danışmır, insanlara bəyan etmirsə) o, bidətə sığınacaq verən kimsədir. Əgər o bidətçi olarsa (bidətə çağırarsa) və ya bidəti mühafizə edərsə onun halı necə olar?"

[322] Muslim 1978, ən-Nəsai 7/ 232, Əhməd 1/ 107.

Tarih ibn Şihban (Salman Farsi) ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Bir kişi bir milçəyə görə Cənnətə, başqa bir kişi isə bir milçəyə görə Cəhənnəmə düşdü". Səhabələr: "Ey Allahın Rəsulu! Bu necə ola bilər?"- deyə soruşdular. Peyğəmbər ρ: "İki nəfər bütə sitayiş edən bir tayfanın yanından keçirdi. Onlar heç kimə həmin bütə qurban kəsməmiş oradan keçməyə icazə vermirdilər. Bütpərəstlər həmin iki nəfərdən birinə dedilər: "Qurban kəs!" O: "Mənim qurban verməyə heç nəyim yoxdur"- dedi. Onlar: "Heç olmsa bir milçək qurban et!"- dedilər. O da milçəyi bütə qurban etdi və ona yoluna davam etməyə icazə verdilər və o kimsə (öldükdə) Cəhənnəmə düşdü. Bütpərəstlər ikinci kişiyə də dedilər: "Qurban kəs!" O: "Mən Allahdan başqa heç kimə qurban kəsmirəm"- dedi. Onun boynunu vurdular və o kimsə Cənnətə daxil oldu".[323] Bu da dəlildir ki, Allahdan qeyrisinə qurban kəsmək böyük şirkdir. Bütə qurban kəsmək, o kimsənin Cəhənnəmi qazanmasına səbəb olmuşdur. İnsan istəmədiyi halda bu qövmün şərindən qurtulmaq üçün qurban etdiyi bir milçəyə görə Cəhənnəmə düşdü. Əgər bu dünyada dəyəri olmayan bir milçəyə görə Cəhənnəm əzabı varsa, onda Allahdan qeyrisinə dəvələr, qoyunlar qurban edənlərin halı necə olacaqdır? Bu hədisdə zikr edilən müsəlman bir kimsə idi. Əgər kafir olsaydı onun barəsində: "Bir milçəyə görə Cəhənnəmə düşdü"- deyilməzdi. Bəziləri qeyd edirlər ki, bu hədisdə məcburiyyət vardır. Xeyr, əksinə müşriklər onları qurban kəsməyə məcbur etməmişdilər. Onlar o qövmün yanından keçirdilər. O qövm də heç kimə qurban kəsməmiş onların ərazisindən keçməyə icazə vermirdilər. İki nəfər isə istəsəydilər geri qayıdar və digər yolla gedərdilər və əgər məcburiyyət olsaydı, Allahın ayəsinə də zidd olardı. Məcbur edilən bir kimsəyə günah yoxdur; ***"Qəlbi imanla sabit qaldığı halda haqqı danmağa məcbur edilən kəslər istisna olmaqla, kim iman gətirdikdən sonra Allahı inkar etsə və qəlbini küfrə açsa, Allahın qəzəbinə düçar olar. Onlar üçün böyük bir əzab vardır".*** *(ən-Nəhl 106).* Məcbur edilən kimsə Cəhənnəmə girməz. Hətta biz sizinlə razılaşsaq da, belə ki, "onları məcbur ediblər"- deyənlərə cavab: Bu keçmiş ümmətlərdə idi. Bizim şəriətdə isə məcbur edilənə günüh yoxdur. Burada hədisi dəstəkləyən bir hədis vardı: Peyğəmbər ρ buyurdu: "Cənnət sizdən birinizə ayaqqabısının bağından da yaxındır, həmçinin Cəhənnəm də".[324] Bütpərəstlər belə ən böyük əməlin qəlbin əməli olmasını bilirdilər.

---

[323] Əhməd "Zuhd" 15, 22, İbn Əbi Şeybə 13084, İbn Həcər "İsabə" 3/ 510, Səhabə sözü olaraq Mursəl - səhih, Peyğəmbərin ρ sözü olaraq zəif.
[324] əl-Buxari 6488.

# ALLAHDAN QEYRİSİNƏ QURBAN KƏSİLƏN YERDƏ ALLAHA QURBAN KƏSİLMƏZ

***"Müsəlmanlara zərər vurmaq, küfr etmək, möminlərin arasına təfriqə salmaq məqsədilə, əvvəlcədən Allaha və Onun Elçisinə qarşı müharibə edən kimsəni gözləmək üçün məscid tikənlər, əlbəttə: "Biz yaxşılıqdan başqa bir şey istəmədik"– deyə and içəcəklər. Allah şahiddir ki, onlar yalançıdırlar. Heç vaxt orada namaz qılma. İlk gündən təqva üzərində qurulmuş məscid, əlbəttə, içində namaz qılmağın üçün daha layiqdir. Orada təmizlənməyi sevən kişilər vardır. Allah da təmizlənənləri sevir.*** *(ət-Tövbə 108).* İbn Kəsir Σ bu ayənin təfsirində deyir: "Allah Rəsulu ρ Mədinəyə gəlməzdən əvvəl orada cahillik dövründə xristianlığı qəbul etmiş Əbu Amir ər-Rahib adlı bir nəfər yaşayırdı. Allah Rəsulu ρ Mədinəyə gəldikdən, Bədrdə İslamın zəfərindən və müsəlmanların sayı artdıqdan sonra Peyğəmbər ρ onu İslama dəvət etdi. Lakin o, qəbul etməyib Məkkəyə, sonra isə Heraklın yanına qaçdı və oranın sakinlərini müsəlmanlara qarşı müharibəyə çağırdı. Sakinlər köməklik üçün ona söz və sığınacaq verdilər. Sonra tayfasından bir dəstə adama yazaraq bildirdi ki, ordu ilə gəlib Muhəmmədi ρ öz işindən döndərcəkdir. O, onlara özü üçün müşahidə məntəqəsi olan qala tikməyi əmr etdi. Bu məqsədlə Quba məscidinin yanında məscid tikilməyə başladı. (Müsəlmanlar oranı aldıqda) səhabələr Allah Rəsulundan ρ orada namaz qılmağı xahiş etdilər. Peyğəmbər ρ: "Əgər Allah istəsə qayıdanda orada namaz qılarıq, axı biz səfərə çıxırıq". Tabukdan qayıdarkən Mədinəyə yarım günlük məsafədə onun yanına Cəbrail υ gələrək, küfr və müsəlmanlar arasında bölgü salmaq niyyətilə tikilmiş "Məscidud-Dirar - Zərər Məscidi" haqda xəbər gətirdi. Allah Rəsulu ρ Mədinəyə çatmazdan əvvəl oranı yerlə-yeksan etmək üçün adamlar göndərdi. Allah bu cür məscidlərdə namaz qılmağı qadağan etdi. Günahlar və asiliklər itaətin yer üzünə təsir etdiyi kimi təsir edir. Sonra Peyğəmbərə ρ ilk günlərindən Allah xofuna əsaslanan İslam və onun tərafdarları üçün olan Quba məscidində namaz qılmağı buyurdu: "Quba məscidində (iki rükət) namaz ümrəyə bərabərdir".[325] İbn Abbas, Urva, Adiyy, əş-Şabi, əl-Həsən M və başqaları bu ayədə Quba məscidi haqda söhbət getdiyini deyirdilər. Lakin səhih hədisdən söhbətin Peyğəmbər ρ Məscidindən getdiyi bilinir. Abdur-Rahman ibn Əbu Səid əl-Xudri atasından rəvayət edir ki: "Bir gün ilk gündən Allah qorxusuna əsaslanaraq (tikilən) məscid haqda mübahisə edirdik". Biri: "Bu Quba məscididir"- dedi. Digəri: "Bu Allah Rəsulunun ρ məscididir"- dedi. Onların mübahisəsini eşidən Allah Rəsulu ρ buyurdu: "Bu mənim məscidimdir (Başqa rəvayətdə: Əlinə bir ovuc çınqıl daşları alaraq onları yerə vurdu və: Bu mənim

[325] İbn Məcə 1411, ət-Tirmizi 324, ən-Nəsai 2/72, Əhməd 3/487, əl-Albani səhih demişdir.

məscidimdir)".[326] Bu ayədən aydın olur ki, Allaha itaətsizliyə əsaslanan məscidlərdə namaz qılmaq və ya başqa ibadətləri keçirmək olmaz.

Sabit ibn Dəhhaq ψ rəvayət edir ki, bir nəfər Buvanə adlanan yerdə dəvəni qurban kəsməyi nəzir etmişdi və Peyğəmbərin ρ bu haqda fikirini soruşduqda o buyurdu: "Orada cahiliyyə dövründə insanların ibadət etdiyi büt olubmu?" O kimsə: "Yox, olmayıb"- dedi. Peyğəmbər ρ dedi: "Orada müşriklərin hansısa bayramı keçrilibmi?" Adam: "Yox, keçrilməyib". Bu zaman Peyğəmbər ρ buyurdu: "Əhdinə əməl et. Allaha asiliklə əlaqəsi olsa, həmçinin Adəm övladının malik olmadığı halda əhdini yerinə yetirmək olmaz".[327] Öncəki babdan sonra bu babın qeyd edilməsi olduqca uyğundur. Bir öncəki babın məqsədi böyük şirkdən bəhs etməkdirsə, bu babda şirkə aparan vasitələri zikr edir. Allahdan qeyrisinə (ibadət olunan) qurbanlar kəsilən yerdə və ya o, ətrafda Allaha qurban kəsmək qadağandır. Belə yerdə Allaha qurban kəsmək olmaz, hətta Allah üçün kəsilsə də belə. Bir kimsə belə etdikdə həmin yeri əzəmətləndirmiş, (müqəddəs) hesab etmiş, şirkin yayılmasına vəsilə olmuş və Allahdan qeyrisinə qurban kəsən müşriklərə bənzəmiş olur. Allah Peyğəmbərə ρ münafiqlərin tikdiyi məsciddə namaz qılmağı qadağan etmişdir. Çünki, Məscidud-Dirar Allahın dininə, Rəsuluna ρ və müsəlmanlara qarşı mübarizə aparılsın, onlar arasında təfriqə salınsın deyə tikilmişdi. Bu məsciddə namaz qılmaq qadağan edilmişdir. Çünki, sən orada namaz qılmaqla onların əməllərini və sözlərini təsdiqləmiş olursan. Bu eynilə özünə Sələf deyib sonra da Bidət, Təkfir əhli ilə oturub-duran kimsəyə də aiddir. Çünki, sən onlarla oturduqda insanları fitməyə məruz qoymuş olacaqsan. İnsanlar onların da doğru yolda olduqlarını zənn edəcəklər. Məscid, Allahın evi, zahirən çox gözəl bir əməl, lakin hansı məqsədlə tikilmişdir? İslama qarşı döyüşmək, müsəlmanlar arasında ayrılıq salmaq və s. Adı da Məscidud-Dirar – Zərər Məscidi. Hətta Peyğəmbər ρ oranın yandırılmasını əmr edir. Qurban kəsən kimsə də belədir. Orada qurban kəsməklə o yeri ucaltmış, gözəl göstərmişdir və müşriklərin əməlinə bənzəmişdir. Cünki, əsasən müşriklər Allahdan qeyrisinə ibadət olunan yerlərdə qurbanlar kəsirlər. Lakin kimsə sual verə bilər ki: Mənim bunu etdikdə müşriklərə oxşamaq niyyətm yoxdur? Cavab: Hətta sənin niyyətin olmasa da belə, oxşamış olursan. Cünki, qurbanlıq zahirən oxşar olan bir ibadətdir. Həm Kitab Əhli, həm müsəlmanlar, həm də Allahdan qeyrisinə ibadət edənlər qurban kəsirlər. Zahirən onların kəsmək prosesi eynidir. Lakin kənardan onlara baxan kimsə kimin Allah üçün, kimin də Allahdan qeyrisi üçün qurban kəsdiyini bilməz. Fərq yalnız niyyətdədir. Peyğəmbər ρ buyurdu: "Kim bir qövmə bənzəmək istəyərsə, o da

[326] Muslim 1398, Əhməd 3/ 8, ət-Tirmizi 3099, əl-Albani "Səhih".
[327] Əbu Davud 3313, əl-Beyhəqi 10/ 83, ət-Tabərani "Mucəmul-Kəbir" 2/ 75, əl-Albani səhih demişdir.

onlardandır".[328] ***Həmçinin*** – müşriklərə bənzəmək olduğu üçün Allahdan başqasına səcdə edib ibadət etdikləri vaxtlarda nafilə namaz qılınmasını belə qadağan etmişdir. ***Həmçinin*** – müşriklər bunu gördükləri zaman əməllərinin doğru olduğunu zənn edərlər. Doğru ilə batil bir əməl arasında fərq qoymaya bilərlər.

***Həmçinin*** – Hər hansısa bir cahiliyyə bütünün mövcud olduğu məkanda – *büt ordan qaldırılmış olsa belə* - qurban kəsilməz, nəzir ediməz. ***Həmçinin*** – cahiliyyə bütpərəstlərinin keçmişdə bayram keçirdikləri yer olsa belə, orada qurban nəzir edilməz. Allaha asiliklə əlaqəsi olan bir nəziri yerinə yetirmək olmaz. ***Həmçinin*** - insan əlində olmayan bir şeylə niyyət etməməlidir. Məs: Allah mənim xəstəmi sağaltsa, filankəsin qulunu azad edərəm. Dinimiz ***Sədduz Zərai*** – deyə bilinən bir qayda ilə şirk və şirkə aparan bütün yolların qarşısını almaqdadır. Buna görə də Muvahhid olan bir kimsəyə Allahdan qeyrisinə qurbanlar kəsilən yerdə Allaha qurban kəsməsi qadağandır və bu əməl onun Tövhidinə xələldir.

Hədisdə olan faydalardan: **1.** Bu kimsənin qurban kəsmək üçün Peyğəmbərə ρ müraciət etməsi (yəni bilməyənlər öyrənmək üçün Quran və Sünnəni daha yaxşı bilənlərə müraciət etməlidirlər). Çünki, bilirdi ki, dini bizə öyrədən Peyğəmbərdir ρ. Günümüzdə olan müsəlmanlara nəsihət olaraq dedikdə ki: Quran və Sünnəyə müraciət edin. Onlar: “Biz adət-ənənəmizi unutmamalıyıq, dədə-babalarımızın yolu bizə bəs edər”- deyirlər. **2.** Peyğəmbər ρ ətraflı şəkildə bir tərbiyəçi olaraq ondan soruşmağa başladı. Bir başa onu qadağan edərək: “Nə üçün məndən soruşursan, get harada istəyirsən kəs”- demədi. Əksinə onu sual-cavab edərək ətraflı izah verdi. Dəvət edən kimsə də belə olmalıdır. Bir başa hökm verməyə tələsməməlidir. Deməli, harada oldu qurban kəsmək olmaz. **3.** Əgər orada müşriklərin Allahdan qeyri ibadət etdikləri və bayram (hər il müəyyən bir vaxtda qayıdılan yer və ya məkan) keçirdikləri yer olsaydı bu əməli etməyə ona icazə verməzdi. Günümüzdə ən çox qurbanlıq Allahdan qeyrisinə ibadət edilən yerlərdə kəsilir. Bu cür yerlərdə kəsilərək gətrilən ət məhsullarını və ya digər məhsullar şirin çorək, halva və s. yemək qadağan edilmişdir.

***Hökmü*** – Bütün bu məxluqatı gözəl bir şəkildə xəlq edən Allahdır. Bu heyvanları xəlq edərək insanların öhdəliyinə verən də Allahdır və O daha layiqdir ki, qurbanlıq da Onun üçün kəsilsin. Kim olursa-olsun vəzifə və şəxsiyyətindən aslı olmayaraq - Qurbanlıq yalnız Allah üçün olmalıdır. İnsanların niyyətinə görə Allahdan qeyrisinə kəsilən qurbanlığın hökmü də fərqlənir: ***Həmçinin*** - Kim Allahdan qeyrisinə ibadət, təzim məqsədilə qurban kəsərsə, artıq böyük şirk etmiş olar. ***Həmçinin*** – qəbr sahibinə onun üçün şəfaətçi olsun və ya ona yaxınlaşmaq məqsədilə kəsirsə, bu böyük şirkdir.

---

[328] Əhməd 2/ 50, Səhih Əbu Davud 4031. Peyğəmbər ρ buyurdu: "Başqasının sünnəsi (adət ən-ənələri) ilə əməl edən bizdən deyildir". əl-Albani “Səhihul-Cəmi” 5439. Peyğəmbər ρ buyurdu: "Kişi dostunun dinindədir. Buna görə də kiminlə dostluq etdiyinizə baxın". "Səhihul-Cəmi" 3539.

Əli Həsən. "Səyhətu Nadir" səh. 98-99.

**18.** Muhəmməd Nasiruddin əl-Albani Σ deyir: "Dünyəvi qanunlar ilə hökm verməyi halal görən adam, yaxud Allahın haram etdiklərini: zina, sələm və başqa bu kimi ittifaq edilmiş haramları halal edən adam böyük küfr, zülm və fasiqlik edir. Amma kim qoyulma qanunlarla hökm verməyi halal görməyib onlarla hökm verərsə onun küfrü, zülmü və fasiqliyi kiçik olar".

**19**. Saleh əl-Fovzandan – *Allah Onu Qorusun* – soruşurlar ki: "Möhtərəm şeyx, biz eşitmişik ki, siz ***"Allahın nazil etdiyi ilə hökm etməyənlər, əlbəttə kafirdirlər"*** (əl-Maidə 44) - ayəsini birmənalı tətbiq edirsiniz. Xahiş edirik ki, bu haqda bizə məlumat verəsiniz". Cavab: "Mənim və ya kiminsə bir söz dediyini eşitsəniz bu sözü o, adamın kitabında oxuyub yaxud kassetlərində dinləmədikcə inanmayın. Lakin kiminsə adından insanlar arasında danışılan söz və ya şayiələrə (rast gəlsəniz) bunları qəbul etməyin. Bu məlumatı onun yazdığı kitabdan, kassetdən və ya özündən birbaşa soruşaraq dəqiqləşdirin. Şayiələrə inanmaq isə doğru deyildir. Bu gün çox insanlara görə yalan danışmaq adi bir hal olduğundan, onlar öz dediklərini təsdiqləmək üçün kiminsə adından yalan danışırlar… Mən Allahın hökmündən başqası ilə hökm verməyin birmənalı olaraq İslamdan çıxaran böyük küfr olduğunu demirəm. Mən də alimlərin bu məsələdə haqda buyurduqları izahlı fikri deyirəm. İbn Əbil-İzz "Təhavi Əqidəsi"ndə, İbn Kəsir "Təfsir"də (2/ 61) bu haqda geniş danışırlar".[437]

**20**. Şeyx Abdul-Muhsin Abbaddan – *Allah onu qorusun* – soruşurlar ki: "İslam şəriətinin (dünyəvi konstitutsiya) qanunlarla əvəz edilməsi özü böyük küfrdürmü və ya insanın qəlbilə buna yol verilən olmasını hesab etməsi lazımdır? Allahın nazil etdiyi ilə bir dəfə hökm verməyən insanla və ya hamı üçün qanunlar tətbiq edərək bunun yol verilən olmasını hesab etməyən arasında fərq varmı?" Cavab: "Ondan başlayaq ki, Allahın nazil etdiyinə əsaslanmayan bir, on, yüz və min məsələdə hökm çıxarmağın heç bir fərqi yoxdur. İnsan bildikdə ki, bu əməl qınanılandır, öz günahını etiraf edir və bildikdə ki, bu qadağandır - bu küfrdür, küfrdən kiçikdir. Lakin əgər o, hesab edərsə ki, bu yol veriləndir və yaxşıdır, belə bir əməli hətta bir dəfə də icra etsə (Bəzi Sələflər deyirlər ki: Hətta icra etməsə də belə qəlbi ilə inansa) və Allahın nazil etdiyi əsasında hökm verməməyi məqbul saysa, o, kafir olur".[438] Allahın hökmü ilə hökm verməyənə münasibət necə olmalıdır? **1)** Əgər etiqad edirsə ki, Allahın hökmü ilə hökm vermək vacib deyildir, seçimin var, isətəsən dünyəvi hökmlə, istəsən Allahın hökmü ilə hökm edə bilərsən - Böyük küfrdür. **2)** Allahın hökmünə ciddi yanaşmır və insanların qoyduqları sistemlər, qanunlar Allahın hökmündən daha yaxşıdır, Allahın hökmü bu zamana uyğun deyildir – bu da böyük küfrdür. Əgər insan kafirlərə və

---

[437] Saleh əl-Fovzan "Təkfir və qaydaları", "Nəvəqidul-İsləm", İbn Teymiyyə "Məcmuul-Fətava" 7/ 312, İbn Qeyyim "Mədaricus-Salikin" 1/ 335, Useymin "Təxzir min Fitnətit-Təkfir" 68.

[438] "Şərh Sünən Əbu Davud".

münafiqlərə, onların yanında hörmətini qaldırmaq, onların sevgisini qazanmaq üçün bunu edirsə - böyük küfrdür. **3)** Etiqad edir ki, Allahın hökmü ilə hökm vacibdir, bu daha gözəldir, lakin Allahın hökmü ilə hökm vermir. Buna görə cəza olduğunu bildiyi halda – bu kiçik küfrdür. **4)** Əgər insan Allahın hökmünü bilmir və bununla bərabər çalışır ki, Allahın hökmünü öyrənsin və buna (biliyinə) uyğun da hərəkət edir. Lakin sonra aydın olur ki, Allahın hökmü ilə hökm verməyib. Deyilir ki: İcdihadına görə savab qazanır, xətasına görə bağışlanır. Hökm verən kimsə Allahın hökmünü bilməlidir. Əgər öyrənməyib hökm verirsə günah qazanır.

**21**. Abdul-Lətif ibn Abdur-Rahmən Əli Şeyx Σ "Minhəcut-Təsis"də (səh. 71) buyurur: "Quran və Sünnəyə zidd olan şəriətə istinad etmək haram sayılır... Əsası nəfsi istəklər və rəylər olan hər bir hökm bura daxildir. Kim belə hökmlərlə hökm etməyi halal edərsə, (yalnız bu halda) o kafirdir; ***"Allahın nazil etdiyi** (kitab və şəriət) **ilə hökm etməyənlər, əlbəttə, kafirdirlər!"*** *(əl-Maidə 44).* Bəzi təfsir alimləri bu ayənin təfsirində buyurublar: "Burada qəsd olunan küfr böyük küfr deyil, ondan sonrakı mərtəbədə olan kiçik küfrdür. Çünki, onlar bu ayədən belə başa düşüblər ki, dedikləri həmin hökm halal görməyənə aiddir. Lakin (Allahın hökmündən başqası ilə hökm verməyi) halal görənin kafir olmasında isə ixtilaf etmirlər".

***Təkfir Məsələsi Şərtlər və Maneələr*** – Bu məsələ təkfir bölümündə ən incə və ən təhlükəli məsələlərdən olandır. Nə üçün? Çünki, bunun üzərində müəyyən şəxsə hökm çıxarmaq durur. Bu asan bir iş deyildir. (Səfehlər isə bunu sadə bir şeyə çeviriblər) Bunun səbəbi ilə neçə-neçə ayaqlar büdrəmiş, neçə-neçə insanlar bu məsələdə həlak olmuşlar. haradan başlayır? Mütləq təkfiri müəyyəndən ayıra bilməmək bu xətanın mənbəyidir. Şeyx Useymin Σ deyir: "Xüsusi şəxslər üçün xüsusi şərtlər vardır ki, bunlardan yalnız biri əməlin özünə aiddir, digər dördü isə şəxsin özü ilə bağlıdır: **1.** Sübut olunmalıdır ki, (Quran və Sünnə) ilə onun etdiyi əməl küfr əməldir. Əgər biz şübhə etsək və qəti qərarda olmasaq ki, bu əməl və ya söz küfrdür, belə bir kimsəni küfrdə ittiham etmək olmaz. ***Müəyyən Şəxs Barəsində Olan Şərtlər***: **1 -** Həddi buluğa çatmalı və ağlı başında olmalıdır – dəli və həddi buluğa çatmayan olmamalıdır. **2.** Bu söz və ya əməl onun istəyi və ağlı tərəfdən otaya çıxmalıdır, məcburiyyət olmamalıdır. **3.** Qəsdli olaraq etməlidir, xəta edərək yox – sevinc və qəzəbli olmamalıdır. Ona elə bir hüccət qalxmalıdır ki, ona müxalif çıxan küfr edər. **4.** Elimli olmalıdır – cahil, təvil edən olmamalıdır. Bu şərtlərin hər biri müəyyən şəxs üçün cəm olunmalıdır. Bu şərtlərin hər hansı birinin olmaması maneə sayılır.

***Xüsusi Hökm İlə Müəyyən Şəxsi Hökm Etmək Arasında Olan Fərqi Peyğəmbər, Səhabələr və Onlara Tabe Olanların Sözləri ilə -*** Peyğəmbər Σ buyurdu: "Allah içki içənə, süzənə, satana, alana, sıxana, qarışdırana, paylayana, saxlayana və ondan gələn gəliri xərcləyənə lənət edib".[439] Ömər Σ rəvayət edir ki, Peyğəmbərin ρ zamanında

[439] Əbu Davud, əl-Hakim, əl-Albani "İrva" 1529.

Abdullah adında Hişam ləqəbli bir kimsə vardı. Bu adam Peyğəmbəri ρ güldürürdü. Peyğəmbər ρ onu içki içdiyinə görə bir neçə dəfə çubuq cəzası ilə cəzalandırmışdı. Bir gün yenə də Peyğəmbərin ρ yanına gətrilir. Əmr verərək ona yenə də çubuq vurulur. Orada olanlardan biri: "Allahım, buna lənət et! Bu əməldən ötrü nə qədər çox gətrilir". Bu sözləri eşidən Peyğəmbər ρ deyir: "Ona lənət etməyin. Allaha and olsun ki, bilindiyinə görə o, Allah və Onun Rəsulunu ρ sevən biridir".[440] Nə üçün Peyğəmbər ρ ona demədi ki: Sən düz etdin, həqiqətən də o, lənətə layiqdir? Lakin əksinə səhabəyə qadağan edərək: "Ona lənət etməyin. Allaha and olsun ki, bilindiyinə görə o, Allah və Onun Rəsulunu ρ sevən biridir". Peyğəmbər ρ ümumi hökm ilə xüsusi hökm arasında fərq qoydu. Peyğəmbər ρ buyurdu: "Kim Ramazan orucunu ixlasla və əcrini umaraq ibadət edərsə (tutarsa), keçmiş günahları bağışlanar".[441] Bu hədisdə Peyğəmbər ρ ümumi olaraq qeyd edir ki, kim Ramazanı ixlasla oruc tutarsa, keçmiş günahları bağışlanar. Lakin gəlin bu hədisə xüsusi tərəfdən baxaq? Məgər kimsə deyə bilərmi ki: "Əgər mən Ramazan orucunu tutmuşamsa, deməli mənim keçmiş günahlarım bağışlanmışdır?" Ona görə də Peyğəmbər ρ buyuranda ki, filan əməli edən kafirdir, filan əməli edən münafiqdir, filan şeyi edənə Allahın lənəti var – bu o, demək deyildir ki, biz kiminsə belə etdiyini görsək, deməli o kimsə kafirdir və onu lənətləmək lazımdır. ***Həmçinin*** **-** səhabələr də bu yolu izləmişlər: Rəvayət edildiyinə görə Qudamə ibn Məzun içkini halal hesab edərək içərmiş. Bundan xəbər tutan Ömər ψ isə onu kafir adlandırmamış, bir müsəlman kimi cəzalandırmışdır. Çünki o, Qurani-Kərimin ayəsini düzgün başa düşməyərək içki içərmiş. Həmçinin Əbu Cəndəl ibn Suheyl və dostları da şamda olarkən içki içmiş və bunu halal saymışlar; ***"İman gətirib yaxşı işlər görənlərə pis əməllərdən çəkinib iman gətirdikləri, saleh əməllər etdikləri, sonra pis əməllərdən çəkinib iman gətirdikləri, sonra yenə də pis əməllərdən çəkinib yaxşı işlər gördükləri təqdirdə*** *(haram edilməmişdən əvvəl)* ***daddıqları*** *(yeyib içdikləri)* ***şeylərdən ötrü günah tutulmaz. Allah yaxşı iş görənləri sevər".*** *(əl-Maidə 93).*[442] Ənəs ψ rəvayət edir ki, Peyğəmbər ρ Uhud günü başından yara almış, ön dişi də qırılmışdı. Buna görə də: "Peyğəmbərlərini yaralayan bir toplum necə qurtula bilər?"- deyə buyurdu. Allah: ***"Bu işdə sənə dəxli olan bir şey yoxdur…".*** *(Ali İmran 128)* - ayəsi nazil oldu".[443] İbn Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ sübh namazının son rükətində başını rükudan qaldırdıqdan sonra: ***Səmiallahu Limən Həmidəh*** – dedikdən sonra buyurdu: "Allahım filankəsə, filankəsə (Saffan ibn Umeyyə, Suheyl ibn Amr, Haris ibn Hişam) lənət et! (Kafirlər üçün bəd dua etdi)". Lakin Allah ona bunu etməyi

---

[440] əl-Buxari 8/ 14. Babın adı belədir: "İçki içənə lənət etməyin məkruh olması və bundan ötrü dindən çıxmadığı babı", Məcmuul-Fətava 4/ 474.
[441] əl-Buxari, Muslim.
[442] İbn Qudamə "əl-Muğni" 12/ 276. B. 1040, Abdur-Razzaq "Musənnəf" 9/ 240, h. 17076, İbn Həcər "Fəthul-Bəri" 13/ 173, f. 93 əl-Əhkam b. 15.
[443] əl-Buxari 772, 4070, 4559, Muslim 1791, ət-Tirmizi 3003, İbn Məcə 4027, İbn Hibban 6574.

qadağan etdi; *"**Allah ya onların tövbələrini qəbul edər, ya da onlara əzab verər, çünki onlar həqiqətən zalım kimsələrdir**".* *(Ali İmran 128).*[444] Uhud günü Peyğəmbərə ρ o qədər əziyyət verildi, üzü cırıldı, dişi sındırıldı, məğlub oldular, amma bir sözünə görə Allah ona etiraz edərək: *"**Bu işdə sənə dəxli olan bir şey yoxdur…**".* Əgər Peyğəmbərin ρ əlində heç bir mülk, insanların taleyini həll etmək yoxdursa, istədiyini kafir demir, istədiyinə lənət edə bilmirdisə, bəs Peyğəmbərdən ρ aşağı olan kimsələr barəsində nə demək olar? İstənilən bir günah sahibini Allahın rəhmətindən uzaq etmək qadağandır.[445]

***Sələf İmamlarından -*** İbn Teymiyyə Σ deyir: "Təkfirin öz qaydaları, şərtləri və maneələri vardır. Bu şərtlər və maneələr müəyyən şəxsə uyğun gəlməyə də bilər. Ümumi təkfir müəyyəni təkfir etməyi tələb etmir. Əgər şətlər və maneələr aradan qalxarsa, bu hal istisnadır. Buna da dəlil İmam Əhmədin Σ məsələsidir. Kim desə ki, Quran məxluqdur, o, kafirdir. Lakin müəyyən şəxsə gəldikdə isə bunu deməzdilər".[446] İbn Teymiyyə Σ deyir: "Söz və əməl küfr ola bilər. Söz və əməl olaraq belə edən kafirdir, belə deyən kafirdir - deyilir, lakin müəyyən bir şəxs bunu deyibsə və ya edibsə, ona hüccət çatdırılana qədər kafir demirik. Elə bir hüccət ki, onu inkar edən kafir olur. Bu qayda Əhli Sünnə vəl-Camaamatda qəti bir qaydadır. (Kim bu qaydaya qarşı çıxarsa, Əhli Sünnə vəl-Camaatdan sayılmır). Ona görə də qiblə əhlindən olan bir kimsəyə qarşı kafir demək qadağan edilmişdir. Bəlkə də, o kimsə şərtlərin və maneələrin olmadığına görə bu hökmün altına girmir".[447] İbn Teymiyyə Σ deyir: "Bu səbəbdən də elm və sünnə əhli, müxalif olan kimsə onları kafir adlandırsa da belə (sünnə əhli) onlara kafir deməzlər. Çünki, küfr şəriət hökmüdür və insanın eyni tərzdə cavab verməsi yolverilməzdir. Məs: Kiminsə sənə qarşı yalan danışması, ailənə qarşı əxlaqsızlıq etməsi sənin də ona yalan danışmana və onun ailəsinə qarşı əxlaqsızlıq etmənə izn vermir. Çünki, yalan və əxlaqsızlıq Uca Allahın haqqı olduğuna görə haramdır. Kiminsə kafir adlandırılması da Allahın haqqıdır. Ona görə də Allah və Onun Peyğəmbərinin ρ kafir adlandırdığı kəsdən başqası kafir hesab edilməz".[448] İbn Əbil İzz əl-Hənəfi Σ deyir: "Bidət, batil, haram olan sözlər özündə əhatə edir; Peyğəmbərin ρ isbat etdiklərini inkar etmək, inkar etdikləqrini isbat etmək, qadağan etdiklərini əmr etmək, əmr etdiklərini isə qadağan edən sözlər küfrdür. Bu ümumi sözlərdir. Müəyyən şəxsə gəldikdə isə siz şəhadət edirsiniz ki, o kafirdir və Cəhənnəm əhlindəndir. Biz yalnız Peyğəmbərin ρ şahidlik etdiyinə şəhadət edə bilərik. Sənin müəyyən bir kimsəyə hökm verməyin ən böyük azğınlıqdan sayılır. Şahidlik

---

[444] əl-Albani "Səhih".

[445] ***Lənət -*** Xüsusi kəsləri lənətləmək qadağandır, lakin ümumi olaraq kafirləri lənətləmək, onlara bəd dua etmək olar. Onların əleyhinə dua etmək ki: Allah onları məhv etsin, müsəlmanları şərlərindən qorusun və s. Çünki, Peyğəmbər ρ qunutda dua edib.

[446] Məcmuul-Fətava 12/ 466-487, 23/ 348.

[447] Məcmuul-Fətava 3/ 229 – 35/ 165.

[448] Minhəcus-Sünnə 5/ 244.

etməyin ki, Allah onu bağışlamayacaq, əbədi Cəhənnəmdə saxlayacaq, ona rəhm etməyəcək".[449] Şeyx Useymin Σ deyir: "(Əgər söhbət müəyyən şəxsdən gedirsə) bir kimsəni bu əməllərinə görə müşrik, kafir və ya lənətlənmiş adlandırmaq qadağandır. Çünki, bunun öz şərtləri və maneələri vardır. Buna görə də biz qazancı rüşvətdən olan müəyyən şəxsi lənətləmirik. Çünki, o lənətin ona gəlməsinin qarşısını alan şeylər ola bilər ki, məs: cahillik, şübhə və s. Həmçinin şirklə də belədir. Biz müəyyən bir insanı şirk etdiyinə görə müşrik adlandırmırıq. Bu ona dəlilin çatmaması və ya onun ətrafında yaşayan alimlərin səhlənkarlığından dəlillərin çatmamasından ola bilər. Alimlərin bu məsələdə biganəliyi müəyyən bir şəxsə kafir deməyə qadağan edir".[450] Peyğəmbər ρ buyurdu: "Allah rüşvət alana da, verənə də lənət etsin".[451] Həmçinin küfrlə və şirk də belədir. Əgər kimsə şirk edirsə, biz onu müşrik, kafir saymırıq. Çünki ola bilər ki, ona hələ də dəlil çatmayıb və ya o yerdə yaşayan alimlərin cahil və (bu məsələlərə) biganə yanaşıblar. Alimlərin (bu məsələlərə) biganə yanaşmaları müəyyən bir şəxsə kafir deməyi qadağan edir. Ona görə də, ölüdən nə isə istəmək şirkdir, lakin müəyyən şəxsi bu əməlinə görə dəlilin ona çatması bizə bəlli olana qədər müşrik saymaq qadağandır".[452]

***Təkfirin Şərtləri* - 1.** Sübut olunmalıdır ki, (Quran və Sünnə) ilə onun etdiyi əməl küfr əməldir. Əgər biz şübhə etsək və qəti qərarda olmasaq ki, bu əməl və ya söz küfrdür, belə bir kimsəni küfrdə ittiham etmək olmaz. ***Sələflər* -** Kitab və Sünnədən bir işin küfr olduğunu ortaya qoyan bir dəlil olmadığı müddətdə kimsənin kafir olduğuna hökm etməzlər. Bir kimsə bu hökm üzrə ölərsə, işi Uca Allaha qalmışdır. Dilərsə ona əzab verər, dilərsə onu bağışlayar. Çünki, küfrün əsası qəsdən inkar etmək, küfrə qəlbən razı olmaq, küfrə inanmaq, küfrdən sevinmək və rahatlıq hiss etməkdir. Necə ki, kafir imanı küfrdən üstün tutmadıqca mömin olmaz, eləcə də mömin də məqsədli şəkildə küfrü imandan üstün tutmadığı halda müsəlmanların rəyinə görə kafir sayılmaz.

***Müəyyən Şəxslə Bağlı Olan Dörd Şərt*: *Birinci şərt;*** Dəlillər dəlalət edir ki, həddi-buluğa çatmayan və ağlı başına gələnə qədər dəli cəzalandırılmayacaqdır. Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Üç şəxsin üzərindən qələm qaldırılmışdır (onlara günah yazılmır). Həddi buluğa çatmamış uşaq, ruhi xəstə və yuxuda olan şəxs".[453] Əgər belə bir küfr söz uşaqdan çıxarsa (həddi-buluğa çatmayan) bu küfr sayılmaz və ona hökm verilməz. İbn Qudamə Σ deyir: "Mürtədlik ancaq ağıllı insanda olur". İbn Munzir Σ deyir: "Dəli bir kimsə dəli ikən küfr edərsə, hökmünün nə olması barədə alimlər ixtilaf ediblər? Əgər ondan qabaq müsəlman idisə müsəlman olaraq da

[449] Şərh Əqidətul-Təhaviyyə (səh. 357).
[450] Şərh Kitabut-Tövhid 29-30.
[451] Əhməd, İbn Məcə.
[452] Qovlu Mufit alə Kitəbit-Tövhid.
[453] Əbu Davud 4391, əl-Albani "İrvaul Ğəlil" 297.

qalır". ***İkinci şərt;*** Onun etdiyi küfr öz ixtiyarı ilə (qəsd olaraq) məcbur edilmədən olmalıdır. Əhli Sünnə vəl Cammat təkfirə maneə olan səbəblərdən biri də məcburən edilən söz və əməldir. Vurmaq, öldürmək, işgəncə və ya ailə üzvlərindən birini kəsmək kimi şeylə təhdid səbəbilə meydana gələn söz və əməldir. Belə bir durumda dinə zidd olan bir şeyin edilməsi mübahdır. O, küfr sözü söyləyərsə və ya edərsə, günahkar olmaz. Çünki, bu durumda insanın könüllü olması gedər, iradəsi fəsada uğrayar, qəsd ortadan qalxar. Bu durumda bir müsəlman qəlbi imanla dolu olduğu və imanın həqiqətinə qəti olaraq inandığı halda küfrə qəlbilə deyil, sadəcə dili ilə etdiyi müddətdə təkfir edilməz; ***"Qəlbi imanla sabit olduğu halda*** *(küfr sözünü deməyə)* ***məcbur edilən*** *(dil ilə deyib ürəyində onu təsdiq etməyən)* ***şəxs istisna olmaqla, hər kəs iman gətirdikdən sonra küfr etsə*** *(onu ağır təhlükə gözləyir).* ***Lakin qəlbən küfrə razı olanlara*** *(qəlbində könüllü surətdə küfrə yer verənlərə)* ***Allahın qəzəbi tutar və onlar şiddətli bir əzaba düçar olarlar".*** *(ən-Nəhl 106).* Bu ayə Əmmar ibn Yasir və anası N barəsində enmişdir. Onlar müşriklər tərəfindən küfr sözü söyləmək üçün məcbur edilmişlər. Lakin Peyğəmbər ρ Əmmardan soruşdu: "Qəlbin o anda nə vəziyyətdə idi?" O da: "Qəlbim imanla sabit idi"- dedi. Peyğəmbər ρ dedi: "Əgər incitsələr yenə də deyə bilərsən". Buna görə də məcburiyyət və insanın ağlının bağlanması ona küfr hökmünün verilməsi üçün maneədir. İbn Abbas ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Allah mənə görə ümmətimin səhvən, unutqanlıqdan və ya məcburiyyət qarşısında qalaraq etdiyi günahlarından keçib (bağışlayıb)".[454]

***Üçüncü və Dördüncü şərtə*** gəldikdə isə bunları bir az təfsilatı ilə, bu məsələnin öyrəndiyimiz məsələ ilə əlaqəsi olduğu üçün qeyd edəcəyəm. Əhli Sünnə bir çox bidət əhlini küfr etdiklərinə görə kafir saymamışlar. Ya onlara hüccət çatmadığına görə, ya da onların təvilçi olduqlarına görə kafir saymamışlar. Həmçinin, küfr hökmünün düzgün sayılması üçün bu iki şərtin etibarlı olması Sələf minhəcinin (yolunun) seçdiyi bir mövqedir. Sələflər bu iki şərti etibarlı saymaqla bidət əhlindən seçiliblər. O bidət əhli ki, sadəcə küfr əməlinə görə insanları kafir sayıblar. Bir məsələ də vardır ki, bidət əhlinin çoxu sadəcə onlara müxalif olduğuna görə də onları təkfir edirlər. Özlərinə müxalif olanları dəlilsiz təkfir etmək onların əlamətlərindəndir. Bu iki şərtin olması ilə Əhli Sünnə başqalarından seçiliblər. Çünki, ***Birinci və İkinci şərti*** bidət əhli də qəbul edir, lakin ***Üçüncü və Dördüncü şərti*** bidət əhli qəbul etməmişlər.

Əgər onun etdiyi küfr qəzəb, sevindirici bir hadisə zamanı və ya məcbur edilərək baş verərsə, bununla o kimsə küfr etmiş olmur. Bu əməlin küfr olması barəsində ondan hüccət qaldırılmalıdır. Hüccətin ona çatdırılması onun başa düşdüyü tərzdə olmalıdır. Abdur-Rahmən Abdul-Xaliq Σ bu məsələ ilə bağlı belə demişdir: "Cəzalandırma elmdən sonra gəlir – mahiyyəti məlum olan bir şəriət qaydasıdır. Uca Allah bu məsələ ilə bağlı buyurur: ***"Allah bir tayfanı doğru yola yönəltdikdən sonra***

[454] İbn Macə 2045, əl-Beyhəqi 7/ 356, əl-Albani səhih deyib.

***qorxub-çəkinməli olduqları şeyləri özlərinə bildirmədən onları*** *(haqq yoldan)* ***çıxartmaz. Həqiqətən, Allah hər şeyi*** *(olduğu kimi, incəliyinə kimi)* ***biləndir".*** *(ət-Tövbə 115).*[455] ***"Biz Peyğəmbər göndərməmiş əzab vermərik!"*** *(əl-İsra 15).* Həmçinin, İbn Kəsir Σ bu ayənin təfsirində demişdir: "Uca Allah Öz müqəddəs nəfsindən olan ədalətli hökmünün bəyanından və insanlara peyğəmbərlərin xəbərdarlığı çatdıqdan sonra hər hansı bir tayfanın əleyhinə dəlil və sübut olmadıqca onları zəlalətə salmaz. Belə ki, başqa bir ayədə buyurulur: ***"Səmud qövmünə gəlincə, Biz onlara haqq yolu göstərdik…"*** *(Fussilət 17).* ***"Əgər Biz onları*** *(Məkkə müşriklərini)* ***bundan əvvəl məhv etsəydik, mütləq belə deyəcəkdilər: "Ey Rəbbimiz! Nə üçün zəlil və rüsvay olmazdan qabaq bizə bir Peyğəmbər göndərmədin ki, Sənin ayələrinə*** *(hökmlərinə)* ***tabe olaydıq".*** *(Ta ha 134).* ***"Biz Peyğəmbərləri*** *(möminlərə)* ***müjdə verən və*** *(kafirləri)* ***əzabla qorxudan kimi göndərdik ki, daha insanlar üçün peyğəmbərlərdən sonra Allaha qarşı bir bəhanə yeri qalmasın".*** *(ən-Nisa 165).*

***Qəzəbə Gəldikdə -*** qəzəbindən səhf edərək Musa υ Harunu υ vurur və saqqalından tutur, həmçinin də Tövratı yerə atır; ***"…Etdiyiniz səhvlərə görə sizə günah yoxdur. Lakin qəsdən etdiyiniz işlərdən ötrü günah vardır. Allah Bağışlayan və Rəhm edəndir".*** *(əl-Əhzab 5).* Çünki, Allah insanlara gücləri və imkanları ölçüsündə haqqı axtarmalarını əmr etdi. Əgər ictihadlarında haqqa nail olmazlarsa, Allah heç bir nəfsi gücünün çatmadığı şeylə yükləməz. ***Sevincə Gəldikdə -*** Ənəs ibn Məlik ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Allah I qulunun tövbə etməsi ilə sizdən hər hansı birinizin bu halından daha çox sevinir; Bir kimsə otsuz, boş bir quru ərazidə dəvəsi ilə gedirdi. Dəvənin üzərində o, kimsənin yeyəcək və içəcək şeyləri də vardır. (Başqa rəvayətdə: "Çöllük bir əraziyə çatdıqda ona şirin bir yuxu gəldi. Dəvəsi üzərindən enərək bir ağac tapıb altında mürgüləmək üçün uzandı). Oyandıqda bir də baxdı ki, dəvəsi yeyəcək və içəcək şeylərlə birlikdə yoxdur. Dəvəsini axtarmaq üçün oyana-buyana qaçır. Nəhayət dəvəsini axtarıb tapmaqdan ümidini kəsdikdə yatdığı yerə qayıdaraq: "Artıq buradan ölənə qədər ayrılmayacağam!"- deyib yan tərəfi üstə uzanaraq yatdı. (Ayıldıqda) bir də baxdı ki, dəvəsi başı üzərində dayanıb. Dəvəsinin ipindən tutaraq sevincinin şiddətindən: "***Allahummə Ənnə Abdi Və Ənə Rabbukə*** – Allahım Sən mənim qulumsan, mən də Sənin Rəbbinəm!"- deyə şükr edir. Sizdən hər hansı biriniz (itmiş dəvəsini) üzərində yemək və içəcəyi ilə birlikdə tapmasından daha çox, uca Allah tövbə etmiş mömin qulunun tövbəsindən ötrü sevinir".[456] Peyğəmbər ρ buyurdu: "Qiyamət günü bağışlanmış olduqlarını iddia edərək dəlil gətirəcək dörd təbəqədən olan insanlar vardır. Qulağı eşitməyən kar, məcnun adam, yaşlı adam və fitrət zamanı ölən insanlar. Kar belə deyər: "Ey Rəbbim, İslam gəldi lakin mən heç bir şey eşitmədim". Axmaq isə: "Ey Allahım, İslam gəldi lakin balaca uşaqlar belə məni

[455] Abdur-Rahmən Abdul-Xaliq "İman və Küfr ayrımı" s. 79-80.
[456] əl-Buxari, Muslim.

ələ salıb başıma dəvə təzəyi atırdılar". Yaşlı dedi: "İslam gəldi, lakin mən heç bir şey başa düşmürdüm". Fitrət[457] zamanı ölən insanlara gəlincə isə: "Ey Rəbbimiz, sənin elçilərin olan Peyğəmbərlər bizə gəlmədilər". Uca Allah Ona itaət etmələri barədə onlardan əhd edir. Oda girin – hökmünü onlara təbliğ etmək üçün onlara bir Peyğəmbər göndərir. Peyğəmbər ρ: "Nəfsim Əlində olan Allaha and içirəm ki, əgər onlar oda girsəydilər bu onlar üçün sərinlik və salamatlıq olardı".[458] Bu dörd sinif insanı Allah üzürlü saymışdır. Kar insanı hissiyat orqanının olmamasına görə, Fitrət zamanı ölən kimsənin dövründə Peyğəmbər olmadığına görə, dəli ilə qoca kişiyə gəldikdə isə onlara hüccət çatmışdır. Bəs nə üçün Allah onları üzürlü saymışdır? Gələn dəlili başa düşmədikləri üçün. Onlar da başa düşmədiklərini dəlil gətirdilər.

**4)** Etdiyi əməli yozmamlıdır, təvil edən deyil, elimli olmalıdır. Əbi Əfva ψ rəvayət edir ki, Muaz ψ Şamdan gəldiyi zaman Peyğəmbərə ρ səcdə etdi. Allah Rəsulu ρ: "Bu nədir, ey Muaz!"- deyə buyurdu. Muaz ψ: "Mən Şamda olarkən onların rahiblərinə və patriklərinə səcdə etdiklərini gördüm və daxilimdən bu hərəkəti sizin üçün də etmək fikrinə düşdüm"- deyə cavab verdi. Peyğəmbər ρ: "Əgər mən Allahdan başqasına səcdə etməyi hər hansı bir kimsəyə əmr etsəydim, qadının öz ərinə səcdə etməsini emr edərdim. Muhəmmədin nəfsi Əlində olan Allaha and olsun ki, qadın ərinin haqqını ödəyincəyə qədər Rəbbinin haqqını ödəmiş olmaz. Hətta qadın dəvənin belindəki palanın üstündə oturmuş olsa belə, əri onu istədikdə ərinin istəyinə mane olmamalıdır".[459] Səcdə ibadətdən sayıldığı üçün yalnız Allaha edilməlidir. Lakin kimsə bilmədən Allahdan qeyrisinə səcdə edərsə bu əməlinə görə təkfir edilməz. İmam Şəukani Σ belə demişdir: "Bilmədən Allahdan qeyrisinə səcdə edən kimsə təkfir edilməz".[460] Əbu Vaqid əl-Leysi ψ rəvayət edir ki, Peyğəmbər ρ ilə birlikdə Məkkədən Huneynə tərəf yola çıxmışdıq. Biz o, vaxtlar təzə müsəlmanlardan idik və küfrdən yenicə çıxmışdıq. Müşriklərin üstündən silahlarını asaraq (ibadət etdikləri) bir Sidr ağacı vardı. Onun ətrafında yığışaraq öz adət ən-ənələrini (mərasim, ayin) yerinə yetirir və o, ağacı "Zətu Ənvat" deyə çağırırdılar. Biz də bu böyük bir Sidr ağacının yanından keçdikdə: "Ey Allahın Rəsulu! Onların "Zətu Ənvatı" olduğu kimi bizim üçün də "Zətu Ənvat" düzəlt"- dedik. Peyğəmbər ρ: "Allahu Əkbər! Şübhəsiz ki, bunlar hamısı keçmiş adət ən-ənələrdir. Nəfsim Əlində Olana and olsun ki, siz İsrail oğullarının Musadan istədikləri şeyin eynisini məndən istədiniz: ***"…Bizə onların sitayiş etdikləri bütlər kimi bir büt düzəlt!"*** *(əl-Əraf 138).* Həqiqətən, siz əvvəlkilərin

---

[457] Peyğəmbər ρ buyurdu: "Hər doğulan təbiətinə görə (fitrət üzrə) doğular. Sonradan ata-anası onu yəhudiləşdirər, xristianlaşdırar, atəşpərəstləşdirər…" Muslim 2658. Bu hədisdə Peyğəmbər ρ buyurmadı "müsəlmanlaşdırar". Çünki, hər doğulanın doğulduğu təbiəti İslamdır. Ayə: *"(Ya Muhəmməd! Ümmətinlə birlikdə)* ***batildən haqqa tapınaraq üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə*** *(İslama)* ***tərəf tut. Allahın dinini heç vəchlə dəyişdirmək olmaz. Doğru din budur, lakin insanların əksəruiyyəti bilməz".*** *(ər-Rum 30).*

[458] ət-Təbərani 841, İbn Hibban 1827, Əhməd 4/ 24, əl-Albani 1434.

[459] İbn Məcə 1853, İbn Hibban 1390, Əhməd 4/ 381, əl-Albani "İrvaul Ğəlil" 7/ 57.

[460] əş-Şəukani "Neylul Əvtar" 6/ 210.

adət ən-ənəsi ilə gedəcəksiniz”.[461] Bu səhabələr İslamda yeni olduqları üçün bir çox tövhid məsələlərini bilmirdilər. Məhz buna görə də Peyğəmbərdən ρ müşriklərin uğur gətirmək üçün dilədikləri bir büt kimi, onlara da uğur diləmək üçün bir büt düzəltmələrini istəmişlər. Buna baxmayaraq Peyğəmbər ρ onları bəzi kimsələr kimi ayrı-ayrı təkfir etməmiş, bu hərəkətlərinə görə onların İslamdan çıxdıqlarını, tövbə edib ikinci dəfə İslama yenidən dönmələrini söyləməmişdir. Əksinə Peyğəmbər ρ onlara tələb etdikləri şeyin şirk olduğunu, sözlərinin küfr olduğunu söyləsə də özlərini kafirlikdə günahlandırmamışdır. Bu da Sələfi dəvətinin üslubudur. İbn Teymiyyə Σ deyir: "Mən Allahın Ərşi üzərində olmasını qəbul etməyən Hülulilərdən (Allahın hər bir insanın daxilində olmasını deyən azğın firqə) və inkarçılardan olan Cəhmilərin fitnəsi baş verən zaman onlara deyərdim: Əgər mən sizin dediklərinizi desəm kafir olaram. Çünki, sözlərinizin küfr olduğunu bilirəm. Sizi isə kafir hesab etmirəm. Ona görə ki, cahilsiniz. Bu müraciət onların alimlərinə, qazılarına, şeyxlərinə və başçılarına ünvalanmışdır. Onların cəhalətlərinin əsli isə əqli şübhələr üzərində qurulmuşdur. Buna səbəb səhih nəql və ona müvafiq olan sağlam düşüncəni dərk edə bilmədikləri olmuşdur. Ona görə də onların cəhalətlərinə və iftiralarına eyni tərzdə kafir adlandırmaqla cavab vermirik".[462] Muhəmməd ibn Abdul-Vahhab Σ deyir: "Biz Abdul-Qadirin qübbəsindəki bütə sitayiş edən kimsələri, həmçinin Əhməd Bədəvinin qəbrinə ibadət edən kimsələri cahillikləri və onlara bu əməllərinin səhf olmasını başa salacaq insanlar olmadığı üçün onları təkfir etmirik. Bizi təkfir etmədiyi və bizimlə savaşmadığı halda Allaha şərik qoşmayan şəxsləri bizə hicrət etmədi deyə necə kafir adlandıra bilərik? Subhənəllah! Bu bizə qarşı olan böyük iftiradır".[463]

***Tağut*** **-** Tağutu inkar – Tövhidin ruknudur. Tüğyan – sözündəndir. Həddi aşmaq deməkdir. İbn Qeyyim Σ deyir: "Tağut bəndənin ibadtdə, itaətdə və tabeçilikdə (ardıyca) getdiyi hər bir şeydə ifrata vararaq həddi aşmasıdır". İnsan Allahın dinində həddi necə aşır? Alimlərin ardınca hər bir şeydə halalı haram, haramı halal, sünnəni bidət, bidəti sünnə edərək getdikdə həddi aşır. İsa υ tağut deyildir. İnsanlar onu tağut etmişdilər. Həmçinin Əbu Hənifə, İmam Şafii, İmam Məlik, İmam Əhməd M və s. Onları təqlid etməkdə həddi aşaraq onları özlərinə Tağut etmişlər; ***“Su aşıb-daşdıqda Biz sizi üzən gəmidə daşıdıq”.*** *(əl-Haqqa 11)* - buyuruğunda da bu kökdən gəlməkdədir. *"(Ya Muhəmməd!)* ***Sənə nazil olana və səndən əvvəl nazil edilənlərə iman gətirdiklərini iddia edənləri görmürsənmi? Onlar Tağutun hüzurunda mühakimə olunmaq istəyirlər. Halbuki onlara inanmaları əmr olunmuşdur. Şeytan isə onları çox uzaq olan bir zəlalətə sürükləmək istər. Onlara: “Allahın nazil etdiyinə və Peyğəmbərə tərəf gəlin!”– deyildiyi zaman münafiqlərin səndən büsbütün üz döndər-***

---

[461] ət-Tirmizi 2180, Əhməd 5/ 218, əl-Albani səhih adlandırmışdır.
[462] Rəddu aləl-Bəkri 2/ 493.
[463] Dəhlan "Siyanətul-İnsan" 449, Fətava Məsəlul Şeyx Abdul-Vahhab 11 səh, "Minhəc Əhlil-Həqq vəl-İttibə" İbn Suhman səh 56.

***diklərini görərsən".*** *(ən-Nisa 60-61).* əş-Şabii Σ deyir: "Münafiqlərdən biri bir yəhudi ilə mübahisə edərkən yəhudi Muhəmmədin ρ rüşvət almayacağını bildiyinə görə demişdi: "Mühakimə üçün gedək Muhəmmədin ρ yanına". Münafiq isə yəhudilərin rüşvət alacağını bildiyi üçün: "Yaxşı olar ki, yəhudi hakimə müraciət edək"- dedi. Beləliklə də hər ikisi mühakimə üçün Cuheynədəki bir kahinin yanına gedib ona müraciət etmək barədə razılığa gəldilər. Belə olduqda: *"(Ya Muhəmməd!)* ***Sənə nazil olana və səndən əvvəl nazil edilənlətrə iman gətirdiklərini iddia edənləri görmürsənmi? Onlar Tağutun hüzurunda mühakimə olunmaq istəyirlər"***[464] **-** ayəsi nazil oldu. Bu ayənin nazil olma səbəblərindən digərində isə: İki nəfər öz aralarında mübahisə edirlər və təklif edirlər ki, Peyğəmbərə ρ müraciət etsinlər ki, aralarında hökm versin. Onlardan biri deyir: "Kəb ibn Əşrəfə müraciət etsək yaxşı olar". Nəhayət Ömərə ψ müraciət edirlər. Onlardan biri hadisəni Ömərə danışır. Ömər ψ Allahın Rəsuluna ρ müraciət etməyə razı olmayan kimsədən soruşur ki, onun Peyğəmbərə ρ müraciət etmək istəməməsi doğrudurmu? O: "Bəli, bu belədir"- deyir. Ömər ψ qılıncı ilə vurub onu öldürür".[465] ***"O, halda onların arasında Allahın nazil etdiyi kitabla hökm et. Onların nəfslərinin istədiyinə uyma. Allahın sənə nazil etdiyinin bir qismindən sənə tovlayıb yayındıra biləcəklərindən ehtiyat edib özünü onlardan gözlə. Əgər onlar*** *(bu hökmələrdən)* ***üz döndərsələr, bil ki, Allah onları bəzi günahlarına görə müsibətə düçar etmək istəyir. Doğurdan da insanların çoxu fasiqlərdir".*** *(əl-Maidə 49).* ***"Biz hər ümmətə Allaha ibadət edin və tağutdan çəkinin deyə peyğəmbər göndərdik".*** *(ən-Nəhl 36).* Hər bir millətin Tağutu onun, Allahı və Rəsulunu ρ buraxaraq onların əvəzində müraciət etmiş olduğu, ibadət etdiyi və Allahın bəsirətinə xilaf olaraq ardı ilə getdiyi və ya itaətin yalnız Allaha və Peyğəmbərinə ρ deyil, onlara da məxsus olduğunu deyən kimsələrdir. Allahdan qeyrisinə ibadət etməklə onun ibadət etdiyi şey tağutdur. Həmçinin ardınca getdiyi şey – ona deyiləndə ki, Allah və Rəsulu ρ bizə belə deyib, onlar bizim şeyximizin ardınca gedirik. Bunlar və itaət etdiyi tağutdur. Bura onlara tabe olmaqda hər bir şəxs valideyn, rəhbər və s. daxildir. Allahın qoyduğu həddi aşarsansa sən onu tağut etmiş olursan; ***"Amma xeyr! Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim təyin etməyincə və verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan sənə tam bir itaətlə boyun əyməyincə iman gətirmiş olmazlar".*** *(ən-Nisa 65).*

Onda belə bir sual ortaya çıxır ki, yəhudi və xəsranilər İsa υ və Uzeyrə υ ibadət edirlər və bu ibadətlə həddi aşırlar. Onda İsa υ və Uzeyr υ tağutdur? Xeyr, onlar ardıcıllarına onlara ibadət etməyi əmr etməyiblər. Əksinə Qiyamət günü onların bu ibadətlərini danacaqlar; "***Xatırla ki, o zaman*** *(Qiyamət günü)* ***Allah belə buyuracaq: "Ya Məryəm oğlu İsa! Sənmi insanlara: "Allahla yanaşı məni və anamı da özünüzə***

[464] İbn Əbi Asim "Sünnə" 15, əl-Bağdadi "Tarix" 4/ 369, əl-Bəğavi 1/ 212, əl-Albani "Mişkət" zəif hədis.
[465] İbn Həcər "Fəthul-Bəri" 5/ 29,37, əl-Bəğavi "Təfsir" 1/ 446.

***tanrı bilin"– demişdin?"*** *(İsa cavabında)* ***deyəcək: "Sən pak və müqəddəssən! Haqqım çatmayan bir şeyi demək mənə yaraşmaz, əgər bunu mən demiş olsaydım Sən onu mütləq bilərdin. Sən mənim ürəyimdə olan hər şeyi bilirsən, mən isə Sənin zatında olanı bilmirəm. Şübhəsiz ki, qeybi bilən ancaq Sənsən!"*** *(əl-Maidə 116-117).* Buna görə də Tağut məsələsində dördüncü şərt odur ki, ona ibadət etməkdə, itaət etməkdə və ardı ilə getməkdə özləri razı olsunlar; ***"Sonra onlar özlərinin həqiqi Himayədarı olan Allaha qaytarılacaqlar. Hökm yalnız Ona məxsusdur və O, ən tez haqq-hesab çəkəndir".*** *(əl-Ənam 62).* ***"Bilin ki, yaratmaq da, əmr etmək də Ona məxsusdur".*** *(əl-Əraf 54). "(Ya Peyğəmbər!)* ***Nəfsini özünə tanrı edən və Allahın bilərəkdən yoldan çıxartdığı, qulağını və qəlbini möhürlədiyi, gözünə də pərdə çəkdiyi kimsəni gördünmü? Allahdan başqa kim onu doğru yola sala bilər? Məgər düşünüb ibrət almırsınız?"*** *(əl-Casiyə 23).*

***Tağut Beş Qismdir*** – **1.** İblis. ***"Qiyamət gününə qədər Mənim lənətim sənin üstündən əskik olmasın".*** *(ə-Sad 78)* - ayəsində Allahın xitab etdiyi lənətli və İlahi rəhmətdən qovulmuş şeytandır; ***"Bir zaman Biz mələklərə: "Adəmə səcdə edin!"– dedikdə, İblisdən başqa hamısı səcdə etdi O imtina edib təkəbbür göstərdi və kafir oldu".*** *(əl-Bəqərə 34).* **2.** Allahdan qeyrisinə özünün razılığı ilə ibadət olunanlar. Bundan Allaha sığınırıq. İstər həyatda ikən ona ibadət edilsin, istərsə də ölümündən sonra ona ibadət edilsin, bundan razı olduğu təqdirdə, o kimsə tağutdur. **3.** İnsanları özünə ibadət etməyə çağıran bir kimsə də belədir. İstər ona ibadət etməsinlər. Belə bir kimsənin çağırışı istər qəbul edilsin, istərsə də qəbul edilməsin, o kimsə tağutdur. **4.** Qeybi bildiyini iddia etmək. Qeyb insanın görmədiyi, hal-hazırda olmayan deməkdir. Bu da iki növdür. **1)** Nisbi qeybdir ki, bəzi insanlar üçün məlum ola bilir. Bəzi kimsələr üçün məchul. **2)** Mütləq qeyb isə yalnız Allah tərəfindən və Allahın istədiyi Peyğəmbər tərəfindən bilinə bilər. Bunu bildiyini iddia edən kimsə kafirdir. Çünki o, bu iddiasıyla Allah və Rəsulunu ρ inkar etmişdir; ***"Göylərdə və yerdə qeybi Allahdan başqa heç kəs bilməz. Onlar nə vaxt diriləcəklərini də bilməzlər".*** *(ən-Nəml 65).* Qeybdən xəbər verən insanlara bir sualımız vardır. Peyğəmbər ρ qeybi bilmədiyi halda, sizin qeybi bilməniz necə mümkün ola bilər? Sizmi daha üstünsünüz, yoxsa Allahın Rəsulu ρ? ***"Qeybi bilən ancaq Odur və O qeybi heç kəsə əyan etməz. Bəyənib seçdiyi Peyğəmbərdən başqa".*** *(əl-Cinn 26-27).* Bu qeyb bilgisini iddia edən kimsələrin kafir olmasını açıqlayan ikinci bir dəlildir. Allah Peyğəmbərinə ρ hər kəsə bunu elan etməsini əmr etmişdir: ***"De ki: "Mən sizə demirəm ki, mənim yanımda Allahın xəzinələri vardır, mən qeybi də bilmirəm…".*** *(əl-Ənam 50).* **5.** Uca Allahın nazil etdiyi ilə hökm etmək Rububiyyət tövhidinin tələb etdiyidir. Buna görə də Uca Allah Ondan qeyrisinə tabe olan kimsələri "Rəblər" deyə adlandırmışdır: ***"Onlar Allahı qoyub öz alimlərini və rahiblərini, Məryəm oğlu Məsihi özlərinə tanrı*** *(rəblər)* ***etdilər. Halbuki***

***onlara ancaq bir olan Allaha ibadət etmək əmr olunmuşdur. Ondan başqa heç bir həqiqi ilah yoxdur".*** *(ət-Tövbə 31).*

# İSTİAZƏ – SIĞINMAQDA ŞİRK

***İstiazə – Azə - Yəuzu -*** sığınacaq tələb etmək (axtarmaq), kimdənsə sığınacaq istəmək və ya nədənsə (hansısa yerdən) o şey onu şərdən qorumasına ümid və etiqad etmək. Xoşlanılmayan bir şeydən himayə edilməyi istəmək deməkdir. Buna görə də ***İstiazə*** - edən kimsə sığındığı kimsənin himayəsinə girmiş və ona güvənmiş, ona bağlanmış deməkdir. ***İyaz -*** bir pisliyi dəf etmək deməkdir, ***Liyaz*** – xeyri tələb etmək üçün edilir. Ümumiyətlə ***İst*** – kəliməsi tələb etmək, istəmək deməkdir. ***İstisqa*** – namazı yağış tələb etmək, istəmək deməkdir. ***Həmçinin*** - ***İst*** – kəliməsi bir şeyin əzəmətli olduğunu da bildirir. ***İstəğnəllah*** – Allah ən varlıdır və heç bir şeyə də möhtac deyildir. Ona görə də əgər istəyən istənilləndən aşağı (zəlildirsə) artıq bu duadır. Yox əgər istədiyin səninlə eyni səviyyədədirsə bu xahiş ***İltimas -*** adlanır. Özündən aşağı olandan istəyirsə bu artıq əmrdir. ***İstiazə*** - sığınacaq tələb etməkdir. Bu tələbdə dua vardır. Çünki, sən aşağıdan yuxarı istəyirsən, istədiyin isə səndən yuxarıdır. ***İstiazə - Anə - Ğasə -*** hər birində dua vardır və dua da ibadətdir. Dəlil: ***"Şübhəsiz ki,*** *(bütün)* ***məscidlər Allaha məxsusdur. Allahdan başqa heç kəsə ibadət etməyin!"*** (əl-Cinn 18). Kim desə ki, bu ayədə ***İstiazə -*** yoxdur? Biz xeyr, vardır. Bu da duadır. Bu üç ibadətin üçündə də dua, istək vardır. Artıq kim sığınacaq istəyirsə, kömək diləyirsə bilsin ki, istədiyindən aşağıdır. Dua ilə yalnız Allaha müraciət edilməlidir. Allahdan qeyrisinə sığınmaq isə şikdir. Yalnız Allahın qadir olduğu, himayə edə biləcəyi bir şeydə Allahdan qeyrisinə sığınmaq şirkdir. ***Sığınmanın Bir Neçə Növü Vardır:***

**1.** Uca Allaha sığınmaq. Bu da Allaha möhtac olmağı, Ona bağlanmağı, hər bir işdə Allahın kifayət etməsinə və hal-hazırda, gələcəkdə, kiçik, böyük, insan və ya insandan başqa hər şeyə qarşı mütləq bir mənada himayə edəcəyinə inanıb bağlanmağı əhatə etməkdədir; ***"De ki: "Pənah aparıram sübhün Rəbbinə, yaratdıqlarının şərindən, zülmətə bürünməkdə olan gecənin şərindən,*** *(ovsun oxuyub)* ***düyünlərə üfürən*** *(yaxud cadu edib iplərə düyün vuran)* ***qadınların şərindən və bir də paxılın şərindən".*** *(əl-Fələq 1-5).* ***"De ki: "Pənah aparıram insanların Rəbbinə, insanların ixtiyar sahibinə, insanların Tanrısına, vəsvəsə verən, qaçıb gizlənən şeytanın şərindən. O, şeytan ki, insanların ürəklərinə vəsvəsə salır. O, şeytan ki, cinlərdən də olur, insanlardan da".*** *(ən-Nəs 1-6).*

**2.** Ölülərlə ya da sığınma tələbini qarşılama gücünə malik olmayan canlılar ilə istiazə. Bu növ istiazə şirk sayılır. Ona görə də kimsə qəbr sahibinə qəlbi ilə sığınarsa (Yönələrsə) bu zaman böyük şirk etmişdir; ***"Həqiqətən bir para insanlar bir para***

***cinlərə pənah aparırlar*** *(sığınırlar)*. ***Bununla da onların təkəbbürünü, azğınlığını artırırdılar".*** *(əl-Cinn 6).* Mücahid Σ deyir: "Bu vadinin ağasına sığınırıq. Bu isə onların cahilliyini daha da artırırdı". ***Rahaq*** – İbn Abbas, Qatadə N deyirlər: "Onların günahını artırdı". Bəziləri deyirlər ki: "***Rahaq*** **-** Cinlərin təkəbürlüyünü artırırdı". Bu ayənin təfsirində deyilir ki: Bir qrup insanlar cinlərə sığınıraq pənah apardılar. Bu da onların qəlblərində qorxu yaratmışdır. Cinlər bunu bildikdə özlərini daha da üstün saydılar. Digər təfsirdə: "Cahiliyyə dövründə ərəblərdən biri qaranlıq bir vadidə gecələmək istədikdə cinlərdən qorxduğu üçün: "Burada var olan qövmün səfehlərindən bu qövmün ağasına sığınıram"- deyərdi. Yəni cinlərin böyüyünə sığınardı. Cinlər də insanların onlardan qorxduqlarını, onlara sığındıqlarını gördükdə onları daha da çox qorxutmağa başladılar". Xaulə bint Həkim əs-Suləmiyyə O rəvayət edir ki: "Allah Elçisi ρ belə buyurmuşdur: "Kim qonaq qalacağı bir yerə gələr və: "Əuzu bikəlimətilləhit-təmməti min şərri mə xaləq"- (Yaratdıqlarının şərindən Allahın tam kəlamlarına sığınıram!) - deyərsə, oradan ayrılana qədər ona heç bir şey zərər verməz".[466] Uca Allahın Kəlamı, Əzəməti, İzzəti və buna bənzər sifətlərindən hər hansı bir sifəti ilə istiazə etmək; ***"Əgər sənə şeytandan bir vəsvəsə gəlsə Allaha sığın. Şübhəsiz ki, Allah eşidəndir, biləndir".*** *(Fussilət 36).*

**3.** Lakin insan kimdənsə gücü çatacağı bir sığınacağı istəyərsə burada açıqlama vardır: Məhəbətin ən yüksəyi Allaha olmalıdır. Bu da ibadət olan sevgidir. Allahdan qeyrisini Allah səviyyəsində sevmək, ucaltmaq qadağan edilmişdir. Lakin Allah insanlar arasında sevgi qoymuşdur. Həmçinin, ibadət olan qorxu yalnız Allahdan qorxulmalıdır. Bununla yanaşı Allah təbii qorxu deyilən bir şey xəlq etmişdir. ***İstiazə*** **-** yalnız Allaha qarşı edilməlidir. Ona görə də qadir olduğu bir şey olsa da belə məxluqata sığınmaq qadağandır. Çünki, ***İstiazə*** **-** ilk növbədə sığınacaq istədiyin kimsəyə qarşı qəlbin yönəlməsi, bağlanması, sığınacaq istənməsi, ona müraciət edilməsi, qorxu (o, sənə kömək edəcək yoxsa yox) ümüd edəcək hala gələrsə, demişlər ki: "Əgər qəlb əməlləri belə bir halda birləşərlərsə, bir yerə cəm olarsa onu Allahdan qeyrisinə yönəltmək olmaz". Çünki, ***İstiazədə*** **-** həm qəlbin, həm də əzaların əməlləri vardır. Qəlb əməllərinə gəldikdə: İnsan qəlbini ona bağlayır yəni ümid edir, müraciət etdiyi zaman sakitlik hiss edir, öz qurtuluşunu o kimsədə görür. Bu iki etiqad bir yerdə cəm olarsa onu Allahdan qeyrisinə yönəltmək olmaz. Digər qrup alimlər: Qadir olduğu bir şeydə məxluqa yönəlməkdir. Yəni hər hansısa bir şərdən qurtarmaq üçün kimdənsə sığınacaq istəməkdir. Məxluqun qadir olmadığı, bacarmadığı bir şey (iş) olarsa, o vaxt şirk olur. Qəlbi Allaha imanla dolu, qəlbi rahat, Allaha ümid edir, Allahdan kömək umur və hansısa bir qula bir işi üçün onu səbəb sayaraq yönəlirsə bu icazəli istiazədir. Onun istiazəsi yalnız zahiri əzalarladır, qəlbi ilə deyildir.

---

[466] ət-Tirmizi 3437; İbn Macə 3547. əl-Albani hədisi səhih adlandırmışdır.

İnsan, məkan ya da bunlardan başqa sığınılması mümkün olan şeylərlə istiazə etmək. Belə bir sığınmaq caizdir. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "İrəlidə bir çox fitnələr olacaqdır. Bu fitnələr zamanı yatan kimsə, oyaq olandan, oturan kimsə ayaqda durandan, ayaqda duran kimsə yürüyəndən, yürüyən kimsə qaçandan xeyirlidir. Hər kim fitnə vaxtına yetişərsə sığınsın və ya gizlənmək üçün yer taparsa gizlənsin (Başqa rəvayətdə: "Dəvəsi olan dəvəsinin yanına, qoyunu olan qoyunlarının yanına, ərazisi olan ərazisinə, bu kimi malları olmayan qılıncını alıb kəskin tərəfini daşa vurub (yaylarnızı qırın) sonra bacardığı qədər sağ qalmağa çalışsın)".[467] Əgər zalımın şərindən sığınacaq olursa belə bir kimsənin mümkün olduğu qədər himayə edilməsi lazımdır. Lakin haram bir əməli etmək, yaxud da fərz olan bir işdən qaçmaq üçün sığınma istəyirsə, belə birisinin himayə edilməsi haram olur. Əli ψ rəvayət edir ki, Peyğəmbər ρ mənə dörd şeyi buyurdu: "Yenilik edib dinini dəyişən (bidətçiyə, cinayətkara) sığınacaq verənə Allah lənət etsin".[468] Aişə O rəvayət edir ki, Mahzum oğullarından, oğurluq etmiş bir qadının durumu Qureyşliləri xeyli üzmüşdü. Qureyşlilər dedilər: "Bu qadın haqqında Peyğəmbər ρ ilə kim danışa bilər? Peyğəmbərin ρ çox sevdiyi Usamə ibn Zeyddən ψ başqasının buna cəsarəti çatmaz"- deyə qərar verdilər. Usamə ψ bu halı Peyğəmbərə ρ danışdıqda, o: "Allahın qoyduğu cəzalardan birinin qaldırılmasınımı istəyirsən?"- deyə buyurdu və qalxaraq bir xütbə verdi: "Sizdən əvvəlkiləri həlak edən bu idi: Özlərindən adlı-sanlı biri oğurluq edincə onu buraxardılar. Zəif və yoxsul kimsə oğurluq etdiyi zaman isə ona cəza verərdilər. Allaha and olsun ki, Muhəmmədin qızı Fatimə O də oğurluq etsəydi belə onun əlini kəsərdim (Qəzəbdən onun rəngi dəyişmişdi. Usamə ψ: "Ya Rəsulullah! Mənim üçün Allahdan bağışlanma dilə"- dedim. Sonra o qadının əli kəsildi)".[469]

## İSTİĞASƏ – KÖMƏK DİLƏMƏKDƏ ŞİRK

***İstiğasə*** – çətin anda kömək, imdad diləməkdir. ***Ğous*** – o deməkdir ki, kimsə çətin bir hala düşür, kədər, qəm, qüssə onu bürüyür, qorxur ki, şiddətli bir hadisə baş verəcək və s. Həmçinin kim belə bir vəziyyətdə olana kömək edərsə ona ***Əğasahu*** - deyilir. ***İstiğasə*** - pis (çətin) bir anda kimdənsə kömək istəmək, ***İstianə -*** isə yaxşı və pis bir anda kimdənsə kömək istəmək deməkdir; ***"O, şəhərə əhalisi xəbərsiz ikən daxil oldu və orada bir-biri ilə vuruşan iki kişi gördü. Biri onun tərəfdarlarından, o biri isə düşmənlərindən idi. Tərəfdarlarından olan kəs onu düşməninə qarşı köməyə çağırdı. Musa onu vurub öldürdü və: "Bu, şeytan əməlindəndir. Həqiqətən, o, haqq yoldan azdıran açıq-aydın bir düşməndir!"– dedi".*** *(əl-Qəsəs 15)*. Peyğəmbərin ρ

[467] Muslim 2887.
[468] Muslim 1978, İmam Nəvəvi "Şərh Səhih Muslim" 13/150.
[469] əl-Buxari 6788, Muslim 1688.

dövründə bir nəfər münafiq möminləri incidirdi. Onlardan bəziləri dedi: "Gedək Allah Rəsulundan ρ bu riyakara qarşı ***İstiğasə -*** kömək istəyək". Peyğəmbər ρ buyurdu: "Məndən yox, Allahdan kömək istəmək lazımdır".[470] İstiazə və İstiğasənin ixlasla Allaha yönəldilməsi İman və Tövhiddir. Allahdan başqasına yönəldilməsi isə şirk qoşmaqdır. ***Bunun Bir Neçə Növü Vardır:***

**1.** Uca Allahdan imdad, kömək diləmək. Bu əməllərin ən fəzilətlisi və mükəmmələrindəndir. Peyğəmbərlərin və onlara tabe olanların izlədikləri yol budur; ***"O vaxt siz Rəbbinizdən kömək diləyirdiniz. O da: "Mən sizə bir-birinin ardınca gələn min mələklə yardım edəcəyəm"– deyə duanızı qəbul etmişdi".*** *(əl-Ənfal 9).*

**2.** Ölülərdən və ya hal-hazırda olmayıb buna gücü çatmayan canlı kimsələrdən kömək istəmək. Bu böyük şirkdir. Çünki, bu əməli belə bir kimsələrin kainatda hansısa bir gücə malik olduqlarına inanan və Rububiyyətdə onlara bir pay ayıran kimsə edər; ***"Darda qalan kimsə yalvardığı zaman ona cavab verən, şəri sovuşduran və sizi yer üzünün varisləri edən kimdir? Heç Allahla yanaşı başqa bir məbudmu var? Siz necə də az düşünürsünüz?"*** *(ən-Nəml 62).* Məs: Ölü sahibindən və ya diri bir kimsədən elə bir şeyi istəyirsən ki, buna yalnız Allah qadirdir. Qorxaraq, zəlil olaraq, ümid edərək edirsənsə, yalnız Allahın qadir olduğu bir şeyi ondan diləsən şirk olur. Ey filankəs! Ehtiyaclarımı ödə, problemlərimi həll et, ruzi ver, şəfa ver və s. deyə müraciət edərsə, Allah belələrinə Kitabında buyurur: ***"Sizin Ondan qeyri dua etdikləriniz bir çəyirdək qabığına da sahib deyillər. Əgər siz onlara dua etsəniz onlar sizin dualarınızı eşitməzlər. Eşitsələr də belə cavab verməzlər. Özləri də Qiyamət günü sizin şərik qoşduqlarınızı danacaqlar. Heç kəs sizə hər şeydən xəbərdar olan Allah kimi xəbər verə bilməz".*** *(Fatir 13-14).* Ölü ilə dua edən kimsə arasında heç bir bağlantı yoxdur və Qiyamət gününə qədər ona cavab verməzlər. Belə bir kimsəni Allah imtahan edə bilər. On il övladı olmayan on birinci il gəlir qəbir sahibindən diləyir, kömək istəyir və övladı olur. Ona görə də deyilir ki: Qəbir sahibi ona övladın verilməsinə əsla səbəb olmadı, çünki ölülər heç nəyə sahib deyillər. Deyilir ki: O, günü istədi ona da verildi. ***Daha doğru*** – Allahdan başqa heç kəsin qadir olmadığı bir şeyi və Allahdan başqa heç kəsin kömək edə bilməyəcəyi bir şeyi məxluqdan istəyərsə böyük şirkdir. Həmçinin qeybdə olan bir kəsdən (istər ölü, istər diri) olsun bir şey istəmək olmaz. Heç bir dünyəvi xeyri onlardan ala bilməzsən. Əksinə bununla axirət dünyanı da puç etmiş olacaqsan.

**3.** Həyatda olan, bilən və kömək etməyə gücü çatan kimsələrdən kömək istəmək. Bu əməl icazəlidir; ***"O, şəhərə əhalisi xəbərsiz ikən daxil oldu və orada bir-biri ilə vuruşan iki kişi gördü. Biri onun tərəfdarlarından, o biri isə düşmənlərindən idi. Tərəfdarlarından olan kəs onu düşməninə qarşı köməyə çağırdı. Musa onu vurub öldürdü və: "Bu, şeytan əməlindəndir. Həqiqətən, o, haqq yoldan azdıran açıq-aydın***

[470] əl-Heysəmi 10/ 159, ət-Tabərani "Mucəmul-Kəbir".

***bir düşməndir!"– dedi".*** *(əl-Qəsəs 15).* ***İstiğasə -*** duanın bir növüdür. Məxluqun qadir olduğu bir şeydə ondan kömək istəmək olar. Məs; Birinə deyirsən ki, gəl mənə maşını itələməyə kömək et. ***Həmçinin* -** İnsan kömək istədiyi zaman qəlbində etiqad etməlidir ki, bu kimsə yalnız səbəbdir. Kömək isə Allahdandır. Öz-özlüyündə insan buna qadir deyildir. Kömək Allahdandır, sadəcə bu insanın səbəbilədir. Lakin sən Allahı unutsan, o kimsəyə təvəkkül etsən bu Tövhidə xələldir. Əgər sənə bir bəla, müsibət üz versə, kim onu səndən qurtara bilər? Yalnız o müsibəti təqdir edən səni qurtara bilər; ***"Allah sənə bir zərər yetirmiş olsa səni ondan Allahdan başqa heç kəs qurtara bilməz".*** *(Yunus 107).*

**4.** Gizli (qeybi) bir qüvvəyə sahib olduğuna inanmadan gücü çatmayan, həyatda olan bir kimsədən yardım istəmək. Məs: Suda boğulan bir kimsənin üzməyi bacarmayan (xəstə) bir adamdan yardım istəməsi və s. Belə bir şey boş bir işdir və yardım istədiyi kimsəni ələ salmaqdır.

# İSTİANƏ – YARDIM DİLƏMƏDƏ ŞİRK

Dua iki qismdir: **1)** ***Dua İbadə -*** bu növ duanı Allahdan qeyrisinə yönəltmək olmaz. Namaz, zəkat, oruc və s. **2)** ***Dua Məsələ -*** istək duası. Hansısa bir istəklə Allaha yönəlməkdir. Dua edən kisənin özünə faydası olan bir şeyi istəməsi və ya bir zərərdən uzaqlaşmaq üçün yardım istəməsidir. ***İstiğasə*** - ***Dua*** arasında fərq – Başa gələn bir bəlanı uzaqlaşdırmaq üçün kömək, imdad diləməkdir. ***İstiğasə*** - sadəcə pislikdən qurtulmaq üçün edilərkən, ***Dua*** – həm pislikdən, həm də gözəl şeyləri istəmək üçün edilir. ***Bu Bir Neçə Növü Vardır:***

**1.** Allahdan yardım diləmək. Bu qulun Rəbbinin qarşısında zəlil olması, işlərini Ona həvalə etməsi və Onun yetərli olduğuna inanmasını əhatə edir; ***"Biz yalnız Sənə ibadət edir və yalnız Səndən kömək diləyirik".*** *(əl-Fatihə 5).*

**2.** Məxluqatın gücünün yetəcəyi bir xüsusda yardım istəmək. Bu da özü üçün yardım istəyənin durumuna görə dəyişir. Əgər özü üçün yardım istənilən xüsus yaxşılıqdırsa, bu həm yardım istəyən, həm də yardım edən üçün icazəlidir; ***"Yaxşılıq etməkdə və Allahdan qorxmaqda bir-birinizə yardım edin".*** *(əl-Maidə 2).* Əgər günah üçün olursa bu yardım istəyən üçün də, yardım edən üçün də haram olur; ***"Günah işlər görməkdə və düşmənçilikdə bir-birinizə köməkçi olmayın".*** *(əl-Maidə 2).* Mübah bir işdə olursa bu həm yardım istəyən üçün, həm də yardım edən üçün caizdir. Lakin yardım edən yaxşılığın qarşılığında savab ala bilər; ***"Yaxşılıq edin, şübhəsiz ki, Allah*** *(ehsan)* ***yaxşılıq edənləri sevir".*** *(əl-Bəqərə 195).*

**3.** Gücü çatmayan və hal-hazırda olan bir yaradılmışdan yardım istəmək. Belə bir yardım istəmək də boş bir şeydir. Belə etməyin heç bir mənası yoxdur. Məs: Ağır bir yükü daşımaq üçün gücsüz və zəif birisindən yardım diləmək kimi.

**4.** Müləq olaraq ölülərdən və ya həyatda olan kimsələrdən həyata keçirə bilməyəcəkləri və qeybi bir iş haqqında yardım istəmək. Belə bir şey də şirkdir. Çünki, belə bir əməli edən kimsə onların kainatda hansısa bir gücə malik olduqlarına inandığına görə edir.

**5.** Uca və böyük Allahın sevdiyi bir neçə əməl və ibadətləri irəli sürərək yardım istəmək; ***"Səbr və namaz ilə yardım istəyin".*** *(əl-Bəqərə 153).* İbn Abbas ψ rəvayət edir ki, bir gün (minikdə) Peyğəmbərin ρ tərkində oturmuşdum. O, buyurdu: "Ey oğul! Mən sənə bir neçə kəlimə öyrədəcəyəm. Allahı qoru ki, Allah da səni qorusun. Allahı qoru ki, Onu öz qarşında tapasan. Bir şey dilədikdə, Allahdan dilə. Kömək istədikdə yenə də Allahdan kömək istə. Bunu da bil ki, əğər bütün insanlar sənə xeyir vermək üçün bir yerə yığışsalar da belə Allahın yazdığından artıq sənə heç bir xeyir verə bilməzlər. Bunu da bil ki, əğər sənə zərər vermək üçün bir yerə yığışsalar da yenə də Allahın yazdığından artıq sənə zərər verə bilməzlər. (Çünki) qələmlər qaldırılmış, səhifələrin (mürəkkəbi) qurumuşdur".[471] Başqa bir rəvayətdə: Peyğəmbər ρ buyurdu: "Allahı qoru ki, Onu öz qarşında tapasan. Yaxşı günündə Allahı yada sal ki, Allahda səni çətin (pis) günündə yada salsın. Bunu da bil ki, səni ötüb keçən bəla sənə toxunmamalı idi. Sənin başına gələn bəla isə bil ki, səni ötüb keçməməli idi. Bunu da bil ki, (Allahın) yardımı, zəfəri - səbrlə birlikdədir. Qurtuluş – kədər və sıxıntı ilə bərabərdir və şübhəsiz ki, hər bir çətinliklə birlikdə - asanlıq vardır".[472]

***"Allahı qoyub, sənə nə bir fayda, nə də bir zərər verə bilməyən şeylərə yalvarma. Əgər belə etsən, sözsüz ki, zalımlardan olarsan. Əgər Allah sənə bir zərər toxundursa, bunu Ondan başqa heç kəs aradan qaldıra bilməz. Əgər sənə bir xeyir diləsə, heç kəs Onun lütfünün qarşısını ala bilməz. O, bunu Öz qullarından istədiyinə nəsib edər. O, Bağışlayandır, Rəhmlidir".*** *(Yunus 106-107).* Allah sevimli Peyğəmbəri ρ haqqında buyurur: Əgər sən də Allahdan qeyri nə zərər, nə də xeyir vermək gücünə sahib olmayan birisinə ibadət edib çağırsan, bunun səbəbilə özünə zülm edənlərdən olarsan. Əgər bu sözlər Allahın Peyğəmbəri, Allahın dostu barəsidə söylənilmişsə bəs digər insanlar barəsində nə demək olar? Biz daha çox şirkdən qorxub çəkinməliyik. Sonra Allah buyurur: Əgər O, sizə zərər yetirsə kim Onun toxundurduğu zərəri aradan qaldıra bilər. Onun insana göndərdiyi bəlanı kim qaldıra bilər? Yalnız Allah. Buna görə də Allahdan qeyrisinə yönələrk kömək istəmək mənasız bir şeydir; ***"Siz Allahı qoyub ancaq bütlərə ibadət edir,*** *(onlara tanrı deməklə)* ***yalan uydurursunuz. Sizin Allahdan başqa ibadət etdikləriniz sizə ruzi verməyə qadir deyillər. Ruzini Allahdan diləyin. Ona tapının, Ona şükür edin. Siz*** *(Qiyamət günü)* ***Onun hüzuruna qaytarılacaqsınız!"*** *(əl-Ənkəbut 17).* Allah bu ayədə məxluqata ruzini yalnız Ondan diləməyi əmr edir. Çünki, Allahdan qeyri heç kəs ruzi verməyə qadir deyildir. Sonra

---

[471] ət-Tirmizi 2516, əl-Albani "Səhihul-Cəmi" 7834.

[472] "Riyadus-Salihin" 63, əl-Albani səhih deyib.

isə Ona ibadət edərək verdiyi nemətlərə görə Ona şükr etməyi buyurur. Çünki, qayıdış yalnız Onadır; ***“Allahı qoyub Qiyamət gününədək özünə cavab verə bilməyən əşyalara yalvaran kimsədən daha çox azmış kim ola bilər? Halbuki o bütlər onların yalvarışından xəbərsizdirlər. İnsanlar bir yerə toplanılacaqları zaman bütlər onlara düşmən kəsiləcək və onların ibadətini inkar edəcəklər”.*** *(əl-Əhqaf 5-6).* Bu ayədə Allah məxluqatın ən azmış kimsələri barədə xəbər verir. O, kəslər ki, Allahı buraxaraq dirilərdən yox, ölmüş kimsələrdən yardım diləyirlər. Bunlardan da daha dəhşətlisi ağac, dağ, qəbir və s. istəyənin halıdır; ***“Darda qalan kimsə yalvardığı zaman ona cavab verən, şəri sovuşduran və sizi yer üzünün varisləri edən kimdir? Heç Allahla yanaşı başqa bir məbudmu var? Siz necə də az düşünürsünüz?”*** *(ən-Nəml 62).* Bu ayə dəlildir ki, Allahdan qeyri heç kəs duanı qəbul edə bilməz. Duaları qəbul edən və cavab verən yalnız Allahdır.

## ŞƏFAƏTDƏ ŞİRK

***Şəfaət - Şəf*** sözündən (Cütlük – Cüt) sözündən götrülüb. Şəfaət istəyən tələb edəndir. Tələb edən isə ikincinin cütü olur. İstəyən digərinin yanına gəlir, ondan şəfaət istəyir və cüt olurlar. ***İstilahi Mənası -*** kimin üçünsə xeyir diləmək, şər və əzabdan uzaq etmək üçün vasitəçi olmaq deməkdir.[473] ***Şəfaət*** – dua deməkdir. Dua isə Allahdan qeyrisinə edilməz. Allahdan qeyrisinə şəfaət şirkdir. Müəyyən qaydalar olmadan şəfaət istəmək qadağan edilmişdir. Şəfaət Quran və Sünnə ilə iki qismdir: **1.** ***Mənfi şəfaət*** - Allahdan başqasının gücü çatmayacağı məsələlərdə Ondan başqasından şəfaət diləmək, Allahın izni olmadan şəfaət istəmək və ya Allaha şərik qoşulan bir şeydən şəfaət diləməkdir. Allahın müşriklərdən inkar etdiyi şəfaətdir ***"Allahın izni olmadan onun yanında kim şəfaət edə bilər".*** *(əl-Bəqərə 255).* ***"Rəbbinin hüzuruna cəm ediləcəklərindən qorxanları Quranla xəbərdar et. Onların Allahdan başqa heç bir hamisi və havadarı yoxdur. Bəlkə də onlar pis əməllərdən çəkinsinlər".*** *(əl-Ənam 51).* **2.** ***Müsbət şəfaət*** – Allahdan söz və əməlindən razı olacağı birini özün üçün şəfaətçi olmasını tələb etməkdir və ya gücü çatacağı bir şeydə bir bəşərdən köməkçi olmasını istəməkdir. Allahın şəfaət edənə icazə verməsi - şəfaət edəndən və olunandan razı olmasıdır. Peyğəmbərin ρ dövründə səhabələr onun yanına gələrək ondan şəfaət etmələrini yəni dua etmələrini xahiş edərdilər; ***“Yoxsa onlar Allahdan qeyrilərinimi özlərinə şəfaətçi etdilər? De: "Əgər onlar heç bir şeyə malik deyillərsə və heç bir şey anlamırlarsa bəs necə olsun?" De: "Şəfaət bütünlüklə Allaha məxsusdur. Göylərin və yerin hökmranlığı da Ona məxsusdur. Sonra siz Ona qaytarılacaqsınız".*** *(əz-Zumər 43-44).* Şəfaət bütünlüklə Allaha məxsusdur. Ona görə də şəfaət zamanı qəlb heç kəslə bağlı olmamalıdır. Allahın izni olmadan heç kəs şəfaətlə məşğul ola bilməz. Nə

---

[473] "Qamusul-Muhit" Ayn babı, Sin fəsli s. 947, Useymin "Şərhu Limatil-Etiqad" s. 80.

mələk, nə Peyğəmbərlər, nə də onlardan aşağı olan bir kəs şəfaət edə bilməz. Yaxşı, Allahın izni olmadan və Allahın razılığı olmadan heç kimsə şəfaət edə bilməzsə, bu zaman Allah şəfaət etməyə kimə izn verəcək? Müşriklər elə zənn edirdilər ki, onların ibadət etdikləri bütlər onlar üçün Allah dərgahında şəfaətçi olacaqlar. Hansısa bir ibadət növü ilə qəbir sahibinə yönəlsələr, o da Qiyamət günü onlar üçün şəfaətçi olacaqdır. Onlar elə zənn edirlər ki, Allahın izni olmadan, razılığı olmadan kimsə şəfaət edə bilər. Bu ayələr isə bütün bu etiqadları alt-üst edir. Müşriklər: "Biz bu bütlərə bizi Allaha yaxınlaşdırsınlar deyə ibadət edirik"- dedilər. ***"Biz, onlara ancaq bizi Allaha daha çox yaxınlaşdırsınlar deyə ibadət edirik"– deyirlər...".*** *(əz-Zumər 3).* ***"Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən...".*** *(əl-Qəsəs 56).* Allah – Ey Rəsulum! Sən sevdiyini hidayətə yönəldə bilməzsən, onların hidayətə yönəlmələri sənin üzərinə düşən bir məsuliyyət deyildir. Sənin işin sadəcə təbliğ etməkdir. Allah dilədiyinə hidayət verir, çünki O, hidayətə kimin layiq olduğunu ən gözəl biləndir. Qəbir sahibindən, ölüdən şəfaət edən kimsə artıq özünü şəfaətdən məhrum etmiş olur.

Allah Qurani-Kərimin bir çox ayələrində şəfaətin yalnız Ona məxsus olduğunu və heç kəsin bu işdə hər hansı bir payı olmadığını bizə bildirir; ***"Yoxsa onlar Allahdan qeyrilərinimi özlərinə şəfaətçi etdilər? De: "Əgər onlar heç bir şeyə malik deyillərsə və heç bir şey anlamırlarsa bəs necə olsun?" De: "Şəfaət bütünlüklə Allaha məxsusdur. Göylərin və yerin hökmranlığı da Ona məxsusdur. Sonra siz Ona qaytarılacaqsınız".*** *(əz-Zumər 43-44).*

Nə zaman olacağına gəlincə, Uca Allah bizə şəfaətin ancaq onun izni ilə olacağını xəbər vermişdi; ***"Allahın izni olmadan onun yanında kim şəfaət edə bilər".*** *(əl-Bəqərə 255).* *"**Onun izni olmadan heç bir şəfaət edən ola bilməz".*** *(Yunus 3).* ***"Axirət də, dünya da ancaq Allahındır. Göylərdə neçə-neçə mələklər vardır ki, onların şəfaəti heç bir fayda verməz. Ancaq Allah öz istədiyi və razı olduğu kimsəyə izn verdikdən sonra*** *(onun şəfaəti fayda verər)****".*** *(ən-Nəcm 25-26).* ***"Onun hüzurunda izn verdiyi kimsələr istisna olmaqla heç kəsin şəfaəti fayda verməz".*** *(Səba 23).*

Kimlərin şəfaət edəcəyinə gəlincə isə, Uca Allah bizə şəfaətin ancaq Onun izn verməsindən sonra gerçəkləşəcəyini xəbər verdiyi kimi, bu xüsusda ancaq Onun sevdiyi kimsələrin şəfaət edəcəyini də xəbər vermişdir; ***"Ruh*** *(Cəbrail)* ***və mələklər səf-səf duracağı gün, Mərhəmətli Allahın izin verdiyi kimsələrdən və doğru söz deyənlərdən başqa heç kəs danışmayacaq".*** *(ən-Nəbə 38).* ***"Allahdan əhd almış kəslər müstəsna olmaqla, qalanları*** *(kafirlər)* ***şəfaət etməyə qadir olmazlar".*** *(Məryəm 87).* Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Hər bir Peyğəmbərin qəbul edilmiş duası vardır. Hər bir Peyğəmbər də bu duasını etmişdir. Lakin mən duamı

Qiyamət günü ümmətimə şəfaət etmək üçün saxladım. Artıq ümmətimdən Allaha heç bir şeyi şərik qoşmamış olan kimsələr inşəallah bu şəfaətə nail olacaqlar".[474]

Uca Allah bizə ancaq Allahın razı olduğu kimsələr üçün şəfaət ediləcəyini də xəbər vermişdir; ***"Allah onların keçmişini və gələcəyini bilir. Onlar yalnız Onun razı qaldığı şəxslərdən ötrü şəfaət diləyir və Onun qorxusundan tir-tir əsirlər".*** *(əl-Ənbiya 28).* ***"O gün Mərhəmətli Allahın izin verdiyi və söz deməsinə razı olduğu şəxslərdən başqa heç kimin şəfaəti fayda verməyəcəkdir".*** *(Ta ha 109).*

Bütün bu ayələrdən bəlli oldu ki, şəfaət yalnız Allahın söz və əməlindən razı olduğu kəslərə izn verdikdən sonra və Allahın razı olduğu kimsələrə ediləcəkdir. Bundan qeyri olan şəfaət (yəni: Allahın gücü çata biləcək şeylərdə Allahdan qeyrisindən şəfaət istəmək) isə müşriklərin bütləri, tanrıları haqqında inandıqları şirk olan şəfaətdir. Çünki, onlara görə Allahın izni və rizası olmadan onların bütləri onlara şəfaət edəcəklər. Allah bu cür şəfaət istəyənlər haqqında buyurur: ***"Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən bütlərə ibadət edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir"- deyirlər. De ki: "Allaha göylərdə və yerdə*** *(özünə şərik)* ***bilmədiyi bir şeyimi xəbər verirsiniz? Allah Özünə şərik qoşulan bütlərdən uzaqdır və ucadır".*** *(Yunus 18).* ***"O vaxt ki, biz sizi aləmlərin Rəbbinə tay tuturduq. Bizi ancaq günahkarlar azdırdı. İndi isə bizim nə şəfaətçilərimiz, nə də bizə canıyanan bir dostumuz var! Bir də dünyaya qayıda bilsəydik, möminlərdən olardıq!"*** *(əş-Şuəra 98-102). "(Ya Peyğəmbər!)* ***Onları ürəklərin ağıza gələcəyi, udquna belə bilməyəcəkləri yaxın günlə*** *(Qiyamət günü ilə)* ***qorxut.*** *(O, gün)* ***zalimlərin nə bir dostu, nə də bir şəfaətçisi olar".*** *(əl-Mumin 18).* ***"Şəfaət edənlərin şəfaəti onlara fayda verməz".*** *(əl-Muddəssir 48).* ***"Qorxun elə bir gündən ki, o gün heç kəs heç kəsin işinə yarıya bilməz, heç kəsdən*** *(gördüyü pis işlər müqabilində)* ***əvəz*** *(fidyə)* ***qəbul edilməz, heç kəsin şəfaəti fayda verməz və*** *(Allahın əzabından xilas olmaqda)* ***onlara*** *(günahkarlara)* ***heç bir kömək də göstərilməz".*** *(əl-Bəqərə 123). "(Allaha qoşduqları)* ***şəriklərindən onlar üçün şəfaət edəcək kimsələr olmayacaq. Onlar öz şəriklərini inkar edəcəklər".*** *(ər-Rum 13).*

Allahın izni və razılığı olmayan hər hansı bir şəfaət heç kəsdən, hətta şəfaət edən Peyğəmbər də olsa belə ondan qəbul olunmaz. Allah Qurani-Kərimdə üç Peyğəmbəri xatırladaraq buyurur ki, onların şəfaəti, şəfaət etdikləri insanlara heç bir fayda verməmişdir. Allah onların şəfaətini qəbul etməmişdir, çünki buna onun izni və razılığı olmamışdır; ***"Nuh Rəbbinə*** *(dua ilə)* ***müraciət edib dedi: "Ey Rəbbim! Oğlum*** *(Kənan)* ***mənim ailə üzvlərimdəndir. Sənin vədin sözsüz ki, haqdır. Sən hakimlərin hakimisən". Allah buyurdu: "O, sənin ailəndən deyildir. Çünki o,*** *(küfr etməklə)* ***pis bir iş görmüşdür.*** *(Və ya sənin məndən onu xilas etmək xahişin yaxşı iş deyildir).* ***Elə isə bilmədiyin bir şeyi Məndən istəmə. Sənə cahillərdən olmamağı nəsihət edirəm".*** *(Hud*

---

[474] əl-Buxari, Muslim.

*45-46).* ***İbrahim öz atasına: "Mən*** *(öz Rəbbimdən)* ***mütləq sənin bağışlanmağını diləyəcəyəm. Mən heç vəchlə səni Allahdan*** *(Allahın əzabından)* ***qurtara bilmərəm*** *(mənim bacardığım yalnız budur)* ***deməsi istisnadır".*** *(əl-Mumtəhinə 4).* Peyğəmbər ρ idi ki, müşrik olaraq ölən əmisi üçün Allahdan bağışlanma dilədikdə, Allah ona bu əməli qadağan edərək buyurdu: ***"Müşriklərin Cəhənnəmlik olduqları*** *(müsəlmanlara)* ***bəlli olduqdan sonra, onlarla qohum olsalar belə, Peyğəmbərə və iman gətirənlərə onlar üçün bağışlanma diləmək yaraşmaz".*** *(ət-Tövbə 113).*

Belə ki, Allah yaratdığı məxluqlardan şəfaəti yalnız üç şərtlə qəbul edir. **1)** Şəfaət edəndən Allahın razı olması. **2)** Şəfaət olunandan Allahın razı olması. **3)** Allahın şəfaət edənə şəfaət etmək üçün izn verməsi. Bu üç şərtsiz şəfaət edən istər mələk olsa, istər peyğəmbər olsa belə, şəfaəti qəbul olunmayacaqdır. Quran və Sünnə ilə isbat olunan şəfaətin (qiyamət günü) bir neçə növü vardır.

**1.** Bu ən böyük şəfaət olacaqdır. Bu şəfaət də Peyğəmbərə ρ məxsusdur. Allahın ona vəd etmiş olduğu Məqamul-Mahmud da budur; ***"Ola bilsin ki, buna görə Rəbbin səni tərifəlayiq bir məqama yüksəltsin".*** *(əl-İsra 79).* Abdullah ibn Amr ibn əl-As ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Azanı eşitdikdə müəzzinin ardınca onun dediklərini təkrarlayın. Sonra mənə salavat gətirin. Mənə bir dəfə salavat deyənə Allah on dəfə rəhmət deyər. Bundan sonra Allahdan mənim üçün vəsiləni istəyin. Allah onu istədiyi qullarından birinə verəcəkdir və mən ümüd edirəm ki, o mənəm. Mənim üçün Allahdan bunu istəyənə Qiyamət günü mənim onun üçün şəfaət etməyim vacib olar".[475] Cabir ibn Abdullah ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Azanı eşitdikdən sonra: "Ey kamil dəvətin və qılınacaq namazın Rəbbi olan Allahım! Muhəmmədə vəsilə dərəcəsini və fəzilətini bəxş et. Onu vəd etdiyin tərifə layiq məqama yüksəlt"- deyənə, Mənim şəfaətim vacib olar".[476]

**2.** Peyğəmbər ρ Cənnətliklərin cənnətə girməsi üçün şəfaət edəcəkdir. Yəni onlar Cənnətə girməyi haqq qazanmış olmaqla birlikdə, ancaq onun şəfaətindən sonra Cənnətə girmələri üçün onlara izn veriləcəkdir. Əbu Hureyra ψ rəvayət edir ki, bir gün Peyğəmbərə ρ cəmdək gətirdilər. Sonra bu cəmdəyin bel tərəfini (bişirib) ona verdilər. Ətin bu yeri onun xoşuna gəlirdi. O, ətdən bir tikə dişlədikdən sonra dedi: "Qiyamət günü mən insanların ən hörmətlisi olacağam. Bunun nə səbəbdən belə olduğunu bilirsinizmi? Allah (bütün) insanları - əvvəlkiləri və sonrakıları - elə bir yerə yığacaq ki, carçı onları çağıra bilsin, gözlər də onları əhatə etsin. Günəş insanlara yaxınlaşdıqdan sonra onları elə bir dərd və kədər bürüyəcək ki, onların buna tab gətirməyə və dözməyə gücü çatmayacaq. Onda onlar bir-birlərinə deyəcəklər: "Başınıza gələnləri görmürsünüzmü? Bəlkə, Rəbbiniz yanında sizin tərəfinizi saxlayan bir adam tapasınız?" Bəziləri deyəcək: "Gərək Adəmdən xahiş edəsiniz!"

---

[475] Muslim.

[476] əl-Buxari – bu haqda "Müsəlmanın qalası" kitabına baxa bilərsiniz. Azan bölümü. Səid əl-Qahtani.

Onlar Adəmin υ yanına gəlib deyəcəklər: “Sən bəşəriyyətin atasısan! Özünü də Allah Öz Əlləri ilə yaratmış, Öz Ruhundan sənə üfürmüş və mələklər Onun əmri ilə sənə səcdə etmişlər. Odur ki, Rəbbinin yanında bizdən ötrü şəfaət et (şəfaətçi ol)! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu, başımıza nələr gəldiyini görmürsənmi?!” Adəm deyəcək: “Bu gün Rəbbim elə qəzəblənmişdir ki, O bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Çünki, O mənə ağaca yaxınlaşmağı qadağan etdi, lakin mən Ona asi oldum. Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin Nuhun yanına!” Onda onlar Nuhun yanına gəlib deyəcəklər: “Sən yer üzünə göndərilmiş ilk elçisən. Özünü də Allah şükür edən bəndə adlandırmışdır. Odur ki, Rəbbinin yanında bizdən ötrü şəfaət et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!” Nuh deyəcək: “Bu gün Rəbbim Y elə qəzəblənmişdir ki, O bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Mənim dua etməyə imkanım var idi, lakin mən qövmümün əleyhinə bəddua etdim. Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin İbrahimin yanına!” Onda onlar İbrahimin yanına gəlib deyəcəklər: “Ey İbrahim! Sən həm Allahın peyğəmbəri, həm də yer əhli arasında Allahın ən sevimli dostusan. Elə isə Rəbbinin yanında bizdən ötrü şəfaət et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!” İbrahim deyəcək: “Bu gün Rəbbim elə qəzəblənmişdir ki, O bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Mən üç dəfə yalan danışmışam.[477] Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin Musanın yanına!” Onda onlar Musanın yanına gəlib deyəcəklər: “Ey Musa! Sən Allahın elçisisən, Allah öz risaləti[478] ilə, üstəlik səninlə bilavasitə danışmaqla səni digər insanlardan üstün etmişdir. Elə isə Rəbbinin yanında bizdən ötrü şəfaət et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!” Musa deyəcək: “Bu gün Allah elə qəzəblənmişdir ki, O bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir. Mən adam öldürmüşəm. Halbuki, onu öldürmək mənə əmr edilməmişdi.[479] Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin İsanın yanına!” Onda onlar İsanın yanına gəlib deyəcəklər: “Ey İsa! Sən həm Allahın Elçisi, həm Onun Məryəmə göndərdiyi Kəliməsi, həm də Onun Ruhundansan. Sən hələ körpə ikən, beşikdə insanlarla danışırdın. Elə isə Rəbbinin yanında bizdən ötrü şəfaət et! Məgər sən bizim

---

[477] Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "İbrahim υ bu üç hal müstəsna əsla yalan danışmamışdır. Bu yalanlardan iksi Allahın zatı və rizası üçündür. Birinci: "Bütpərəstlərə mən xəstəyəm deməsi, ikincisi isə bütün bütləri sındıraraq öz qövmünə: "Bəlkə bu işi bütlərin bu böyüyü edib?!" deməsidir. Üçüncüsü isə İbrahimin yanında Sara olduğu halda zalım hökmdarın ərazisindən keçərkən yoldaşına əgər səndən kim olduğunu soruşarsa de ki, sən mənim bacımsan. Şübhəsiz ki, "Sən mənim İslamda bacımsan".

[478] Peyğəmbərlik vəzifəsi.

[479] Fironun adamlarından bir Misirli Musa υ qövmündən biri ilə döyüşürdü. Musanın qövmündən olan Musadan kömək istədikdə, Musa da kömək edərək düşmənin sinəsinə yumruqla vurur. Bu yumruq da onu öldürür. əl-Qəsəs 18-ci ayəsinə bax.

nə vəziyyətdə olduğumuzu görmürsənmi?!” İsa deyəcək: “Bu gün Rəbbim elə qəzəblənmişdir ki, O bundan əvvəl heç vaxt belə qəzəblənməmiş və bundan sonra əsla belə qəzəblənməyəcəkdir”. İsa öz xətasını onlara bildirməyəcək (Başqa rəvayətdə: Mən Allahdan başqa tanrı edildim[480]), sadəcə belə deyəcək: “Ah nəfsim, nəfsim, nəfsim! Gedin başqasının yanına. Gedin Muhəmmədin yanına!” Onda onlar Muhəmmədin yanına gəlib deyəcəklər: “Ey Muhəmməd! Sən həm Allahın Elçisi, həm də peyğəmbərlərin sonuncususan. Allah sənin keçmiş və gələcək günahlarını bağışlamışdır. Elə isə Rəbbinin yanında bizdən ötrü şəfaət et! Məgər sən bizim nə vəziyyətdə olduğumuzu görmürsənmi?!” Onda mən ərşin altına gəlib, Rəbbimin Y qarşısında səcdə edəcəyəm. Sonra Allah mənə elə təriflər və alqışlar göndərəcək ki, məndən əvvəl heç kəsə belə təriflər və alqışlar göndərməmişdir. Sonra da belə deyəcək: “Ey Muhəmməd! Başını qaldır və istə, sənə istədiyin veriləcəkdir; şəfaət et, şəfaətin qəbul olunacaqdır”. Mən başımı qaldırıb deyəcəm: “Ümmətim, ey Rəbbim! Ümmətim, ey Rəbbim!” Onda belə deyiləcək: “Ey Muhəmməd! Ümmətindən sorğu-suala çəkilməyəcək kimsələri Cənnətin sağ qapılarından içəri daxil et. Halbuki, onlar başqa insanlarla birlikdə (Cənnətin) digər qapılarından da keçə bilərlər”. Peyğəmbər ρ dedi: “Canım Əlində Olana and olsun ki, Cənnət qapılarındakı laylardan hər iki lay arasındakı məsafə Məkkə ilə Himyər (yaxud Məkkə ilə Busra) arasındakı məsafə qədərdir”.[481] Başqa bir rəvayətdə Peyğəmbər ρ buyurdu: "Allah (Qiyamət günü) insanları toplayır, möminlər ayağa qalxırlar. Nəhayət Cənnət onlara yaxınlaşdırılır". İnsanlar Adəmin υ yanına gələrək deyəcəklər: "Ey atamız! Cənnəti bizə açdır". Adəm deyəcək: "Sizi Cənnətdən ancaq atanız Adəmin xətası çıxartdı. Mən bunun sahibi deyiləm. Siz mənim oğlum İbrahimin υ yanına gedin". İbrahim: "Mən bunun sahibi deyiləm. Mən ancaq pərdə arxasından xəlil (dost) olmuşdum. Siz Allahın Kəliməsi olan Musanın υ yanına gedin"- deyəcəkdir. Camaat Musanın υ yanına gəlirlər. Musa: "Mən buna sahib deyiləm. Siz Allahdan gəlmə söz və ondan gəlmə bir ruh olan İsanın υ yanına gedin"- deyəcəkdir. İsa: "Mən buna sahib deyiləm!"- deyəcək və insanları Muhəmmədin ρ üstünə göndərəcəkdir".[482]

**3.** Cəhənnəmdə bəzi müşriklərin cəzasının yüngülləşdirilməsi üçün ediləcək şəfaət. Səid ibn Musəyyibin atası deyir ki, Əbu Talib ölüm anında ikən Peyğəmbər ρ onun yanına gəldi. Onun yanında Əbu Cəhl ilə Abdullah ibn Əbu Umeyyə ibn Muğira da var idi. Peyğəmbər ρ buyurdu: "Ey əmi! ***Lə İləhə İllələh*** – kəlməsini de ki, bununla Allah yanında sənin lehinə şəhadət edim". Əbu Cəhl və Abdullah ibn Əbu Umeyyə ibn Muğira da: "Ya Əbu Talib! Abdulmuttalibin millətini tərkmi edirsən?"- dedilər. Peyğəmbər ρ sözünü əmisinə deməkdə davam edirdi. Onlar da öz sözlərini deməkdə

---

[480] Əhməd 2/281,282.

[481] əl-Buxari 4343, 4435, 4712; ət-Tirmizi 2434.

[482] Muslim.

davam edirdilər. Nəhayət Əbu Talibin onlara söylədiyi son söz: "Abdulmuttalibin milləti üzərindəyəm!"- oldu və ***Lə İləhə İlləllah*** deməkdən çəkindi. Peyğəmbər ρ buyurdu: "Yaxşı bil ki, Allaha and olsun, qadağan olunanadək sənin üçün Allahdan bağışlanma diləyəcəyəm". Bundan sonra Allah ayə nazil etdi: ***"Müşriklərin Cəhənnəmlik olduqları** (müsəlmanlara) **bəlli olduqdan sonra, onlarla qohum olsalar belə, Peyğəmbərə və iman gətirənlərə onlar üçün bağışlanma diləmək yaraşmaz".*** *(ət-Tövbə 113).* ***"Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah istədiyini doğru yola yönəldir. O, doğru yolda olanları da daha yaxşı tanıyır".*** *(əl-Qəsəs 56).* Başqa rəvayətdə Peyğəmbər ρ buyurdu: "Ey əmi! ***Lə İləhə İlləllah*** – kəlməsini de ki, bununla Allah yanında sənin lehinə şəhadət edim". Əbu Talib: "Qureyşin məni ayıblaması və haqqımda: "Əbu Talib bunu ancaq qorxudan dedi!"- deməlari olmasaydı, onu deyib səni məmnun edərdim".[483] Abbas ibn Abdulmuttalib ψ deyir: "Ya Rəsulallah! Şübhə yox ki, Əbu Talib daima səni düşmənlərdən qoruyur və sənə kömək edirdi. Bunlar ona fayda verəcəkmi?" Peyğəmbər ρ: "Bəli, mən onu böyük Cəhənnəm atəşi içində olduğunu gördüm və sonra onu oradan topuğuna qədər olan bir atəş çuxuruna çıxardım. Oradan belə beyni qaynayır".[484]

**4.** Bir qurup insanların sorğu-sualsız olaraq Cənnətə girmələri üçün ediləcək şəfaət. Hüseyn ibn Abdur-Rahmən deyir ki: "Mən Səid ibn Cubeyrin yanında idim. Dedim: "Dünən sizin hansınız düşən ulduz gördünüz?" O: "Mən gördüm"- dedi. Sonra əlavə etdi ki: "O, vaxt mən namazda deyildim. Məni əqrəb sancmışdı". O: "Bəs sən nə etdin?"- deyə soruşdu. Mən dedim: "Ruqiyyə (dua) etdim". O dedi: "Səni buna sövq edən nə idi?" Mən dedim: "Şabinin rəvayət etdiyi hədis". O dedi: "Şabinin sizə rəvayət etdiyi nədir". Mən belə rəvayət etdim: "O, bizə Burəydə ibn Huseyn əl-Əsləmdən rəvayət edib. O demişdir: "Göz dəyənə yaxud ilan çalana ruqiyyə (dua) ilə əlac etmək olar". Bunun üzərinə o dedi: "Eşitdiyinə (eşitdiyi kimi) əməl edən insan nə gözəl insandır". Lakin İbn Abbas ψ bizə Peyğəmbərdən ρ belə bir hədis nəql etmişdi: "Peyğəmbər ρ buyurmuşdur: "Mənə bütün ümmətlər göstərildi. Peyğəmbər gördüm ki, ətrafında çox kiçik bir camaat var idi. Peyğəmbər gördüm ki, ətrafında bir və ya iki nəfər var idi. Bir Peyğəmbər də gördüm ki, ətrafında bir nəfər də belə yox idi. Birdən, mənə üzaqdan bir qaraltı göstərildi. Mən onları ümmətimdən zənn etdim". Mənə: "Bu Musanın υ qövmüdür"- dedilər. Sən üfüqə doğru bax! Mən baxdıqda böyük bir qaraltı gördüm. Mənə təkrar: "Digər üfüqə doğru bax!"- deyildi. Yenə də böyük bir qaraltı gördüm. Mənə: "Bu sənin ümmətindir. Bunlar ilə bərabər yetmiş min nəfər hesabsız və əzabsız olaraq Cənnətə girəcəkdir"- deyildi. Peyğəmbər ρ bu xütbəsindən sonra qalxıb evinə girdi. Bunun ardından insanlar, hesabsız və əzabsız olaraq Cənnətə girəcək olan bu kimsələr haqqında müzakirəyə başladılar. Bəziləri: "Şübhəsiz ki,

---

[483] Muslim.
[484] Muslim.

bunlar Peyğəmbərin ρ dost-yoldaşlarıdır". Bəziləri də: "Bəlkə onlar İslamda doğulan və Allaha şərik qoşmayanlardır"- dedilər. Bunlardan başqa bəzi fikirlər irəli sürüldü. Bu vaxt Peyğəmbər ρ onların yanına gəldi və: "Haqqında müzakirə etdiyiniz şey nədir?"- deyə buyurdu. Ona məsələni başa saldıqdan sonra Peyğəmbər ρ buyurdu: "Cənnətə haqq-hesabsız girən möminlər ovsun oxumazlar və tələb etdirməzlər. Təşəəüm və Tətəyyür etməz və hər şeydə öz Rəblərinə təvəkkül edərlər". Bu vaxt Ukkaşə ibn Mihsan ayağa qalxıb dedi: "Məni də onlardan etməsi üçün Allaha dua et". Peyğəmbər ρ buyurdu: "Sən onlardansan". Onun ardınca başqa birisi qalxıb dedi: "Məni də onlardan etməsi üçün Allah dua et". Peyğəmbər ρ buyurdu: "Bu işdə Ukkaşə səndən qabağa düşdü". Başqa bir rəvayətdə Peyğəmbər ρ buyurur: "Ümmətimdən bir zümrə Cənnətə girər ki, onlar yetmiş mindir. Onların üzləri bədrlənmiş ayın parlaması kimidir. Onlar qızğın dəmirlə bədənlərini dağlamayanlardır".[485]

**5.** Bir qurup Cəhənnəmə düşmüş Muvahhidlərin (Tövhid əhlinin) Cəhənnəmdən çıxarılması üçün ediləcək şəfaət. Rəvayət edilir ki, Ənəs τ demişdir: “Muhəmməd ρ bizə belə rəvayət etmişdir: “Qiyamət günü insanların arasına çaxnaşma düşəcək. (Nəhayət,) onlar Adəmin yanına gəlib deyəcəklər: “(Ey Adəm!) Rəbbinin yanında bizdən ötrü havadarlıq et (şəfaətçi ol)!” (Adəm) deyəcək: “Mən buna layiq deyiləm. Lakin siz İbrahimin yanına gedin. Həqiqətən, o, Mərhəmətli Allahın ən sevimli dostudur.” Sonra onlar İbrahimin yanına gələcəklər. İbrahim deyəcək: “Mən buna layiq deyiləm. Lakin siz Musanın yanına gedin. Həqiqətən, o, Allahın (bilavasitə) danışdığı (bir adamdır)”. Sonra onlar Musanın yanına gələcəklər. Musa deyəcək: “Mən buna layiq deyiləm. Lakin siz İsanın yanına gedin. Həqiqətən, o, Allahın ruhudur və Onun Kəlməsidir”. Bundan sonra onlar İsanın yanına gələcəklər. İsa deyəcək: “Mən buna layiq deyiləm. Lakin siz Muhəmmədin ρ yanına gedin”. Beləliklə, onlar mənim yanıma gələcəklər. Onda mən deyəcəyəm: “Mən buna layiqəm!” Sonra mən Rəbbimdən izn istəyəcəyəm və mənə izn veriləcəkdir. Sonra Allah mənə indi bilmədiyim həmd-sənaları təlqin edəcək və mən o həmd-sənalarla Ona təriflər deyəcəyəm və səcdəyə qapanacağam. Onda Allah buyuracaq: “Ey Muhəmməd! Başını qaldır, danış, sənə qulaq asılacaq, istə, sənə istədiyin veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq”. Mən deyəcəyəm: “Ey Rəbbim! Ümmətim, ümmətim!” Allah buyuracaq: “Get, qəlbində arpa dənəsi ağırlığında imanı olan kimsələri atəşdən çıxart!” Mən gedib onları (oradan) çıxardacağam. Sonra geri dönüb həmin həmd-sənalarla Allaha təriflər deyəcəyəm və Onun qarşısında səcdəyə qapanacağam. Onda mənə deyiləcək: “Ey Muhəmməd! Başını qaldır, danış, sənə qulaq asılacaq, istə, sənə istədiyin veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq”. Mən deyəcəyəm: “Ey Rəbbim! Ümmətim, ümmətim!” Allah buyuracaq: “Get, qəlbində zərrə qədər və ya

[485] əl-Buxari, Muslim.

xardal dənəsi ağırlığında imanı olan kimsələri atəşdən çıxart!" Mən gedib onları (oradan) çıxardacağam. Sonra geri qayıdıb həmin həmd-sənalarla Allaha tariflər deyəcəyəm və Onun qarşısında səcdəyə qapanacağam. Onda mənə deyiləcək: "Ey Muhəmməd! Başını qaldır, danış, sənə qulaq asılacaq, istə, sənə istədiyin veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq". Mən deyəcəyəm: "Ey Rəbbim! Ümmətim, ümmətim!" Allah buyuracaq: "Get, qəlbində xardal dənəsi ağırlığından daha az, daha az, daha az imanı olan kimsələri atəşdən çıxart!" Mən gedib onları (oradan) çıxardacağam". Digər rəvayətdə Peyğəmbər ρ demişdir: "Mən dördüncü dəfə qayıdıb həmin həmd-sənalarla Allaha tariflər deyəcəyəm və Onun qarşısında səcdəyə qapanacağam. Onda mənə deyiləcək: "Ey Muhəmməd! Başını qaldır, danış, sənə qulaq asılacaq, istə, sənə istədiyin veriləcək, havadarlıq et, havadarlığın qəbul olunacaq". Mən deyəcəyəm: "Ey Rəbbim! Mənə izn ver: "Lə ilahə illəllah!"– deyən kimsələrə (şəfaətçi) olum." Allah buyuracaq: "Mənim izzətimə, əzəmətimə, böyüklüyümə və ululuğuma and olsun ki, Mən: "Lə ilahə illəllah!"– deyən kəsləri oddan çıxardacağam".[486] Ənəs ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Dörd kimsə Cəhənnəmdən çıxarılıb Allahın hüzuruna götürüləcəkdir. Sonra təkrar Cəhənnəmə göndərilmələri əmr edildikdə onlardan biri deyir: "Ya Rəbbim! Məni Cəhənnəmdən çıxardığında təkrarən Cəhənnəmə geri göndərəcəyini heç ümid etmirdim". Allah da onu Cəhənnəmdən qurtarır".[487]

**6.** Cəhənnəmə girmələri əmr olunmuş bir qurup insanların Cəhənnəmə girmə-mələri üçün ediləcək şəfaət. Əbu Səid əl-Xudri ψ rəvayət edir ki, Allah Elçisi ρ demişdir: "Möminlərin Cəhənnəmə girmiş qardaşlarına görə Rəbbləri ilə mücadilə etmələri sizdən birinizin dünyada haqq uğrunda mücadilə etməsindən daha şiddətli olacaqdır. Onlar deyəcəklər: "Ey Rəbbimiz! Onlar bizim qardaşlarımızdır. Onlar bizimlə namaz qılar, oruc tutar və həcc edərdilər, Sən isə onları Cəhənnəmə saldın". Allah buyuracaq: "Gedin və tanıdıqlarınızı oradan çıxardın!" Möminlər gəlib onları görkəmlərindən tanıyacaqlar. Od onlardan kimisini baldırının yarısına qədər, kimisini də topuğuna qədər bürüyəcəkdir. Möminlər də onları (oddan) çıxaracaqlar. Onlar deyəcəklər: "Ey Rəbbimiz! Artıq Sənin bizə əmr etdiyin kəsləri çıxartdıq". Allah buyuracaq: "Qəlbində dinar ağırlında iman olan kəsləri çıxardın!" Sonra isə: "Qəlbində yarım dinar ağırlığında"- hətta "zərrə ağırlığında"- deyə buyuracaq". Əbu Səid əl-Xudri ψ dedi: "Kim inanmırsa, bu ayəni oxusun: "***Şübhəsiz ki, Allah Özünə şərik qoşulmasını bağışlamaz, bundan başqa*** *(daha kiçik günahları)* ***isə istədiyi kimsəyə bağışlayar. Allaha şərik qoşan kəs iftira atmaqla böyük bir günah etmiş olur"*** *(ən-Nisa 48)"*.[488] Başqa rəvayətdə Ravi Əbu Səid əl-Xudri ψ deyir: "Mənə inanmırsanız bu

[486] əl-Buxari 7510, Muslim 326.
[487] Muslim "İman" 321.
[488] ən-Nəsai 5010, 5027. əl-Albani hədisi səhih adlandırmışdır.

ayəni oxuyun: ***"Həqiqətən, Allah zərrə qədər də olsa zülm etməz. Əgər** (qulun gördüyü iş)* ***yaxşı əməl olarsa,*** *(Allah)* ***bunu artırar".*** *(ən-Nisa 40).* Peyğəmbərlər, Mələklər, Möminlər şəfaət edirlər. Bundan sonra Cabbar olan Allah: "İndi növbə Mənim şəfaətimədir"- deyir və Cəhənnəmdən bir ovuc çıxarır. Buradan vücudları tamamilə yanmış insanları çıxarır. Sonra bunlar Cənnətin çölündə bir çaya salınırlar. Bu çaya "Həyat suyu" deyilir. Onlar selin gətirdiyi yığınlar arasında qalan yabanı reyhan toxumları necə sürətlə bitərsə, elə bitəcəklər. Bu yabanı reyhan otlarını bir qaya ilə ağac arasında görmüsünüz. Bu otun günəşə baxan tərəfi yaşıl, kölgəyə baxan tərəfi isə ağdır. Çaya salınan bu kimsələr çıxarılarkən ağlıq və parlaqlıq baxımından sanki mərcan kimi parıldamaqdadırlar. Onların boyunlarına boyunbağılar taxılır. Beləliklə Cənnətə girirlər. Cənnətliklər bunlar haqqında: "Bunlar Rahmən olan Uca Allahın azad etdiyi qullarıdır. Bunların etdikləri bir əməl, göndərdikləri bir xeyir olmadan Allah onları Cənnətə qoymuşdur"- deyirlər. Bunlara: "Gördükləriniz və bir o qədəri sizindir"- deyilir".[489] Onlar deyəcəklər: "Ey Rəbbimiz! Sən aləmlərdən heç kəsə verməndiyin nemətləri bizə verdin!" Allah buyuracaq: "Sizə bundan da üstün olanını hazırlamışam!" Onlar deyəcəklər: "Ey Rəbbimiz! Bundan da üstün nə ola bilər ki?" Allah buyuracaq: "Mənim rizam! Artıq bundan sonra Mənim sizə heç vaxt qəzəbim tutmayacaq".[490]

**7.** Peyğəmbərin ρ Cənnətə girən bir qrup insanların əməllərinin mükafatı olaraq Cənnətdə dərəcələrinin artırılması üçün ediləcək şəfaət. Ənəs ibn Məlik ψ rəvayət etdi ki, Peyğəmbər ρ buyurdu: "Şəfaətim ümmətim arasında böyük günah etmiş kimsələrə olacaqdır".[491] Osman ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Qiyamət günü üç sinif insan şəfaət edəcəkdir: "Peyğəmbərlər, alimlər, şəhidlər və möminlər".[492]

Bütün bu şəfaətlərdən başqa Qiyamət günü qulun tutduğu oruc, oxuduğu Quran da şəfaət edəcəkdir. Peyğəmbər ρ buyurdu: "Oruc və Quran Qiyamət günü qula şəfaət edəcəkdir".[493] Əbu Umamə ψ rəvayət etdi ki, Peyğəmbər ρ buyurdu: "Quranı öyrənin, çünki o, qiyamət günü əhli üçün şəfaətçi olacaqdır".[494] Nəvvas ibn Səman ψ rəvayət etdi ki, Peyğəmbər ρ buyurdu: "Qiyamət günü Quran və ona əməl edənlər gətiriləcək. İrəlidə əl-Bəqərə və Ali-İmran surələri gedərək, oxuyub əməl edənlərə şəfaət edəcəklər".[495] Əli ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim Quran oxuyar, onu əzbərləyər, halal saydığını qəbul edər, haram etdiyi şeyi də haram edərsə, Allah o kimsəni Cənnətə salar. Ayrıca Cəhənnəmə girmələri əmr edilmiş ailəsindən on

[489] əl-Buxari 6886, 7439.
[490] Muslim.
[491] Əhməd 3/ 213.
[492] əl-Heysəmi "Məcməuz-Zəvaid" 10/ 381.
[493] əl-Albani "Səhih Hədislər Silsiləsi" 3882.
[494] Muslim.
[495] Muslim.

kimsəyə şəfaətçi olar".[496] Əbu Səid ψ rəvayət etdi ki, Peyğəmbər ρ buyurdu: "Qiyamət günü (Cənnət əhli Cənnətə, Cəhənnəmliklər də Cəhənnəmə ayrıldıqdan sonra) ölüm, qara bir qoyun surətində gətirilir. Cənnət ilə Cəhənnəm arasında dayandırılır və deyilir: "Ey Cənnət əhli! Siz bunu tanıyırsınızmı?" Cənətliklər dərhal boyunlarını uzadıb başlarını ona doğru qaldırırlar və ona (qoyuna) baxırlar; "Bəli, tanıyırıq! Bu ölümdür"- deyirlər. Sonra: "Ey Cəhənnəm əhli! Siz bunu tanıyırsınız?"- deyilir. Onlar da başlarını qaldıraraq baxırlar və: "Bəli, tanıyırıq! Bu ölümdür"- deyirlər. Bundan sonra qoyunun kəsilməsini əmr edirlər və dərhal qoyun kəsilir. Sonra deyilir: "Ey Cənnət əhli! Cənnətdə əbədi yaşayacaqsınız, artıq sizə ölüm yoxdur! Və ey Cəhənnəm əhli! Siz də Cəhənnəmdə əbədisiniz, artıq ölüm yoxdur!" Bundan sonra Peyğəmbər ρ bu ayəni oxudu: *(Ya Muhəmməd!)* ***Qəflətdə olanları və iman gətirməyənləri işin bitmiş olacağı*** *(haqq-hesab çəkilib möminlərin cənnətə, kafirlərin isə Cəhənnəmə girəcəyi)* ***peşmançılıq günü*** *(insanın pis əməllərinə görə peşman olacağı, lakin bu peşmançılığın heç bir fayda verməyəcəyi qiyamət günü)* ***ilə qorxut!*** *(O, gün bütün)* ***yer üzünə və onun üzərində olan hər şeyə yalnız biz varis olacağıq. Onlar bizim hüzurumuza qaytarılacaqlar"***. *(Məryəm 39-40)"*.[497]

## ELMDƏ ŞİRK

İlk olaraq bilinməlidir ki, hər məkanı elmi ilə əhatə edib bilmək syalnız Allahın sifətlərindəndir. O, az və ya çox, yaxın və ya uzaq, gizli və ya açıq hər şeyi bilir. Heç bir zaman Ondan gizli qalacaq bir şey yoxdur. Burada işıqlıqla qaranlığın, göylərlə yerin, dağların zirvəsi ilə dənizlərin dərinlikləri arasında hər hansı bir fərq yoxdur. Hər zaman və məkanda zərrə qədər də olsa heç bir şeyin gizli qalmadığı bir elm Allahın zatına aid olan sifətlərindəndir. Bu sifətlərdə heç kimsə Allaha ortaq olmaz; ***"Hər şeyi bilən Sən, hikmət sahibi Sənsən".*** *(əl-Bəqərə 32).* ***"Yerə daxil olanı da, yerdən çıxanı da, göydən enəni də, göyə qalxanı da O bilir".*** *(Səba 2).* ***"Göylərdə və yerdə zərrə qədər bir şey Ondan gizli qalmaz".*** *(Səba 3).* ***"Qeybin açarları Allahın yanındadır. Onları ancaq Allah bilir. Allah suda və quruda nə varsa bilir. Elə bir düşən yarpaq yoxdur ki, Allah onu bilməsin. Yerin zülmətləri içində elə bir toxum*** *(kainatda)* ***elə bir şey yoxdur ki, məhz açıq-aydın kitabda olmasın".*** *(əl-Ənam 59).* ***"O, bilmədən heç bir meyvə qabığından çıxmaz, heç bir qadın hamilə olmaz və bari-hamilini yerə qoymaz".*** *(Fussilət 47).* ***"Ey Rəbbimiz! Sənin rəhmin və elmin hər şeyi ehtiva etmişdir".*** *(əl-Mumin 7).* ***"Mən sizin bildiklərinizi bilirəm".*** *(əl-Bəqərə 30).* ***"Allah qeybləri çox gözəl biləndir".*** *(ət-Tövbə 78).* ***"Şübhəsiz ki, O gizlini də, gizlinin gizlisini də bilməkdədir"***. *(Ta ha 7).* ***"Allah hər şeyi bilməkdədir".*** *(ən-Nisa 176).*

[496] ət-Tirmizi 2907. əl-Albani zəif adlandırmışdır.
[497] Muslim.

Məxluqatdan hər hansı birinin adını tələffüz edərkən ona ayaqda ikən, oturarkən, yaxından və ya uzaqdan səslənən, başına bir bəla gəldikdə və ya düşmənlərinin şərini sovuşdurmaq üçün ona yalvaran və onunla istiğasə etmək, düşüncəsini onu görür kimi ona yönəltmək, onun adını dililə və ya qəlbilə söylədikdə onun surətinə yaxın olduğunu və ya qəbrinin başında durmuş kimi inanan, bütün bunları gözünün önünə gətirdiyində onun bunu bildiyini, başına gələn bütün xəstəlikləri, çətinliyi, ölümü, üzüntünü, sevinci bildiyini, danışdığı hər bir şeyi eşitdiyini, zehnindən keçənləri, başına gələn kədərləri bildiyini və bütün bunlardan xəbərdar olduğunu qəbul edən kimsə müşrik olur. Həmçinin də hansısa seyyidin, şeyxin, imamın Allahdan vergi olaraq qeyb elmlərinə sahib olması, digər məxluqlardan fərqli olaraq gizli elmlərə sahib olmasına inanmaq da şirkdir. Bu cür şirkə elmdə şirk qoşmaq adı verilir. Bu Allahın elmini bir başqasına məxsus etməkdir.

Bu əməllərdən hər hansı birini peyğəmbərlərə, seyyidlərə, imamlara, övliyalara, şəhidlərə və s. məxsus edərək başına bir sıxıntı və darlıq gəldikdə onlara nəzir demək, uşağı olduqda onlar üçün qurbanlar kəsmək, uşaqlarını onların adları ilə adlandırmaq (İmamverdi, Pirverdi, Ocaqverdi, Abbasqulu, Məmmədqulu, Həsənqulu, Əliqulu, Hüseynqulu və s.), onlar üçün yeməklər bişirmək və ya onların adları ilə bağlı yeməklər bişirmək (imam süfrəsi açmaq, hədiy bişirmək, Hindistanda Fatimə O adına bir yemək növü vardır ki, ondan yalnız qadınlar yeyə bilərlər), onlar üçün meyvələr ayırmaq, bu adın xatirinə heyvanlardan müəyyən bir sürü ayıraraq (nə vaxtsa onları kəsəcəyini niyyət edərək) onlara yaxşı qulluq etmək: Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ qurbanlıq dəvə ilə gedən birisini görüb buyurdu: "Dəvəyə min get!" O kimsə dedi: "Ya Rəsulullah! Bu qurbanlıq bir dəvədir". Bundan sonra Peyğəmbər ρ ikinci, yoxsa üçüncü dəfəsində: "Vay sənin halına! Min bu dəvəyə get (Başqa rəvayətdə: Veyl olsun sənə!)"- deyə buyurdu”.[498]

İslam alimlərinin qəbirpərəst bidət əhlinə qarşı və İslam toplumlarında şirkin növlərini, səbəblərini və əlamətlərini açığa çıxartmaq üçün həqiqətən də dəyərli əməkləri olmuşdur. Müslmanların çoxu Tövhidin həqiqətini bilmədikləri üçün fərqinə varmadan da şirkə düşməkdədirlər. Şirk anlamını bəzi müsəlmanlara görə yalnız daşa, ağaca və ya bütə tapınmaqdan ibarət olduğunu bilirlər. Buna görə də bunların çoxu itaətdə, boyun əyməkdə, sevgidə və qorxuda şirkə düşmüşlər. Bunun səbəbi də qulluq və şirkin mənalarından xəbərsiz olmalarıdır.

Şirk insanı zəlil etməkdən və alçaltmaqdan başqa bir şey deyildir. Şirk insanı yaradılmışlara boyun əyməsinə, ona heç bir zərər və fayda vermədikləri kimi, nə ölümə, nə də yenidən dirilməyə güc yetirməyən insanlara qulluq etməsinə (qul olmasına) yol açır.

---

[498] Muslim 1322.

# SURƏT YARADANLAR

***Şəkil*** **-** Forma, Surət Vermək deməkdir. Bu da insan, heyvan və s. ola bilər. İki qismdir: **1)** Kölgəsi olan – daş, ağac, plastilin, palçıq üzərində canlı olanların heykəllərini oymaq. **2)** Kölgəsi olmayan - rənglər, cizgilər vasitəsi ilə kağız üzərində şəkil şəkmək. Canlı məxluqun surətini çəkməyin qadağan olunmasına səbəb: **1.** Şəkil çəkən özünü Allaha bənzətmək istəyir. Tövhid odur ki, sən Allaha heç kəsi şərik qoşmursan. Şəkil çəkən əməli ilə Allaha oxşamaq, yaratmaqda Onunla bəhsə girmişdir. Allah yaradır və istədiyinə də istədiyi surəti verir. Şəkil çəkən rəssam qəlbindən, ağlından keçirdiyi forma və surəti çəkdiyi şəkilə verir. Bu da Tövhidin kamilliyinə, Allahın Rububiyyətinə ziddir. **2.** Surət yaratmaq şirkə aparan bir vəsilədir (yoldur). Şəriətin məqsədi isə şirkə aparan bütün yolları bağlamaqdır. Bu da Uluhiyyətdə şikdir. İlk şirkin yaranması Nuhun υ qövmündə olan saleh kimsələrin surətlərini çəkməklə başladı. Useymin Σ deyir: Şəkil çəkməyin bir neçə növü vardır. **1)** Kölgəsi (cəsədi) olan şeylər – insan, dəvə, şir və s. Bildiyim qədər bütün alimlər ittifaq ediblər ki, haramdır. Surət yaratmaqda, çəkməkdə niyyət rol oynamır. Kimsə deyə bilər: Mən dincəlmək üçün çəkirəm, pul qazanmaq üçün çəkirəm, Allahın yaratdığına bənzətmək ağlımdan belə keçmir. Xeyr, bu belə deyildir. Kimsə kafirlərin libasını geyinsə, kimsə qadın libası geyinsə və desə: Mənim qadınlara oxşamağa niyyətim yoxdur, bu modadır. Biz deyəciyik ki, xeyr, sənin niyyətin olmasa da belə oxşayırsan. Artıq sən niyyətin olmsa da belə şəkil çəkməklə oxşatmış olursan. Peyğəmbər ρ buyurdu: "Ey Aişə! Qiyamət günündə Allah qatında insanların ən şiddətli əzaba düçar olanı Allahın yaratdığına bənzər şeylər yaratmağa çalışanlardır".[499] **2)** Şəkil çəkir lakin fiziki cəsədi yoxdur. Rənglər, cizgilər vasitəsi ilə kağız, pərdə və s. üzərində şəkil şəkmək. Bu da hədislərlə haramdır. Aişə O rəvayət edir ki: "Mən Peyğəmbərin ρ döyüşə çıxdığını gördüm. O vaxtı mən kənarları saçaqlı bir yataq örtüyü almış və onu qapı üzərinə asmışdım (Başqa rəvayətdə: Qanadlı at şəkli olan bir örtük). Peyğəmbər ρ qayıtdıqda bu pərdəni gördü. Mən Peyğəmbərin ρ bunu xoşlamadığını üzündən hiss etdim. Peyğəmbər ρ pərdəni çəkdikdə onu cırdı, hətta yerindən qopardı və: "Şübhəsiz ki, Allah bizə divarın daşını və torpağını belə surətlə olan pərdə ilə örtməyimizi əmr etmədi"- deyə buyurdu. Aişə O: "Biz örtüyü parçaladıq və ondan iki yasdıq tikdik və yastığın içini xurma yarpaqları ilə doldurduq. Peyğəmbər ρ mənim bu işimi pis qarşılamadı (Başqa rəvayətdə: Bunu çevir. Çünki, hər dəfə onu görür və dünyanı xatırlayıram)".[500] **3)** Fotoaparat vasitəsilə şəkil çəkmək. Bu ixtilaflıdır. **1.** Harama daxildir. Fotoapartla çəkilən şəkil, əllə çəkilən şəkildən daha canlı olur. **2.** Bu şəkil çəkməyin hökmündə deyildir. Fotoaparatla şəkil

---

[499] əl-Buxari 5954, Muslim 2108.
[500] Muslim 2107.

çəkmək sanki kserokopiya aparatı vasitəsilə bir şeyin surətini çıxarmaq kimidir. Allahın yaratdığı şəkildə qalır. Sadəcə düyməni basır və surəti çıxardır. Haram və mubah olur. Nə zaman olur? Əgər bir kimsənin surətini xatirə üçün çəkirsə ər-arvad, ana, uşaq və s. bu haramdır. Məqsəd qəmi, kədəri aradan qaldırmaq, kef tutmaq üçündürsə olmaz. Çünki, insan surətləri saxlayır. Bunu heç kəs inkar edə bilməz. Əgər şəxsiyyət, prava, cinayətkarı axtarmaq, pul və s. mübahdır. Saleh Əli Şeyx – *hafizahullah* - deyir: "Kamera güzgü kimidir". **4)** Ruhu olmayan şeylərin şəkili. İki qismdir: **1.** İnsan öz əli ilə düzətdiklərinin şəklini çəkir. Komputer, maşın, təyyarə və s. halaldır. **2.** Allahın yaratdıqlarının şəklini çəkir. Bu da iki qismdir: **1.** Nə ki, artmır - daş, dəmir və s. olar. **2)** Nə ki, artır - ağac, bitkilər və s. ixtilafdır. Çoxu icazə vermişlər. İbn Abbasın ψ yanına bir rəssam gələrək ondan rəsmləri haqqında fətva istədi. İbn Abbas ψ: "Mənə yaxınlaş"- dedi. Rəssam da ona yaxınlaşdı. Sonra təkrar ona: "Mənə yaxınlaş"- dedi. Rəssam da ona yaxınlaşdı. İbn Abbas ψ əlini bu fətva istəyən rəssamın baş üstünə qoyaraq dedi: "Mən sənə Peyğəmbərdən ρ eşitdiyim bir hədisi xəbər verəcəyəm (yaxşı dinlə). Mən Peyğəmbərdən ρ dinlədim: "Hər bir musavvir (surət çəkən) Cəhənnəmdədir. Musavvirin təsvir etdiyi hər surətə Qiyamət günü (Allah) həyat verir və o canlı surət Cəhənnəmdə onu çəkən sahibinə əzab verir"- deyə buyurdu. İbn Abbas ψ: "Əgər sən sənətini davam etdirmək məcburiyyətindəsənsə ağac rəsmi və həyat sahibi olmayan vücud rəsmlərini çək (Başqa rəvayətdə: Hər kim dünyada bir surət çəkərsə, Qiyamət günü o, surətə ruh verilməsi əmr olunar. Halbuki o, həyat vermək qüdrətinə sahib deyildir)"- dedi".[501] Bəziləri isə qadağan etmişlər. Ümumi hədisiə görə: Mücahid bu rəydə olub. Əbu Hureyra ψ demişdir: "Peyğəmbərin ρ belə dediyini eşitmişəm: "Allah Y buyurmuşdur: "Mənim yaratdığım kimi yaratmağa çalışan kimsədən daha zalım kim ola bilər?! (Bacarırlarsa,) qoy bir qarışqa yaratsınlar, yaxud bir dən yaratsınlar, yaxud bir arpa dənəsi yaratsınlar!"[502] Görəsən Allah nə üçün sual formasında deyir? Çünki, sual formasında daha bəlağətli və dinləyənə daha çox çatır. Həmçinin, Allah müraciət etdiyi kimsələrin nə qədər zəif, aciz olduğnu göstərir. Mənim yaratdığıma bənzər bir şeylər yaratmaq istəyəndən başqa daha haqsız kim ola bilər. Peyğəmbər ρ buyurdu: "Ey Aişə! Qiyamət günündə Allah qatında insanların ən şiddətli əzaba düçar olanı Allahın yaratdığına bənzər şeylər yaratmağa çalışanlardır".[503]

***Hansı Şərtlərlə Evdə Şəkil Saxlamaq Olar***: **1.** Əzəmətləşdirmək üçün valideyn, prezident, övliya, seyyid və s. saxlamaq - Haramdır. **2.** Ləzzət almaq üçün şəkil saxlamaq – Haramdır. **3.** Uşaqların şəkillərini xatirə üçün saxlamaq – haramdır. Mələklər surət olan evə girməzlər. **4.** Şəkil kitabın, qəzet və jurnalların içində olarsa.

---

[501] əl-Buxari 2225, 5953, Muslim 2110.
[502] əl-Buxari 5497, 5609, 5953.
[503] Bxari 5954, Muslim 2108.

İmkan varsa yığışdırmaq lazımdır. **5**. Əgər şəkillər aşağı bir yerdədirsə zibil yerində, ayaq altında, tualetdə və s. olar. Bəs paltarda olar? Xeyr, hətta alt paltarda da olmaz. Useymin Σ deyir: “Pampers – alçaq yerə geyinildiyi və tullanıldığı üçün olar”. Albani Σ deyir: “Uşaqlara oyuncaqlarla oynamaq nə üçün icazə verilib? Çünki, zərurət vardır. Uşaqda analıq hisləri oyanır. Öyrətmək niyyəti ilə heyvanları tanıtmaq və s. - olar. Qayda: Başqasına görə qadağan olunan ehtiyaca görə icazəlidir”. **6.** Bunsuz keçinmək olmaz – şəxsiyyət, sürücülük vəsiqəsi və s. - olar. **7.** Dərs ləvazımatı – dəstamaz, namazın qılınma şəkilləri və s. – olar. Aişə O rəvayət edir ki, balaca bir yasdıq almışdım. Üstündə bir neçə (heyvan) rəsmləri vardı. Peyğəmbər ρ bunu gördükdə qapının önündə durdu və içəriyə girmədi". Aişə O: "Mən Peyğəmbərin ρ bundan xoşlanmadığını üzündən hiss edərək dedim: “Ya Rəsulullah! Allaha və Onun Rəsuluna tövbə edirəm. Mən nə xəta etdim?" Peyğəmbər ρ: "Bu nə yasdıqdır?"- deyə buyurdu. Aişə O dedim: "Mən bunu sənin üçün üzərinə oturasan deyə aldım". Peyğəmbər ρ buyurdu: "Bu surətlərin sahibləri Qiyamət günü heç şübhəsiz ki, əzab olunacaqlar və onları (aciz etmək üçün): "Surətlərini çəkdiyiniz bu heyvanları dirildin"- deyiləcəkdir (Başqa rəvayətdə: Mən bu yasdığı sökərək iki dirsək yasdıq tikdim. Artıq Peyğəmbər ρ evdə onlara dirsəklərini dayayardı)”[504]. İbn Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Bu surətləri çəkənlər Qiyamət günü əzab olunacaqlar. Tez olun çəkdiyiniz surətlərə can verin deyiləcəkdir".[505] Aişə O rəvayət edir ki, Cəbrail υ gəlməsi haqqında Peyğəmbərə ρ söz verdi. Nəhayət vəd edilən vaxt gəldi, lakin Cəbrail υ hələ də gəlməmişdi. Peyğəmbər ρ əlində dəyənək olduğu halda gözləməkdə idi. Dəyənəyi əlindən atdı və: "Allah vədindən dönməz, Rəsulları da dönməzlər"- deyə buyurdu. Sonra arxa tərəfə döndükdə çarpayının altında bir köpək balasını gördü. O deyə buyurdu: "Ey Aişə! Bu köpək bura nə vaxt girmişdir?" Aişə O dedi: "Allaha and olsun ki, bilmirəm". Peyğəmbər ρ köpəyin çıxarılmasını əmr etdi, o da çıxarıldı. Ondan sonra Cəbrail υ gəldi. Peyğəmbər ρ buyurdu: "Mənə vəd etdiyin vaxt gələcəyini bildirmişdin, mən də səni gözlədim lakin gəlmədin". Cəbrail υ: "Mənim gəlməyimin qarşısını evində olan köpək almışdır. Biz mələklər içində köpək və surət olan evə girmərik. (Başqa rəvayətdə: Meymunə O Peyğəmbərin ρ nə üçün kədərli olduğunu soruşduqda o: "Cəbrail υ bu gecə mənimlə görüşəcəyini vəd etmişdi, lakin gəlmədi. Allaha and olsun ki, mənə qarşı sözündən heç vaxt dönməmişdir”. Sonra Peyğəmbərin ρ qəlbinə evimizin bir dirəyi altında olan bir köpək balası düşdü. Həmin an onun çıxarılmasını əmr etdi. Köpək balası çıxarıldı. Sonra əlinə su alaraq köpək balasının yatdığı yerə səpdi. Nəhayət axşam olduqda Cəbrail υ gəldi. Peyğəmbər ρ buyurdu: "Dünən gecə mənimlə görüşəcəyini vəd etmişdin!?" Cəbrail υ dedi: "Bəli, elədir. Lakin biz mələklər içində köpək və surət olan

[504] Muslim 2108.
[505] Muslim 2108.

heç bir evə girmərik". Peyğəmbər ρ o günü səhərə qədər itlərin öldürülməsini əmr etdi. Hətta o, dərəcəyə qədər ki, kiçik baxçaları qoruyan itlərin də öldürülməsini əmr etdi, sadəcə böyük baxçaları qoruyan itlərə dəyilmədi[506]”.[507] Peyğəmbər ρ buyurdu: "İçində köpək və surət olan evə (rəhmət) mələkləri girməz".[508] Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Mələklər içində köpək və zınqırov olan heç bir səfərdə olan qəbiləyə yoldaşlıq etməzlər".[509] Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Zınqırov şeytanın mizmarıdır".[510]

# ŞİRKİN HƏQİQƏTİ

***Şirk* -** Xaliqə (Yaradana) oxşamaq, Xaliqi (Yaradanı) məxluqa (yaradılmışa) oxşatmaqdır. Həqiqi bənzətmək də elə budur. Necə ki, Allahın qəlbini çevirdiyi və başı aşağı etdiyi şəxsin halı tərsinə çevrilmiş, işi qarışdıraraq bəsirəti kor olan şəxs belə işləri edir. Bu insan Tövhidi oxşatmaq, oxşatmağı isə ucalıq və itaət adlandırır. Buna görə də müşrik məxluqu Xaliqə oxşadır. Uluhiyyət xüsusiyyətlərindən biridə səcdə, təvəkkül, tövbə, ucaltmaq və hörmət məqsədilə and içməkdir. Kim bunları Allahdan qeyrisinə edərsə məxluqu (yaradılanı) Allaha (Yaradana) bənzətmişdir. ***Həmçinin* -** Mənfəət və zərər vermək Allahın Əlindədir, dua, qorxu, nəzir, qurban və s. ibadətlər Allaha yönəlməlidir. Əgər bir kimsə bu kimi şeyləri Allahdan qeyrisinə

---

[506] Muslim 2104, 2105. Peyğəmbər ρ buyurdu: "Önündə palan (sütrə) olmayan bir kimsənin namazını həddi-buluğa çatmış qız, ulağ və it poza bilər". Əbu Zərr ψ: "Ya Rasulullah! Qara itlə qırmızı itin nə fərqi vardır?"- deyə soruşdum. Peyğəmbər ρ: "Qara it şeytandır"- deyə buyurdu. Muslim, Əbu Davud. İbn Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Hər kim ov itindən, qoyun itindən və ərazini qorumaq üçün saxlanılan itdən başqa (məqsədlər) üçün it saxlayarsa, hər gün o kimsənin savabından iki qirat savab azalar". əl-Buxari 2322, Muslim 1575, 1559, 2104. İbn Ömər ψ rəvayət edir ki, Peyğəmbərin ρ köpəklərin öldürülməsini əmr edərkən buyurdu: "İlanları və köpəkləri öldürün. Xüsusən də ilanlardan arxasında iki ağ cizgili cinsi ilə və bir də ən pisi olan quyruqsuz (zınqırov) ilanını öldürün. Çünki, ilanların bu iki cinsi gözün nurunu aparır və hamilə qadının uşağının düşməsinə səbəbdir". İbn Ömər N bütün ilanları öldürürdü. İbn Ömər ψ Əbu Lubadə əl-Bədriyə: “Peyğəmbər ρ ev ilanlarını öldürməyi qadağan etmişdir”- hədisini rəvayət etdikdən sonra, o da bu əməlindən vaz keçdi". Muslim 2233. Hədisin mətnində ***əl-Cinn*** kəliməsi vardır ki, lüğətdə izahı – ***əl-Cannu*** mimin təşdidi ilə cinn ləfzindən cəm ismidir. Zəməxşəri deyir ki: "Cann cinlərin atasıdır. Adəm də bütün bəşəriyyətin atasıdır. Cann xüsusi bir qövmdür ki, insanlardan əvvəl yaradılmışlar. Canın bir növü də ilan adıdır ki, gözləri qara əksər evlərdə dolaşırlar və heç kimə də zərər verməzlər". İbn Məsud ψ rəvayət edir ki, Peyğəmbər ρ ilə bərabər Minada bir mağarada idik (Başqa rəvayətdə: Peyğəmbər ρ ehramlı halda Minada bir ilan öldürülməsini əmr etmişdir). Bu vaxt ona ***Vəl Mursələti Urfə*** – surəsi nazil olmuşdur. Biz də bu surəni Peyğəmbərin ρ ağzından ilk alanlar idik. Bu an birdən-birə üstümüzə bir ilan gəldi. Peyğəmbər ρ: "Bu ilanı öldürün"- deyə buyurdu. Biz də onu öldürməyə çalışdıq, lakin ilan qaçdı. Peyğəmbər ρ: "Allah sizi ilanın şərindən qoruduğu kimi ilanı da sizin şərinizdən qorudu"- deyə buyurdu. Muslim 2234, 2235. Əbu Səid əl-Xudri ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Mədinədə müsəlman olmuş cinlərdən bir camaat vardır. Hər kimin evində uzun ömürlü ev ilanları vardısa, onlardan bir şey gördükdə onları üç gün elan edib qovun (Başqa rəvayətdə: Üç dəfə qovun). Gedərsə nə yaxşı, əgər bundan sonra da sizə görsənərsə artıq onu öldürün. Çünki o, şeytandır (Başqa rəvayətdə: Çünki o, kafirdir)". Muslim 2236.

[507] Muslim 2104, 2105.

[508] Muslim 2106.

[509] Muslim 2113.

[510] Muslim 2114.

yönəldərsə, artıq məxluqu Allaha bənzətmişdir. Heç bir şeyə qadir olmayanı (öldürmək, diriltmək, mənfəət və xeyir) hər bir şey Əlində olan Allaha bənzətmişdir. Bütün bu işlərin əsası Allahın Əlindədir. Allahın istədiyi hər bir şey olur, istəmədiyi isə olmur. Allahın vermədiyi bir şeyi heç kəs verə bilməz, verdiyinə də heç kəs mane ola bilməz. Əgər Allah bəndəsinə rəhmət qapılarını açarsa onun qarşısını heç kəs ala bilməz, yox əgər ona rəhm etməzsə heç kəs ona rəhm edə bilməz. Ən çirkin oxşatmaq da elə budur ki, möhtac olanı, aciz olanı Qadir olana, möhtac olmayana oxşatmaqdır. Allah hər tərəfdən kamildir. Onda naqislik yoxdur. Bu da quldan (bəndədən) onu tələb edir ki, ibadətin hər bir növünü Allaha yönəltsin. Bunların hər biri də ağıl, fitrət və şəriət tərəfdən buna dəlalət edir. Əgər bir kimsə bu kimi ibadətləri Allahdan qeyrisinə yönəldərsə, artıq o kimsə qeyrisni oxşarı və bənzəri olmayan Allaha oxşatmışdır. Bu da ən çirkin və batil bir oxşatmaqdır. Ən böyük çirkinlik olduğu üçün ən böyük zülm adlanmışdır. Bu zülmü də Allah bağışlamır, baxmayaraq ki, Allah rəhməti özünə vacib etmişdir.

Uluhiyyətin xüsusiyyətlərindəndir ki, bu qulluq iki əsas üzərində qurulmuşdur. Bundan başqası da yoxdur. Sevginin ən uca dərəcəsi ilə zəlilliyin ən uca dərəcəsi. Bu da Allaha qulluğun tamamlığıdır. Bu əsaslara görə də insanlar fərqlənirlər. İnsanın Allahı ən uca sevgi ilə sevməsi və bununla da yanaşı yalnız Allah qarşısında zəlil olmasıdır. Bunlardan biri olmazsa ibadət də olmaz. Lakin şeytanlar insanların ağıllarını və fitrətlərini dəyişərək korlamışlar. Sağlam ağıl heç vaxt şəriətə zidd olmur. Əgər bir kəs deyirsə bu mənim ağlıma batmır, deməli naqislik elə onun öz ağlındadır. Əgər onun ağlı sağlam olsaydı, Quran və Sünnədə gələnləri qəbul edərdi. Allah Öz nuru ilə dilədiyini hidayət edir.

***Həmçinin*** - əgər bir kimsə özünü böyük apararsa, insanlara özünü ucaltmağa, tərifləməyə çağırarsa, təkəbbürlük edərsə, özünə itaət etməyə və özünə qorxu, ümüd, sığınmaq tərəfdən bağlanmağa çağırarsa, o kimsə özünü Allaha oxşatmışdır. Allahın Rububiyyət və Uluhiyyətini özünə götürmək istəmişdir. Şahənşah, Hökmdarlar hökmdarı, Hakimlər hakimi, Qazilər qazisi, Hüccətullah, Ayətullah və s. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Allah qatında ən çirkin ad (ən çirkin adın sahibi) Məlikul-Əmlak adını daşıyan kimsədir". Sufyan ibn Uyeynə Σ deyir: "Şahən şahdır". (Başqa rəvayətdə: "Qiyamət günü Allah qatında ən mənfur, ən çirkin və Allahın ən çox qəzəb etdiyi, Allahdan başqa heç bir həqiqi məlik yox ikən, Məlikul-Əmlak – Məliklərin məliki – adı ilə adlandırılmış kimsədir)".[511] Belə bir insan Allahın onu lazımınca alçalmağa və Qiyamət günü insanların ayaqları altında qalmağa layiqdir. Əgər surət çəkən Qiyamət günü insanlar arasında ən şiddətli əzaba düçar olan olacaqsa, onda Rububiyyətdə, Uluhiyyətdə özünü Allaha oxşadan barədə zənnin nədir?

---

[511] Muslim 2143.

# HƏNƏFİ ALİMLƏRİNƏ GÖRƏ ŞİRK

***Lüğətdə şirk*** – Bir şeydə birisinə şərik olmaqdır. Şərik olmaq, şirkət eyni kökdəndir. Birisinə bir şeydə şərik olmaq – şərik olunan şeyin azında və ya çoxunda pay sahibi olmaq deməkdir. İstilahi mənası – şəriətə görə hər küfrün imanın ziddi olduğu kimi, şirk də Tövhidin ziddidir. İmam Abdul-Qadir əd-Dəhləvi deyir: "Şirk insanın Allahdan başqasında Allahın sifətlərindən bir sifətin varlığına etiqad etməsidir. Məs: "Filan kimsə hər şeyi bilir, filan kimsə dilədiyini edir, mənə xeyrin və şərin toxunması onun əlindədir – bu kimi sözləri söyləmək və ya Allahdan başqasını Allahı ucaltdığı kimi ucaltmaqdır. Birindən bir şey istəmək üçün ona səcdə etmək və ya onun üçün etiqad sahibi olmaq".[512] İmam Əhməd ər-Rumi[513] və Şeyx Əbul-Həsən ən-Nədvi deyirlər: "Şirk sadəcə insanın başqasını Allaha şərik qoşub Onunla arasında heç bir fərq görməməsindən əlavə, insanın Allahın zatına və sifətlərinə xas olan ibadətləri başqasına məxsus etməsidir. İnsanlardan birinə səcdə etmək, onun adına qurban kəsib nəzir demək, çətin anlarda ondan kömək diləmək və onun hər yerdə hazır olduğuna, onun qeybdən xəbər verməsinə inanmaq deməkdir. Bunların hamısı ilə şirkə səbəb olur və insan bununla müşrik olur".[514] ***"Həqiqətən əgər sən müşriklərdən "Göyləri və yeri kim yaratmışdır?"- deyə soruşsan, onlar mütləq "Allah!"- deyə cavab verəcəklər. De ki: "Həmd olsun Allaha!"*** *( Loğman 25).* Çox təəssüf ki, chillərin çoxu sadəcə Rububiyyət tövhidinin kifayət olduğunu söyləməkdədirlər. Beləcə, Uluhiyyətdə şirk qoşmaq onlara bəsit və yüngül gəlmiş və ibadəti Allahdan başqasına sərf etmişlər".[515] Muhəmməd Alauddin əl-Haskəfi deyir: "Allahdan başqasına nəzir demək, ölülərdən ötrü xalqın arasında bir çox kimsələrin başına mum yaxması, qəndil yağı və bənzəri şeylər kimi övliyaların qəbirlərinə yaxınlaşmaq üçün alınan pulun

---

512 Abdul-Qadir ibn Abdur-Rahim əl-Uməri əd-Dəhləvi əl-Hənəfi hicrətin 1230-cu ilində vəfat etmiş, məşhur alimlərdəndir. Nuzhətul-Havatir (c. 7, səh. 302-304).

513 Osmanlı alimlərindəndir. Hicrətin 1043-cü ilində ölmüşdür. Hidayətul-Arifin 1/ 157, Məcmuəl-Muəllifin 2/ 83. Şirkin altı növünü zikr edirlər. Şirkut-Tərrib – Bu Allaha yaxınlıq üçün Allahdan başqasına ibadət etmək. Məcalisul-Əbrar Alə Hazinətil-Əsrar (səh. 150-152).

514 Muhəmməd İsmail ibn Abdul-Ğani ibn Abdur-Rahim əl-Uməri əd-Dəhləvi əl-Hənəfi (h. 1193-1246). Takviyətul-İman, Tənvirul-Ayneyn fi İsbəti Rail-Yadeyn, ən-Nədvi Risalətut-Tövhid 32-33.

515 Əbu Hənifə və əshabının bu haqda rəylərini öyrənmək üçün: Bədaius-Sənai 1/ 320, Tuhfətul-Fuqaha 2/ 256, Fəthul-Mulhim 121-122, Ziyarətul-Qubur (səh. 29, əl-İbda s. 197), Təbyinu Həqaiq 1/ 264, Haşiyətu Mərakil-Fəlah s. 405, Kəvakibud Dərari 1/ 317, Məcalisul-Ərbəa s. 13 və s. Əhməd İbn əs-Sərahəndi əl-Hənəfi əl-Mətrudi əl-Naqşibəndi (ölümü h. 1034). Bəyanul-Əqaid, Nuzhətul-Havatir 5/ 43-45. Muhəmməd İbn Əli ibn Həmid ibn Sabir əl-Hənəfi ət-Təhnəvi. "Mucəmul-Muəllifin" 11/ 47, "Bahrur-Raik" 2/ 298, 3/ 88, 5/ 124, "Ruhul-Məani" 17/ 213, 313, 6/ 129, 11/ 98, "Tuhfətul-Fuqaha" 3/ 67, "Təysirur-Rahmən" 2/ 352, "Fətva əl-Hindiyyə" 6/ 323, 326, "əl-İbda" s. 189, "Təkviyətul-İman" s. 19-21 (Urduca), "Risalətut-Tövhid" s. 25, 33, 40, "Rəddul-İşraq" s. 16-17 – Bu kitablarda Allahdan başqasına səcdə etmək, övliyalara dua edərək yardım istəmək, onlarla istiğasədə olmaq, övliya üçün nəzir, qurban kəsmək və s. kimi əməllərin şirk olması və qəbirpərəstlərə şiddətli rədd vardır.

hamısı icma ilə batil və haramdır".[516] Muhəmməd ibn Yəhya ibn Muhəmməd əl-Qandəhləvi əl-Hənəfi deyir: "Qəbirlər üzərinə məscid bina etmək yəhudilərə bənzəməkdir. Bu yəhudilərin Peyğəmbərlərini və böyüklərini ucaltmaq üçün hörmət olsun deyə onların qəbirləri üzərində məscid bina etmələrində təzim və bütlərə tapınanların əməllərinə bənzər bir şeydir. Bu qəbirlərə qəndil aparmaq isə malda olan israfdır; ***"Mallarını boş yerə sərf edənlər şeytanın qardaşlarıdır. Şeytan isə Rəbbinə qarşı çox nankordur".*** *(əl-İsra 27).* Bu cür əməl etmədə yəhudilərə bənzəmə vardır. Çünki onlar böyüklərinin qəbirləri üzərinə qəndillər asaraq oraları işıqlandırır və lazımsız şeylərlə qəbirlərə böyük hörmət bəsləyərlər".[517] Alusi əl-Hənəfi deyir ki: "Mən salehlərin qəbirlərini yüksəltməyi, üzərinə daşla bina tikməyi, o qəbirlərə doğru namaz qılıb, təvaf etməyi, qəbirləri əllə salamlayıb, müəyyən vaxtlarda orada toplanmağı mübah sayan cahil kimsələr gördüm. Bunların hamısı Allah və Rəsuluna ρ qarşı açıq bir düşmənçilik və dində Allahın izn vermədiyi şeyləri etməkdir. Allah Rəsulunun ρ səhabələrinin onun qəbiri ilə necə davrandıqlarını (üstəlik qəbri yer üzündə olan qəbirlərin ən fəzilətlisi olduğu halda) bilməyin sənə yetərli olar. Buraxdıqları izə tabe olsan və indikilərlə onları müqayisə etsən (düşünsən), Allah səni hidayətə yönəldər".[518] İsmail əd-Dəhləvi – "Takviyətul-İman", ən-Nədvi "Risalətut-Tövhid" əsərində deyirlər ki: "Şirk fitnəsinin çox güclənməsi və insanlar arasında yayılması və Tövhidin qərib qalmasıdır. İnsanların çoxu şirkin nə məna daşıdığını bilmirlər. İman etdiklərini söylədikləri halda bir çox əməllərində şirkə düşüb onun çirkinliyinə bulaşmışlar". ***"Onların çoxu Allaha şərik qoşmadan iman etməzlər".*** *(Yusuf 106).* **Həmçinin** – ölülər vasitəsilə Allaha təvəssül etməyi İmam Əbu Hənifə, Əbu Yusuf M qadağan ediblər".[519]

Bu gün insanların çoxu şeyxləri, peyğəmbərləri, imamları, mələkləri və cinləri, sıxıntı anlarında çağırıb onlardan ehtiyaclarının ödənilməsini, istəklərinin gerçəkləşməsini ummaqdadırlar. Hətta başlarına gələcək bəlalardan qorxaraq öz uşaqlarına Pirverdi, Huseynqulu, Əliqulu və s. isimlər də verirlər. İnsanların qəlblərinə şübhə salmaq üçün: Bu Allahın onlara verdiyi bir nemətdir, onlara dua edib yalvarmağımız, onlardan kömək diləməyimiz ancaq Allaha yalvarma və Ondan yardım diləməkdir. Onların Allah qatında ayrı bir yeri və məqamı vardır. Hər kəs buna çata bilməz. Onlar istədiklərini edə bilərlər. Onlar Allah qatında bizim şəfaətçilərimiz və vəkillərimizdir". Onların bu sözləri Məkkə müşriklərinin sözlərinə necə də bənzəyir; ***"Allahı qoyub özlərinə dost tutanlar: "Biz onlara bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!"- deyirlər".*** *(əz-Zumər 3).* ***"Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən bütlərə ibadət edir və: "Bunlar Allah***

[516] Muhəmməd ibn Əli ibn Muhəmməd əl-Husni əl-Haskafi hənəfilərin Şam muftisidur. "Durrul-Muxtar" 2/ 439.
[517] "Kəvakibud-Dərari" 1/ 316-317.
[518] "Ruhul-Məani" 15/ 239-240.
[519] "Durrul-Muxtar" 630, "Şərhul-Əhyər" 2/ 282.

***yanında bizdən ötrü şəfaət edənlərdir!"- deyirlər. De ki: "Allaha göylərdə və yerdə bilmədiyi bir şeyimi xəbər verirsiniz? Allah Özünə şərik qoşulan bütlərdən uzaqdır və ucadır".*** *(Yunus 18).*

# ALLAHLA, ONUN AYƏLƏRİ, PEYĞƏMBƏRİ, ŞƏRİƏTİ VƏ YA BUNLARDAN HƏR HANSI BİRİ İLƏ İSTEHZA EDİB ZARAFATLAŞMAQ

Bütün Peyğəmbərlər insanları Tövhidə dəvət etdikləri zaman istehza (lağlağa) ilə qarşılaşmışlar. Nuhdan υ başlayaraq Muhəmməd Peyğəmbərə ρ qədər Peyğəmbərlər qövmləri tərəfdən bu əziyyəti çəkmişlər; ***"Eləcə də*** *(səndən əvvəl)* ***hər Peyğəmbər üçün günahkarlardan bir düşmən etmişdik. Rəbbinin sənə bir rəhbər, bir mədədkar olması kifayət edər".*** *(əl-Furqan 31).* ***"Onlar səni gördükdə ancaq məsxərəyə qoyur*** *(və belə deyirlər)****: "Allahın Peyğəmbər göndərdiyi şəxs budurmu".*** *(əl-Furqan 41).* ***"Biz sizdən əvvəlkilərə də neçə-neçə Peyğəmbərlər göndərmişdik. Onlara elə bir Peyğəmbər gəlməzdi ki, ona istəehza etməsinlər".*** *(əz-Zuxruf 6-7).* ***"Nuh gəmini düzəldir, ümmətinin əyan-əşrafı isə yanından ötüb-keçdikcə onu məsxərəyə qoyurdular. Nuh onlara deyirdi: "Əgər*** *(indi)* ***siz bizi məsxərəyə qoyursunuzsa, biz də*** *(Allahın əzabı gəldikdə)* ***sizi siz bizi məsxərəyə qoyduğunuz kimi məsxərəyə qoyacağıq".*** *(Hud 38-39).* ***"Yadınıza gətirin o vaxt ki, Musa öz qövmünə: "Allah sizə bir inək kəsmənizi əmr edir!" – dedi. Onlar isə: "Bizi məsxərəyəmi qoyursan!"– dedilər. Musa da: "Allah Özü məni cahil olmaqdan saxlasın!"– dedi".*** *(əl-Bəqərə 67).* *"(Ya Muhəmməd!)* ***Kafir olanlar səni gördükləri zaman ancaq məsxərəyə qoyaraq*** *(bir-birinə)****: "Sizin tanrılarınızı tənə edən bumudur?"– deyərlər. Halbuki onlar, məhz onlar Rəhmənin öyüd-nəsihətini*** *(Quranı)* ***inkar edirlər".*** *(əl-Ənbiya 36).* *"(Ya Muhəmməd! Təbuk döyüşünə gedərkən səni lağa qoyan)* ***münafiqlərdən*** *(nə üçün belə etdiklərini)* ***soruşsan: "Biz ancaq söhbət edib zarafatlaşır, əylənirdik"– deyə cavab verərlər. De ki: "Allaha, Onun ayələrinə və Peyğəmbərinə istehzamı edirsiniz.*** *(Əbəs yerə)* ***üzr istəməyin. Siz iman gətirdikdən sonra artıq kafir oldunuz. Aranızdan bir qismini bağışlasaq da, digər qismini günahkar olduğu üçün əzaba düçar edəcəyik".*** *(ət-Tövbə 65-66).* [520] İbn Ömər, Muhəmməd ibn Kəb, Zeyd ibn Əsləm, Qatadə M rəvayət edirlər ki: "Təbuk döyüşündə bir nəfər: "Bizim bu Quran oxuyanlar kimi qarınqulu, yalançı və döyüşdə qorxaq görmədik". Onlar Peyğəmbəri ρ və onun Quran oxuyan səhabələrini nəzərdə tuturdular. Auf ibn Məlik ψ deyir ki: "Sən münafiqsən, Allaha and olsun ki, bunu Peyğəmbərə xəbər verəcəyəm"- dedim. Peyğəmbərə ρ xəbər vermək üçün getdim. Lakin Peyğəmbərin ρ yanına gəldikdə artıq vəhyin məni qabaqladığını gördüm.

[520] Təbəri Təfsir 10/ 173, İbn Kəsir "Təfsir" 4/ 111, 112, İbn Hişam 4/ 168.

(İstehza edən kimsə) Peyğəmbərin ρ yanına ondan üzr istəmək üçün gəlmişdi. Bu zaman Peyğəmbər ρ artıq dəvəsinə minərək səfərə hazırlaşırdı. O: “Ey Allahın Rəsulu! Biz sadəcə səfər çətinliyini aradan qaldırmaq üçün boş-boş danışırdıq”. İbn Ömər ψ deyir ki: “Sanki onun dəvə yüyəninə bağlı olduğunu və ayaqlarının da sürünərək daşlara dəydiyini və bu sırada: “Biz zarafat edib boş-boş danışırdıq”-dediyini və Peyğəmbərın ρ ona əhəmiyyət vermədən sadəcə bu sözləri təkrar edərək: ***"Allaha, Onun ayələrinə və Peyğəmbərinə istehzamı edirsiniz.*** *(Əbəs yerə)* ***üzr istəməyin. Siz iman gətirdikdən sonra artıq kafir oldunuz"-*** ayəsini oxuduğunu görürəm”.[521] Müsəlman buna qarşı çox diqqətli olmalıdır. Kiçik bir söz müsəlmanın bütün həyatını, axirətini məhv edə bilər. ***Allah Qorusun*** bu küfr iki qismdir: **1)** Allahın şəriəti ilə edilən istehza. **2)** Kovni (dünyəvi) dəlillərlə istehza etmək. Məs: Yay aylarında soyuq olur və deyir ki: “Bu nə boş şeydir. Yayda da soyuq olar və ya əksini söyləmək”. Məgər kainatda baş verənlər Allahın izni (qədəri) ilə olmur? Hər bir şey Allahın hikməti üzərində qurulmuşdur. Allahın qədəri, təqdir etdiyi ilə istehza etmək, “Allah bu zərərli şeyləri nə üçün yaradıb” və s. demək küfrdür. Allah gizli və aşkar olan hər bir şeydən xəbərdardır. İbn Teymiyyə Σ deyir: "Peyğəmbər ρ onları şirkdən çəkindirdiyi zaman onunla istehza etdilər. Bütün müşriklərin halı belədir. Peyğəmbərlər onları Tövhidə dəvət etdikləri zaman, bütpərəstlik canlarına hopduğu üçün onları söydülər və onları ağılsız, azmışlar və dəliliklə vəsfləndirdilər. Onlara bənzəyən kimsələr də belədir. Əgər içində bütpərəstlik hisləri varsa, Tövhidə çağıran birini gördükdə eyni şəkildə onunla istəhza edib (lağlağa) edən görərsən".[522] İstehzanın bir neçə növü vardır. İstehza bəzən sözlə olur ki, istehzanın ən çox yayılan şəkili budur. Bəzən də işarə ilə olur. İşarə ilə edilən istehza (lağlağa) göz-qaş hərəkəti və ya dil çıxarmaqla olur. Bəzən də əl hərəkətləri ilə olur. Allaha istehza etmək ***Kufru Muarada -*** etiraz küfrüdür. Şeyx Useymin Σ deyir: “Bütə səcdə edənin küfründən də şiddətlidir”. İbn Qudamə Σ deyir: "İstər zarafatla olsun, istərsə ciddi bir şəkildə olsun Allahı söyən kimsə kafir olur. Allah ilə, ayələri, Peyğəmbərləri və Kitabları ilə istehza edən kimsə də belədir".[523] Qurtubi Σ Təbuk döyüşündə olan istehza edənlərin halını açıqlayarkən İbnul-Arabinin sözlərini gətirir: "Onların söylədikləri şeylər istər ciddi, istərsə də zarafat olsun - küfrdür. Çünki, zarafatla küfr etmək də küfrdür. Ümmət arasında bu haqda ixtilaf yoxdur. Araşdırma aparmaq elmin və həqiqətin qardaşıdır, zarafat və istehza batilin və cəhalətin qardaşıdır".[524] İbn Teymiyyə Σ deyir ki: "Allah ilə, Onun ayələri və Peyğəmbərləri ilə istehza etmək küfrdür. Bunu edən kimsə daha öncə mömin idisə kafir olduğuna hökm edilər".[525] ***Həmçinin -*** Muhəmməd ibn Abdul-

---

[521] İbn Əbu Hatim 6/1829, İbn Cərir “Təfsir” 10/119.
[522] Dəkaikut Təfsir 3/332.
[523] əl-Muğni "Kitabul Murtəd" 12/298-299.
[524] Camiul Əhkamul Quran 8/397.
[525] Macmuu Fətava 7/273.

Vahhab Σ da öz dəyərli kitabı olan "Tövhid Kitabında" belə bir bölüm açmışdır. Həmçinin "İslmdan çıxaran on şərt" kitabında da – Peyğəmbərin ρ dinində olan bir şeylə və ya onun savabı və ya cəzası ilə zarafat edib (istehza) etməyi altıncı şərt olaraq zikr etmişdir. Həmçinin, Muhəmməd ibn İbrahim Əli Şeyx, İbn Bəzz və Şeyx Useymin Σ din ilə istehza edənlərin kafir olmasını söyləyən alimlərdir.[526]

Allahı və Peyğəmbərini ρ, Dini söyənin tövbəsinin qəbul olunmasında alimlər arasında ixtilaf vardır. Hənbəli məzhəbinə görə qəbul edilmir və mürtəd olaraq öldürülür. Lakin digər qrup alimlər deyirlər ki: Nasux Tövbə (səmimi tövbə) qəbul edilir. Səhih rəy də budur. Alimlərin ixtilafı məsələnin nə qədər təhlükəli olduğunu göstərir. Bunun Tövhid ilə olan bağlılığı – hökmü küfrdür ki, Tövhidin əslinə ziddir. Peyğəmbəri ρ söyənin tövbəsi qəbul olunurmu? Şeyx Useymin Σ deyir: "Tövbəsi qəbul edilir, lakin hədd ilə öldürülür. Cənazəsi qılınır və müsəlman olaraq dəfn edilir. Ölümü tövbəsi deməkdir. Lakin Peyğəmbərin ρ haqqı qalır. Çünki, öz haqqına görə onu bağışlayıb bağışlamamdığı Qiyamətdə bilinəcək". Həmçinin – istehza məclislərində olduğun zaman, ya etirazını bildir, ya da get. Əks təqdirdə sən də onlara şərik olacaqsan; ***"Ey iman gətirənlər! Bir camaat digərini məsxərəyə qoymasın. Ola bilər ki, bunlar onlardan daha yaxşı olsunlar. Qadınlar da qadınları lağa qoymasınlar. Ola bilər ki, bunlar onlardan daha yaxşı olsunlar. Bir-birinizə tənə vurmayın və bir-birinizi pis ləqəblərlə çağırmayın. İman gətirdikdən sonra fəsadçı adlanmaq necə də pisdir. Məhz tövbə etməyənlər zalımlardır".*** *(əl-Hucurat 11).* ***"O, kəslər ki, lağlağıdan və lazımsız şeylərdən üz döndərirlər".*** *(əl-Mumin 3).* İbn Kəsir Σ bu ayənin təfsirində deyir ki: "Allah insanlarla istehza (lağlağa) etməyi qadağan edir. İnsanlarla istehza etmək onları kiçik görməkdir. Necə ki, Peyğəmbər ρ buyurdu: "Təkəbbürlük haqqı qəbul etməmək və insanları kiçik görməkdir".[527] ***"Onlar Mənim ayələrimi və*** *(Peyğəmbər vasitəsilə)* ***qorxudulduqları əzabı məsxərəyə qoyurlar".*** *(əl-Kəhf 56).* ***"Bəli sən onlara təəccüblənirsən, onlar isə*** *(sənin bu inamına)* ***istehza edirlər".*** *(əs-Saffət 12).* Muhəmməd ibn Əli Şeyxdən Σ: "Saqqal pislikdir deyən kimsə mürtəd sayılırmı?"- deyə soruşulduqda, o: "Bunu yaxşıca araşdırmaq lazımdır. Əgər bunu Peyğəmbərin ρ bir sünnəti olduğunu bildiyi halda edərsə, haqqında mürtədlik hökmü qalxar, yox əgər o kimsəyə yaraşmadığı üçün istehza edərsə küfr deyildir".[528] ***"Həqiqətən, günahkarlar iman gətirmiş kimsələrə*** *(dünyada)* ***gülürdülər. Möminlərin yanından keçərkən*** *(onları dolamaq məqsədilə)* ***bir-birinə qaş-göz edirdilər. Ailələrinin*** *(yaxın adamlarının)* ***yanına qayıtdıqda isə*** *(onları doladıqları üçün)* ***kefləri kök qayıdırdılar. Möminləri gördükdə: "Doğrusu, bunlar*** *(haqq yüldan)* ***azanlardır!"– deyərdilər. Halbuki onlar möminlərə nəzarətçi göndərilməmişdilər".*** *(əl-Mutaffifin 29-*

---

[526] Fətva Muhəmməd İbn İbrahim 1/174, 12/195, İbn Bəzz 3/165, Useymin "Məcmuus Səmin Min Fətva" 1/62.
[527] Təfsirul Quranil Azim 7/356, Muslim 91, ət-Tirmizi 1999, Əbu Davud 4/352.
[528] Fətva Əli Şeyx 12/195.

*33). "**Könüllü surətdə** (bollu) **sədəqə verən möminlərə tənə edənləri və güc-bəla ilə əllərinə düşəni təsəddüq edən kəsləri məsxərəyə qoyanları Allah özü məsxərəyə qoyacaqdır. Onlar şiddətli bir əzaba düçar olacaqlar".** (ət-Tövbə 79). "**Onlara haqq olan** (Quran) **gəldiyi zaman onu yalan hesab etdilər. Müşriklərin məsxərəyə qoyduqları Quranın xəbərləri onlara gəlib çatacaq".** (əl-Ənam 5).*

# ŞİRKUL-ƏSĞƏR - KİÇİK ŞİRK

Kiçik şirk insanı İslamdan çıxartmadığı kimi Tövhidin əslinə də zərər verməz. Lakin Tövhidin kamilliyinə zərər verir. Kiçik şirk böyük şirkə aparan əməllər, sözlər və niyyətlərdir.[529] Burada bir məsələ də vardır ki, kiçik şirk böyük şirkə aparan yoldur. Əgər bir kimsə etiqad etsə ki, "hər bir şeydən qoruyan Allahdır, sadəcə bu gözmuncuğunu, həmayılı səbəb olaraq taxmışam"- bu kiçik şirkdir. Lakin etiqad etsə ki, xeyr, mənə kömək edən, şəfa verən bu gözmuncuğudur və s. artıq bu əməl böyük şirkə çevrilir. Bunların hər ikisindən də çəkinmək lazımdır. Çünki, kiçik şirkin özü belə böyük günahlardan da böyükdür.

# ƏMƏLDƏ ŞİRK

***<u>Halqa Taxmağın, İp Bağlamağın, Gözmuncuğu, Həmayıl Və Tilsimlər Haqqında - Qayda</u>* -** Allah nəticəni əldə etmək üçün müəyyən səbəblər qoymuşdur. Bu səbəblər Şəri və Kovni (dünyəvi) ola bilər. Məs: **1.** Şəri səbəb - Şəhadət kəliməsi İslam dininə girmək üçün vasitədir, Peyğəmbərin ρ şəfaətinə nail olmaq istəyirsənsə azandan sonra onun üçün Vəsiləni dilə. Fatihə surəsi şəri bir səbəbdir. Nədən? Gözdən, bədnəzərdən, ilan və əqrəb sancmasından qorunmaq və şəfa tapmaq üçün. Ümumiyyətlə Quran möminlər üçün şəfadır. Bu Quran və Sünnə bunu təsdiqləyən şəri bir səbəbdir. **2.** Kovni (dünyəvi) səbəb iki şərtlə qəbul edilir: **1.** Quran və Sünnədə ona qadağa olmasın. Çünki, şəriətin qadağan etdiyi şeylər faydalı səbəblər ola bilməz. **2.** İnsanlar arasında bilinən bir şey olsun. Məs: Baş ağrısından müalicə üçün dərmanlar vardır. Qəbul etdikdə baş ağrıları keçir. Susuzluqdan su içməklə, aclıqdan yemək yeməklə qurtarmaq olar. Bu da insanlar arasında məşhur olan və şəriətin qadağan etmədiyi bir səbəbdir. İnsanlar arasında məşhur olub, şəriətin qadağan etdiyi bir əməl olarsa bu da qadağandır. Lakin bir kimsə susuzluğa qarşı əlinə ip bağlasa ki, "bu susuzluğumu aparacaq" və ya "baş ağrım bununla keçəcək", bu nə şəriətdə əmr edilən bir şeydir, nə də dünyəvi bir əmrdir. Bir kimsə etiqad etsə ki, "əlimdə olan bağlama öz-özlüyündə xeyirin gəlməsinə və şərin getməsinə kömək edir"- Rububiyyət Tövhidində böyük şirk etmişdir. Çünki, belə bir kimsə Allahla yanaşı başqa bir yaradıcının olmasına etiqad edir. Lakin səbəb kimi qəbul etsə - kiçik şirkdir. Çünki, bu ip, halqa, gözmuncuğu və s. öz-özlüyündə heç bir şeyə qadir deyildir. Allah bu əməli (ipi, dəmiri) gözdən və s. qorunmaq üçün səbəb etməmişdir. Nə Quran, nə də Sünnə belə bir əmələ icazə verməmişdir. Bal müxtəlif xəstəliklərdən şəfadır. Dünyəvi tərəfdən baxdıqda təcrübədən götürülüb ki, bal müalicə olunmağa

[529] "Qavlus-Sədid fi Məqasidit-Tövhid" s. 31, 54.

səbəbdir. Quran oxumaq möminlər üçün şəfa və rəhmətdir; ***“Biz Quranda möminlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik. Bu ayələr zalımların ancaq ziyanını artırır”.*** *(əl-İsra 82).* Şəriət tərəfdən bu icazəlidir. Lakin Allah bütlər, qəbirlər vasitəsilə (şəfa, övlad və s.) istəməni nəticəni əldə etmək üçün səbəb qoymamışdır; ***"De ki: "Elə isə bir söyləyin görək, əgər Allah mənə bir zərər toxundurmaq istəsə, sizin Allahdan qeyri ibadət etdikləriniz onun zərərini aradan qaldıra bilərlərmi?" Yaxud: "Əgər Allah mənə bir mərhəmət əta etmək istəsə, onlar Onun mərhəmətinə mane ola bilərlərmi?" De ki: "Mənə təkcə Allah kifayət edər".*** *(əz-Zumər 38).* ***"Əgər Allah sənə bir zərər yetirsə, səni ondan Allahdan başqa heç kəs qurtara bilməz. Əgər Allah sənə bir xeyir diləsə, heç kəs Onun nemətinə maneçilik edə bilməz".*** *(Yunus 107).* İmran ibn Hüseyn ψ rəvayət edir ki, Peyğəmbər ρ bir dəfə qolunda sarı halqa (qolbağ) olan bir nəfəri görüb buyurdu: "Bu nədir?" Adam: "Zəiflik üz verməsin deyə gəzdirirəm (çiyində, qolda olan ağrılardan)"- dedi. Peyğəmbər ρ: "Dərhal onu çıxart, çünki o, sənin zəifliyini daha da artırır. Əgər qolunda bu qolbaqla ölsən heç vaxt rahatlıq tapmazsan".[530] Uqbə ibn Amir ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Boynuna ***Təmimə -*** (tilsim, həmayıl, amulet) asana Allah xeyirli sonluq verməsin, ***Vədə -*** gözmuncuğu gəzdirənə Allah rahatlıq verməsin (həm asmaq, həm də bağlanmaq)".[531] Əbu Səadə deyir ki: "Gözmuncuqları ərəblərin uşaqların boynuna taxdığı muncuqlardır, onlar (muncuqların uşaqları nəzərdən qoruduğunu) güman edirdilər. Lakin İslam bütün bunların boş bir şey olduğunu isbat etdi". Peyğəmbər ρ buyurdu: "Kim ***Təmimə -*** tilsim assa şirk etmiş olur".[532] Əbu Hatim rəvayət edir ki, Huzeyfə ψ əlində qızdırmaya qarşı ip bağlamış bir nəfəri gördükdə ipi qırdı və bu ayəni oxudu: ***"İman gətirənlərin əksəriyyəti Allaha şərik qoşmadan inanmırlar".*** *(Yusuf 106).* İnsanların Allahdan üz döndərib uşaqlarını muncuqlarla və kəndirlərlə inandırmağa nə vadar edir? ***"Allahdan qeyrisini özlərinə dost seçənlər özünə yuva qurmuş hörümçək kimidirlər. Evlərin ən zəifi isə şübhəsiz ki, hörümçək yuvasıdır. Kaş biləydilər! Şübhəsiz ki, Allah onların Allahı qoyub nəyə dua etdiklərini bilir. O, yenilməz qüvvət və hikmət sahibidir".*** *(əl-Ənkəbut 41,42).* Bəladan uzaq olmaq və sıxıntıları dəf etmək məqsədilə halqa, ip və s. taxılması şirk sayılır. Peyğəmbərin ρ ondan soruşması onun, o halqanı qoluna nə üçün taxdığının səbəbini öyrəmək və ya qınamaq üçün idi. Ola bilər ki, o kimsə bunu gözəllik və s. məqsədlərlə taxardı. Lakin Peyğəmbər ρ dəqiqləşdirdikdən sonra: “Dərhal onu çıxart, çünki o, sənin zəifliyini daha da artırır. Əgər qolunda bu qolbaqla ölsən heç vaxt rahatlıq tapmazsan”- deyə ona əmr etdi. Günümüzdə təkfirçilər üçün dəlildir ki, hökm verməmişdən öncə soruşmaq lazımdır. Bu haqq olan kəlimədir. Çünki, şirk insanların zənn etdiyi kimi

[530] Əhməd 4/ 445, İbn Məcə 3531, İbn Hibban 1410, 6088, əl-Hakim 8502.

[531] Əhməd 4/ 154, İbn Hibban 1443, 6086, əl-Hakim 8501.

[532] Əhməd 4/ 156, əl-Albani “Səhih Cəmi” 6394, “Səhih Silsilə” 492.

xeyirdən çox zərər gətirir. Belə şeylər insanın iradəsini də zəiflədir. Həmin o halqalar bağlandığı üçün insanın xəstəliklərə qarşı mübarizəsi zəifləyir, Allaha təvəkkülü azalır. Etiqad edir ki, nə qədər ki, bu qolbaq məndədir xəstəlik olmayacaqdır. Bu qolbaq çıxdıqda xəstələnəcəyəm. Artıq onun həyatı bu qolbaqdan asılı olur. İstənilən şirk edən bu cür bəlaya düşür. Allah belə bir kimsəyə xeyirli sonluq verməz. Gözdəymədən, həsəddən, paxıllıqdan qorunmaq üçün boyunlarına, yaxalarına sancaq vururlar. Fovzan – *hafizahullah* - deyir ki: “Allah ona rahatçılıq verməz – yəni ona vəsvəsələr, kədər, qəm verər, ona düşmənlərini göndərər ki, rahatçılıqda olmasın”. Bu da günümüzdə olan müsəlmanların halıdır. Çünki, müsəlmanlar bu gün Allahdan başqa kimə, nəyə isyəyirsən qəlblərini bağlayıblar.

Əbu Bəşir əl-Ənsari ψ rəvayət edir ki, Peyğəmbəri ρ səfərlərin birində müşayət edirdim. Peyğəmbər ρ dəvələrin boynundakı köhnəlmiş (gərilmiş) yay ipindən olan boyunbağıları (həmayılı) çıxarmağı və qırılmamış bir dənə də olsun boyunbağı saxlamamaq əmri ilə qasid göndərərdi".[533] Cahiliyyə ərəbləri etiqad edirdilər ki, bu kimi şeylər mal-qaranı gözdən qoruyur. Ruveyfi ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Ey Ruveyfi! Bəlkə sən çox yaşadın. Ona görə hamıya söylə: “Kim saqqalına düyün (hörük) vursa, köhnəlmiş yay ipindən boyunbağı gəzdirsə və ya heyvan peyini və sümüyü ilə təmizlənsə Muhəmməd o adama cavabdeh deyildir (uzaqdır)".[534] Useymin Σ deyir ki: “Qövm başçıları təkəbbürlükdən saqqallarına hörük vurardılar və gözəl saqqalı olduğuna görə ona göz dəyməsindən qorxurdu. Ona görə də hörük vururdu ki, insanların gözü dəyməsin”. Səid ibn Cubeyr Σ deyir ki: “Bir kimsədən tilsimi qırıb atmaq bir qulu azad etmək kimidir".[535] İbn Məsud ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Ruqyə (ovsun), Təmimə (amulet) və Tivələ (kişi qadını sevmək üçün edilən sehr) şirkdir".[536]

***<u>Təmimə - Amulet - Həmayıl - Gözmuncuğu</u>*** – uşaqların boyunlarından onları göz dəymə və şərdən qorumaq üçün asılır. Göz formasında, dəridən də ola bilər. Bəzən dənizdən çıxan balıqqulağı da taxırlar. Əksər hallarda kiçik uşaqlara asılır və ya taxılır. Lakin bu hamıya – uşağa və ya böyüyə - qadağandır. Məzmunu Quran ayələrindən ibarət olan amuletlərin taxılması icazəlidir, yoxsa yox? Allah Rəsulunun ρ səhabələri, onların tələbələri və sonrakı nəsillərin alimləri məzmunu Allahın Kəlamından ibarət olan tilsimlərə dair müxtəlif fikirdədirlər. Abdullah ibn Amr, Aişə və s. səhabələr M tilsimləri (amuleti) qadağan edən hədisin yalnız şirk olanlara aid olduğuna əsaslanaraq buna icazə verirdilər. Lakin İbn Abbas, İbn Məsud, Huzeyfə,

---

[533] əl-Buxari 3005, Muslim 2115, Əbu Davud 2552, Əhməd 5/ 216, Malik 2/ 937.
[534] Əbu Davud 36, ən-Nəsai 8/ 135, Əhməd 4/ 108, əl-Albani səhih deyib.
[535] Vəki rəvayət etmişdir, İbn Əbi Şeybə 5/ 36.
[536] Əbu Davud 3883, İbn Məcə 3530, Əhməd 1/ 381, əl-Hakim 4/ 418, əl-Albani səhih deyib.

Uqbə ibn Amr M və s. bunu qadağan edirdilər.[537] Abdullah ibn Amrdan ψ gələn əsərdə deyilir ki: O, Quran öyrənə bilməyən tələbələrinə (Qüran ayələrindən) ibarət amulet asdırardı". ***Həmçinin*** – Aişədən O də belə məzmunlu bir əsər vardır. Lakin hər iki əsər alimlər tərəfindən zəif hesab edilmişdir. əl-Albani Σ deyir: "Sənədində olan Muhəmməd ibn İshaq tədlis edən Mudəllis[538] bir ravidir".[539] Aişədən O gələn əsərin sənədində olan Bukeyr ibn Abdullah ilə Qasım ibn Abdullahın bir-birindən rəvayət etmələri Rical[540] kitablarında qeyd olunmur. Bu da sənədin qırılmasıdır. Bəzi böyük alimlər bu əsərlərə əsaslanaraq Quran ayələrindən ibarət olan amuletlərin taxılmasına icazə vermişlər. Hər iki əsər zəif olduğu üçün səhih rəy Quran ayələrindən amulet taxmağın qadağan olunmasıdır. Hətta səhih olsa da belə yenə də səhih olan odur ki, əslə qayıdılır, bu da əməlin qadağan olunmasıdır. Lakin Quran ayəsini asana və ya taxana demək olarmı ki: "O, şirk edir?" Xeyr, əgər Qurandan bir ayədirsə şirk etmiş sayılmır. Çünki o, Allahın ayəsindən, sifətlərindən istəmişdir. Quran da Allahın kəlamıdır. ***Həmçinin*** – bəzi müsəlmanlar qabların içinə, evlərin divarlarına, miniklərinə məzmunu Quran ibarət olan ayələri asırlar. Əgər bunları öyrənmək məqsədilə edirlərsə heç bir problem yoxdur, bundan qeyri məqsədlər üçün istifadə edilərsə icazəli deyildir. Çünki, Allah bu ayələri asmaq, minikdə gəzdirmək üçün deyil, öyrənib əməl etmək üçün nazil etmişdir. Quranın ayələrini amulet kimi taxmağa icazə verməkdə bir çox zərərlər vardır: **1.** Ümumi qadağanın olması. **2.** İnsanda müsəlmana qarşı şübhə yaradır ki, bu amulet Allah kəlamıdır, yoxsa şirk olan bir şeydir. Çünki, əksər vaxtı amulet bağlamanın içində olur. Müsəlman barəsində pis zənn etməyə yol açır. **3.** Bir müddətdən sonra insan bütünlüklə qəlbini o amuletlə bağlayır. Artıq elə zənn edir ki, ona kömək edən budur. Bu əmələ icazə vermək şər qapılarının açılmasına səbəbdir. Şəriət həmişə şər sonluğa aparan qapıları

---

[537] İbn Əbi Şeybə "Musnəd" 5/ 36, Suleyman ibn Abdullah Σ deyir ki: "Bu İmam Əhməd və onun əshabından rəvayət edilir". Abdur-Rahmən ibn Həsən "Fəthul-Məcid".

[538] ***Müdəllis:*** Bu kəlimə ( مُدَلِّسٌ ) ərəbcə "dəlləsə" ( دَلَّسَ ) felinin məlum növündən əmələ gəlmiş feli sifətdir. Bu da adamaldadan, yalançı, fırıldaqçı, kələkbaz və s. mənaları ifadə edir. (Mücəmul-Vəsit, səh. 293; Bolşoy Arabsko-Russkiy slovar, 1/ 260; Rusca-Azərbaycanca lüğət, 2/ 255). ***İstilahi mənası*** - bu, ravinin "tədlis" etməsi deməkdir. "Tədlis" kəlməsi lüğətdə yalan, fırıldaq, kələk və s. mənaları ifadə edir. İstilahi mənada isə "tədlis" üç növdür: a) "tədlisul-isnad"- bu, ravinin rastlaşdığı kimsədən (başqa bir ravidən) eşitmədiyi rəvayəti elə bir formada rəvayət etməsidir ki, həm eşitməsi həm də eşitməməsi ehtimal edilir". b) "tədlisut-təsviyə"- bu, "müdəllis" ravinin öz şeyxindən "eşitdim" deməklə hədis rəvayət etməsidir ki, o, isnadın tərkibində olan, bir-birilə rastlaşmış iki "siqa" ravinin arasında (hədisi birindən eşidib digərinə çatdırmaqda vasitə) olan "daif" ravinin adını vurğulamır və onlardan birincisi[538] "müdəllis" də deyildir. Odur ki, "Müdəllis" ravi (şeyxindən eşitdiyi hədisin isnadını sadaladıqda) elə bir ləfz gətirir ki, o iki "siqa" ravinin birinin digərindən həmin hədisi eşitməsi ehtimal edilir və beləliklə də isnadın tərkibi yalnız "siqa" ravilərdən ibarət olur) "tədlisuş-şuyux"- bu, bir ravinin digərindən eşitdiyi hədisi rəvayət etməsidir ki, həmin ravi şeyxinin (hədisi rəvayət edən şəxsin) tanınmaması üçün onu məşhur olmadığı adı ilə, yaxud kunyası ilə, yaxud nəsəbi ilə, yaxud da xassəsi ilə qeyd edir. (İbnus-Səlahın "Ülumul-Hədis" əsəri, səh. 167; İbn Həcərin "Nükət" əsəri, 2/ 261; Səxavinin "Fəthul-Muğis" əsəri, 1/ 190; Abduləzizin "Dəvabitul-Cərh vət-Tədil" əsəri, səh. 120-121).

[539] Kəlimə Tayyib 44 səh.

[540] ***Rical*** – hədis və əsərləri rəvayət edən rəvayətçilərin (ravilərin) həyatlarına aid müəyyən alimlər tərəfindən yazılan kitablar.

bağlayır. Çünki, Allahın kəlamından olan yazıları taxmaq başqa yazıları taxmağa da gətirib çıxarır. **3.** İnsanlar bu ayələrə hörmətlə yanaşmırlar. Amuleti taxanın ona qarşı istər-istəməz hörmətsiz münasibəti olur. Çünki o, bununla murdar yerlərə, ayaqyoluna və s. girir.

# SÖZDƏ ŞİRK

***Allahdan Qeyrisinə And İçmək*** - Kəbəyə, əmanətə, şərəfə, bir şeyin bərəkətinə (çörək haqqı, işıq haqqı), bir kimsənin həyatına (sən öl, mən ölüm), peyğəmbərə, müqəddəs hesab edilən insanlara, ataya, anaya və uşaqların canına and içmək haramdır və bunlardan birinə and içən kimsəyə Şəhadət kəliməsini söyləməsi lazımdır. Peyğəmbər ρ buyurdu: "Kim Lat və Uzzaya and içərsə dərhal ***Lə İləhə İlləllah*** – (Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur) desin".[541] Nə üçün Allahdan qeyrisinə and içən şirk etmişdir? Çünki andda təzim vardır. And içən içdiyi kimsəni ucaltmışdır. Onu inandırmaq üçün and içmişsə - kiçik şirkdir. Bir şey də vardır ki, əgər bu kimi sözlər dildə gəzən sözlərdirsə (dili bu sözlərə vərdiş etdiyinə görə və s.) bu da kiçik şirkdir. Əgər and içdiklərini Allah qədər təzim edərsə (qəbri, qəbir sahibini, salehləri, daşı, ağacı) bu zaman böyük şirkdir. Burada niyyət rol oynamır, sözün özü şirkdir. Çünki, and içən qarşısındakını inandırmaq üçün elə bir şeyə and içməlidir ki, o da onun andını qəbul etsin. Bir şeyi unutmayın ki, kiçik şirkin özü belə böyük günahlardan da böyükdür. Peyğəmbər ρ buyurdu: "Allahım! Bilərəkdən edə biləcəyim şirkdən sənə sığınıram və bilmədən etdiyim şirkə görə isə Səndən bağışlanma diləyirəm".[542] İbn Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Diqqət edin! Allah atalarınıza and içməyi qadağan edir. Kim and içərsə ya Allaha and içsin, ya da sussun".[543] İbn Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Allahdan qeyrisinə and içən şirk və ya küfr etmişdir".[544] Peyğəmbər ρ buyurdu: "Əmanətə and içən bizdən deyildir".[545] İbn Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Atalarnıza and içməyin! Kim Allaha and içərsə doğru danışsın. Kimin üçün Allaha and içsələr qane (razı) olsun. Kim bu anda razı olmazsa (bu) Allahdan deyildir".[546] Qane olan kimsə Allahı əzəmətləşdirmiş olur, qane olmayanın isə Tövhidi naqisdir. Rəvayətlərdə gəlir ki: İsa υ oğurluq edən bir nəfəri görür və ona yaxınlaşaraq: "Sən oğurluq edirsən?"- deyə soruşur. O deyir: "Ondan başqa heç bir

541 Fəthul-Bəri 11/ 536.
542 Əhməd 4/ 403.
543 Fəthul-Bəri 11/ 530.
544 Əhməd "Musnəd" 2/ 125, Əbu Davud 3251, ət-Tirmizi 1535, İbn Hibban 4357, əl-Albani "Səhihul-Cəmi" 2561, 6204, "Səhih Silsilə" 2042.
545 Əbu Davud 3253, əl-Albani "Səhih Silsilə" 94.
546 İbn Məcə 2101, əl-Albani "Səhihul-Cəmi" 7247.

həqiqi məbud olmayan Allaha and olsun ki, mən oğurluq etmədim". İsa υ buyurur: "Özümü (gözümü) yalançı saydım və sənin andını isə qəbul etdim".[547] İbn Məsud ψ deyir ki: "Allaha yalandan and içmək mənim üçün Allahdan qeyrisinə doğurdan and içməkdən daha yaxşıdır (sevimlidir)".[548] Bu bir misaldır. İbn Məsud ψ üçün hər iki and sevimli deyildir. Hər iki əməl də günahdır. İkincinin günahı birincidən daha şiddətlidir. Çünki, həm and içirsən, həm də andına yalan olaraq Allahın adını qatırsan. Şirkin fəsadı isə yalan and içməkdən daha şiddətlidir.

***<u>İçilən Andla Nə Vaxt Razı Qalmaq Olar Və Olmaz?</u>*** - Yalan danışmq qadağan edilmişdir. Əgər yalan danışan yalanını Allahın adı ilə qüvvətləndirərsə bunun günahı daha da böyükdür. Çünki, belə bir kimsə Allahı aşağı görmüşdür. Kim ki, sənə Allahın adı ilə and içirsə razı qalmalısan, bu da Allahı ucaltmaqdır. Şeyx Useymin Σ içilən andla bağlı beş halı qeyd edir. Hissi tərəfdən razı olmaya bilərsən, lakin şəriət tərəfdən razı qalmalısan: **1.** Yəqinliklə bilirsən ki, o yalandan and içir. Belə kimsəyə inanmaq olmaz. **2.** Sən ehtimal (şübhə) edirsən ki, o yalandan and içir. Belə kimsəyə inanmaq olmaz. **3.** Həm yalan, həm də doğru tərəfdən də ehtimallar eynidir. Belə halda sən onun andını təsdiq edirsən. **4.** Onun doğru olduğuna ehtimal daha çoxdur. Belə andı qəbul edib inanmalısan. **5.** Bilirsən ki, o doğurdan and içir. İnanmalısan.

***<u>Allahın Adından Çox And İçmək Olarmı?</u>*** – ***Həlif - And -*** təsdiq etməkdir. Öz dediyin sözlərin haqq olduğunu sübut etmək üçün əzəmətli və mühüm olan bir şeyi zikr etməklə olur. Nə üçün bu bab bu kitabda qeyd edilmişdir? Çünki, kim Allahın adı ilə tez-tez and içərsə onun qəlbində Allahın əzəməti aşağı olar və Allahı layiqli şəkildə ucaltmış olmaz. Bu da Tövhidin kamilliyinə ziddir. Çox and içmək deyildikdə məqsədyönlü şəkildə qəsd olunur. Dili vərdiş etdiyinə görə and içərsə bu çox and içmək deyildir; ***"Allah sizi bilmədən içdiyiniz andlara görə cəzalandırmaz, lakin*** *(bilə-bilə)* ***içdiyiniz andları*** *(pozmağa)* ***görə cəzalandırar. Belə bir andı pozmağın kəffarəsi ailənizə yedirtdiyiniz orta hesabından on yoxsulu yedirdib doyurmaq, yaxud geyindirmək, yaxud da bir kölə azad etməkdir. Bunları etməyə imkanı olmayan şəxs üç gün*** *(dalbadal)* ***oruc tutmalıdır. Bu içdiyiniz andların kəffarəsidir. Bununla belə andlarınızı qoruyun*** *(onları pozmaqdan çəkinin).* ***Allah ayələrini sizə belə izah edir ki, bəlkə şükr edəsiniz".*** *(əl-Maidə 89).* ***Andlarınızı Qoruyun -*** Andın əvvəli and içməkdir, ortası pozulmaqdır, sonu isə kəffarədir. Şeyx Useymin Σ deyir ki: "İnsanın öz andını qorumasının üç halı vardır: **1)** İnsan (filan işi etməyə) bilə-bilə and içir. **2)** Əgər yerinə yetirməsə kəffarə verməlidir. On kasıbı yedizdirib-içizdirmək və ya geyindirmək, qul azad etmək, üç gün oruc tutmaq. Əgər keçmişdə etdiyi bir əmələ görə and içsə ki: "Vallahi mən etməmişəm". Buna görə kəffarə yox, tövbə tələb edilir. Çünki, Allahın

---

[547] əl-Buxari, Muslim.
[548] ət-Təbərani "Mucəmul-Kəbir" 9/ 205, 8902, əl-Heysəmi "Məcməuz-Zəvaid" 4/ 180, əl-Albani "Silsilə Daif" 1/ 130.

adından yalandan and içməkdir. **3)** Andınızı qoruyun - kəffarələri verin. Elə bir hallar ola bilər ki, insan andını pozması vacibdir. Məs: And içir ki, Vallahi mən filan qardaşla danışmayacağam. Andı pozub xeyirli olana yönələrək kəffarə ödəməlidir. Çünki, Peyğəmbər ρ müsəlman bir kimsə ilə üç gündən artıq danışmamağı haram saymışdır. Əbu Əyyub əl-Ənsari ψ rəvayət edir ki, Peyğəmbər ρ dedi: "Heç bir kimsəyə üç gündən artıq qardaşı ilə küsülü qalması halal olmaz. Qarşı-qarşıya gəldikdə bu (ondan) üz çevirir, o da (bundan) üz çevirir. Onların ən xeyirlisi salamı birinci verib (sözə) başlayandır".[549]

***<u>Ehtiyac Olmadan And İçmək</u>*** **-** bəyənilmir. Lakin hərdən olar. Çünki, Peyğəmbər ρ ondan tələb edilmədiyi halda and içmişdir. Bu da bu əməlin nə qədər təhlükəli olduğuna diqqəti çəkmək üçün edilmişdir. Aişə O rəvayət edir ki, Mahzum oğullarından oğurluq etmiş bir qadının durumu Qureyşliləri xeyli üzmüşdü. Qureyşlilər: "Bu qadın haqqında Peyğəmbər ρ ilə kim danışa bilər? Peyğəmbərin ρ çox sevdiyi Usamə ibn Zeyddən ψ başqasının buna cəsarəti çatmaz"- deyə qərar verdilər. Usamə ψ bu halı Peyğəmbər ρ danışdıqda, o: "Allahın qoyduğu cəzalardan birinin qaldırılmasınımı istəyirsən?"- deyə buyurdu və qalxaraq bir xütbə verdi: "Sizdən əvvəlkiləri həlak edən bu idi: Özlərindən adlı-sanlı biri oğurluq edincə onu buraxardılar. Zəif və yoxsul kimsə oğurluq etdiyi zaman isə ona cəza verərdilər. Allaha and olsun ki, Muhəmmədin qızı Fatimə də oğurluq etsəydi onun belə əlini kəsərdim (Qəzəbdən onun rəngi dəyişmişdi. Usamə ψ deyir: "Ya Rəsulullah! Mənim üçün Allahdan bağışlanma dilə"- dedim. Sonra o, qadının əli kəsildi)". [550] Peyğəmbərdən ρ and içmək tələb edilmədiyi halda and içmişdir.

İmran ibn Hüseyn ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Mənim ümmətimin ən yaxşıları mənim əsrimdəkilər, sonra onların ardınca gələnlər, daha sonra yenə də onların ardınca gələnlərdir. (İmran ψ deyir ki: "Yadımda deyil ki, o özündən sonra iki yoxsa üç nəsil zikr etdi"). Onlardan sonra elə insanlar ortaya çıxacaq ki, istənilmədiyi halda şahidlik (yalandan) edən, xəyanət[551] etdikləri üçün onlara etibar edilməyəcək, vəd verəcək, ancaq yerinə yetirməyəcəklər. Onlar ancaq yoğunlaşıb piylənəcəklər".[552] İbn Məsud ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Mənim ümmətimin ən xeyirliləri mənim əsrimdəkilər, sonra onların ardınca gələnlər, daha sonra yenə də onların ardınca gələnlərdir. Bundan sonra elə insanlar gələcəklər ki, şahidlik etməmiş and içəcəklər və and içməmiş şahidlik edəcəklər".[553] ***"Əhd etdiyiniz zaman Allaha***

---

[549] əl-Buxari "Ədəbul Mufrad" 399. əl-Albani səhih olduğunu demişdir.

[550] əl-Buxari 6788, Muslim 1688.

[551] ***"Ey iman gətirənlər! Bilə-bilə Allaha, Onun Peyğəmbərinə və aranızdakı əmanətlərə xəyanət etməyin".*** *(əl-Ənfal 27).* ***"Yusif dedi: Bu ona görədir ki, vəzir*** *(evdə)* ***olmadıqda mənim ona xəyanət etmədiyimi və Allahın xainlərin hiylələrinə yol vermədiyini bilsin".*** *(Yusuf 52).* Useymin Σ deyir ki: "Xəyanət etmək haramdır. Lakin Hiylə döyüş zamanı icazə verilir". Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Müharibə yalandır (hiylədir)". əl-Buxari 3029.

[552] əl-Buxari 3650, Muslim 2535, Əbu Davud 4657, ət-Tirmizi 2221.

[553] əl-Buxari 2652, Muslim 2533.

***verdiyiniz əhdi yerinə yetirin. Allahı özünüzə zamin edib and içdikdən sonra onu pozmayın. Həiqətən Allah nə etdiyinizi bilir".*** *(ən-Nəhl 91).* ***"Ey iman gətirənlər! Əhdlərə sadiq olun".*** *(əl-Maidə 1).* ***"Əhdə vəfa edin. Çünki,*** *(insan)* ***əhd barəsində*** *(Qiyamət günü)* ***cavabdehdir".*** *(əl-İsra 34).*[554] Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Yalan yerə içilən and malın (satışını) artırsa belə, bərəkəti yox edər".[555] Yalandan öz malını satmaq üçün Allahın adından and içmək qadağandır. Malın satılmasına kömək etsə də bərəkəti yox edər və ya malı tələf olar. Belə bir kimsə Allahın adı ilə and içməsə satmaz və almaz. O, Allahı öz ticarətində mülk etmişdir. Allahın adı ilə and içməklə varlanır. Əgər bu andı yalandırsa bu daha qorxulu və təhlükəlidir.

***<u>Allahın Adından And İçmək</u>*** **-** üç qismə bölünür: **1.** Allah və Rəsulunun ρ xəbər verdiyi şeylərə and içmək. İstər təsdiq, istərsə də inkar formasında. Məs: Allaha and olsun ki, Allah Ona şərik qoşanı bağışlamayacaqdır, Allaha and olsun ki, Peyğəmbər ρ Qiyamət günü şəfaətçilik edəcəkdir və s. *"(Ya Peyğəmbərim!)* ***Səndən: "O*** *(bizi qorxutduğun əzab və ya Qiyamət günü)* ***doğrudurmu?"– deyə xəbər alacaqlar. Onlara belə cavab ver: "Rəbbimə and olsun ki, o doğrudur. Siz ondan canınızı qurtara bilməzsiniz!"*** *(Yunus 53).* ***"Ayələrimizi inkar edənlər: "Qiyamət bizə gəlməyəcəkdir"– dedilər.*** *(Ya Peyğəmbər! Sən onlara)* ***de ki: "Qeybi bilən Rəbbimə and olsun ki, Qiyamət sizə gələcəkdir…".*** *(əs-Səba 3).* **2.** Allaha ümüd bəsləyərək və Allah barəsində gözəl zənn edərək and içirsən. Əgər bu iki şərt gözlənilərsə, bu cür and da caizdir. Ümid – Gözəl Zənn. Rabiyə bint Nadr ψ Ənsarlardan bir qadının dişini vuraraq sındırır. Onlardan bunun əvəzi olaraq qisas tələb edirlər. Ənəs Rabiyə bint Nadrın ψ bibisi idi. Peyğəmbər ρ də qisas əmrini verdikdə Ənəs ψ: "Ya Rəsulullah! Sən Rabiyənin dişini sındıracaqsan! Vallahi, Allah buna imakan verməyəcəkdir"- deyə and içir. Peyğəmbər ρ: "Allahın Kitabında qisasdır"- deyə buyurdu. Lakin sonra Ənsarlar bu qisaslarından vaz keçərək bağışlayırlar və Peyğəmbər ρ deyir: "Allahın elə bəndələri vardır ki, bir iş üçün Allaha and içərlərsə Allah onların andını boşa çıxarmaz. Dilədiklərini yerinə yetirər". Allah barəsində zənni gözəldir. Muvahhid kimsə öz əməllərinin, sözlərinin ardınca baxar. Onları daima Quran və Sünnə ilə ölçər. Ehtiyat edər, qorxar. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Bir kimsə heç bir əhəmiyyət vermədən Allahın rizasına uyğun bir söz söyləyər və onun səbəbi ilə Allah da onun dərəcələrini yüksəldər. Yenə də bir kimsə heç bir əhəmiyyət vermədən Allahı qəzəbləndirəcək bir söz söyləyər və onun səbəbi ilə Cəhənnəmə yuvarlanar".[556] **3.**

---

[554] İbn Məsud, İbn Ömər və Ənəs M rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Əhdini pozan hər kəs üçün Qiyamət günü bir bayraq olacaqdır. Bu filankəsin vəfasızlığının bayrağıdır" əl-Buxari 3188, Muslim 1735. Əbu Səid əl-Xudri ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Qiyamət günü hər bir əhdini pozanın arxasında əhdini pozmasının miqdarına görə bir bayraq olacaqdır. Diqqət edin! Dövlət başçısının vəfasızlığından daha böyük bir vəfasızlıq yoxdur" Muslim 1738.

[555] əl-Buxari 2087, Muslim 1606.

[556] əl-Buxari, əl-Albani "Mişkətul Məsabih" 4813.

Allahın adından özündən razı olaraq and içir. Bu andda təkəbbürlük vardır. Özünü elə yerə qaldırır ki, Allahı borclu çıxardır. Bu Tövhidin kamilliyinə ziddir, hətta Tövhidin əslinə də zidd ola bilər. Belə and içən istəyir ki, Allah onun etdiyi, istədiyi kimi etsin. Özünü yüksəldir, digərlərini isə alçaldır. Allahın rəhmətinin qarşısını alan kimsədir, insanlara qarşı təkəbbürlüdür, özünü digərlərindən üstün tutandır və s. Tövhid əhlindən belə bir şey çıxmaz. O, elə zənn edirdi ki, ibadəti ilə elə bir səviyyəyə çatıb ki, Allahdan nə istəsə ona veriləcəkdir. Allah isə onu bu sözünə görə cəzalandırdı. Bu da qadağan olunan and içməkdir ki, Allah haqqında pis zəndə olmaqdır. Belə and içənin andını Allah puç edər. Cundəb ψ rəvayət edir ki, Allah Elçisi ρ demişdir: "Bir adam dedi: "Allaha and olsun ki, Allah filankəsi bağışlamayacaq!" Uca Allah belə buyurdu: "Mənim filankəsi bağışlamayacağıma and içən kimdir? Həqiqətən, Mən onu bağışladım və sənin əməlini də boşa çıxartdım!"[557]

# KİÇİK ŞİRK SAYILAN BƏZİ SÖZLƏR

***Allah Və Sən İstəyən Kimi Olsun* -** sənin sayəndə, göydə Allah və yerdə sən, Allah və sən istəyən kimi olsun, mənim Allahdan və səndən başqa heç kimim yoxdur, Allaha və sənə sığınıram, bu Allahdan və səndəndir, ümüdüm Allaha və sənədir, Allah, Muhəmməd, Ya Əli və s. bu qəbildən olan sözlər də sözdə şirkə aiddir. Bu sözün böyük və kiçik olması niyyətdən aslıdır. "***Və***"- bağlayıcısı müqayisədir, ***Və* -** bağlayıcısı əvvəl gələn ilə sonra gələnin dərəcəsini bildirir. ***Summə* -** "sonra" dərəcə fərqini bildirir. Əgər "***Və***" – bağlayıcısı ilə hər iksini də eyni tutarsa - böyük şirkdir. Yox eyni səviyyədə tutmazsa - kiçik şirkdir. Huzeyfə ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Allah və filankəs istəyərsə - deməyin. Lakin Allah istəyən, sonra filankəs istəyən olsun".[558] Quteylə ψ rəvayət edir ki, bir yəhudi Peyğəmbərin ρ yanına gələrək dedi: "Siz Allah və sən istəsən, Kəbəyə and olsun deməklə şirk etmiş olursunuz". Bundan sonra Peyğəmbər ρ onlara əmr etdi ki, and içdikdə belə desinlər: "Kəbənin Rəbbinə and olsun! Əgər Allah istəsə, sonra sən istəsən".[559] İbn Abbas ψ rəvayət edir ki, bir nəfər Peyğəmbər ρ dedi: "Əgər Allah və sən istəsən". Peyğəmbər ρ buyurdu: "Məni Allaha bərabər (tay) tutdun, əgər Allah istəsə (deyin)".[560] Məxluq Allahın istəyi ilə birisinin istəyini eyni yerə qoymaqla artıq kiçik şirk etmiş olur; ***"Aləmlərin Rəbbi Allah istəməyincə, siz istəyə bilməzsiniz!"*** *(ət-Təkvir 29).* Tufeyl ψ rəvayət edir ki, bir gün yuxuda gördüm ki, mən bir dəstə yəhudinin yanına gəlib onlara dedim: "Əgər siz

---

[557] Muslim 2621, 4753, 6847.

[558] Əbu Davud 4980, ən-Nəsai "Sunənul-Kubra" 10720, 10721, İbn Məcə 2117, Əhməd 5/ 384, əl-Albani "Səhih Silsilə" 137. Dildə "Və" bağlayıcısı, "Sonra" zərfinin işlədilməsinin yaratdığı fərq.

[559] ən-Nəsai 7/ 6, 4714, 10822, Əhməd 6/ 371, əl-Hakim 7815, əl-Albani "Səhihul-Cəmi" 6214, "Səhih" 1166.

[560] əl-Buxari "Ədəbul-Mufrad" 783, ən-Nəsai "Əməlul-Yəum vəl-Leyl" 988, Əhməd 1/ 214, 283, 347, İbn Məcə 2117, əl-Albani "Səhih" 139.

Üzeyr Allahın oğludur – deməsəydiniz mömin olardınız". Onlar: "Siz də əgər Allah və Muhəmməd istəməsə deməsəydiniz mömin olardınız"- dedilər. Sonra bir dəstə xristianın yanına gələrək onlara: "Əgər siz İsa Allahın oğludur deməsəydiniz mömin olardınız"- dedim. Onlar: "Siz də əgər Allah və Muhəmməd istəməsə deməsəydiniz mömin olardınız"- dedilər. Səhər yuxudan oyandıqda bu yuxunu bir neçə adama danışdım. Sonra Peyğəmbərin ρ yanına gələrək yuxumu ona da danışdım. O: "Bu haqda kiməsə danışmısan"- deyə buyurdu. Mən: "Bəli"- dedim. Peyğəmbər ρ Allaha həmd-səna etdi, Ona şükür etdi və buyurdu: "Mənə qulaq asın. Tufeyl bir yuxu görüb onu sizdən bəzilərinizə danışıb. Mən bəzi səbəblərə görə əvvəllər qadağan edə bilmədiyim ifadəni siz işlədirsiniz. Bundan sonra "əgər Allah və Muhəmməd istəsə deməyin", deyin ki, "əgər Allah istəsə".[561] Kitab Əhli İslamın düşməni olsada belə, haqq müsəlman üçün hər bir şeydən üstündür. Ona görə də Peyğəmbər ρ haqq olduğu üçün qəbul etdi. Peyğəmbər ρ müsəlmanlara səhflərini düzəltməyi əmr etdi. Belə bir kimsə Peyğəmbəri ρ Allah ilə ***Niddən*** – tay tutmağı heç ağlından da keçirmir. Lakin söz ilə söyləndiyi üçün artıq kiçik şirkdir. Ona görə də o kəslər ki, Allahın sifətlərini Peyğəmbərə ρ verərək artıq böyük şirk etmiş olurlar. Rububiyyət sifətlərini Peyğəmbərə ρ verirlər.

***Hadisələrin Baş Verməsini Allahla Əlaqələndirməmək*** - Məs: Qapıçı olmasaydı evimizə oğru girərdi, bu dərman olmasaydı həyatını itirərdi, təcrübəmiz olmasaydı işimiz alınmazdı, pulum olmasaydı batardım, bu təyyarəçi olmasaydı ölərdik, Jeep olmasaydı ölərdik, təcili yardım tez gəlsəydi ölməzdi, iynəni tez vursaydılar ölməzdi, filan ticarətçinin bacarığı olsaydı bu hala gəlməzdi, mən bunlara öz elmim sayəsində nail olmuşam, bütün bu nemətlərə mən özüm nail olmuşam, bu mənim haqqımdır, Allah bunu mənə verməli idi və s. bu qəbildən olan sözlər Tövhidə zidd olan sözlərdir. Allahı unudaraq neməti Allaha deyil səbəb ilə bağlamaqdır. əl-Həris əl-Əşari ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Allah Yəhyə ibn Zəkəriyyəyə υ beş kəlməni, bunlarla əməl etməsini və onlara əməl etmələrini Bəni İsrailə söyləməsini əmr etdi. Lakin Yəhyə bu sözü söyləməyi unutdu (gecikdi). İsa υ ona dedi: "Allah sənə beş kəlimə öyrədib onlarla əməl etməyini və Bəni İsrailə də onlarla əməl etmələrini əmr etməyini söylədi. Ya sən bunları onlara əmr edəcəksən, ya da mən bunu onlara söyləyəcəyəm". Yəhyə: "(Ey mənim qardaşım!) Onlara (məndən öncə) sən əmr etsən yerə batırılmağımdan və ya əzab edilməyimdən qorxuram – deyib xalqı Beytul-Məqdisə topladı. Məscid ağzına kimi doldu. (Allaha həmd etdikdən sonra) Allah mənə beş kəlimə öyrətdi və onlarla əməl etməyimi və sizə də əməl etməyinizi mənə əmr etdi. ***Birincisi*** – Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın. Allaha şərik qoşanın misalı: Bir nəfər öz malından (ən yaxşı malından) qızıl və ya gümüş müqabilində bir kölə alır və ona: "Bu mənim evim, bu da işim. Çalış

---

[561] İbn Məcə 2118, Əhməd 5/72, əd-Dərimi 2/295, əl-Albani "Səhih" 138.

(qazandığını) mənə ödə! Kölə çalışar, lakin qazancını ağasından başqasına ödəyir. Kölənin belə etməsinə kim razı olar?...".[562] Allah ruzi verir, şəfa verir, yedizdirir, içizdirir, geyindirir və s. təşəkkürü isə başqasına bildirirlər. Vallahi, belə edən kimsə zalımdır. Neməti əta edəni unudur. Görəsən onlara qarşı belə edilsəydi necə cavab verərdilər? Neməti Allahdan qeyrisinə nisbət etmək, Allahın qınadığı bir şeydir. Neməti səbəbə bağlamaq olmaz. Yəni Allah, sənə veriləcək xeyiri onlar vasitəsilə sənə yönəldir. O, xeyirin sənə verilməsinin qarşısını alan da Allahdır; ***"Başına gələn müsibətdən sonra dərgahımızdan ona bir mərhəmət əta etsək mütləq: "Bu elə mənim haqqımdır. Qiyamətin qopacağını güman etmirəm. Doğurdan da əgər Rəbbimin hüzuruna qaytarılıb gətrilsəm Onun dərgahında məni ən gözəl nemət*** *(Cənnət)* ***gözləyir"- deyər. Biz kafir olanlara nə etdiklərini mütləq*** *(bir-bir)* ***xəbər verəcək və sözsüz ki, onlara şiddətli bir əzab daddıracağıq***. *(Kafir, naşükür)* ***insana nemət bəxş etdiyimiz zaman*** *(imandan)* ***üz döndərər, haqdan uzaqlaşıb yan gəzər. Ona bir pislik üz verdikdə*** *(Rəbbinə)* ***uzun-uzadı dua edər*** *(yaxşı gündə Allahı unudar, dar gündə dərhal Ona yalvarar)"****.*** *(Fussilət 50-51).* ***"İnsana gəldikdə isə Rəbbin onu imtahana çəkib ehtiram etsə, ona bir nemət versə o: "Rəbbim mənə ehtiram göstərdi!"- deyər. Amma nə zaman Rəbbin onu imtahana çəkib ruzisini əskiltsə: "Rəbbim məni alçaltdı, mənə xor baxdı!"- deyər".*** *(əl-Fəcr 15-16).* ***"Bu mənə yalnız biliyimə görə verilmişdir!"- deyər. Xeyr, bu bir imtahandır. Lakin onların əksəriyyəti bilməz".*** *(əz-Zumər 49).* İbn Kəsir Σ deyir: "Allah bildirir ki, bədbəxtlik baş verdikdə insan Onun qarşısında alçalır, peşmançılıq keçirir və Ona müraciət edir. Sonra isə əgər Allah bu bəlanı insan üçün rəhmlə əvəz edərsə insan icazə veriləni aşaraq azğınlıq edir və deyir: "Bu mənə biliyimə görə verilmişdir. Allah buna layiq olanları bilir. Mən Allahın yaxşı bəndəsi olmasaydım mənə bunu verməzdi". Allah: ***"Xeyr, bu tamahdır…".*** Məsələ onun güman etdiyi kimi deyildir. Biz ona verdiyimiz nemətlərlə sınadıq. Tabe olacaq yoxsa asi olacaqdır. Ancaq biz bu haqda əvvəlcədən bilirdik". ***"Şübhəsiz ki, bu sözü onlardan əvvəlkilər də demişdilər. Lakin qazandıqları onlara heç bir fayda vermədi".*** *(əz-Zumər 50).* İbn Kəsir Σ deyir: "Onların sözləri düzgün deyildir və sərvətləri onlara fayda verməyəcəkdir və onlar uğur qazana bilməyəcəklər". ***"Həqiqətən Qarun Musa qövmündən idi. Onlara*** *(İsrail oğullarına)* ***qarşı*** *(zülm etməkdə, Musanın üzünə ağ olmaqda və özünü yuxarı tutmaqda)* ***həddini aşmışdır. Biz ona açarlarını bir dəstə güclü adamın zorla daşıya biləcəyi xəzinələr vermişdik. Qövmü ona belə dedi:*** *(Malına qürrələnib)* ***sevinmə. Şübhəsiz ki, Allah*** *(malına qürrələnib)* ***sevinənləri sevməz. Allahın sənə verdiyindən özünə axirət qazan*** *(malını Allah yolunda sərf et).* ***Dünyadakı nəsibini də unutma. Allah sənə yaxşılıq etdiyi kimi sən də yaxşılıq et. Yer üzündə fitnə-fəsad törətməyə cəhd göstərmə. Həqiqətən, Allah fitnə-fəsad törədənləri sevməz.*** *(Qarun)* ***dedi: "Bu mənə yalnız məndə olan elm sayəsində verilmişdir". Məgər Qarun Allahın***

---

[562] ət-Tirmizi 2863, 3102, Əhməd 16042, əl-Albani səhih demişdir.

***ondan əvvəl özündən daha qüvvətli və daha varlı olan neçə-neçə kəsləri məhv etdiyini bilmirdimi? Günahkarlar öz günahları barəsində sorğu-sual olunmazlar".*** *(əl-Qəsəs 76-78).* Bu iki sinif insana aiddir: **1)** İnsan etiraf etsə ki, ona ruzi Allahdan deyil öz zəhməti ilə qazanmışdır, onda olan elmə görə verilmişdir, bu artıq Rububiyyətdə olan şirkdir. **2)** Allahdan olduğunu etiraf edir, lakin "mən buna layiq olduğum üçün Allah mənə verib. Bu cür də olmalı idi, əksi düşünülməzdir". Bu da Tövhidə zidd olan sözlərdir. Həqiqi mömin Allahın bütün zahiri və batini nemətlərini etiraf edib, Allaha həmd etməlidir. Ona verilən hər bir nemət Allah tərəfindən ona olan rəhmətdir. Özünə güvənmə ki, hər şeyə sən özün nail olmusan. Tövhid qullardan zəlil olmağı əmr edir. Bil ki, Allah sənə heç bir şeylə borclu deyildir. Bütün bu nemətləri Allaha aid etməli, bu nemətlərə görə Allaha şükr etməli və onları Allahın razı qaldığı yerlərə sərf etməlisən. Bunları sən haqq etməmisən, bütün haqlar Allaha aiddir. İnsan hər tərəfdən yalnız Allahın quludur. İman və Tövhid yalnız bu yolla kamil olar. Bunun ziddi yalnız nankorluq, təkəbbürlük, özündən razılıq gətirər. Kim ki, bu nemətləri özünə nisbət edərsə, Tövhidində naqislik vardır. Artıq o kimsə iki şeyi özündə birləşdirmişdir: **1)** Allahı təzim etməyi tərk etmiş. **2)** Sahib olmadığı bir şeyi özünə aid etmişdir.

Qatadə Σ bu ayə barəsində deyir: "O, iddia edirdi ki, bütün qazandıqları onda olan elmə görədir. Kim iddia etsə ki, bunları öz bacarığı ilə qazanmışdır, onun halı Qarunun halı kimidir. Ona görə də hər bir müsəlmana nemət gəldikdə onu Allah tərəfindən olduğunu sansın". İmanlı bir kimsə belə sözlərdən uzaqdır. Səndə olan istək, əməl, sözlərin, niyyətin - hər bir şey Allahdandır. O qədər insanlar var ki, elmi, biliyi, savadı - hər bir şeyi var, lakin ruzi qazana bilmirlər. İnsana Allahın verdiyi nemətlərə görə ona şükr etməsi vacibdir; ***"Sizə gələn hər bir nemət Allahdandır".*** *(ən-Nəhl 53).* Sən öz elminlə, bacarığınla qazansan da belə, bil ki, Allah tərəfindəndir. İmam Bəğavi Σ deyir: "(Bu nemət) mənə Allahdan gəlmiş bir elm üzrə verilmişdir. Doğrusu bu mənim haqqımdır". Bilirəm ki, dünya həyatında bu mənə verildiyinə görə Allah qatında mənim yerim, şərəfim vardır. Mücahid Σ deyir: "Bu yaxşılığı əməlim sayəsində qazandım. Mən bu yaxşılığı haqq etdim". İbn Kəsir Σ deyir: "Allahın sizə bəxş etdiyi nemətlərlə qürrələnib insanlar arasında fəxr etməyin. Bu sizin əməyinizin nəticəsi olmayıb, Allahın qəza və qədəri ilə sizə bəxş edilən ruzisidir. Allahın nemətləri ilə təkəbbür və lovğalığ etməyin. Sevincinizi şükrə, kədərinizi isə səbrə çevirin".[563] ***"Onlar İslamı qəbul etdiklərinə görə sənə minnət qoyurlar. De ki: "Müsəlman olduğunuzla mənə minnət qoymayın! Xeyr, əgər*** *(iman gətirdiyinizi)* ***doğru deyirsinizsə,*** *(bilin ki)* ***sizi imana müvəffəq etməklə əslində Allah sizin boynunuza minnət qoymuş olar".*** *(əl-Hucurat 17).* ***"Onlar Allahın neməti haqqında bildikləri halda, sonradan onu inkar edirlər. Onların çoxu kafirdir".*** *(ən-Nəhl 83).* Mucahid Σ

[563] İbn Kəsir "Təfsir" 4/ 314.

deyir: "Bu ayədə ifadə edilən birinin: Mənə nə, bunu mən atalarımdan miras olaraq aldım!"- deməsidir. Onlar neməti Allaha deyil, valideynlərinə nisbət etdilər. Bu mənə valideyinlərimdən miras qalmışdır. Məs: "Bu ev sənə haradandır?"- deyə soruşularsa, o: "Valideyinlərimdən"- deyir. Xəbər formasında cavab verilir. Bu sözdə heç bir problem yoxdur. Lakin Mucahidin Σ qəsd etdiyi: "O kimsə bu sözü səbəblə bağlayır. Yəni valideyin ruzinin sənə verilməsi üçün bir səbəbdir, onu da Allah xəlq etmişdir. Sənin valideyinlərinə o ruzini verən Allahdır. Bu səbəbləri yaradanı, neməti verəni isə unudursan. Bu Allahın nemətinə qarşı küfrdür". ***"Sizə gələn hər bir nemət Allahdandır".*** *(ən-Nəhl 53).* Daha öncə deyildiyi kimi qulların üzərinə düşən, nemətlərin həm sözlə, həm də könüllə Allaha nisbət etmələridir. Tövhid də bu yolla kamil olar. Uca Allahın nemətlərini həm qəlbi, həm də dili ilə inkar edən kimsə kafirdir. Nemətləri söz və qəlb olaraq Allaha izafə etmək İmanın kamilliyindəndir. Avn ibn Abdullah Σ deyir: "Əgər filankəs olmasaydı belə olmazdı". İbn Quteybə Σ deyir: "Bunlar bizim ilahlarımızın şəfaəti sayəsində oldu". ***"...Siz də bunu bildiyiniz halda heç kəsi Allaha tay tutmayın".*** *(əl-Bəqərə 22).* İbn Abbas ψ bu ayədə keçən ***Əndad*** – kəliməsi haqqında deyir: "Bu şirk deməkdir. Qaranlıq bir gecədə qara bir daşın üzərində qarışqanın ayaq izindən daha gizlidir. Ey filan! Allaha, sənin və mənim həyatıma and olsun, bu it olmasaydı oğrular evə daxil olardılar, əgər ördək olmasaydı oğrular girərdi, sən və Allah istəsə, Allah və filankəs olmasaydı – kimi sözlər şirkdir".[564]

Şükür etməyin üç rüknü vardır: **1.** Həm sənə, həm də insanlara verilən nemətlərin Allah tərəfindən olduğunu qəlblə etiraf etmək. **2.** Bu nemətlərin Allahdan olduğunu dil ilə etiraf edib Allahı tərif etmək. **3.** Həmin neməti Allahın razı qaldığı yerə sərf etmək. Rəvayət edilir ki, Əbu Hureyra τ Peyğəmbərin ρ belə dediyini eşitmişdir: "(Vaxtı ilə) Allah İsrail oğullarından üç nəfəri – cüzam xəstəliyinə tutulmuş birisini, keçəli və kor adamı imtahana çəkmək istədi. Odur ki, onların yanına bir mələk göndərdi. Mələk (insan qiyafəsində əvvəlcə) cüzam xəstəliyinə tutulmuş kimsənin yanına gəlib dedi: "Sənin ən çox istədiyin şey nədir?" O dedi: "Gözəl rəng və gözəl dəri! İnsanlar artıq məndən diksinirlər". Mələk əlini onun vücuduna sürtdü və bu çirkinlik keçib getdi, onun rəngi və dərisi gözəlləşdi. Mələk soruşdu: "Sənin ən çox sevdiyin mal nədir?" O: "Dəvə ya da inəkdir[565]"– deyə cavab verdi. Ona on aylıq boğaz dəvə verildi və mələk dua edib dedi: "(Allah) bunu sənin üçün bərəkətli etsin!" Sonra mələk keçəlin yanına gəlib dedi: "Sənin ən çox istədiyin şey nədir?" O dedi: "Gözəl saçım (olsun) və bu (keçəllik) məndən getsin. İnsanlar artıq məndən diksinirlər". Mələk əlini onun başına çəkdi və onun keçəlliyi keçib getdi, ona gözəl saç

[564] Əbu Hatim.

[565] Hədisi nəql etmiş İshaq ibn Abdullah tərəddüd edərək cüzam xəstəliyinə tutulmuş kimsənin və keçəlin – ikisindən birinin dəvə, digərinin isə inək istədiyini iki cür rəvayət etmişdir.

bəxş edildi. Mələk soruşdu: "Sənin ən çox sevdiyin mal nədir?" O: "İnəkdir"– dedi. Ona boğaz inək verildi və mələk dua edib dedi: "(Allah) bunu sənin üçün bərəkətli etsin!" Bundan Sonra mələk korun yanına gəlib dedi: "Sənin ən çox istədiyin şey nədir?" O dedi: "Allah gözlərimi özümə qaytarsın və mən insanları görə bilim." Mələk əlini (onun gözlərinə sürtdü) və Allah onun gözlərini özünə qaytardı. Mələk soruşdu: "Sənin ən çox sevdiyin mal nədir?" O: "Qoyundur"– dedi. Ona balalı bir qoyun verildi (və mələk dua edib dedi: "Allah bunu sənin üçün bərəkətli etsin!)" Bundan sonra bu ikisinin[566] heyvanları bala verdi, üçüncüsünün də (qoyunu) balaladı. Bir müddət keçdikdən sonra birinin bir vadi dolusu dəvəsi, o birinin bir vadi dolusu mal-qarası, üçüncüsünün də bir vadi dolusu qoyunu oldu. Sonra mələk ilk dəfə gəldiyi görkəmdə və qiyafədə cüzam xəstəliyinə tutulmuş kimsənin yanına gəlib dedi: "Mən kasıb bir adamam. Səfərdə ikən mənim bütün vəsaitim tükənmişdir. Bu gün mən yalnız və yalnız Allahın köməyi ilə, sonra da sənin köməyinlə (istəyimə) nail ola bilərəm. Sənə gözəl rəng, gözəl dəri və (bu qədər) sərvət bəxş etmiş Allah rizasına mənə bir dəvə ver, onun sayəsində səfərimi başa çatdıra bilim". (Bu adam cavabında ona) dedi: "Düzü, (özümün) o qədər verəcəyim var ki!" (Mələk) ona dedi: "Gərək ki, mən səni tanıyıram. Məgər sən həm cüzam xəstəliyinə tutulmuş, həm insanların diksindiyi, həm də kasıb bir adam deyildinmi? Sonra da Allah sənə (istədiklərini) vermədimi?" Adam dedi: "(Bu var-dövlət) mənə ata-babalarımdan miras qalmışdır". Mələk dedi: "Əgər yalan danışırsansa, Allah səni əvvəlki halına qaytarsın!" Sonra mələk ilk dəfə gəldiyi görkəmdə və qiyafədə keçəlin yanına gəldi və ona da əvvəlkinə dediklərinin eynisini söylədi. Əvvəlki adam ona rədd etdiyi kimi keçəl də ona yox cavabı verdi. (Onda Mələk) dedi: "Əgər yalan danışırsansa, Allah səni əvvəlki halına qaytarsın!" Sonra mələk ilk dəfə gəldiyi görkəmdə və qiyafədə korun yanına gəlib dedi: "Mən kasıb adamam, yolda qalmışam. Səfərdə ikən mənim bütün vəsaitim tükənmişdir. Bu gün mən ancaq və ancaq Allahın köməyi ilə, sonra da sənin köməyinlə (istəyimə) nail ola bilərəm. Sənin gözlərini özünə qaytaran Allah rizasına mənə bir qoyun ver, onun sayəsində səfərimi başa çatdıra bilim". Adam dedi: "(Doğrudur,) mən kor idim, Allah gözlərimi mənə qaytardı, kasıb idim, O mənə var-dövlət nəsib etdi! Odur ki, nə qədər (qoyun) istəyirsənsə, götür. Vallahi ki, bu gün mən sənin Allah rizası üçün götürdüyün şeylərə hədd qoymayacağam". Mələk dedi: "Malını özünə saxla. Bu sizin üçün yalnız bir imtahan idi. Allah səndən razı qaldı, lakin o biri iki dostuna qəzəbi tutdu!"[567]

***<u>Allahın Nemətini Allahı Unudaraq Yağışla Bağlamaq, Küləklə Bağlamaq</u>*** **-** Allaha qarşı nankorluqdur. Çünki, bu küləyi əsdirən, yağışı yağdıran da Allahdır. Yağış səbəbilə o bərəkəti yer üzünə verən də Allahdır. Lakin nə qədər olur ki, yağışın

---

[566] Dəvə və inək verilmiş o iki kimsənin.
[567] əl-Buxari 3464, Muslim 2964.

yağması bərəkətdən çox ziyan gətirir. Peyğəmbər ρ buyurdu: "Quraqlıq yağışın yağmaması deyildir. Əsl quraqlıq yağış yağır, lakin yer heç nə bitirmir". Hər şeyi edən Allaha bel bağlamaq lazımdır. Bu neməti yaradan, bu səbəbləri yaradan Allahdır, insanlar isə Allahı unudaraq hansısa səbəblərə bağlanırlar. Səbəblərin Allahın Qəza və Qədərinə bağlı olduğunu bildirmək üçün ilk öncə Allah, sonra filan şey olmasaydı – deyilə bilər. Qul qəlbində, sözündə və əməlində Allaha şərik qoşmaqdan qaçmadığı müddətdə Tövhidi mükəlləşməz. Muvahhid olan bir kimsə bu başlığa daha çox diqqət yetirməlidir. Çünki, Allah bizi bir çox nemətlərlə nemətləndirmişdir. Biz də öz növbəsində bütün bu nemətləri onu verən Uca və Böyük Allah ilə bağlamalıyıq. Buna görə Ona həmd edib, təriflər deməliyik.

Allah kafirlərə də nemət vermişdir. Lakin bu, o demək deyil ki, bu nemətlərlə onları Cənnətlə müjdələyir: ***"Münafiqlərin nə malları, nə də oğul-uşağı səni təəccübləndirməsin. Allah onlarla ancaq münafiqlərə dünyada əzab vermək, kafir olduqları halda canlarını almaq istər".*** *(ət-Tövbə 55).* Peyğəmbər ρ buyurdu: "Həqiqətən də Allah mömin bir bəndəsi ilə ədalətsiz davranmır. Onun etdiyi hər bir yaxşı əmələ görə onu bu dünyada da, axirətdə də mükafatlandırır. Kafir isə Allah üçün etdiyi yaxşı əməllərinin mükafatını yalnız bu dünyada alır. Axirətdə isə onun heç bir savabı olmur".[568] Peyğəmbər ρ duasında buyurardı: "Allahım! Verdiyinə mane ola biləcək, vermədiyini də verə biləcək yoxdur".[569]

***Əgər – Sözü Barəsində Nə Gəlib?*** – Peyğəmbər ρ buyurdu: "Güclü mömin Allaha zəif mömindən daha çox sevimli və xeyirlidir. Lakin onların hər ikisində də xeyir vardır. Hər bir işdə özünə faydalı olanı etməyə səy göstər. Allahdan kömək dilə, (Allaha sığın) aciz olma. Başına bir müsibət gələrsə demə: "Əgər belə etsəydim belə belə olardı". De ki: "Allahın qəza və qədəri bu imiş. O, nə dilərsə onu da edər" de. Çünki Əgər sözü şeytanın əməlinə yol açır".[570] ***Əgər*** – sözü Allahın qədəri ilə razılaşmamaqdır. Bu da Tövhidin kamilliyinə Rububiyyət Tövhidinə ziddir. Hökmü nədir? **1. *Əgər*** – sözünü şəriətə etiraz şəkilində işlətsən haramdır. Hətta küfr həddinə çatır; *"(Müharibəyə getməyib Mədinədə evlərində)* ***oturan və*** *(müharibəyə getmiş)* ***qardaşları haqqında: "Əgər onlar sözümüzə qulaq assaydılar, öldürülməzdilər"-deyənlərə*** *(Ya Məhəmməd!)* ***söylə ki: "Əgər doğru deyirsinizsə, onda*** *(bacarıb)* ***ölümü özünüzdən uzaqlaşdırın".*** *(Ali-İmran 168).* **2. *Əgər*** – sözünü Qədərə etiraz olaraq söyləmək də haramdır; *"(Müharibəyə getməyib Mədinədə evlərində)* ***oturan və*** *(müharibəyə getmiş)* ***qardaşları haqqında: "Əgər onlar sözümüzə qulaq assaydılar, öldürülməzdilər" deyənlərə*** *(Ya Məhəmməd!)* ***söylə ki: "Əgər doğru deyirsinizsə, onda*** *(bacarıb)* ***ölümü özünüzdən uzaqlaşdırın".*** *(Ali-İmran 168).* **3. *Əgər*** – sözünü peşman

---

[568] Muxtəsər Səhih Muslim 60.
[569] əl-Buxari 1/255, Muslim 1/414.
[570] Muslim 2664, İbn Hibban 2896.

olmaq, heyfslənmək şəklində də işlətmək qadağandır. Peyğəmbər ρ buyurdu: "Güclü mömin Allaha zəif mömindən daha çox sevimli və xeyirlidir. Lakin onların hər ikisində də xeyir vardır. Hər bir işdə özünə faydalı olanı etməyə səy göstər. Allahdan kömək dilə, (Allaha sığın) aciz olma. Başına bir müsibət gələrsə demə: "Əgər belə etsəydim belə belə olardı". De ki: "Allahın qəza və qədəri bu imiş. O, nə dilərsə onu da edər" de. Çünki Əgər sözü şeytanın əməlinə yol açır".[571] **4. *Əgər*** – sözünü günah əməllərdə dəlil gətirmək qadağandır; ***"Müşriklər deyəcəklər: "Allah istəsəydi, nə biz, nə də atalarımız Ona şərik qoşar, nə də biz bir şeyi haram edə bilərdik". Onlardan əvvəlkilər də öz peyğəmbərlərini beləcə yalançı hesab etmişdilər. Axırda əzabımızı daddılar. De: "Bizə göstərə biləcəyiniz bir bilginizmi var? Siz ancaq zənnə qapılır və ancaq yalan danışırsınız".*** *(əl-Ənam 148).* **5. *Əgər*** – sözünü arzulamaq şəkilində demək. Bunun da hökmü arzu edən şəxsin arzuladığı şeydən aslıdır. Yaxşı şeyi arzu edirsə olar: Əgər mənim pulum olsaydı Allah yolunda belə edərdim, pis şeyi arzu edirsə qadağandır: Əgər pulum olsaydı belə içərdim. İbn Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "İki fəzilət sahibindən başqa heç kəsə həsəd (qibtə) caiz deyildir. Onlardan biri Allah tərəfindən bir kimsəyə Quran biliyi verilə və o da onu gecə və gündüz oxuyar. Digəri isə Allah tərəfindən bir kimsəyə mal-dövlət verilmişdir. O da onu gecə və gündüz (Allah yolunda) xərcləyər (Başqa rəvayətdə: Bu ümmətin məsəli dörd nəfərin misalına bənzəyir: Allah bir kimsəyə mal və elm vermişdir. O da elmi ilə malından Allah yolunda xərcləyər. Bir başqa adama da elm verildiyi təqdirdə, mal verilməmişdir. O da: "Əgər mənim də bu adam kimi malım olsaydı onun etdiyi əməlinin bənzərini mən də edərdim". Bu iki kimsə əcr baxımından eynidirlər. Digər bir sinif insana Allah var-dövlət verdiyi təqdirdə ağıl verməmişdir. O da malı haqqı olmayan haram yerlərə xərcləyir. Bir başqa adama da nə var-dövlət, nə də ağıl vermişdir. O da: "Əgər mənim də bu adam kimi malım olsaydı (haqqı olmayan haram yerlərə) xərcləyərdim". Bu iki kimsə günah baxımından eynidirlər[572])".[573] **6. *Əgər*** – sözünü xəbər vermək formasında işlətmək caizdir. Əgər dərsə gəlsəydim faydalanardım. Peyğəmbər ρ buyurdu: "Əgər qardaşım Musa υ səbr etsəydi, Allah aralarında baş verən hadisələri bizə danışardı".[574] Xeyiri təmənna etmək: "Əgər filankəs kimi malım olsaydı, onun kimi xeyir edərdim".[575]

Güclü mömin zəif mömindən İmanına və bu imandan doğan şeylərə görə üstündür. Əməl etməyə yönəl, gücdən düşmə, məyus olma, irəli get və təvəkkülü çoxalt. Nəticə isə Allahdandır. Xeyir varsa Allah sənə verəcək, xeyir yoxdursa Allah

---

[571] Muslim 2664, İbn Hibban 2896.
[572] İbn Məcə 4228, Əhməd 4/ 23.
[573] əl-Buxari 73, Muslim 815.
[574] əl-Buxari 3401, Muslim 2380.
[575] əl-Buxari 7232.

sənə verməyəcəkdir. Qəzəblənmə, peşman olma, "əgər" sözünü demə. İmanın möminlər arasında belə fərqli olması, imanın artıb azalmasına da dəlildir. İbn Qeyyim Σ deyir: "Şəriət bir kimsəyə başına gələn bəla (müsibətdən) sonra: "Əgər mən belə-belə etsəydim belə olardı"- deməyi qadağan edir. Şəriət bəyan edib ki, bu əməl şeytana qapı açır. Şeytana necə qapı açır? Onu kədərlənməyə, peşman olmağa, sıxıntı çəkməyə, qədərə qarşı narazılığa, razılaşmamağa sövq edir. Bütün bunlar onun Allaha olan razılığını azaldır. İnsan bilməlidir ki, yalnız Allahın istədiyi baş verir, istəmədiyi isə baş vermir".[576] İnsanın ötüb keçən şeylərə baxmamağı Tövhidin kamilliyindəndir. Vacib olan olanlara səbr edib, razı qalmaq və olan hadisədən xeyirə yönələrək ibrət almaqdır. Əgər ötüb keçən əməli günahdırsa buna görə oturub deməməlidir ki, "belə-belə etsəydim günah etməzdim". Əksinə günahına görə tövbə edib, Allahdan bağışlanma diləməlidir. Şeytan insanın qəlbinə girərək onun Rəbbi barəsində fikirlərini pisləşdirir. Əgər belə olarsa onun Tövhidi naqisləşər və "əgər" sözünü istifadə etmək əksər hallarda münafiqlərin, Allah barəsində pis düşünən insanların sifətlərindəndir.

***<u>Zəmanəni Söymək</u>* -** Xalqın iradəsi Allahın iradəsidir, Din Allahın vətən hamınındır, Zəmanə pis zəmanədir, vəfasız zəmanə və s. ***"Onlar dedilər: "Həyat ancaq bizim dünya həyatımızdır. Kimimiz ölür, kimimiz də doğulur. Bizi öldürən ancaq zamandır". Bu haqda onların heç bir biliyi yoxdur. Onlar ancaq zənnə qapılırlar".*** *(əl-Cəsiyə 24).* Ümumiyyətlə zəmanəni pisləmək üç şəkildə olur: **1.** Zəmanə barəsində onu pisləməyərək xəbər vermək. Bu gün hava istidir. Bu gün hava soyuqdur və s. Buna da dəlil: ***"Elçilərimiz*** *(mələklər)* ***Lutun yanına gəldikləri zaman*** *(tayfası bu gözəl qonaqlara bir pislik yetirər deyə)* ***əndişəyə düşdü, ürəyi sıxıldı və: "Bu çox çətin, başı bəlalı bir gündür"– dedi".*** *(Hud 77).* **2.** Etiqad edəsən ki, hər bir şeyi edən zəmanədir. Xeyir və şəri edən zəmanədir. Buna görə də zəmanəni söymək. Bu da böyük şirkdir. Çünki, sən etiqad edirsən ki, Allahdan başqa xeyir və şəri edə bilən xaliq vardır. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Zəmanəni söyməyin. Çünki, Allah zəmanənin özüdür".[577] **3.** Etiqad edir ki, xeyir və şər Allahdandır. Lakin hər hansı bir il, gün pis keçdikdə zəmanəni söyür. Bu isə haramdır. Həqiqətdə isə onun söyməsi Allaha qayıdır. Çünki, zəmanəni idarə edən Allahdır və bununla da Allahı söymüş olur. Əbu Hureyra ψ rəvayət edir ki, Allah Elçisi ρ demişdir: "Allah Y buyurur: "Adəm övladı dəhri söyməklə Mənə əziyyət verir. (Çünki) dəhr[578] Mənəm. Hər şey Mənim əlimdədir, gecəni gündüzə, gündüzü

---

[576] "İləmun Muvəkkiin".
[577] Muslim 2246, Əhməd 2/ 395, 491. ***Dəhr*** – zəmanə Allahın İsimlərindən deyildir.
[578] İbn Teymiyyə demişdir: "Dəhr zamandır. Hər kəs zamanı söyərkən, müsibəti onun başına gətirəni qəsd edir və beləliklə, bu söyüşü Allaha aid edir. Çünki, həqiqətdə bu müsibəti onun başına gətirən Allahdır. Deməli: "Dəhr Allahdır"- dedikdə, dəhrə aid etdiyi hər bir şeyin Allaha aidliyi qəsd edilir". Sarimul-Məslul 3/ 922.

də gecəyə çevirən Mənəm!”[579] ***“Onlar dedilər: "Həyat ancaq bizim dünya həyatımızdır. Kimimiz ölür, kimimiz də doğulur. Bizi öldürən ancaq zamandır". Bu haqda onların heç bir biliyi yoxdur. Onlar ancaq zənnə qapılırlar”.*** *(əl-Cəsiyə 24).* ***"Allahı və Onun Peyğəmbərini incidənlərə Allah dünyada və axirətdə lənət eləmiş və onlar üçün həqarətli bir əzab hazırlamışdır".*** *(əl-Əhzab 57).*

***Adları Allahdan Başqasının Qulluğuna Nisbət Etmək*** **-** Hüseynqulu, Pirverdi, Əliqulu, Abdul-Kəbə, Abduş-Şəms, Allah, Muhəmməd ya Əli, Hakimlər hakimi, Şahənşah, Məlikul-mulk (mülk sahibi), Qazilər qazisi, Hüccətullah, Ayətullah və s. kimi adlarla Allahdan başqasının qulluğuna nisbət etmək. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Allah qatında ən çirkin ad (ən çirkin adın sahibi) ***Məlikul-Əmlak*** adını daşıyan kimsədir". Sufyan ibn Uyeynə Σ deyir: "***Şahənşahdır***". (Başqa rəvayətdə: "Qiyamət günü Allah qatında ən mənfur, ən çirkin və Allahın ən çox qəzəb etdiyi Allahdan başqa heç bir həqiqi məlik yox ikən, ***Məlikul-Əmlak*** – Məliklərin məliki – adı ilə adlandırılmış kimsədir)".[580] ***Qazılar Qazısı*** – iki cür olur: **1.** Ya o kimsə özü-özünü belə sayır (adlandırır). **2.** Kimsə onu bu cür adlandırır, o da bundan razı olur. Belə bir kimsə özünü Allah ilə bir səviyyəyə qoymuşdur. Bunun İslamda hökmü Rububiyyətdə şirkdir. Mufti ilə Qazı arasında fərq nədir? ***Mufti*** – fətva verəndir. Lakin bu fətvanın həyata keçməsi üçün onun səlahiyyəti yoxdur. ***Qazı*** – üç şeyi özndə əhatə edir: **1)** Fətva verir. **2)** Allahın hökmü ilə hökm verir. 3) Bu hökmün, fətvanın həyata keçməsini əmr edir. Ona görə də yalnız Allah özü-özünü bu cür adla adlandıra bilər. Əmr və hökm vermək Allaha aiddir. Şeyx Useymin Σ deyir: “Ümumi olaraq demək olar: Misirin Qazılar qazısı və s. şirk və haram deyildir. Lakin qeyd edir ki, bundan da çəkinmək lazımdır. Çünki, insanın qəlbi zəifdir. Ola bilər ki, sən qəsdlə deməyəsən. Lakin bu sözlər deyilən kimsə üçün fitnə olsun. Təkəbbürlənə və özünü yuxarı tuta bilər”. ***Həmçinin*** **-** Hər kimə gəldi: Şeyxul-İslam, İmam adlandırmaq olmaz. Kiməsə bu cür ad verilibsə, onların İslam üçün daha çox dəyərləri, xeyirləri olduğu üçün deyilmişdir. Lakin bu ad sahiblərini şişirdərək “İslamın bütün məsələlərində onlara yönəlməliyik”- və s. deyilərsə bu qadağandır. Şeyx Useymin Σ deyir: “***Huccətul-İsləm, Huccətullah*** - demək olmaz. Çünki, insanlar üçün Hüccət Peyğəmbərlərdir”. ***Ayətullah -*** əgər qəsd nişanə, işarə mənasındadırsa olar. Çünki, hər bir şey Allahın nişanəsidir, ayəsidir. Yox əgər nə isə xüsusi bir şey ayə kimi qəsd olunarsa qadağandır”. ***Məlikul-Əmlak – Şahənşah*** – kim özünü bu cür titullarla adlandırarsa, artıq özünü yüksək bir məqama qaldırmışdır. İstər istəməz məliklər insanlar arasında yüksəkdirlər. Lakin bu kimsə özünü məliklərdən də daha bir yüksəklikdə tutmuşdur. Allah isə belə bir kimsəni əməlinin əksi olaraq alçaltmışdır. Bu sözlərə oxşaq sözlərin hər biri qadağandır. ***İstisnadır -*** bu mövzuda

---

[579] əl-Buxari 4826, 6937, 7053, 7491.

[580] əl-Buxari 6205, Muslim 2143, Əbu Davud 4961, ət-Tirmizi 2837, İbn Hibban 5835.

Abdulmuttalib adı. Lakin bu adın qadağan olmasında icma yoxdur. Peyğəmbər ρ Huneyn döyüşündə deyir: “Mən Peyğəmbərəm, bu yalan deyil, mən Abdulmuttalibin nəvəsiyəm”. Bu o demək deyil ki, icazəlidir, əksinə qadağandır. Peyğəmbər ρ bu sözləri xəbər olaraq deyir, Peyğəmbər ρ bu sözləri deməklə onların icazəli olduğunu söyləmir. Kimisə Allahdan qeyrisinə qul etmək şirkdir və qadağandır. Lakin küfr, şirk haqqında xəbər vermək küfr deyildir. Həmçinin, digər hədisdə deyir: “Ey Abdulmənaf oğulları!”

Hani ibn Zeyd ψ rəvayət edir ki, Peyğəmbərin ρ yanına bir qrup heyət gəldi. Aralarından birinə: "Əbul-Həkəm deyildiyində Peyğəmbər ρ o kimsəyə: "Həkəm Allahdır. Nə üçün sənə Əbul-Həkəm deyirlər?"- deyə buyurdu. Adam dedi: "Qövmüm hər hansı bir məsələdə ixtilaf etdiklərində mənim yanıma gəlirlər, mən də hakimlik edərək aralarında hökm verirəm. Beləcə hər iki tərəf də verdiyim hökmə razı qalırlar". Peyğəmbər ρ: "Övladların varmı"- deyə buyurdu. Adam: "Bəli, Şurayh, Abdullah və Muslim Bəni Hani"- dedi. Peyğəmbər ρ: "Ən böyüyü hansıdır?"- deyə buyurdu. Adam: "Şureyh"- dedi. Peyğəmbər ρ: "Artıq sən Əbu Şureyhsən"- deyə buyurdu”.[581] Əbul-Həkəm bu hədisdə olduğu kimi səhabənin adı idi. Peyğəmbərin ρ onun adını dəyişməsində iki səbəb vardır: **1)** əl-Həkəm - Allahdır. **2)** Bu sadəcə onun adı deyildir. Onun sifəti idi. O, hökm verən idi. Allahın İsimlərinə isə hörmətlə yanaşmaq lazımdır. Sadəcə ad kimi Həkəm qoymaq olar. Çünki bu adı daşıyan səhabələr olub. Lakin o, bu adla bərabər hökm verən sifətini də almışdır. Peyğəmbər ρ şər olan adları xeyirli adlarla dəyişərdi. ***Həmçinin*** – uşağın olması Allahn valideyinlərə bəxş etdiyi nemətidir. İnsan buna görə Allaha şükr etməli və övladına Allahın razı olduğu bir ad verməlidir. İnsanın övladına gözəl ad verməsi də bu şükrə aiddi. Əgər övladına Pirverdi, Əliqulu, Hüseynqulu və s. adlar verərsə, bu Allahın nemətinə qarşı nankorluqdur. Əgər etiqad etsə ki, filankəsin quludur, filan Pir verdi, artıq şikr etmişdir. Belə bir kimsə dərhal Tövbəyə tələsməli və adı dəyişməlidir.

***Allah onlara sağlam övlad verdikdə isə özlərinə verdiyi şeydə Ona şərik qoşmağa başladılar*** – ***“Sizi tək bir candan xəlq edən, ünsiyyət bağlayıb rahatlıq tapsın deyə ondan onun zövcəsini yaradan Odur. Adəm övladı zövcəsini ağuşuna aldıqda o, yüngül bir yüklə yükləndi*** *(hamilə oldu)* ***və bir müddət onu bətnində gəzdirdi. Zövcəsi ağırlaşdığı zaman hər ikisi özlərinin Rəbbi olan Allaha: "Əgər bizə sağlam bir övlad versən, əlbəttə, şükür edənlərdən olarıq"– deyə dua etdilər. Allah onlara sağlam övlad verdikdə isə özlərinə verdiyi şeydə Ona şərik qoşmağa başladılar. Allah isə onların qoşduqları şəriklərdən ucadır”.*** *(əl-Əraf 189-190).* Bəzi izahlara görə ayədə Adəm υ, bəzi izahlara görə isə insan nəzərdə tutulur. Onlar söz verdilər ki, sağlam övladları olsa Allaha şükr edənlərdən olacaqlar. Lakin Allah onlara övlad verdikdə onlar şükr

[581] əl-Buxari “Ədəbul Mufrad” 811, ən-Nəsai 8/226, 5940, Əbu Davud 4955, əl-Hakim 62, İbn Hibban 504, əl-Albani “Səhihul-Cəmi” 1745.

edən yox, Allaha şərik qoşan oldular. Ayə üç cür izah olunur: **1.** ***Sizi tək bir candan xəlq edən*** – Yəni bir cinsdən. Bu cür izah edənlər deyirlər ki, bu qəbildən olan ayələr Qurani-Kərimdə çoxdur; ***"Allah möminlərə, öz aralarından onlara Allahın ayələrini oxuyan, onları günahlardan təmizləyən, onlara Kitabı və Hikməti*** *(Sünnəni)* ***öyrədən bir Elçi göndərməklə mərhəmət göstərmişdir…".*** *(Ali İmran 164).* Bu ayədə onların özlərindən deyildikdə, Ərəblərdən qəsd olunur; ***Sizi tək bir candan xəlq edən*** – deyildikdə bir cinsdən nəzərdə tutulur. Bu ayədə Adəm və Həvva qəsd olunmur. **2.** ***Sizi tək bir candan xəlq edən*** – deyildikdə Adəm qəsd olunur. Onlar deyillər ki, Adəm və Həvva ibadətdə deyil, itaətdə Allaha şərik qoşdular. **3.** ***Sizi tək bir candan xəlq edən*** – Yəni əsli Adəm və Həvvadan olan insan öz zövcəsi ilə yaxınlıq etdikdən sonra Allaha nəzir edirlər ki, övladları sağlam olsa Allaha şükür edənlərdən olacaqlar.[582] Lakin övladları olduqda Allaha şükür etmir, şərik qoşurlar. Bu cür izaha görə Adəm deyil, zuriyyəti qəsd olunur. Bu qəbildən ayələr: ***"Biz həqiqətən insanı*** *(Adəmi)* ***tər-təmiz palçıqdan yaratdıq. Sonra onu nütfə halında möhkəm bir yerdə yerləşdirdik…".*** *(əl-Muminun 12).* Bu ayənin təfsirində İbn Kəsir Σ Həsənul-Bəsridən Σ bir neçə rəvayət gətirir. Lakin heç birində Adəm və Həvva deyilmir. İbn Abbas ψ bu ayəni şərh edərkən deyir: "Adəm (Həvvaya) yiyələndikdə o, ondan hamilə oldu. İblis onların yanına gəlib dedi: "Mən sizi Cənnətdən çıxaran ağanızam. Mənə itaət edin, yoxsa mən sizin uşağınızı buynuzlu edərəm, o, səni yarıb çıxar". O, uşağı Abdul-Həris (İblisin qulu) adlandırmalarını tələb edərək onları qorxutdu. Lakin onlar İblisə itaət etməyə imtina etdilər və uşaq ölü doğuldu. Sonra o, ikinci dəfə hamilə oldu və İblis yenə onların yanına gələrək sözlərini təkrar etdi. Onlar bu dəfə də ona itaət etmədilər. Uşaq yenə də ölü doğuldu. O, üçüncü dəfə də hamilə oldu. İblis yenə də onların yanına gələrək onları qorxutdu. Bu dəfə övlad məhəbbəti onları ələ aldı və onlar uşağın adını Abdul-Həris qoydular". Mücahid Σ deyir: "Onlar qorxurdular ki, uşaq insan olmaz".[583] Bəzi alimlər qeyd edirlər ki, bu qissə batildir. İbn Kəsir Σ deyir: "İsrailiyyətdir". Şeyx Useymin Σ deyir: "Bu qissə bir neçə tərəfdən batildir. Çünki, Peyğəmbərdən ρ səhih olaraq gəlməmişdir. Çünki, belə rəvayətlər Peyğəmbərlərdən gəlmir". İbn Həzm Σ deyir: "Xurafatdır". Əgər bu səhih olsaydı belə çıxır ki, onlar ya bu şirk üzrə ölüblər, ya da tövbə ediblər. Desək ki, şirk üzrə ölüblər bu böyük böhtandır. Kim deyə bilər ki, Peyğəmbər ρ şirk üzrə ölüb. Desək ki: Tövbə edib bu haqda heç bir məlumat verilməyib. Ola bilməz ki, Allah bizə oların xətasını xəbər versin, lakin tövbə etmələri barədə xəbər verməsin. Peyğəmbərin xətasından söhbət gedirsə, mütləq Allah onların tövbəsindən də xəbər verir. Lakin bu rəvayətdə tövbəsi qeyd olumur. Nə üçün bu rəvayət zəifdir? Çünki, məşhur şəfaət hədisində bütün insanlar Peyğəmbərlərin yanına gəldikləri zaman onlar günahlarını zikr edirlər.

---

[582] Bu ayəyə əsasən bəzi alimlər bu cür nəzir deməyi haram görürlər.

[583] Əbu Hatim 5/ 1634, İbn Cərir 9/ 99, Şovkani "Fəthul-Qadir"2/ 279 - Zəif hədis.

Adəm: "Mən qadağan olunmuş ağacdan yemişəm"- deyir. Bu isə günah olan əməldir. Əgər o, səhih rəvayət olsaydı Adəm şirkini zikr edərdi, günahı yox. Alimlər ittifaq ediblər ki, Peyğəmbərlər şirkdən uzaqdırlar. Şeytan onların yanına gələrək: "Mən sizi Cənnətdən çıxaranam. Mənə itaət edin". Bu şeytanın mənhəci (yolu) deyildir. Şeytan bir kəsi azdırmaq istədikdə belə etməz. Onlar bilərdilər ki, bu onların düşmənidir və itaət etməzdilər. Şeytan belə şeyə qadir deyildir ki, kimisə buynuzlu etsin. Allahdan başqa buna heç kəs qadir deyil. Burada söhbət Adəm və Həvvadan deyil, onun zürriyyətindən gedir. Bu daha doğru təfsirdi. Çünki, Peyğəmbərlər şərik qoşmazlar, bundan uzaqdırlar".

***Mənim Qulum Demək Olarmı?*** – Əbu Hureyra ψ rəvayət edir ki, Rəsulullah ρ buyurur: "Sizdən heç kim öz (qulluqçusuna): "Rəbbini yedizdir", "Rəbbinə dəstəmaz aldır" və s. deməsin. Lakin: "Seyyidim (ağam), Mövlam"- desin. Sizdən heç kim "mənim qulum, kənizim"- deyə xitab etməsin. Lalkin: "Ey cavan, oğlum, qızım"- desin".[584] Bu babın Tövhid ilə əlaqəsi nədir? Biz artıq bu cür kəlimələr haqqında oxuduq və öyrəndik. Bu cür kəlimələr insana Allah ilə bərabər Rəblikdə şərikliyə aparır. Ona görə də Peyğəmbər ρ şirkə aparan kiçik yoları belə bağlayardı. Çünki, hamı bilir ki, Rəbb deyildikdə Allah qəsd olunur. Göylərdə və yerlərdə olan hər bir şey Qiyamət günü Onun qarşısına qul olaraq gələcəkdir. Müsəlman Allahın Rəbliyinə zidd olan sözlərin işlədilməsində ehtiyatlı olmalıdır. Bəzi alimlərə görə haramdır. Əgər özünü əzəmətləşdirsə və qarşısındakını alçatsa haramdır. Bəzilərinə görə isə məkruhdur. Hətta qəlbindən bu fikirlər keçirməsə də belə qadağandır. Allaha qarşı ədəbsizlikdir. Bütün bəşər Allahın qulu olmasına daha layiqdir. Artıq Rububiyyət Tövhidində naqislikdir. Bu cür deməyin hökmü iki qismə bölünür: **1. *Qul -*** sözünü özünə deyil, başqasına izafə edərək demək olar. Filankəsin qulu, onun qulu və s. *"(Ey möminlər!)* ***Aranızda olan subay kişiləri və ərsiz qadınları, əməlisaleh kölə və cariyələrinizi evləndirin…".*** *(ən-Nur 32).* **2. *Qul*** – sözünü özünə mənsub edərək demək. Bu da iki formadadır: **1) *Qul*** – sözünü xəbər formasında demək caizdir: Məs: Bu kimdir? Cavab olaraq: Mənim qlumdur. **2) *Qul -*** sözünü nida (əmr) formasında demək isə qadağandır: "Ey qulum! Bura gəl" və s. Alimlər bu cür deməyin məkruh yoxsa haram olmasında ixtilaf ediblər. Şeyx Useymin Σ deyir: "Ən azından məkruhdur". Peyğəmbər ρ buyurdu: "Müsəlmanın miniyində və qulunda sədəqə (zəkat) yoxdur". Peyğəmbər ρ ***Qul*** – sözünü üçüncü şəxs əvəzliyinə mənsub edərək işlətdi.

***Mənim Rəbbim Demək Olarmı?*** – Bu cür deməyin də dörd hökmü vardır: **1. *Sən - Siz -*** ikinci şəxs əvəzliyinə qoşularsa qadağandır. Rəbbini yedizdir, Rəbbini içizdir və s. hədisdə bu şəkildə gəlmişdir. **2. *Mən - Biz*** – birinci şəxs əvəzliyinə qoşularaq demək olar: Mənim Rəbbim və s. *"**Axı o,** (sənin ərin) **mənim ağamdır**". (Yusuf 23).* **3. *O***

[584] əl-Buxari 2552, Muslim 2249, Əbu Davud 4975, ən-Nəsai 10070.

***- Onlar*** – üçüncü şəxs əvəzliyinə qoşularaq deyilərsə olar: Rəsulullahdan ρ Qiyamətin əlamətləri haqqında soruşan məşhur Cəbrailin υ hədisində belə buyurdu: "Qul qadının öz ağasını (Rəbbini) doğması…".[585] **4.** ***Rəbb -*** sözünü hansısa sözə izafə edərək demək olar. Əgər izafə edilən kəlimə insan və ya canlı deyilsə burada heç bir problem yoxdur. Məs: Evin rəbbi, mülkün rəbbi və s. Bu sözlərdə ibadət olunan bir şey yoxdur. Rəbb sözündən sonra canlı bir şey işlədmək qadağandır. Məs: Uşağın Rəbbi, Qulun Rəbbi və s. ***"Yusuf onlardan qurtulacağını yəqin etdiyi kimsəyə dedi: "Ağanın yanında məni yada sal!" Lakin şeytan ona Yusufu ağasının yadına salmağı unutdurdu və o, zindanda bir neçə il də qaldı".*** *(Yusuf 42).*

***Mövla Demək Olarmı?*** - əl-Mövla dedikdə Allaha aiddir. İnsanlığa gəldikdə isə iki qismdir: **1)** Ümumi - kafir, mömin, fasiq, müsəlman və s. **2)** Xüsusi - yalnız möminlər üçün; ***"Bu ona görədir ki, Allah möminlərin Himayəçisidir. Kafirlərin isə heç bir himayəçisi yoxdur".*** *(Muhəmməd 11).* Peyğəmbərin ρ Sünnəsində daha çox rast gəlinir: Mövla Zeyd, Mövla Nəbi və s.

***Seyyid Demək Olarmı?*** – ***Seyyid*** – padşah, hökmdar, ağa, itaət olunan şəxs deməkdir. ***əs-Seyyid*** – dedikdə, artıq Allah qəsd olunur. Çünki əs-Seyyid Allahın isimlərindəndir. Abdullah ibn Şixxir ψ rəvayət edir ki, bir gün Bəni Amr qəbiləsinin nümayəndələrinin tərkibində Peyğəmbərin ρ yanına gəlmişdim. Biz ona: "Ey bizim ağamız! (Seyyidimiz)"- deyə müraciyət etdik. O: "Ağa (seyyid) Allahdır"- deyə buyurdu. Onda biz dedik? "Ey bizim fəzilətlimiz və əfzəlimiz"- dedik. O: "Öz sözlərinizi deyin, sözlərinizə diqqət edin ki, şeytan sizi aldatmasın".[586] Ənəs ψ rəvayət

---

[585] əl-Buxari, Muslim.

[586] Əbu Davud 4806, Əhməd 4/ 25. ***Tərif Etmək Olarmı? -*** Peyğəmbər ρ tərif etdikdə həddi aşmağı və tərif olunan üçün bir fitnə olmasından qorxulduğu üçün tərif etməyi qadağan edərdi. Bu haqda bir çox dəlillər vardır: Əbu Bəkrə ψ rəvayət edir ki, Peyğəmbərin ρ hüzurunda bir kimsə digər bir kimsəni tərif etdi (Başqa rəvayətdə: "Ya Rəsulullah! Filan və filan xüsuslarda Allah və Rəsulundan sonra, o kimsədən daha fəzilətli heç kimsə yoxdur). Peyğəmbər ρ: "Vay sənə! Sən (belə tərif) etməklə qardaşının boynunu vurdun. Vay sənin halına! Sən qardaşının boynunu vurdun"- deyə buyurdu. Muslim 3000. Əbu Musa ψ rəvayət edir ki, Peyğəmbər ρ bir kimsə digər bir kimsəni tərif edərək həddini aşdığını gördükdə buyurdu: "And olsun ki, siz o kimsəni (məğrur edib) həlak etdiniz və ya o kimsənin belini qırdınız". Muslim 3001. Bir kimsə Osmanı ψ tərif etməyə başladı (Başqa rəvayətdə: Bir kimsə əmrlərdən birini tərif etməyə başladı). Bu vaxt Miqdad ψ o an iki dizi üzərinə çökdü. İri bir adam olmasına baxmayaraq yerdən çınqılları ovuclayaraq tərif edənin üzünə atmağa başladı. Osman Miqdada N: "Sənin bu halın nədir?"- dedi. Miqdad ψ dedi: "Peyğəmbər ρ: "Tərif edən kimsələri gördüyünüz zaman onların üzlərinə torpaq atın"- deyə buyurmuşdu. Muslim 3002. Peyğəmbər ρ tərifi töhmətləyərdi, çünki o insanı öz şəxsi gözündə ucaldır və təkəbbürlüyə səbəbdir. Bu isə Tövhidin kamilliyinə ziddir. Buna görə də ən çətin sınaqlar zamanı belə Allah Rəsulu ρ aləmlərin Rəbbi qarşısında alçalardı. Bu Allaha itaətə, Onun qarşısında qorxmağa və təvəzökarlığa aparır. Allah qarşısında alçalmağa can atmayan hər kəs Onun hüququna əl uzadır. Çünkü, Mutəkəbbir yalnız Allahdır. Əbu Səid əl-Xudri və Əbu Hureyra N rəvayət edir ki, Peyğəmbər ρ dedi: "(Allah Y buyurdu): "İzzət və təkəbbürlük Mənim libaslarımdır. Kim bunlardan birinə şərik olmaq istəsə, ona əzab verərəm". əl-Buxari "Ədəbul-Mufrad" 552; Əbu Davud 4090, 3567; Muslim 2620, 6846. əl-Albani səhih hesab etmişdir. Peyğəmbər ρ buyurdu: "Qəlbində zərrə qədər təkəbbürlük olan kimsə Cənnətə girməz…Təkəbbürlük haqqı danmaq və insanlara xor baxmaqdır". Muslim 91. Peyğəmbər ρ buyurdu: "Kim təkəbbürlü olaraq yeriyərsə və təkəbbürlü olaraq danışarsa Cənnətə girməz". Əbu Davud. Peyğəmbər ρ buyurdu: "Qəlbində xardal dənəsi qədər iman mövcud olan kimsə Cəhənnəmə girməz. Qəlbində xardal dənəsi qədər ululuq və əzəmət olan kimsə də Cənnətə girməz". Muslim 91. Peyğəmbər ρ buyurdu: "Cənnət və Cəhənnəm aralarında

edir ki, bəzi kimsələr: "Ey Allahın Rəsulu! Ey bizim xeyirlimiz və ən xeyirlimizin oğlu, bizim ağamız (seyyidimiz) və ağamızın oğlu!"- deyə müraciət etdikdə Peyğəmbər ρ buyurdu: "Məni özünüz bildiyiniz kimi çağırın, şeytan sizi aldadıb yoldan çıxarmasın. Mən Allahın qulu və elçisi Muhəmmədəm. Sevirəm ki, siz məni Allahın layiq bildiyindən yuxarı qaldırmayasınız".[587] Yəni öz sözlərinizdə diqqətli olun. Bu tərzdə kimisə tərif etmək sonda Ğuluva gətirib çıxarar ki, şeytanın tələsinə düşərsiniz. Ona görə də Peyğəmbər ρ onların bu sözlərinin qarşısın dərhal aldı. Şeytan sizi bu sözlərlə aldadaraq doğru yoldan azdırmasın. Peyğəmbərin ρ bu sözləri deməkdə məqsədi bir idi: Tövhidi qorumaq, şirkin yollarını isə bağlamaqdır. Peyğəmbər ρ Allaha qarşı edilən kiçik belə əbəbsizliyin qarşısını alırdı. Mütləq seyyidlik, idarəçilik, ağalıq Allaha aiddir. ***Əl*** – müəyyənlik artikli ilə olarsa bu zaman Allah qəsd edilir.

Bəzi kimsələr bu hədisi oxuduqları zaman elə zənn edirlər ki, Peyğəmbər ρ ***Seyyid*** kəliməsini deməyi belə qadağan edib. İnsanlara qarşı Seyyid (ağa) kəliməsi üç cür işlədilir. **1)** Kiminsə qulu varsa ağası onun üçün seyyiddir. **2)** Əgər hansısa bir qəbilə başçısı, böyük bir kimsədirsə olar. Rəsulullah ρ isə Qiyamət günü bütün insanların seyyidi olacaqdır. Rəsulullah ρ buyurdu: "Qiyamət günü insanların seyyidi mənəm, qəbri açılacaq ilk kişi mənəm. İlk şəfaət edən və şəfaəti qəbul olunacaq ilk kişi də mən olacağam".[588] Peyğəmbər ρ Sad ibn Muaz ψ gəldikdə buyurdu: "Seyyidiniz üçün ayağa qalxın".[589] **3)** Ərə Seyyid deyilir. Çünki, ağalıq kişilərə aiddir, qadınlara seyyid demək olmaz; ***"Axı o,*** *(sənin ərin)* ***mənim ağamdır".*** *(Yusuf 23).* ***Həmçinin -*** kiməsə Seyyid dedikdə baxmaq lazımdır ki, o kimsə buna layiqdir ya yox. Layiq deyilsə fasiq, münafiq biridirsə demək olmaz. Bureydə ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Münafiqə (seyyid) ağa – deyə müraciət etməyin. Əgər o, ağa olsa onda siz

---

münaqişə etdilər. Cəhənnəm: "Mənə Cəbbarlar və Mutəkəbbirlər girər" dedi. Cənnət: "Mənə zaiflər və miskinlər girər" dedi. Muslim 2846.

***Tərif Etmək Nə Zaman Olar?*** – İmam Nəvəvi Σ deyir: "Bu hədislərin hər biri tərif etməyin qadağan olmasını bildirir. Lakin tərif etməyi mubah edən hədislər də vardır ki, alimlər bir-birinə zid görsənən bu hədisləri bu cür açıqlamışlar. Əgər tərif olunan kimsə tərifdən sonra onda öyünmək, qürurlanmaq, təkəbbürlük hissləri yaranmazsa, nəfsinin əsiri olmazsa belə bir kimsəni tərif etmək nə haramdır, nə də məkruh. Lakin bu söylənilənlər onun haqqında ehtimal olunursa, belə bir kimsəyə qarşı üzünə tərif etmək məkruhdur. Tərif etməyin mubah olduğunu göstərən hədislər. Peyğəmbər ρ Əbu Bəkrə ψ Cənnətin bütün qapılarından çağırılacaq olanları qəsd edərək: "Sənin də onlardan olmağını umuram"- deyə buyurmuşdu.[586] Həmçinin: "Sən geyimini təkəbbürlük edərək yerlə sürükləyənlərdən deyilsən".[586] Peyğəmbər ρ Ömərə ψ: "Şeytan sənin bir yolla getdiyini görərsə, heç şübhəsiz ki, yolunu dəyişərək başqa bir yola keçər"- deyə buyurmuşdu.[586] Peyğəmbər ρ tərif etməyi bizə öyrədərək buyurdu: "Mən filankəsi (yaxşı adam) hesab edirəm. Onu hesaba çəkən isə Allah olacaq. Mən heç kəsi Allah yanında təmizə çıxartmıram. Əgər (Həmin şəxsin həqiqətən də) o, cür olduğunu bilirsə, mən onun bu cür və bu cür olduğunu hesab edirəm"- desin. Muslim 2296. Təriflənən şəxs isə deməlidir: "Allahım! Onların söylədiklərinə görə məni qınama, bilmədikləri şeyləri (onlardan gizli qalan günahlarımı) mənə bağışla (və məni onların zənn etdiklərindən də daha xeyirli et)". əl-Buxari "Ədəbul Mufrad" 761.

[587] ən-Nəsai 10078, İbn Hibban 6240, Əhməd 3/ 153, 241.

[588] əl-Buxari, Muslim.

[589] Muslim 1768.

Allahı qəzəbləndirmiş olarsınız".[590] Qadağa iki cürdür. Haram - Məkruh. Burada olan qadağa haram yox, məkruhdur. Şirkə, günaha aparmasın deyə qarşısı alınır. Peyğəmbər ρ onlara necə deməklərini də öyrətdi. Çünki, Allah Rəsulunu ρ ən uca məqamlarda qul olaraq adlandırmışdır. Rəsulullah ψ Allahın qulu olmaqdan özünə şərəf duyardı. O, quldur lakin ona ibadət edilməz. O, bir Rəsuldur yalanda ittiham edilməz. Şəriət haramı qadağan etdikdə mütləq halal qapısını göstərir. Dəvətdə də müsəlmanlar belə olmalıdırlar. Əgər sən haram qapısını bağlayırsansa mütləq halal qapısını (yolu) ona göstərməlisən. Bu da Tövhidi qorumaq, şirkin qarşısını almaq üçündür.

# ALLAHIN RƏHMƏTİNDƏN ÜMİD ÜZMƏK VƏ ALLAHIN ƏZABINDAN ƏMİN OLMAQ

Belə bir hala düşən qul Tövhidin əslindən və imanın vaciblərindən olan qorxu və ümidi zay etmişdir. ***Qul İki Şeydən Qorxmalıdır***: **1)** Allahın rəhmətindən və mərhəmətindən ümid kəsməsinə yol açacaq dərəcədə qorxunun əsiri olmaq. **2)** Allahın cəza və əzabından əminlik hiss edəcək dərəcədə ümid bəsləməkdir; ***"Məgər o ölkələrin əhalisi əzabımızın onlara gecə vaxtı, onlar yatarkən gəlməyəcəyindən əminmi oldular? Ya da o ölkələrin əhalisi əzabımızın onlara səhər-səhər, onlar əylənərkən gəlməyəcəyindən əminmi oldular? Yaxud onlar Allahın hiyləsindən ehtiyat etmirdilərmi? Allahın hiyləsindən yalnız ziyana uğrayanlar ehtiyat etməzlər".*** *(əl-Əraf 99).* ***"Allahın mərhəmətindən ümidinizi kəsməyin. Allahın mərhəmətindən yalnız kafirlər ümidini üzər".*** *(Yusuf 87).* *"(İnsanlar)* ***ümidsizliyə qapılandan sonra yağmur göndərən…".*** *(əş-Şura 28).* ***"Bizimlə qarşılaşacaqlarına ümid etməyən, dünyanı bəyənib ona bel bağlayan və ayələrimizdən qafil olanların – məhz onların qazandıqları günahlara görə düşəcəkləri yer Cəhənnəmdir".*** *(Yunus 7-8).* *"(Ya Muhəmməd!)* ***Yadına sal ki, bir zaman kafirlər səni həbs etmək və ya öldürmək, yaxud da*** *(Məkkədən)* ***çıxardıb qovmaq üçün sənə qarşı hiylə qururdular. Allah da tədbir tökdü. Allah tədbir tökənlərin ən yaxşısıdır".*** *(əl-Ənfal 30).* İbn Abbas ψ rəvayət edir ki, Peyğəmbərdən ρ nəyin böyük günah olduğunu soruşdular. O buyurdu: "Allaha şərik qoşmaq, Allahın rəhmətindən (köməyindən) ümidi kəsmək və Allahın məkrindən əmin olmaq".[591] İbn Məsud ψ rəvayət edir ki: "Böyük günahların ən böyüyü - Allaha şərik qoşmaq, Allahın məkrindən əmin olmaq, Allahın mərhəmətinə ümidsizlik və Allahın köməyinə ümidi itirmək".[592] İnsan isətnilən bir çətinlik, imtahan, bəla, müsibətə düşdüyü zaman ümidini kəsməməli və Allah barəsində xeyir

---

[590] Əbu Davud 4977.

[591] əl-Bəzzar 106, əl-Heysəmi 1/ 104, əl-Albani "Səhihul-Cəmi" 4601.

[592] əl-Heysəmi "Məcməuz-Zəvaid" 1/ 109, ət-Təbərani "Mucəmul-Kəbir" 9/ 156, İbn Kəsir 1/ 485.

zənn etməlidir. Nə qədər çətin imtahanlarla qarşılaşanlar olub ki, çətinliyin son anında Allah onlara asanlıq vermişdir.

***<u>Allahın Rəhmətindən Və Mərhəmətindən Ümid Kəsməyin İki Səbəbi Vardır</u>:*** **1)** İnsanın özünə zülm etməsi və haramlara qarşı cürətlənməsidir. Qul rəhmətə mane olan səbəblərə düşməklə günahlarda israr edərək rəhmətdən ümidini kəsir. Bu minval üzrə davam etməklə bu hal insanın bir vəsfi və ayrılmaz əxlaqı halına gəlir. Şeytanın istədiyi də budur. Belə bir quldan bu şeyləri içindən çıxardaraq tövbə etmədən xeyir gözlənilməz. **2)** Etdiyi günahlarına görə insanın qorxusunda güclənmə meydana gələrkən, Allahın rəhmət və məğfirət haqqında olan biliyinin zəifləməsidir. Bunun sonunda qul cəhaləti üzündən Allaha tövbə etməsinə rəğmən onu bağışlamayacağını, məğfirət etməyəcəyini ağlına salır. İradəsi zəifləyir və rəhmətdən ümidini kəsir. Bütün bunlar qulun Rəbbi barəsində biliyin azlığından, nəfsinin acizliyindən və sevgisizliyindən irəli gəlir.

Allahın ***Məkr*** və ***Keyd*** (Hiyləyə qarşılıq vermək sifəti); ***"Həqiqətən, kafirlər hiylə qururlar. Mən də hiylə qururam".*** *(ət-Tariq 15-16).* ***"Onlar bir hiylə qurdular. Biz isə özləri də bilmədən*** *(gözlənilməyən bir əzabla)* ***hiylələrinin cəzasını verdik".*** *(ən-Nəml 50).* Allahın hiylə sifəti vardır. İnsandan fərqli olaraq Allahda bu sifət kamil, tərif olunandır, insanlarda isə naqis sifət sayılır. Allahın hiyləsi qarşılıqlı kafirlərin hiyləsinə qarşıdır. Allahın feli sifətlərindəndir. Allah daima bu sifətə mənsub deyildir. İstədiyi vaxt onu edir. Sələflərdən bəziləri Allahın qullarına olan Məkrini (yəni hiyləyə qarşılıq verməsini) onların bilmədikləri bir yerdən nemətlər ilə dərəcə-dərəcə əzaba yaxınlaşdırılması deyə açıqlamışlar. Onlar yeni bir günah etdikdə, O da onlara yeni bir nemət ehsan edir. Sələflər uzun müddət xeyirdə olduqları zaman qorxar və bunun istidrac (tədricən əzaba yönəldilmə) olduğunu zənn edərdilər. Peyğəmbər ρ buyurdu: "Bir kimsə günah etməyə davam etdiyi müddətdə və Allahın ona dünyadan sevdiyi şeyləri verdiyini görəcək olsan, bil ki, bu Allah tərəfindən (o, kimsəni) dərəcə-dərəcə əzaba yaxınlaşdırılmasıdır".

***<u>Allahın Əzabından Əmin Olmağın İki Təhlükəli Səbəbi Vardır</u>***: **1)** Qulun dindən üz döndərərək Rəbbini və Rəbbinin haqlarını tanımaq xüsusunda qafil olması. İnsanın qəlbində Allah qorxusu sönüb imanın bir zərrəsi qalmadıqda, qəflət və zəlalət içində haramlara dalır, vaciblərə qarşı səhlənkar olur. Çünki, iman insana Uca Allahdan dünya və axirətdə qorxmaq hissini qazandırır. **2)** Qul cəhalət üzərində qaldıqca insanın əməli ilə özünü məğrur, bəyənmiş, cahil bir abid sanması, etdikləriylə təkəbbürləndikdə qəlbindən Allah qorxusu qalxır. Allah yanında uca məqamlara sahib olduğunu zənn edərək zəif və səviyyəsiz nəfsinə güvənir və özünün Allahın əzabından əmin olduğunu zənn edir. Sonda da zəlil olaraq xeyirə çatmaqdan qarşısı alınır. Çünki, öz əli ilə özünə qarşı cinayət etmişdir; ***"Ayələrimizi yalan hesab edənləri haradan olduğunu özləri də bilmədən tədricən məhvə yaxınlaşdıracağıq".*** *(əl-*

*Əraf 182).* ***"Kafirlərə edilmiş xəbərdarlığı unutduqları zaman*** *(küfrlərini daha da artırmaq məqsədilə)* ***hər şeyin*** *(bütün nemətlərin)* ***qapılarını onların üzünə açdıq. Kafirlər özlərinə verilən*** *(dünya)* ***nemətlərinə sevindikləri vaxt onları qəflətən yaxaladıq və onlar*** *(hər şeydən)* ***məhrum oldular".*** *(əl-Ənam 44).* ***"Biz onları bilmədikləri yerdən dərəcə-dərəcə əzaba yaxınlaşdıracağıq".*** *(Nun 44).* Bu bir ***İstidrac*** – dərəcə-dərəcə əzaba yaxınlaşmaqdır. İnsanlar Allahın Rəsullarının əmrlərini zay etdikdə, qadağalarını etdikləri zaman ruzidə boluq, bədəndə sağlamlıq, malda, pulda artım, bolluq qapıları açılar. Bununla sevinib qəflətdə olduqları və bu çirkin halları ilə sevindikləri zaman Allah onları əzabı ilə yaxalayar.[593] Peyğəmbər ρ buyurdu: "Sizin üçün ən çox qorxduğum şey Allahın yerin bütün bərəkətlərini (dünya nemətlərini və şirinliklərinin) qapılarını sizə açmasıdır".[594] Allah hiyləyə qarşılıq verənlərin ən xeyirlisidir; ***"Onlar*** *(İsaya inanmayanlar)* ***hiyləyə əl atdılar. Allah da onların hiyləsinə qarşı əvəz verdi. Allah bütün hiyləgərlərdən tədbirlidir*** *(hiyləgərlərə ən yaxşı cəza verəndir)****".*** *(Ali İmran 54).* Bu ayə yəhudilərin İsanı υ öldürmək istədiklərinə görə nazil olmuşdur. Xain Yahuda adında biri İsanı υ öldürmək üçün onu təqib edənlərlə birlikdə (İsanın υ) olduğu yerə gəlir. Lakin Allah I İsanı υ səmaya yüksəldir. Xain Yahudanı isə İsaya υ bənzədir. Xain Yahuda evi axtarıb İsanı υ orada tapmadıqda çölə çıxır. Onunla gələnlər Yahudanın İsa υ olduğunu görüb bu inancla onu öldürürlər.[595]

## "ALLAHA SALAM OLSUN"- DEMƏK

İbn Məsud ψ rəvayət edir ki: "Namazda Peyğəmbər ρ ilə birlikdə ikən: "Qullarından Allaha salam olsun, filana və filana da salam olsun"- dedik. Peyğəmbər ρ: "Allahın üzərinə salam olsun deməyin. Çünki, Allah özü Salamdır".[596] ***Allaha salam olsun*** – deyilməz. Çünkü, bu sözü Allaha dedikdə sanki onun üçün hansısa bir zərərdən salamatlıq diliəyirsən. Halbuki, əs-Səlam Allahın Özüdür. O, salamtlığı verən də Allahdır. Allahın heç kəsə ehtiyacı yoxdur. Ona dua ilə yönəlirlər, Onun üçün dua etmirlər. Allahı bütün naqisliklərdən çox-çox uzaqdır. Şəriət bir şeyə qadağa qoyduqda, qadağanı daha xeyirli bir şeylə əvəz edir. Bu haramdır, bax belə-belə et! Bu daha xeyirlidir. Şəriətin hikmətidir. Şəriət həmişə insana halal yolla çıxış qoyur.

---

[593] Təbəri "Cəmiul-Bəyan" 5/ 193-194, İbn Kəsir 2/ 132.
[594] əl-Buxari "Riqaq" 81, Muslim "Zəkat" 12.
[595] İbn Kəsir 11/ 37.
[596] əl-Buxari 835, Muslim 402.

# "ALLAHIM! İSTƏYİRSƏNSƏ MƏNİ BAĞIŞLA"- DEMƏK

Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Heç biriniz – Allahım! İstəyirsənsə məni bağışla, istəyirsənsə mənə rəhm et!"– deyə dua etməsin. (Dua etdikdə) qəti olaraq istəyin. Heç kəs Allahı hər hansı bir işi etməyə məcbur edə bilməz".[597] Bu hədis iki cür şərh edilir: **1)** Sanki bu insanın Allahın onu bağışlamasına ehtiyacı yoxdur. Belə bir kimsənin Tövhidi kamil olamz. Özünün Allaha ehtiyaclı olduğunu, kasıb olduğunu, zəlil olduğunu göstərməlirdir ki, Allah ona rəhm etsin. İnsan Ondan bir göz qırpımı belə ayrı qala bilməz. Sanki Allahın aciz olduğunu, kimdənsə qorxduğunu sanır. "İstəyirsən bağışla, qorxursansa bağışlama". "Mənim elə də ehtiyacım yoxdur, istəyirsən bağışla". Bu təkəbbürlük sifətidir. Allahdan bir şey istəikdə qətiyyətlə istə, utanma, çəkinmə, istə! Allah ondan istəyəni sevir. Allah varlıdır, biz isə kasıbıq. Allah verdikcə mülkündən azalmaz. Əksinə Ondan istənilməyəndə qəzəblənir. Allahdan bağışlanma diləmək isə daha üstündür. **2)** Allahdan bir şey istədikdə qətiyyətlə istəmək lazımdır. İnsanlardan istədikdə kimisi vermir, kimisi ağız əyir, kimisi gecikdirir, minnət edir və s. Allah isə belə deyildir. Ondan istənilməyəndə qəzəblənir. Onun mülkü saya gəlməzdir. Bütün məxluqat Ona möhtacdır. Heç kəs Allahı bir şeyi etməyə məcbur edə bilməz. Sən belə dedikdə sanki zənn edirsən ki: "Bu işi etmək Allah üçün çətindir, sənə verə bilməz". Bu da Tövhidin kamilliyinə ziddir. Bu hədis Allahı Onun əzəmətinə yaraşmayan nöqsanlıqlardan təmizləyir. Belə bir kimsə bu sözləri deməklə elə zənn edir ki, Allahı nə isə etməyə vadar edir. Belə deyənə Allahın onu bağışlaması sanki əhəmiyyətsiz olur. "İstəyirsənsə bağışla, istəyirsənsə yox". Ona görə də Peyğəmbər ρ buyurur: "Allahdan bir şey istədikdə ən yüksəyini (ən yaxşısını, böyüyünü) istəyin ki, aşağı olanı verilsin". Fikirləşmə ki, Allah onu verə bilməz. Ən böyüyünü istə ki, aşağı olan verilsin.

# KÜLƏYİ SÖYMƏYİN QADAĞAN EDİLMƏSİ

Küləyi söymək haramdır yoxsa məkruh? Külək var insanlara yağış gətirir, xeyir bərəkət gətirir. Külək var gəldiyi zaman ölüm, dağıntı, uçurumlar bəla gətirir. Külək yalnız Allahın əmri ilə əsir. Həmçinin, günəş, ay da Allahın əmri ilə hərəkət edir. Çünki, sən bu cür məxluqları söyməklə onların Xaliqini də təhqir etmiş olursan. Allah bu küləklər səbəbilə neçə-neçə qövmləri məhv etmişdir. Allah onu istədiyi tərəfə yönəldir. Bəzən bu küləklərdə xeyir, bəzən isə insanlar üçün şər vardır. Allah bununla onların üzərində olan qüdrətini bəyan edir. Lut qövmünü yeddi gün yeddi gecə ardı-arası kəsilmədən külək əsdirir; ***"Küləkləri Öz mərhəməti önündə yağışdan***

---

[597] əl-Buxari 6239, Muslim 2679, Əbu Davud 1483, ət-Tirmizi 3497.

***qabaq müjdəçi olaraq göndərən Odur. Nəhayət, o küləklər ağır buludları daşıyarkən, Biz o buludları ölü bir diyara tərəf qovur, onunla yağmur endirir və bunun vasitəsi ilə hər cür meyvə yetişdiririk. Biz ölüləri də belə dirildəcəyik. Bəlkə, düşünüb ibrət alasınız".*** *(əl-Əraf 57).* Lakin Peyğəmbərin ρ öyrətdiyi kimi nə isə küləkdən xoşuna gəlməzsə bu zaman bu duanı de: Ubeyy ibn Kəb ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurur: "Küləyi söyməyin. Xoşlamadığınız bir şey gördükdə: "Allahım! Bu küləyin və küləklə gələnin və ona əmr edilən xeyiri istəyirəm! Allahınm bu küləyin və küləklə gələnin və ona əmr edilənin şərindən Sənə sığınıram".[598] Sələflər deyirlər: "Dəniz hər gün Adəm oğullarının günahlarına görə Rəbbindən izn istəyir ki, onları suya qərq edib batırsın. Allah isə izn vermir". İnsanların küləyi təhqir etmələrini çox eşidirsən. Küləyi söyən zamanı söyən kimidir. Zamanı söyən də Allahı söymüş olur. İnsanın nə isə xoşuna gəlmədiyi zaman xeyirli söz söyləməlidir, qəzəbini, nəfsi-istəyinə qalib gələrək xeyir söyləməlidir. Çünki, baş verən Allahın qədəri və iznilədir. Bütün bu məxlqlar özləri heç nəyə sahib deyillər. Yalnız Allahın izni ilə iş görürlər.

## ALLAHIN ADI İLƏ İSTƏYƏN

İbn Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurur: "Kim sizdən Allahın adı ilə istəyərsə verin, kim sizdən Allahın adı ilə sığınacaq istəyərsə verin, kim sizi dəvət edərsə dəvətini qəbul edin, sizə yaxşılıq edəni mükafatlandırın, mükafatlandırmaq üçün bir şey tapmasanız mükafatlandırmış olduğunuzu görənə (bilənə) qədər onun üçün dua edin".[599] Hər bir şeyin sahibi, hər bir şeyi idarə edən, gördüyün və görmədiyin hər bir şeyin Rəbbi, əs-Saməd olan Allahın adı ilə səndən istəyirsə sən ona necə verməyə bilərsən? Allahın adı ilə istəyəni rədd etmək, istədiyini ona verməmək qadağandır. Çünki, göylərdə və yerlərdə olanlar Allahın adını eşitdikdə belə qorxularından Onu İsim və Sifətləri ilə tanıdıqları üçün əsirlər. Muvahhid olan bir kimsə Allahın adı ilə istəyənə istədiyini verər. Allahın adı ilə istəyənə vermək Allahı ucaltmaqdır, rədd etmək Allahın adını aşağı tutaraq, Tövhidə zidd davranmaqdır. Allahın adı ilə istəmək nə deməkdir: İki cür başa düşülür: **1**) Səndən bir şey istədiyi zaman Allahın adı ilə istəyirlər. Bu sualı iki qismə bölmək olar? **1.** İstəməyin özü halaldır, yoxsa məkruh? **2.** Cavab vermək vacibdirmi? İstəmək – ehtiyac olmadan məkruhdur. Səhabələr Peyğəmbər ρ beyət etmişdilər ki, heç kəsdən heç bir şey istəməyəcəklər. Pul istəməyə gəldikdə isə bu haramdır. Səhl ibn Hənzələ ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Ehtiyacını ödəyəcək qədər imkanı olduğu halda başqasından istəyən kimsə ancaq Cəhənnəm atəşini artırmaq istəyir". Soruşdular ki: "Bəs onda ehtiyacını ödəməmək nədir?" Peyğəmbər ρ: "Səhər və axşam

[598] ət-Tirmizi 2252, ən-Nəsai 10769, əl-Albani "Səhihul-Cəmi" 7315.
[599] ən-Nəsai 2565, Əbu Davud 1672, Əhməd 2/ 99.

yeyəcəyi miqdarı qədər"- deyə buyurdu".[600] İbn Məsud ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Özünə çata biləcək qədər malı olmasına baxmayaraq dilənən insan Qiyamət günü üzündə yara və (üzü) sıyrılmış halda gələcəkdir".[601] Avfu ibn Məlik əl-Əşcai ψ rəvayət edir ki, Peyğəmbərin ρ hüzurunda doqquz, yaxud səkiz, yaxud yeddi kişi idik. Peyğəmbər ρ: "Allahın Rəsuluna beyət etməzsinizmi?"- deyə buyurdu. Halbuki biz bir az öncə ona beyət etmişdik və Peyğəmbər ρ bu sualını üç dəfə təkrar etdi və biz də əllərimizi beyət üçün uzadıb: "Ya Rəsulullah! Biz bir az öncə sənə beyət etdik. İndi nə üçün beyət edirik"- dedik. Peyğəmbər ρ buyurdu: "Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın, beş vaxt namaz qılın və insanlardan heç bir şey istəməyin". Sonra mən bu camaatdan bəzilərini gördüm ki, hər hansı birisinin qamçısı yerə düşdüyü zaman (yaxın olan) birisindən istəməzdi. (Özü düşər) və götürərdi".[602] Səvban ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim mənə insanlardan bir şey dilənməyəcəyinə söz verirsə mən də onun Cənnətə girməsinə zamin olaram". Səuban ψ: "Mən söz verirəm"- dedi. Ravi deyir ki: "Həqiqətən də Səvban heç kimsədən bir şey istəməzdi".[603] Çıxılmaz vəziyyət istisnadır. Çünki, insanlardan istəmək artıq səni onun yanında başı aşağı edir, səni hörmətdən salır və s. Səni ona bağlı edir.

***<u>Allahın Adı İlə İstəyən</u>:*** **1)** Şəriətlə bağlı (haqqı varsa) bir şey istəyirsə vermək vacibdir. Hətta o, səndən Allahın adı ilə istəməsə də belə. Məs: Səndə zəkat pulu var. Kasıb birisi gəlir və istəyir. Allahın adı ilə istəməsə də ona vermək sənə vacibdir. **2)** Şəriətlə bağlı haqq deyil, sadəcə Allahın adı ilə istəyir iki şərtlə vermək vacibdir: **1)** Haram üçün istəyərsə olmaz. Pul ver içki alım, siqaret alım. Allah üçün verə bilmərəm. **2)** Əgər hansısa bir fərdi şəxs konkret olaraq sənə yaxınlaşıb və Allahın adı ilə nə isə istəyir və sən onun istəyini etmək iqtidarındasansa, onu rədd etmək haramdır. Dilənçi və yalan danışan bura aid deyil. Əgər bir neçə adama müraciət edirsə və səndə onların içərisindəsənsə, onda rədd edə bilərsən. Sən kimdənsə istəyirsənsə artıq o səndən üstün olur. Çünki, o verəndir, sən isə alan. Verən əl həmişə alandan üstündür. Bu da Tövhidin kamilliyinə zidd olandır. İnsanın qəlbi yalnız Allaha bağlı olmalıdır. O qəlb yalnız Allah sevgisi ilə dolmalıdır. Şeyx Useymin Σ deyir: "Əsl olaraq kimdənsə nə isə istəmək məkruhdur. Əgər buna (ciddi) bir ehtiyac yoxdursa bir kimsəyə kimdənsə nə isə istəmək yaraşmaz. Səhabələr Allah Rəsuluna ρ beyət etmişdilər ki, heç kəsdən heç bir şey istəməyəcəklər. İnsanlardan bir şey istəmədikdə artıq sən öz hörmətini qaldırmış olursan. Heç kəsə icazə vermirsən ki, kiminsə yanında başı aşağı olasan. Onun yanında başı aşağı olduqda artıq ona ehtiyacın olacaq. Belə etmək yaraşmaz. Əbul-Abbas Səhl ibn Sad əs-Səidi ψ rəvayət edir ki, bir kişi Peyğəmbərin ρ yanına gələrək dedi: "Ey Allahın Rəsulu! Məni elə bir

[600] Əbu Davud 2/ 281, əl-Albani "Səhihul-Cəmi" 6280.
[601] Əhməd 1/ 388, əl-Albani "Səhihul-Cəmi" 6255.
[602] Muslim 1043.
[603] Əbu Davud 1643.

əmələ yönəlt ki, onu etdikdə həm Allah məni sevsin, həm də insanlar məni sevsinlər". (Peyğəmbər ρ) buyurdu: "Dünyada zahid[604] ol, Allah səni sevəcəkdir, insanların əlində olana zahid ol (göz dikmə), insanlar da səni sevəcəklər".[605] İnsanlardan bir şey istəmək bəzən məkruh, bəzən də haram olur. Əgər buna ciddi ehtiyac yoxdursa, bir kəsdən pul istəmək haramdır. Alimlər zəkat babında deyirlər ki: Yalnız kimə icazə verilmişsə (zəkat) götürmək ona da icazəlidir götürmək". Nə üçün vermək lazımdır? Allahı təzim etmək, ən əzəmətli Olanın adı ilə istədiyi üçün.

Kimsə səndən Allaha sığınırsa onu yalnız burax. Peyğəmbər ρ ***Cəvniyyə*** adlı bir qadına evlənmək xəbərini göndərir. Peyğəmbər ρ onunla evləndiyi zaman ilk gecədə qadın ondan Allaha sığınır. Peyğəmbər ρ kənara çəkilərək: "Sən elə bir şeydən sığınacaq istədin ki"- get atanın evinə. Qadın Peyğəmbərdən ρ Allaha sığındığı üçün Allah da onu qorudu. Evlənməyərək onu ailəsinə geri göndərdi. ***Həmçinin*** **-** İçki içənə sən onu içki içməyə qoymayanda, deyir ki: "Səndən Allaha sığınıram". Burada əksinə fikir vermyib ədəblə qadağan edirsən. Əgər sənə yaxşılıq edibsə çalış əvəzini qaytar. Tam təşəkkür etdiyini bilənədək ona yaxşılıq et. Baçarmırsansa, dua et ki, qəlbin rahatlansın.

## ALLAHIN ÜZÜ XATİRİNƏ

Cabir ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Allahın üzü xatirinə yalnız Cənnət istəlinir".[606] Müsəlman bir kimsəyə Allahın İsimlərinə hörmətlə yanaşmaq və onları daima uca tutmaq vacibdir. Dünyəvi ehtiyacları onun gözəl Vəchi (Üzü) ilə istəmək olmaz. Allahın Vvəchi ilə yalnız xeyirli və mühüm, yüksək işlər istənilir. Bu da Tövhidə İsim və Sifətlər tövhidinə qarşı hörmətdir. Məs: Allahdan istədikdə Cənnəti və ya Cənnətə apran şeyləri diləyirsən.

## ALLAHI ÖZÜNLƏ BİR MƏXLUQ ARASINDA VASİTƏÇİ TUTMAQ

Cubeyr ibn Mutim ψ rəvayət edir ki, bir bədəvi Peyğəmbərin ρ yanına gələrək: "Acizik, övladlarımız acdır, mallarımız həlak olur. Rəbbindən bizim üçün yağış dilə! Biz adətən Allahı özümüzlə sənin aranda vasitəçi edirdik. (Yəni, Allah ilə səndən istəyirik). İndi isə səndən istəyirk ki, sən bizimlə Allah arasında vasitəçilik edəsən". Peyğəmbər ρ: "Subhənəllah! Subhənəllah!" Bunu o, qədər təkrar etdi ki, səhabələr bu

---

[604] ***Zahid*** – dünyaya rəğbət bəsləməyin və bağlı olmağın ziddidir (əksi). İbn Teymiyyə Σ deyir: "Zahidlik axirətdə fayda verməyəcək şeyləri tərk etmək deməkdir". İbn Qeyyim "Mədaricus-Salihin" 285**.**

[605] İbn Macə 4102. əl-Albani "Səhihul-Cəmi" 935.

[606] Əbu Davud 1671, əl-Albani "Zəif" 6351.

narazılıq səhabələrin də üzündə büruzə verdi. "Vay olsun sənə! Allahın nə olduğunu bilmirsənmi? Allahın əzəməti bundan yüksəkdir. Allahın kiminsə qarşısında şəfaətçi götürmürlər"- deyə buyurdu".[607] Allahı özünlə kiminsə arasında vasitəçi – şəfaətçi etmək qadağandır. Allahı o, kimsənin yanında aşağı edirsən. Peyğəmbər ρ Allahı bu nöqsanlıqdan uca tutaraq dedi: "***Subhənəllah!*** Allah sənin dediklərindən Ucadır". Bu zəif hədis olsa da, mənası səhihdir. Öz işlərində Allahdan başqa hər kəsi vasitəçi tuta bilərsən.

---

[607] Əbu Davud 4726, əl-Albani "Zəif".

# ŞİRKUL XƏFİY - GİZLİ ŞİRK RİYA

Saleh əməlin qəbul olunması üçün şərtlərdən biri də riyadan uzaq olaraq ixlas ilə Allah üçün etməkdir: Ömər ibn Xəttab τ rəvayət edir ki, mən Peyğəmbərin ρ belə dediyini eşitdim: "Əməllər ancaq niyyətlərə görədir. Hər kəsə də yalnız niyyət etdiyi şey qalacaqdır. Kim hicrəti[608] əldə edəcəyi dünya (malından) və ya evlənəcəyi qadından ötrü etmişsə, onun hicrəti (Allah və Onun peyğəmbərinin ρ razı qalması üçün deyil), hicrət etdiyi şeyə aiddir".[609] Sünnəyə uyğun olan əməldir: Ummu Abdullah Aişə O deyir ki, Peyğəmbər ρ buyurdu: "Hər kim bizim işimizlə əlaqəli ondan olmayan bir şeyi sonradan ortaya çıxararsa, o rədd olunacaqdır (Başqa rəvayətdə: "Hər kim bizim işimizə uyğun olmayan bir əməl etsə, o (əməl) rədd olunacaqdır)".[610] ***"Münafiqlər Allahı aldatmağa çalışırlar. Halbuki əsilndə Allah onları aldadır. Onlar namaza durduqları zaman*** *(yerlərindən)* ***tənbəlliklə*** *(könülsüz)* ***qalxar, özlərini*** *(yalandan)* ***xalqa göstərər və Allahı olduqca az yad edərlər".*** *(ən-Nisa 142).* ***"Kim Rəbbi ilə qarşılaşacağına ümüd bəsləyirsə, yaxşı iş görsün və Rəbbinə etdiyi ibadətdə heç kəsi şərik qoşmasın".*** *(əl-Kəhf 110).* Bu iki hədis əməllərin tərəzisidir. Bunlarla əməlləri ölçərək qiymət verə bilərsən.

***Riya – Raə*** – sözündən götrülüb, göstərmək deməkdir. Şəriətdə isə hər hansı bir əməli insanlara göstərmək və eşitdirmək üçün etmək deməkdir. Həmçinin xəbər yayılsın və insanlar onun haqqında danışsınlar deyə, bir iş görən də kiçik şirkə düşmüş olur. Hətta bəzi alimlər qeyd edirlər ki, riya insanda çox olarsa bu böyük şirkə də apara bilər. Riya iki qismdir: **1.** Münafiqin riyası - İnsan İslamı göstərir, lakin küfrü gizlədir. Bu da Tövhidin əslinə zidd olan böyük küfrdür. **2.** Müsəlman kişi və qadın öz əməllərini göstərir. Bu da kiçik - gizli şirkdir. Riya göstərməklə olur, Təsmiyyə - eşitdirərək riya etməkdir. Bu şirkin ən yüngül olanıdır. Bu kimsə bilir ki, Allahdan başqa ibadətə layiq haqq ilah, Ondan başqa xeyir verən, zərər verən, öldürən, dirildən və s. yoxdur. Bu növ şirk, Allahdan başqa ibadətə layiq ilah olmadığına, Ondan başqa zərər və fayda verən heç bir ilah və rəbbin olmadığına inanan kimsədən gəlir. Lakin bu kimsə etdiyi əməlində xalis Allaha yönəlmir. Görürsən ki, belə kimsələr öz davranışlarında və etdiyi ibadətlərində Allah üçün ixlaslı olmayıb, bəzən də nəfsi üçün pay ayırırlar. Etdiyi əməli dünyanı tələb etmək, bəzən də rəhbərlik, dərəcə və insanlar qatında şöhrətə nail olmaq üçün edir.

---

[608] Hicrət sözü aşağıdakı mənaları verir: (a) müsəlmanın dinini qorumaq məqsədilə İslama düşmənçilik edən ölkədən təhlükəsiz yerə köçməsi; (b) Muhəmməd Peyğəmbərin ρ əshabələrinin əvvəlcə Həbəşistana (indiki Efiopiyaya), sonra da Mədinəyə köçməsi; (c) Muhəmməd Peyğəmbərin ρ Məkkədən Mədinəyə köçməsi; (ç) başlanğıcı xristian təqviminin 622-ci ilinə uyğun gələn müsəlman təqvimi.

[609] əl-Buxari 1, Muslim 1907.

[610] əl-Buxari 2697, Muslim 1718.

Əməlində həm Allah üçün, həm nəfsi istəyi üçün, həm şeytan və insanlar üçün də pay vardır. Bu da ibadətdə şirkdir. Bu da insanların çoxunun halıdır. Buna görə də görürsən ki, bir əməldə bir neçə pay vardır. Riyanın isə hamısı şirkdir; ***"Kim Rəbbi ilə qarşılşacağına ümid bəsləyirsə yaxşı iş görsün və Rəbbinə etdiyi ibadətdə heç kəsi şərik qoşmasın".*** *(əl-Kəhf 110).* Uluhiyyətdə tək olduğu üçün ibadətdə də Allah təklənməlidir. Saleh əməl də riyadan uzaq olan və sünnəyə müvafiq olan əməldir. Əgər əməldə riya varsa və ya o əməl sünnəyə uyğun deyilsə, saleh əməl sayılmır. Saleh əməlin də iki şərti vardır. İxlaslı olmalı və sünnəyə uyğun olmalıdır. Ömər ψ dua edərək deyərdi: "Ey Allahım! Sən mənim əməlimin hamısını saleh əməl et və bütün etdiyim əməllərimi də Sənin üçün edənlərdən et! Bu əməlimdə heç kimsə üçün bir pay ayırma!" Bu ibadətdə olan şirk əməlin savabını yoxa çıxarır. Əgər etdiyi əməl vacibdirsə, cəzaya layiq görülür. Elə bil ki, o əməli etməyib. Buna görə də əməli etmədiyinə görə cəzaya layiq görülür. Allah əmr etmişdir ki, ibadət heç bir şeylə qarışmadan xalis Ona olmalıdır; ***"Halbuki onlara əmr edilmişdir ki, Allaha dini yalnız Ona məxsus edərək, digər bütün batil dinlərdən İslama dönərək ibadət etsinlər, namaz qılıb zəkat versinlər. Doğru-düzgün din budur!"*** *(əl-Bəyyinə 5).* Əgər bir kimsə ibadətində xalis olmazsa (muxlis), o kimsə əmr olunanı yerinə yetirməmişdir. Elə bil ki, onun etdiyi əməl əmr olunmayan bir şeydir. Ona görə də səhih deyildir və qəbul da olunmur. İbn Abbas ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "(İnsanlara) eşitdirmək üçün bir iş görənin əməlini Allah (Qiyamət günü insanlara) eşitdirəcəkdir. Özünü göstərmək üçün bir iş görənin əməlini də Allah (Qiyamət günü insanlara) nümayiş etdirər".[611] Cundəb ibn Abdullah ibn Sufyan ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim etdiyi yaxşılığı xalqa eşitdirmək üçün edərsə Allah da Qiyamət günü onu rəzil edər. Kim də riya edərsə Allah da Qiyamət günü onun riyakarlığını xalqın önündə açar".[612] Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim ki, Allah rizası üçün öyrənilməsi lazım olan bir elmi sırf dünya malını əldə etmək üçün öyərənərsə, Qiyamət günü Cənnətin iysini belə almaz".[613] Əbu Hureyra ψ rəvayət edir ki, Allah Elçisi ρ demişdir: “Uca və Ulu Allah buyurdu: “Mən şərik olmağa möhtac deyiləm. Kim Məndən qeyrisini Mənə şərik qoşaraq bir əməl etsə, onu da, onun şirkini də tərk edərəm”.[614] Əbu Səid ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Sizin üçün nəyin Məsih Dəccəldən də daha təhlükəli və qorxulu olduğunu xəbər verimmi?" Səhabələr: "Bəli, ya Rəsulullah!"- dedilər. O: "Bu gizli şirkdir. Bir adamın namaz qıldıqda başqa birisinin ona baxdığını hiss edincə namazını bəzəyib düzməsidir".[615]

---

[611] Muslim 4/ 2289.

[612] əl-Buxari 6499.

[613] Əbu Davud 3664.

[614] Muslim 2985, 5300, 7666.

[615] Əhməd 3/ 30, İbn Məcə 4204, əl-Albani “Səhihul-Cəmi” 2607.

Muaz ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Riyanın azı belə şirkdir"[616]. Fudeyl ibn İyad Σ deyir: "Əməllər həm düzgün, həm də səmimi olmayana qədər, səmimi olub düzgün olmayanda və ya düzgün olub səmimi olmayanda qəbul edilmir. Səmimi Allah üçün edilən, düzgün isə Sünnəyə uyğun olandır". Mömin işlərini yalnız Allah üçün etməli, ürəyində insanlardan tərif eşitmək arzusu olmamalıdır. Peyğəmbər ρ buyurdu: "Sizin haqqınızda ən çox qorxduğum şey kiçik şirkdir". Səhabələr: "Bu nədir? Ya Rəsulullah"- dedilər. Peyğəmbər ρ: "Riya"- deyə buyurdu".[617] ***"Etdikləri əməllərə görə sevinən və görmədikləri işlərə görə tərif olunmağı sevən kimsələrin əzabdan xilas olacaqlarını güman etmə. Onları şiddətli əzab gözləyir".*** *(Ali İmran 188).* Mahmud ibn Ləbid ψ rəvayət edir ki, Allah Elçisi ρ demişdir: "Həqiqətən, sizin üçün ən çox qorxduğum kiçik şirkdir". Dedilər: "Ey Allahın Elçisi, kiçik şirk nədir?" O buyurdu: "Riyakarlıq. Uca və Ulu Allah qullarının əməllərinin əvəzini verəcəyi gün (riyakarlara) deyəcək: "Dünyada əməllərinizi göstərdiyiniz kəslərin yanına gedin! Baxın görün, onlar etdiklərinizin əvəzini verə bilirlərmi?!"[618]

***Riya Qatışan İbadətin Hökmü Nədir?* -** Bir neçə növdür: **1.** İbadətin əslində riya olarsa. Əgər ibadətin əsli riya ilə edilərsə, artıq həmin ibadət batil olur. İbadətin əsli Allah üçün deyil kiminsə üçün edilir. Yəni bu kimsədə əvvəldən riya etmək niyyəti vardır. Bu ibadət batildir. Gözləyirdi ki, kimsə məscidə daxil olsun bu da sünnəni qılsın. Buna görə cəza vardır. Gizli şirkə düşmüş olur. **2.** İbadət əsnasında riya gələrsə. Bu da müxtəlif qismlərə bölünür. **1)** Əgər ibadətin əvvəli axırı ilə bağlıdırsa bu cür ibadət əsnasında riya gələrsə ibadət batil olur. Məs: ***Namaz*** – əvvəli ilə axırı bir-birinə bağlıdır. Lakin bəzi alimlər qeyd edirlər ki: İnsanın riya ilə artırdığı hissə batil olur. **2)** Bu ibadətin əvvəli axırı ilə bağlı deyildir. Məs: Sədəqə vermək. Birinci dəfə verdikdə Allah üçün verdin, ikinci dəfə isə kiməsə göstərmək üçün verdin. Bu özü də iki hissəyə bölünür. Əgər ibadət əsnasında insana riya gələrsə və bununla mübarizə apararsa bu ibadət qəbuldur. Əgər riyaya davam edərsə artıq həmin ibadət batil olur; ***"Kim Rəbbi ilə qarşılaşacağına ümid bəsləyirsə, yaxşı iş görsün və Rəbbinə etdiyi ibadətdə heç kəsi şərik qoşmasın".*** *(əl-Kəhf 110).* **3.** İbdətdən sonra riya gələrsə. Bunun heç bir zərəri yoxdur. Lakin sədəqə verdikdən sonra verdiyi insana minnət edərsə, başa qaxarsa verdiyi sədəqə batil olur; ***"Ey iman gətirənlər! Sədəqələrinizi malını riyakarlıqla sərf edən, Allaha və axirət gününə inanmayan şəxs kimi, minnət qoymaq və əziyyət verməklə puça çıxarmayın".*** *(əl-Bəqərə 264).* Əbu Hureyra ψ rəvayət edir ki, Rəsulullah ρ buyurdu: "Allah mənim ümmətimin qəlbindən keçən, lakin dilinə gətirmədiyi, yaxud həyata keçirmədiyi günahlarını bağışlayır".[619]

---

[616] əl-Hakim.
[617] Əhməd 5/ 428, 429, ət-Tabərani 4/ 23, əl-Albani "Səhihul-Cəmi" 1555, "Səhih Silsilə" 951.
[618] Əhməd 22523, 23630, 23686, 24356. əl-Albani buna oxşar hədisi "Sahihul-Cəmius-Sağir"də (№ 1555) səhih adlandırmışdır. Həmçinin Şueyb əl-Arnavut da hədisin isnadını səhih adlandırmışdır.
[619] Muslim 127, 331.

***Riya Olmayan Əməllər*** **-** İnsanların tərif etməsi: Əbu Zərr ψ rəvayət edir ki, mən: "Ya Rəsulullah! Bir kişi yaxşı bir əməl edir və xalq da onun bu əməlinə görə onu tərif edir. Buna nə buyurursan?"- dedim. Peyğəmbər ρ: "Bu mömin üçün bu dünyada olan bir müjdədir"- deyə buyurdu". [620] Gözəl geyinmək və keçinmək: Peyğəmbər ρ buyurdu: "Allah gözəldir və gözəldən başqasını da qəbul etməz".[621] ***"O, yaratdığı hər şeyi gözəl yaratdı".*** *(əs-Səcdə 7).* ***"Ey Adəm oğulları! Sizə ayıb yerlərinizi örtəcək bir geyim və bir də bəzəkli libas nazil etdik. Lakin təqva libası daha yaxşıdır".*** *(əl-Əraf 26).* Peyğəmbər ρ buyurdu: "Allah nemətinin əsərini, qulunun üzərində görməyi sevər".[622] Əbul-Əhvas əl-Cəşmi deyir ki, Peyğəmbər ρ üzərimdə köhnə və cırılmış paltar gördü və buyurdu: "Malın varmı?" Mən: "Bəli"- dedim. O: "Nəyin var?"- deyə buyurdu. Mən: "Dəvələrim və qoyunlarım"- dedim. O: "O, halda sənə verdiyi bu nemət və qayğını üzərində göstər"- deyə buyurdu".[623] Peyğəmbər ρ minbər üzərində namaz qılaraq buyurdu: "Mənə tabe olmağınız və necə namaz qıldığımı öyrənməyiniz üçün belə etdim".[624] Peyğəmbər ρ üzünü səhabələrə tutub buyurdu: "Hansı biriniz bu gün oruc tutb?" Əbu Bəkr ψ: "Mən" dedi. Peyğəmbər ρ: "Hansı biriniz bu gün cənazəni təqib edib?"- dedi. Əbu Bəkr ψ: "Mən"- dedi. Peyğəmbər ρ: "Hansı biriniz bu gün kasıbı yedizdirib?"- dedi. Əbu Bəkr ψ: "Mən"- dedi. Peyğəmbər ρ: "Hansı biriniz bu gün xəstəni ziyarət edib?"- dedi. Əbu Bəkr ψ: "Mən"- dedi. Peyğəmbər ρ buyurdu: "Bu dörd gözəl xisləti özündə cəm edən kimsə Cənnətə daxil olar".[625]

# NİYYƏT VƏ İSTƏKLƏRDƏ ŞİRK

***İxlas*** – insanı sözlərində, əməllərində, niyyətdə və iradədə xalis Allah üçün edir. İbrahimin υ hənif dini də elə budur. Bu dindən başqası da qəbul edilmir. Həqiqi din də elə budur. İstək və niyyətdə şirkə gəlincə, bu sahili olmayan dəniz kimidir. Bu məsələdə şirkdən qurtaran çox az kimsə olur. Əgər bir kimsə əməli ilə Allahdan qeyrisinin razılığını güdərsə və ya hər hansı bir şeylə Allahdan qeyrisinə yaxınlaşmağı niyyət edərsə, Allahdan qeyrisindən mükafat diləyərsə, belə bir kimsə niyyətdə, istəkdə Allaha şirk qoşmuşdur. İnsanlar etdikləri əməlləri ilə dünyanı qəsd edirlər. Riyada insan öz ibadətində maddi bir şeyi istəmir. Lakin bu ibadətdə isə insanlar dünya malını qəsd edirlər. Axirətdə olan savab və mükafatı düşünmürlər. Müəzzin azanı maaşa görə verir. Maaşı kəsiləndə azan vermir. Dünya malını əldə etmək və vəzifə sahibi olamq üçün elm öyrənir. Allahın əmri olduğu üçün deyil,

[620] Muslim 2642.
[621] Muslim 1015.
[622] ət-Tirmizi 2819.
[623] Əbu Davud 4063.
[624] əl-Buxari, Muslim.
[625] Muslim 6132.

sadəcə sağlamlıq üçün oruc tutur; ***"Kafirlər Odun qarşısına gətiriləcəkləri gün onlara deyiləcəkdir: "Siz dünya həyatınızda pak nemətlərinizi sərf edib qurtardınız və onlardan zövq aldınız. Bu gün isə siz yer üzündə haqsız olaraq təkəbbür göstərdiyinizə və asi olduğunuza görə alçaldıcı əzabla cəzalandırılacaqsınız!"*** *(əl-Əhqaf 20).* ***"Hər kəs fani dünyanı istəsə, dilədiyimiz şəxsə istədiyimiz neməti orada*** *(dünyada)* ***tezliklə verərik. Sonra isə*** *(axirətdə)* ***ona Cəhənnəmi məskən edərik. O, Cəhənnəmə qınanmış və qovulmuş bir vəziyyətdə daxil olar".*** *(əl-İsra 18).* ***"Kim dünyanı və onun bər-bəzəyini istəyərsə, Biz ona əməllərinin əvəzini elə orada verərik. Onların dünyadakı mükafatları əsla azaldılmaz. Belələrini axirətdə atəşdən başqa bir payı yoxdur. Onların dünyada gördükləri işlər puç olar və bütün əməlləri boşa çıxar".*** *(Hud 15-16).* Ayə onu göstərir ki, Allah kafir olanlara bu dünyada nemət verir. Lakin axirətdə isə onlara oddan başqa heç bir şey verilməyəcəkdir. Dünya həyatını nəfsilə istəyən əsasən kafirlərdir. Çünki, olar dünya üçün çalışırlar. Bu ayə ləfzən kafirlər barəsində olsa da bütün insanlara (müsəlmanlara) da aiddir. Muhəmməd ibn Abdul-Vahhab Σ deyir: "Sələflər bu ayəyə əsasən insanları dörd qismə aid ediblər: **1)** Kiçik şirk edənlər – saleh əməllərilə dünyanı qəsd edir. Əməli Allah üçün edir, lakin savabı axirətdə deyil, bu dünyada istəyir. Məs: Allaha namaz qılır, lakin bununla Allahdan sağlam bədən, ticarətinin yaxşı olmasını diləyir. Qohumluq əlaqələrini dünya üçün edir. O, Allahdan savab, atəşdən qorunmağı istəmir. Allahın əmr etdiyi əməllər iki qismdir: **1.** O əməllərdir ki, insan əməl edir, çünki Allah onların edilməsini əmr edib, lakin onlar üçün dünya mükafatı qeyd etməyib. Məs: Namaz, oruc, və s. Bunları etdikdə dünya mükafatını istəmək olmaz. Kim edərsə artıq şirk etmişdir. Bu əməllərin mükafatı axirətdədir. **2.** O əməllər ki, Allah edildiyi zaman bu dünyada mükafat verəcəyini buyurmuşdur. Qohumluq əlaqələrinin möhkəmləndirilməsi, valideynlərə münasibət və s. Bu əməmlləri edən kimsə yalnız bu dünyada olan mükafatı üçün çalışsa, axirəti unutsa (axirət savabını düşünməsə) hətta əməli Allah üçün etsə də belə şirkə düşmüş olar. Lakin həm bu dünyada, həm də axirətdə qazanmaq üçün düşünsə bu gözəldir. **2)** İnsan hansısa saleh əməlləri dünya mənfəti, mülkü üçün edir. Dini elmləri yalnız karyerə üçün öyrənir, müəllim, direktor olsun. Dünya mülkünü çoxaltmaq üçün çalışır, Quran əzbərləyir ki, sonda bunun vasitəsilə Quran müəllimi, məscid imamı olub pul qazansın. Allah qorusun! Niyyəti yoxdur ki, bunlarla cahillikdən qurtarsın, Cəhənnəmdən qorunsun, Cənnətə yaxınlaşsın. Yalnız niyyəti budur. Zahirən xeyirli görsənsə də niyəti düz deyildir. **3)** Riya əhlidir. Etidiyi əməli yalnız insanların tərifini qazanmaq üçün edir. **4)** Saleh əməllər edirlər, lakin onlar əvvəlcədən kafirdirlər. Kitab əhli və s. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ demişdir: "Qiyamət günü üç sinif insan ilk sorğu-suala çəkilənlərdən olacaqdır. Şəhid Allahın hüzuruna gətiriləcək və Allah ona bəxş etdiyi nemətlər haqqında xəbər verdikdən sonra deyəcək: "Bu nemətlərin müqabilində nə etmisən?"

O: “Sənin yolunda vuruşub şəhid olmuşam”- deyə cavab verəcək. Allah isə ona belə deyəcək: “Yalan danışırsan! Sənə “qəhrəmandır”- desinlər deyə vuruşmusan. Ona da artıq nail olmusan”. Sonra əmr olunacaq və onu üzüstə sürükləyib Cəhənnəmə atacaqlar. Sonra elm öyrənmiş və onu insanlara öyrətmiş, çoxlu Quran oxumuş bir şəxs Allahın hüzuruna gətiriləcək və Allah ona nəsib etdiyi nemətlər haqqında xəbər verdikdən sonra deyəcək: “Bu nemətlərin müqabilində nə etmisən?” O: “Sənin xatirinə elm öyrənib onu insanlara öyrətmişəm və çoxlu Quran oxumuşam”- deyə cavab verəcək. Allah isə ona belə deyəcək: “Yalan deyirsən! Sənə “alimdir”- desinlər, həmçinin “qaridir”- desinlər deyə elm öyrənmisən, Quran oxumusan. Ona da artıq nail olmusan”. Sonra əmr olunacaq və onu üzüstə sürükləyib Cəhənnəmə atacaqlar. Sonra (dünyada) zəngin olmuş bir adam Allahın hüzuruna gətiriləcək və Allah ona verdiyi nemətlər haqqında xəbər verdikdən sonra deyəcək: “Bu nemətlər müqabilində nə etmisən?” O: “Var-dövlətimi Sənin yolunda xərcləmişəm, Sənin buyurduğun yerlərə sərf etmişəm”- deyə cavab verəcək. Allah isə ona belə deyəcək: “Yalan danışırsan! Sənə “nə səxavətli insandır”- desinlər deyə malından xərcləmisən. Ona da artıq nail olmusan”. Sonra əmr olunacaq və onu üzüstə sürükləyib Cəhənnəmə atacaqlar”.[626]

Namaz əsnasında Allahdan dünyəvi bir şeyləri istəmək qadağan deyildir, əksinə icazəlidir. Lakin namazı dünyəvi bir şey üçün qılmaq qadağandır. Namaz qılır ki, ruzisi artsın, namaz qılır ki, sağlam olsun və s. Həmçinin, digər ibadətlər də belədir. Dünyəvi bir şeyi Allah üçün edilən bir şeylə qarışdırmaq olmaz. Əhu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Dinarın qulu bədbəxt olsun, dirhəmin qulu bədbəxt olsun. Pal-paltarın, zinətin qulu bədbəxt olsun. Beləsinə istədiyi veriləndə razı qalar, verilməyəndə isə qəzəblənər. Bədbəxt olsun və başı aşağı çevrilsin. Onun (ayağına) batan tikan belə çıxaran olmasın. Atının yüyənindən tutaraq saçı, başı dağınıq və ayaqları tozlanan kimsəyə müjdələr olsun. Keşikdə durduqda vəzifəsini yerinə yetirər, qoşunun arxa hissəsindədirsə üzərinə düşəni edər, halbuki insanlar nəzərində izn istəsə izn verilməyən, vasitəçilik etsə vasitəçiliyi qəbul edilməəyən birisidir".[627] ***Birinci İnsanın*** **-** dərdi dinar və dirhəmidir, bütün bunları Rəbbinə ibadətdən üstün görür, onun məyus və peşman olması da dinar və dirhəminə görədir. Dərdləri, fikirləri, can atdıqları libaslarıdır. Bu kimi şeylər onu Rəbbinə ibadətdən yayındırır. Onun yoldaşlığı, kefi-halı bundan aslıdır. Dostluğu və düşmənçiliyi də buna görədir. Nə üçün o varlıdır, mən isə kasıb və s. Allah dünyanı sevdiyinə və sevmədiyinə də verir, dini isə sevdiyinə verir. Belə bir sevgi insanı – ***Allah Qorusun*** – dindən də çıxarda bilər. ***İkinci İnsan*** **-** birincinin tam əksidir. O, dünya üçün deyil, Axirəti üçün çalışır. Peyğəmbər ρ onu bir çox xeyirli şeylərlə vəsf edir. Onun niyyəti

[626] Muslim 527, 1905, 5032.
[627] əl-Buxari 2887, İbn Məcə 11/ 216.

Allahın adının yüksək olmasıdır. Onun üçün fərq etməz, istər ön cəbhə olsun, istər arxa cəbhə, onun üçün məqsəd birdir – Allahın adı yüksək olsun. Baş-gözü, saçı toz içindəir, çünkü bunları təmizləməyə belə vaxtı yoxdur. Pinti olduğu üçün deyil, Allahın dinini, müsəlman torpaqlarını qoruduğu üçün belədir. Həm də bu insan elə bir vəzifə sahibi, böyük bir insan da deyildir. Sadə bir insandır ki, məqsədi axirəti qazanmaqdır. Hara göndərsələr gedir, nə əmr etsələr boynuna düşəni edir. İnsanların gözündə aşağı olmaq o demək deyil ki, Allahın gözündə də belə bir kimsə aşağıdır. Əsla!

İnsanın malı, dünyanı sevməsi və bu işdə dəridən qabıqdan çıxması insanın bu şərəfli ömrünü zay etməsidir. Onlar elə zənn edirlər ki, xoşbəxtlik yalnız pulun çox olmasındadır. Bölünmüş, yazılmış ruzini tələb etmək də vaxtı zay etməkdir. Ruzi artıq bölünmüşdür. Həris, tamahkar insan isə məhrumdur. Sələflər deyərdilər: "Qədər haqdırsa, onda tamahkarlıq boş şeydir. Əgər xəyanət insanın təbiətində varsa, onda hər kəsə bel bağlamaq acizlikdir. Əgər ölüm hər kəsi gözləyirsə, onda dünyaya da arxalanmaq axmaqlıqdır". İnsan bu ömründə uca dərəcələri və əbədi nemətləri qazana bilərdi. Lakin bu dünya malını toplayaraq bu dünyada qoyub gedir. Hesabı özünə qalır, kefi isə başqalarına. Cabir ibn Abdullah ψ rəvayət edir ki, Peyğəmbər ρ ilə birlikdə Mədinənin Aliyə tərəfindən bazara daxil olduq. Ölmüş kiçik qulaqlı bir oğlaq gördü. Onun qulağından tutaraq buyurdu: "Sizdən kim bunu bir dirhəm qarşılığında almaq istəyər?" Səhabələr dedilər: "Allaha and olsun ki, o diri olsaydı belə onu heç kəs almazdı. Çünki, qüsurlu oğlaqdır. Qulaqları kiçikdir". Peyğəmbər ρ buyurdu: "Allaha and olsun ki, bu sizin üçün nə qədər dəyərsizdirsə, du dünya da Allah üçün o qədər dəyərsizdir".[628] Peyğəmbər ρ buyurdu: "Dünyanın axirətdəki durumu ancaq sizdən hər hansı bir kimsənin barmağını dənizə salıb çıxartdıqdan sonra nə çıxartdığına baxması kimidir".[629] Peyğəmbər ρ buyurdu: "Şübhəsiz ki, dünyanın məhv olması Allah üçün müsəlman bir kimsənin öldürülməsindən daha yüngüldür".[630] Peyğəmbər ρ buyurdu: "Sizi sevindirəcək şeylərin müjdəsini sizə verirəm və bunları (gələcəkdə də) ümid edə bilərsiniz. Allaha and olsun ki, mən sizin üçün fəqirlikdən qorxmuram. Lakin mən sizin üçün əvvəlkilərə dünyanın imkanları geniş verildiyi kimi sizə də veriləcəyindən və onlar necə bu şeydə bir-birləri ilə yarışdıqları kimi sizin də yarışacağınızı və (dünya) onları necə həlak etdisə sizi də həlak edəcəyindən qorxuram".[631] Sələflər deyərdilər: "Sən fikirləşmə ki, kasıblıq varlılığın olmamasıdır. Həqiqi kasıblıq dinin olmamasıdır. Ey qardaşım! Sən tamahkar insanın yığdığı mala görə ona qibtə etmə. Sizin ona yazığınız gəlsin. O, bu dünyada elə bir şeylə məşğul olub ki, sabah onu həlak edəcəkdir". Allahdan qeyrisinə

[628] Muslim şərhi 5/814 (Muslim "Zuhd" 2).
[629] əl-Albani "Səhihul-Cəmi" 5423.
[630] ət-Tirmizi 5/ 82, əl-Albani "Səhihul-Cəmi" 453.
[631] əl-Buxari 4/ 63, Muslim şərhi 5/ 816.

(dünyaya, pula) bağlandıqlarına, Allahı unutduqlarına görə Allah da onları unudar və onları özlərinə həvalə edər; ***"Allahı unutduqları üçün Allahın da onları özlərinə unutdurduğu kimsələrə bənzəməyin! Onlar fasiqlərdir".*** *(əl-Həşr 19).* Ömər ψ rəvayət edir ki, bir gün Peyğəmbərin ρ yanına daxil oldum. O, həsirin üzərində uzanmışdı. Sonra o, qalxıb oturdu, onun əynində izardan başqa bir şey yox idi. Həsirin izi onun çiynində və böyründə qalmışdı. Mən onun eyvanına nəzər salıb gördüm ki, orada təqribən bir saa arpa, bir o, qədər akasiyə ağacının qabığı və bir də aşılanmış dəridən başqa heç bir şey yoxdur. Bu halı gördükdə mənim gözlərim yaşla doldu. Peyğəmbər ρ buyurdu: "Ey Xəttabın oğlu, səni ağladan nədir?" Mən dedim: "Ey Allahın Rəsulu! Nə üçün ağlamayım ki?! Mən görürəm ki, həsir sənin bədənini bu hala salıb, eyvanda da gördüklərimdən başqa bir şey yoxdur. Qeysər (Rum imperatoru) və Xosrov (Fars imperatoru) cah-cəlal içərisində yaşayırlar. Sən isə Allahın Rəsulu və sevimlisi olduğun halda bu da sənin eyvanın!" Peyğəmbər ρ dedi: "Ey Xəttabın oğlu! Məgər istəmirsən ki, onlar üçün dünya, bizim üçün isə axirət olsun? (Başqa rəvayətdə: "Dünya ilə mənim işim nə! Mənim və dünyanın misalı ancaq bir ağacın kölgəsində bir müddət oturan, sonra da oradan durub gedən bir süvariyə bənzəyir[632])".[633] Peyğəmbər ρ buyurdu: "Dünya möminin zindanı, kafirin isə Cənnətidir".[634] Həqiqi azad insan kimdir? Dünyanı əlində edən, dünyanı qəlbinə salmayan kimsədir. Nə qədər dünya malı onda olarsa onu əlində saxlayar. Dünya malını Allaha itaətdə xərcləyər. İmam Əhməddən Σ soruşduqda ki, insanda min dinar olduğu halda zahid ola bilərmi? O: "Bəli, ola bilər". O kimsə: "Ey imam, bu necə ola bilər?"- deyə soruşdu. O: "Artanda sevinmir, azalanda isə kədərlənmir". Tək olan Allaha ibadət edən insan varlı da ola bilər, şərəfli də. Lakin bütün bunlar əlində olar. Bunların heç birini qəlbinə salmaz. Çünki, bütün bunlar dünyanın keçici zövqüdür. Mömin kimsə qəlbini yalnız Allaha sevgi, Peyğəmbərinə ρ itaətlə doldurur. Bu qəlb parçasını Allahdan qeyrisinə yönəltmir; ***"Bilin ki, dünya həyatı oyun və əyləncə, bəzək-düzək, bir-birinizin yanında öyünmək, var-dövləti və oğul-uşağı çoxaltmaq istəyindən ibarətdir. Bu elə bir yağışa bənzəyir ki, ondan əmələ gələn bitki əkinçiləri heyran edir. Sonra o quruyur və sən onun sapsarı olduğunu görürsən. Sonra isə o çör-çöpə dönür. Kimisini axirətdə şiddətli əzab, kimisini də Allahdan bağışlanma və razılıq gözləyir. Dünya həyatı isə aldadıcı ləzzətdən başqa bir şey deyildir".*** *(əl-Hədid 20).* ***"Qadınlar, uşaqlar, qızıl-gümüş yığınları, yaxşı cins atlar, mal-qara və əkin yerləri kimi nəfsin istədiyi və arzuladığı şeylər insanlara gözəl göstərilmişdir. Lakin bütün bunlar dünya həyatının keçici zövqüdür, gözəl dönüş yeri isə Allah yanındadır".*** *(Ali-İmran 14).* ***"Dünya həyatı isə aldadıcı həzzdən, əyləncədən başqa bir şey deyildir".*** *(Ali İmran 185).*

[632] ət-Tirmizi.
[633] Muslim10/ 82.
[634] Muslim 2956.

***"Dünyanın ləzzəti və faydası azdır, lakin müttəqi üçün axirət daha xeyirlidir".*** *(ən-Nisa 77).* ***"…Dünya malı axirət yanında yalnız cüzi bir şeydir".*** *(ət-Tövbə 38).* Peyğəmbər ρ buyurur: "Kimin dərdi axirət dərdi olarsa Allah varı onun qəlbində edər. İşlərini düzüb qoşar, dünya istəmədiyi halda ona gələr. Əgər kimin dərdi dünya dərdi olarsa Allah kasıblığı onun qarşısında edər. Allah onun işlərini dağıdar. Ona dünyadan yazılandan başqası verilməz".[635] Sələflər axirət üçün yaşayar və axirət üçün çalışardılar. Allah da onlara dünyanı istəmədikləri halda verərdi.

[635] ət-Tirmizi, əl-Albani səhih.

# SEHR

***Sehr*** – səbəbin gizlədilməsi, bilinməz olması deməkdir. Şəriətdə isə Sehrin insanın qəlbinə və bədəninə təsir etməsidir. Səhər və Səhur kəlimələri də bundan törənmişdir. Çünki, səhər edilən səhur və səhər edilən əməllər çox vaxt gizli olur. Bəzi alimlər sehrbazın kafir, bəziləri isə bu əməlin böyük günah olduğunu söyləmişlər. Əbu Hənifə, İmam Məlik, İmam Əhməd Σ bu əməlin böyük küfr (şirk) olduğunu, İmam Şafii Σ isə halal görmədiyi və şeytana ibadət etmədiyi müddətdə böyük günahlardan saymışdır. Əgər şetyandan kömək istənilərsə, ona sığınılırsa – böyük şirkdir. Sehrin həqiqəti şeytanı öz işi üçün istifadə etməkdir. Sehirbaz da hər hansı bir işi şeytana yaxınlaşmadan edə bilməz. Şeytana yaxınlaşdıqda, o da sehri etməkdə ona köməklik göstərir.[636] Sehrbazın öldürülməsi isə qazı tərəfindən təyin edilir. Tövbəsi Rəbbi ilə özü arasındadır. Kəffarə olaraq öldürülür. Zina edənin daş-qalaq olunması kimi; ***"…Həqiqətən onlar belə şeyləri satın alanların axirətdə payı olmadığını yaxşı bilirlər".*** *(əl-Bəqərə 102).* ***"…Onlar Cibt və Tağuta inanır".*** *(ən-Nisa 51).* ***"Musa: "Siz atın"- dedi. Onlar*** *(əllərindəkiləri və əsaları)* ***atdıqda, adamların gözlərini bağlayıb*** *(sehrləyib)* ***onları qorxutdular və böyük bir sehr etdilər".*** *(əl-Əraf 116).* ***"Musa dedi: "Xeyr,*** *(əvvəlcə)* ***siz tullayın!*** *(onların əllərindəki ipləri və dəyənəkləri yerə atan kimi)* ***Musaya elə gəldi ki, onların sehri nəticəsində kəndirləri hərəkətə gəlib sürünür".*** *(Ta ha 66).* ***"Şeytanların kimə nazil olduqlarını sizə xəbər verimmi? Onlar hər bir günahkara, yalançıya*** *(cadukara, falçıya, sehrbaza və adlarını kahin qoyub xalqı aldadanlara)* ***nazil olur".*** *(əş-Şuəra 221-222).* ***"Sehrbaz isə harda olursa olsun mətləbinə çatmaz".*** *(Ta ha 69).* ***"Sehrbazlar*** *(dünya və axirətdə)* ***nicat tapmazlar".*** *(Yunus 77).* Ömər ψ rəvayət edir ki: "***Cibt*** – sehirdir, ***Tağut -*** şeytandır".[637] Cabir ψ rəvayət edir ki: "***Tağutlar -*** şeytanların səmadan enib xəbərlər gətirdikləri kahinlərdir ki, onların hər birində bir şeytan vardır".[638] İmam Məlik Σ deyir: "***Tağut -*** Allahdan qeyri ibadət edilən hər bir şeydir". İbn Abbas Σ rəvayət edir: "***Cibt -*** bütlərdir". əş-Şabi Σ deyir: "***Cibt -*** münəccimlərdir". Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Özünüzü yeddi həlak edici günahdan qoruyun". Səhabələr: "Ya Rəsulullah! Onlar hansılardır?"- deyə soruşdular. Peyğəmbər ρ: "Allaha şərik qoşmaq, sehrlə məşğul olmaq, haqqı olmadan Allahın haram etdiyi insanı öldürmək, sələm (faiz) almaq, yetim malını yemək, döyüş günü meydandan qaçmaq, ismətli, namuslu qadınları namussuzluqda ittiham edərək böhtan atmaq".[639]

---

[636] Allaha şərik qoşmadan sehr etmək mümkün deyildir. İnsan artıq düyünlərə üfürməkdən öncə şirk etmişdir. Çünki, ilk öncə bunu etmək üçün necə edilməsini öyrənmişdir. Öyrənmək özü belə şirkdir. Kim qəlbini Allahla bağlayarsa bu ona kifayət olar. Kim də qəlbini Allahdan qeyrisi ilə bağlayarsa şirk edər.

[637] əl-Buxari 8/100.

[638] əl-Buxari 8/100.

[639] əl-Buxari 5/294, 2767, Muslim 89, Əbu Davud 2874, ən-Nəsai 6/257, İbn Hibban 5561.

İbn Qudamə Σ deyir: "Sehr düyünlər, oxumalar və söylənən sözlər, yazılan ifadələr, edilən şeylərdir ki, bunlar sehr edilən kimsənin bədəninə, qəlbinə və ya ağlına bilavasitə təsir edir. Sehirin bir həqiqəti vardır ki, kimisə öldürür, kimisə xəstə edir, kimisə xanımına yaxınlaşmaqdan çəkindirir, ər və arvadı bir-birindən ayırır. Sehrin öyrənilməsi və öyrədilməsi haramdır". Bəziləri özlərinə təskinlik vermək üçün deyirlər ki, biz insanlara yaxşılıq edirik, onların dərdlərini azaldırıq. Buna da "ağ maqiya" adını verirlər. Lakin bu əsla belə deyildir. Nə ağ maqiya, nə də qara maqiya ilə məşğul olmaq olmaz. Bunların hər ikisi də haramdır. Bu işlə məşğul olan adam tövbə etməsə – *Allah Qorusun* – dünyasını da, axirətini də puç edəcəkdir. Əgər sehr yaxşı bir şey olsaydı Allah ondan sığınmağı əmr etməzdi; ***"De ki: "Pənah aparıram sübhün Rəbbinə, yaratdıqlarının şərindən, zülmətə bürünməkdə olan gecənin şərindən,*** *(ovsun oxuyub)* ***düyünlərə üfürən*** *(yaxud cadu edib iplərə düyün vuran)* ***qadınların şərindən və bir də paxılın şərindən".*** *(əl-Fələq 1-5).* ***"De ki: "Pənah aparıram insanların Rəbbinə, insanların ixtiyar sahibinə, insanların ilahına, vəsvəsə verən, qaçıb gizlənən şeytanın şərindən. O, şeytan ki, insanların ürəklərinə vəsvəsə salır. O, şeytan ki, cinlərdən də olur, insanlardan da".*** *(ən-Nəs 1-6).* Nə üçün qadınlar? Çünki, bu işlə ən çox məşğul olan qadınlardır. O, düyünlərdə elə bir şey var ki, sehr edilən kimsəyə məxsus olduğu üçün ona təsir edir. Şeytanın təlqin etdiyi sözləri düyünlərə oxuyaraq şeytanı Allaha şərik qoşurlar. Allaha qarşı küfr etmədikcə sehir yerinə yetirilə bilməz. Qurana qarşı küfr edirlər, ayələri nəcislə yazırlar, murdar yerlərə atır və bundan sonra şeytan onaköməklik göstərir. Onlar sehri Tövhidin yerinə satın almışlar. Şeyx Useymin Σ deyir: "Ona görə də sehrin istənilən növü ilə məşğul olanın həddi ölümdür. Çünki, sehri ilə bir çox insanların həyatını korlamışdır. Öldürüldüyü zaman müsəlman olaraq qalır, yoxsa dindən çıxmış olur? Bu rəydə daha doğru olan dinsiz olmasıdır. Yəni kafir olaraq öldürülməsidir. (Bu da İslam dövlətində qazılar tərəfindən həyata keçrilir). İstənilən bir halda öldürülür. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Sehrbazın cəzası qılınc zərbəsidir".[640] Bəcələ ibn Əbdən Σ rəvayət edir ki: "Ömər ψ yazılı surətdə fərman vermişdir ki, hər bir sehrbaz kişi və qadını öldürün. Biz də üçünü öldürdük".[641]

Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Uca Allah səmada bir iş üçün əmr verdikdə, mələklər Onun dediklərinə tabe olmaq əlaməti olaraq qanadlarını başları üzərində açarlar. Sanki onlar qayaya çırpılmış zəncir gurultusundan qorxurmuşlar. Onların ürəyindən qorxu getdikdən sonra isə soruşurlar: "Rəbbimiz nə buyurdu?" Onlara: "Haqqı buyurdu. O, hər şeydən Ucadır və Böyükdür". Şeytanlar bu sözləri eşitmək üçün oğrun-oğrun bir-birinin belinə minirlər (Sufyan ibn Uyeynə Σ bunu əlinin barmaqları ilə təsvir etdi) üstdə olan eşitdiyini altındakına çatdırır, o da

[640] ət-Tirmizi 1460, əl-Hakim 4/ 360, 8073, əl-Beyhəqi 8/ 136.
[641] əl-Buxari 6/ 184, ət-Tirmizi 1586, Əhməd 1/ 190, Əbu Davud 3043.

öz növbəsində altındakına yetirir ki, həmin sözləri kahinə və ya falçıya çatdıra bilsin. Şeytan o, sözü falçıya çatdırmamış axan ulduz onu məhv edir və ya ulduz şeytana çatmamış şeytan sözü falçıya çatdırır və o da bu doğruya yüz yalan əlavə edir. Adamlar da deyirlər ki: "Məgər bizə filan günü belə-belə demədinmi? Bununla da səmadan eşidilən doğru söz insanlarda onlara qarşı inam yaradır".[642] İbn Abbas ψ rəvayət edir ki, Peyğəmbərin ρ Ənsardan olan səhabələrindən biri mənə xəbər verdi ki, bir gecə Peyğəmbər ρ ilə birlikdə otururkən axan ulduz düşdü və ətrafı aydınlaşdırdı. Peyğəmbər ρ onlara buyurdu: "Cahiliyyə dövründə bunun kimi bir ulduz düşdükdə nə deyirdiniz?" Onlar: "Allah və Onun Rəsulu ən gözəl biləndir. Biz bu gecə böyük bir kimsə doğuldu və böyük bir kimsə öldü deyirdik"- dedilər. Peyğəmbər ρ: "Şübhəsiz ki, bu ulduz heç kəsin ölümü və həyatı üçün atılmaz. Lakin uca və böyük olan Rəbbimiz bir işi hökm etdiyi zaman ***Hamalətul Arş*** (Ərşi daşıyan mələklər) təsbih edərlər. Sonra onların ardınca səma əhli təsbih edər. Nəhayət bu təsbih səma və dünya əhlinə çatır. Ərşi daşıyan mələklərdən sonra gələn mələklər onlara: "Rabbimiz nə buyurdu?"- deyə soruşarlar. Onlar da Rəblərinin buyurduğunu xəbər verərlər. Beləcə səmalar əhalisinin bir qismi digərindən xəbər istəyər. Beləcə xəbər dünya səmasına çatır. Bu an cnlər oğrun-oğrun qulaq asaraq bu sözləri oğurlayaraq dostlarına (sehrbazlara, falçılara) çatdırarlar və axan ulduzlarla (mələklər) onları vurarlar. Gətirdikləri (oğurladıqları) şey sabitdir. Lakin onlar bunun üzərinə yalan qarışdırırlar; ***"Onun hüzurunda izn verdiyi kimsələr istisna olmaqla heç kəsin şəfaəti fayda verməz. Nəhayət ürəklərindən o, müdhiş qorxu çıxınca onlar: "Rəbbimiz nə buyurdu?"– deyə soruşar və o birilər də: "Haqqı buyurdu! O,*** *(hər şeydən)* ***ucadır,*** *(hər şeydən)* ***böyükdür"– deyə vcavab verərlər".*** *(əs-Səba 23)"*.[643] ***"Biz səmada bürclər yaratdıq, onları baxanlar üçün bəzədik. Onları hər bir məlun şeytandan qoruduq. Lakin*** *(şeytanlardan)* ***kim*** *(mələklərin söhbətinə)* ***xəlvəti qulaq assa, onu odlu bir axan ulduz təqib edər*** *(və üstünə düşüb yandırar)*". *(əl-Hicr 16-18).* Muaviyə ibn Həkəm əs-Suləmi ψ rəvayət edir ki, Peyğəmbərdən ρ soruşdum: "Ya Rəsulullah! Mən müşrik bir kimsə idim. Sonra Allah bizə hidayət verdi. Lakin bizim içərimizdə elə kimsələr var ki, kahinlərin yanına gedirlər". Peyğəmbər ρ: "Kahinlərin yanına getməyin. (Başqa rəvayətdə: "Bizdən cizgilər çəkib yazılar yazan bir qrup kimsələr vardır"- dedi. Peyğəmbər ρ: "Peyğəmbərlərdən bir Peyğəmbər cızıb yazardı. Hər kmin yazısı onun yazısına uyğun olarsa qurtulan odur)"- deyə buyurdu. Mən: "Biz təşəum edərdik (bəzi şeyləri uğursuz sayardıq)"- dedim. Peyğəmbər ρ: "Bu hər hansı birinizin qəlbində hiss etdiyi əsli olmayan bir şeydən ibarətdir. Əsla bu əsli olmayan şeylər sizi kəsb edib getdiyiniz işlərdən uzaqlaşdırmasın"- deyə buyurdu".[644] Aişə O

[642] əl-Buxari 4701, ət-Tirmizi 3223, İbn Məcə 94, İbn Hibban 36, İbn Cərir 22/ 91, İbn Kəsir 3/ 538, İbn Xuzeymə "Tövhid" s. 144, İbn Əbi Asim 515.

[643] Muslim 2224.

[644] əl-Buxari 5762, Muslim 2228.

rəvayət edir ki, mən: "Ya Rəsulullah! Kahinlər bizə bəzi şeyləri söyləyirlər ki, onların dedikləri doğru çıxır". Peyğəmbər ρ: "Bu doğru (sabit) olan kəlimələrdir ki, cinlər oğrun-oğrun qulaq asaraq (bu kəlimələri) oğurlayaraq öz dostlarının (sehrbazların, falçıların, kahinlərin) qulağına sözlərə yüz dənə yalan əlavə edərək pıçıldayarlar (Başqa rəvayətdə: "Toyuğun qaqqıldaması kimi sözləri onların qulağına əyilərək boşaldarlar. Onlar heç bir şey deyillər)"- deyə buyurdu".[645] Qabisə ibn əl-Mubarək ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Cizgilər çəkərək fala baxan, quşun ötməsini uğur və ya uğursuzluq sayan və quşun sağa-sola uçmasından (sağ tərəfə uçarsa xeyir, sol tərəfə uçarsa şər kimi) mənalar çıxarmaq küfrün əlamətidir".[646]

***Sehirbazın Qazancının Haram Olması*** - Əbu Məsud əl-Bədri ψ rəvayət edir ki, Peyğəmbər ρ itdən gələn pulu, zinakarın qazancını və falçılıqdan gələn pulu götürməyi qadağan etmişdir".[647] Zeyd ibn Ərqam ψ rəvayət edir ki, Əbu Bəkrin ψ bir qulluqçusu var idi. Onunla şərt kəsmişdi ki, özünü satın alıb azad edəcəkdir. Hər dəfə o, bir şey gətirdikdə Əbu Bəkr ψ ondan soruşardı: "Bu haradandır?" Əgər cavab onu qane edərdisə yeyərdi, qane etmədikdə isə yeməzdi. Oruclu günlərin birində qulluqçusu ona yemək gətirdi. Əbu Bəkr ψ yeməyin haradan olduğunu soruşmağı unudaraq yeməkdən bir loxma ağzına qoydu. Xatırladığı zaman: "Bu yemək haradandır?"- deyə soruşdu. O: "Cahiliyyə vaxtı mən kahinliklə (gələcəyi xəbər verməklə) məşğul idim. Həqiqətdə isə bu belə deyildi və mən sadəcə (insanları) aldadırdım. Bu yemək də (həmin işin) əmək haqqıdır. Əbu Bəkr ψ: "Sənin etdiyin əməl necədə pis bir işdir. Məni həlak edəcəkdin?" Sonra yediyini qusmağa çalışdı. Lakin bacarmadı. Ona su ilə çıxacağını dedilər. O da su içərək qaytarmağa başladı. Mədəsində olan hər bir şeyi qaytarmaqla təmizlədi. Ona: "Sən bütün bunları bir loxmaya görə edirsən?"- dedilər. Əbu Bəkr ψ dedi: "Əgər bu məndən canımla birlikdə çıxsaydı belə mən bunu edərdim. Həqiqətən mən Peyğəmbərin ρ belə buyurduğunu eşitdim: "Cəhənnəm oduna ən layiqli bədən haram ilə qidalanandır".[648]

***Bəlağət Sehirdimi***? - Sehr ümumi bir addır. Bunun içərisinə sehrin digər növləri də daxildir. Hər biri də bir-birindən hökmünə görə fərqlənir. Bəlağət də sehr adlanmışdır. Burada şeytandan kömək yoxdur. Lakin dil cəhəddən sehrin içərisinə daxildir. Gizli olaraq insanların qəlblərinə təsir edir. Bəlağətli insan danışığı ilə yalanı doğru olaraq insanlara çatıra bilər və bununla insanların qəlblərinə təsir edərək onları əsir alır. İnsanlar artıq onun yalanına inanmağa başlayırlar. Bu sehr hökümdə də birincidən fərqlənir. Sehrdə böyük şirk vardır. Lakin bu sehr digərinin hökmündə deyildir. Qılıncla öldürülmək həddi də bu sehr növünə aid deyildir. İbn Ömər ψ

---

645 Muslim 2229.

646 Əbu Davud 3907, əl-Albani zəif adlandırmışdır.

647 əl-Buxari 2237, Muslim 1567.

648 əl-Buxari 3843, Əbu Nuym 1/ 31, əl-Beyhəqi 5760, əl-Albani "Səhih".

rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Bəlağətdə də sehrdən bir pay vardır".[649] İbn Ömər ψ rəvayət edir ki, bir gün şərq tərəfdən iki nəfər gəlmişdi və onlar öz bəlağətli sözlərilə insanları məst etmişdilər. Bu xəbər Peyğəmbərə ρ çatdıqda buyurdu: "Həqiqətən də bəlağətli danışıq (insana) sehrin təsiri kimi təsir göstərə bilər".[650] ***Həmçinin*** – Nəmmamlıq da insanlara sehr kimi təsir edir. Sehr iki sevən insanı bir birindən ayırdığı kimi, nəmmamlıq edərək müsəlmanların arasını vuran kimsə də sehr kimi təsir edir. Qəlblər arasında düşmənçilik, kin, nifrət yaradır. Ən böyük sehirbazlar bilirsizmi kimdir? İslam alimlərini gözdən salmağa çalışanlar, insanlar arasında onlara qarşı nifrət yaratmaq istəyənlərdir. Tövhid insanın gözünü açır, bizə kimin-kim olduğunu öyrədir. İbn Məsud ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Mən sizə nəyin sehrə aid olduğunu deyimmi? Bu nəmmamlq və insanlar arasında söz gəzdirməkdir".[651]

***<u>Kahinlər Kimlərdir?</u>* -** gələcəkdə baş verəcək hadisələrdən (qeybdən) xəbər verən, (falçılıq etmək mənasındadır). Bu falçılar sadəlövh insanları özlərinə inandırmağa məcbur edirlər, onların pullarını və mallarını haram yolla onların əlindən alırlar. Qum üstünədə cizgi çəkməklə, əl içinin xətlərini oxumaqla, balıqqulağı, kofe stəkanı ilə, fincan, güzgü və s. üsullar tətbiq edirlər. Gələcəyini bilmək, nigahda və ticarətdə xoşbəxtmi və yaxud bədbəxtmi olacaqlarını öyrənmək, ulduzlar vasitəsilə gələcəyi xəbər vermək, yer üzündə krizisin olacağını, qiymətlərin qalxıb enməsini, kimiləri də onların yanına nə zaman evlənəcəklərini bilmək, kimə ərə gedəcəyini, kiminsə ailəsini dağıtmağı, itirilmiş əşyaları tapmaq və buna oxşar məqsədlərlə sehirbazların yanına gedirlər. Guya ki, oğurlanmış, itmiş şeylərin yerlərini göstərə bilən kimsələrdir. Onlar avam insanları aldadaraq Qurani-Kərimi açırlar və itən əşyaların yerlərinin orada yazıldığını xəbər verirlər. ***Subhənəllah!*** Bu qədər yalan olar!? Məgər Qurani-Kərimdə insanların itən əşyaları haqda bir şeylər yazılıb. Bu qədər də avamçılıq olar. Dəhşət burasıdır ki, insanlar da onlara inanırlar. Artıq sehri insanlar bir incəsənət ediblər. Bunun üçün klublar açılır, yarışlar keçirilir, sehirbazlar seçilir. ***Allah Qorusun***. Özünü Allahın yaxını və qeybi bildiyini bəyan edən kəs Allahın yaxını yox, şeytanın dostudur. Qeybi bilmək yalnız Allaha xas olan bir haqdır; ***"Qeybin açarları*** *(Allahın)* ***yanındadır. Onları ancaq O bilir.*** *(Allah)* ***suda və quruda nə varsa bilir. Yerə düşən elə bir yarpaq yoxdur ki,*** *(Allah)* ***onu bilməsin. Yerin zülmətləri içində elə bir toxum,*** *(kainatda)* ***elə bir şey yoxdur ki, açıq-aydın kitabda olmasın".*** *(əl-Ənam 59).* ***"Qeybi bilən ancaq Odur və Öz qeybini heç kəsə əyan etməz. Bəyənib seçdiyi Peyğəmbərdən başqa! Allah onların önündə və arxasında gözətçilər qoyar".*** *(əl-Cinn 26-27).* Buna

---

[649] əl-Buxari 5146, Muslim 869, Əbu Davud 5007, ət-Tirmizi 2028, İbn Hibban 5795, Əbu Yəla 5639. Gözəl danışmaq sehr kimi təsir edir. Çünki, gözəl danışan adam həqiqəti yalan, yalanı isə həqiqət kimi təqdim edir. Cahil insanların ürəkləri buna meylli olur və onlar yalanı qəbul edib həqiqəti inkar etməyə başlayırlar.

[650] əl-Buxari 5767.

[651] Muslim 2606, əl-Beyhəqi 10/ 246, Əbu Yəla 5363.

görə də sehrbaza inanan bu ayələrin həqiqiliyini inkar etmiş olur ki, bu da küfrdür. Falçının və ya cadugərin yanına gedən şəxs, onların dediklərinin doğru olduğuna inanarsa küfr etmiş olar. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim bir kahinin (sehirbazın) yanına gələrək onun dediyini təsdiq edərsə, Muhəmmədə nazil olana küfr etmiş olar".[652] İmran ibn Huseyn ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim (düşər-düşməzlik, nəhs gətirmək və s. mövhumatı) sınaq etsə, yaxud etdirsə, kim falcılıq etsə, yaxud öz falına baxdırsa, kim sehr etsə, yaxud sehrbaza müraciət edib inansa bizdən deyildir. Kim də kahinin yanına gedib onun dediklərini təsdiqlərsə, Muhəmmdə nazil olana küfr etmiş olur".[653] Əgər cadugər və ya falçı yanına gedən şəxs onun qeybi bildiyini qəbul etmirsə və onu sadəcə dinləmək və ya buna bənzər bir səbəblə gedirsə küfr etmiş olmur, lakin fərz namazları qırx gün müddətində qəbul edilmir.[654] Peyğəmbər ρ buyurdu: "Kim ***Ərraf***[655] adlanan bir kahinin yanına gələrək ondan bir şeylər barəsində soruşaraq təsdiq etsə (inansa), qırx günlük namazı qəbul edilməz".[656] İmam əl-Manavi Σ deyir: "Bizdən deyildir – yəni İslamın yolundan və bizim Sünnəmizdən deyildir. Çünki bu əməl cahiliyyə dövrünün əməlidir".[657] Sehirbazı ziyarət etmək insanı İslamdan çıxardır yoxsa yox? Alimlər sehirbazın yanına gələrək onun dediklərini təsdiq edən kimsənin küfrü barəsində ixtilaf ediblər. O alimlər ki, sehirbazın yanına gələrək onun dediklərini təsdiq edən kimsənin küfrünün İslamdan çıxardan olduğunu söyləmişlər - onların dəllləri: "Kim bir kahinin və ya sehirbazın yanına gedib onun dediyini təsdiq edərsə, Muhəmmədə nazil olana küfr etmiş olar".[658] Onlar: "Əgər bir kimsə sehirbazın yanına gələrək (onu təsdiq etmədiyi) halda bir şeylər soruşarsa, onun namazı qırx gün qəbul edilməz. Bu da bu əməlin kiçik küfr olmasına dəlildir. Lakin təsdiq edib iman gətirsə, artıq kafir olmuşdur". Digər qrup alimlər: Bu əməlin kiçik küfr olduğunu və İslamdan çıxarmadığını söyləmişlər. Küfürən bəhs edən bütün hədislər bu əməlin kiçik küfr olmasına dəlildir. Peyğəmbər ρ buyurdu: "Kim ***Ərraf*** adlanan bir kahinin yanına gələrək ondan bir şeylər barəsində soruşarsa (inansa) qırx günlük namazı qəbul

---

[652] Əhməd 2/ 408, 429, 476, Əbu Davud 3903, ət-Tirmizi 135, əd-Dərimi 1136, əl-Albani səhih demişdir.

[653] əl-Munziri "Tərğib vət-Tərhib" 4/ 52, 3044, əl-Heysəmi 5/ 117, əl-Bəzzar 3/ 399, əl-Albani "Səhih Tərğib" 3041.

[654] ***Qırx Günlük Namazı Qəbul Olunmaz*** – sözü nə deməkdir? İnanarsa qırx günlük namazı qəbul olunmaz, yəni onun namazı dəstəmazsız namazı qılan bir kimsənin namazı kimi səhih olmaz. O savab ki, namzdan hasil olur, bu zaman olmayacaq. Nə üçün qırx gün? Bunun hikməti isə bilinmir.

[655] ***Ərraf*** – Arif – bilən deməkdir. Ərraf kimdir? Bu barədə ixtilaf vardır. Kahindir - demişlər. Şeytanlar vasitəsilə gələcəkdən xəbər verəndir. Bəziləri isə: Ərraf daha geniş məna olub kahin, astroloq, insanın qəlbində, ağlında olanı söyləyən, müxtəlif şeylər vasitəsilə fala baxan və s. deməkdir. İbn Əsir Σ deyir: "Münəccim, qeybi bildiyini iddia edən kimsədir". Xattabi Σ deyir: "Oğurlanmış əşyanın yerini deyən, qeyb olan şeylərin məkanını bilən və s. buna bənzər şeyləri söyləyən kimsədir".

[656] Muslim 2230, Əhməd 5/ 380, 4/ 68, ət-Tabərani "Mucəmul-Kəbir" 23/ 210.

[657] "Feydul-Qadir" 5/ 384.

[658] Əhməd 2/ 408, 429, 476, Əbu Davud 3903, ət-Tirmizi 135, əd-Dərimi 1136, əl-Albani səhih demişdir.

edilməz".[659] Peyğəmbər ρ buyurdu: "Kim kahinin yanına gedib onun dediyini (təsdiqləyərsə) və ya heyzli qadınla əlaqədə olarsa və yaxud qadınla arxadan yaxınlıq edərsə, Muhəmmədə nazil olana küfr etmişdir".[660] Bu hədis açıq-aydın dəlildir ki, söhbət kiçik küfdən gedir. Çünki, digər günahlarla yanaşı işlədilmişdir. Bu əməli halal sayarsa – bu istisnadır.

***<u>Qeybi Bilən Allahdır</u>* -** Falçıya və cadugarə gəldikdə isə onların hər ikisi də Allahı inkar edənlərdir. Onlar qeybi bildiklərini iddia edirlər. Halbuki qeybi yalnız Allah bilir; ***"Allah pisi yaxşıdan ayırmaq üçün möminləri sizin indi olduğunuz vəziyyətə qoyan deyildir. Allah sizə qeybi də bildirən deyildir. Lakin Allah öz Peyğəmbərlərindən istədiyi şəxsi seçər*** *(ona qeybdən bəzi şeyləri bildirər).* ***Buna görə də Allaha və Onun Peyğəmbərinə inanın. Əgər inanıb Allahdan qorxsanız, sizi böyük bir mükafat gözləyir".*** *(Ali İmran 179).* ***"De ki: "Mən sizə demirəm ki, mənim yanımda Allahın xəzinələri vardır. Mən qeybi də bilmirəm və sizə də demirəm ki, mən mələyəm. Mən özümə gələn vəhyə tabe oluram". De ki: "Kor görənlə bir olurmu? Məgər düşünmürsünüz!"*** *(əl-Ənam 50).* ***"De ki: "Mən Allahın istədiyindən başqa özümə nə bir xeyir, nə də bir zərər verə bilərəm. Əgər qeybi bilsəydim, sözsüz ki,*** *(özüm üçün)* ***daha çox xeyir tədarük edərdim və mənə pislik də toxunmazdı. Mən iman gətirən bir tayfanı qorxudan və müjdələyənəm"*** *(əl-Əraf 188).* ***"Qeybi bilən ancaq Odur! O, qeybi heç kəsə əyan etməz".*** *(əl-Cinn 26). "(Ya Muhəmməd!)* ***De ki: "Allahdan başqa göylərdə və yerdə olanı, qeybi heç kəs bilməz! Onlar yenidən nə vaxt diriləcəklərini də bilməzlər!"*** *(ən-Nəhl 65).* ***"Sonra Süleymana ölüm hökmü verdiyimiz zaman onun öldüyünü onlara*** *(cinlərə)* ***Süleymanın əsasını yeyən ağac qurdu xəbər verdi. O, ölmüş halda yerə sərildikdən sonra cinlərə bəlli oldu ki, əgər onlar qeybi bilsəydilər, alçaldıcı əzab içində qalmazdılar".*** *(Səba 14).* ***"Qeybin açarları Allahın Əlindədir. Onları ancaq Allah bilir. Allah həm suda, həm də quruda olanların hamısını bilir. Elə bir düşən yarpaq yoxdur ki, Allah ondan xəbərsiz olsun, yerin zülmətləri içində elə bir toxum, kainatda elə bir şey yoxdur ki, məhz açıq-aydın*** *(lövhi məhfuzda)* ***olmasın".*** *(əl-Ənam 59).* ***"Qeyb aləmi ancaq Allaha məxsusdur".*** *(Yunus 20).* ***"Göylərin və yerin qeybi Allaha məxsusdur".*** *(Hud 123).* Əgər bir kimsə kahin və sehirbazların qeybi bildiyinə iman edərsə, artıq bu əməl onu İslam dairəsindən çıxardar. İmam əl-Manavi Σ deyir: "Kahinin yanına gələrək onun dediklərinin haqq olduğuna inanan kimsə kafir olmuşdur. Əgər etiqad etsə ki, kahinlər bütün bu xəbərləri cinlərdən, onlar da öz növbəsində mələklərdən oğurlayaraq xəbər verirlər, bu zaman o kafir olmur".[661] Şeyx Abdul-Lətif Əli Şeyx Σ deyir: "Hədisdə Peyğəmbər ρ buyurur: "Məndən sonra bir-birinizin boynunu vuran kafirlər kimi olmayın" və hədis: "Kim kahinin yanına gedib

---

[659] Muslim 2230, Əhməd 5/ 380, 4/ 68.
[660] Əbu Davud 3904, əl-Beyhəqi 7/198, H. 13902, əl-Albani "Səhihul-Cəmi" 5918, 5942.
[661] "Feydul Qadir" 6/23.

onun dediyini (təsdiqləyərsə) və ya heyzli qadınla əlaqədə olarsa və yaxud qadınla arxadan yaxınlıq edərsə, Muhəmmədə nazil olana küfr etmişdir"- bu hədislərdə söhbət əməldə olan küfrdən gedir, lakin bu əməli küfr bütə ibadət edənin, Peyğəmbəri ρ söyənin, Quranı ələ salanın küfrü kimi deyildir".[662] Şeyx Saleh Əli Şeyx – *hafizahullah* - deyir: "Kahinin və ya sehirbazın yanına gedərək onun dediklərinə inanan kimsənin küfrü, onu İslam dairəsində çıxardan küfrdür"- deyənlərin sözləri mübahisəlidir. **1.** Hədisdə deyilir ki, belə bir kimsənin qırx günlük namazı qəbul edilmir. Bu da ona dəlildir ki, bu əməl kiçik küfrdür. Əgər belə bir kimsə kafir olsaydı onda (qırx gün) namazın qəbul olunmasının zikr edilməsinə heç bir ehtiyacı olmazdı. **2.** Heç şübhəsiz ki, Allahdan qeyri kimisənin qeybi bildiyini iddia etməsi küfrdür, lakin insanların əksəriyyəti kahinlərə onların hərdən doğru xəbər vermələrinə görə inanırlar. Buna görə də əgər bir kimsə kahinin və ya sehirbazın yanına gələrək ona: "Mən sənə cinlərin səmalardan oğurladıqları qeybi sözlərə görə inanıram"- deyərsə, bu zaman İslam dairəsindən çıxmır. Bu məsələdə açıq-aydın dəlil odur ki, belə bir kimsə böyük küfr deyil, kiçik küfr etmiş olur".[663]

***<u>Həmçinin</u>*** – bir çox cahil müsəlmanlar elə zənn edirlər ki, kahinlərin qeybdən xəbər vermələri Allahın onlara verdiyi bir vergidir. Çünki, kahin və sehirbazlar arasında namaz, həcc edən kimsələr də vardır. Bu da müsəlmanları daha çox zəlalətə salır. Lakin Muvahhid olan bir kimsə bütün bunların şeytanın bir tələsi olduğunu anlayır. Çünki şeytan Rəbbinə and vermişdir ki, "Sənin bütün bəndələrini doğru yoldan çıxaracağam". Sələflər deyirlər ki: "Şeytan insana doxsan doqquz xeyir qapısını açar. Lakin sonda yüzüncü həlak qapısını açmaqla onu həlak edər". Lakin bu hədislər kahin və sehirbazların yalanını üzə çıxarmaq, onları insanlar arasında rüsvay edilməsi niyyəti ilə çalışan kimsələrə aid deyildir. Heç şebhəsiz ki, bütün bunlar elmli bir kimsə tərəfindən, haqq ilə batili ayırd edə bilən kimsə tərəfindən aparılmalıdır. İbn Teymiyyə Σ deyir: "Lakin haqq ilə batili ayırd edəcək bir elmə sahib olan kimsənin kahini yoxlamaq, yalanını üzə çıxarmaq məqsədilə bunu edərsə, bu əməl icazəlidir". İbn Məsud ψ rəvayət edir ki, biz Peyğəmbər ρ ilə birlikdə idik. İçərilərində İbn Səyyad da olan bir dəstə uşaqların yanına gəldik. Uşaqlar qaçdılar. İbn Səyyad isə oturdu. Peyğəmbərin ρ ondan xoşlanmadığı bir halı var idi. Peyğəmbər ρ: "Mənim Allahın Rəsulu olduğuma şəhadət edirsənmi?"- deyə buyurdu. O: "Sən də mənim Peyğəmbər olduğuma şəhadət edərsənmi?"- dedi. Peyğəmbər ρ: "Cənnətin torpağı nədir?"- deyə buyurdu. O: "O, yumşaq və bəyazdır, iyi isə miskdir"- dedi. Peyğəmbər ρ: "Sən doğru dedin"- buyurdu. Peyğəmbər ρ: "Sən nə görürsən?"- deyə buyurdu. O: "Mən su üzərində bir taxt görürəm"- dedi. Peyğəmbər ρ: "Sən dərya üzərində İblisin taxtını görürsən. Bundan başqa nə görürsən?"- deyə buyurdu. O: "Mən bir (iki) doğru

---

[662] "Rasail əl-Nəcdiyyə" 3/15.
[663] "Şərh Kitabut-Tövhid" kasset 10.

söyləyən və bir (iki) yalan söyləyən görürəm. Mənə doğru xəbər də gəlir, yalan xəbər də"- dedi. O: "Qəlbimdə sənin üçün bir şey saxladım?"- dedi. Peyğəmbər ρ: "Nədir o!"- deyə buyurdu. O: "***Duhh*** (Duman)"- dedi. Peyğəmbər ρ: "Sus, həddi aşma"- dedi. Bu sözlərdən sonra Ömər ψ dedi: "Ya Rəsulullah! İzn ver onu öldürüm". Peyğəmbər ρ: "Əgər fikirləşdiyin (Dəccəl) bu uşaqdırsa, sən onu öldürməyə əsla nail olmayacaqsan. O, Dəccal deyilsə onu öldürməkdə sənin üçün bir xeyir yoxdur"- deyə buyurdu”.[664]

***Xülasə -*** Kahinin yanına gələrək ondan soruşan insanlar bir neçə qrupa bölünürlər: **1)** Sadəcə soruşmaq haramdır. **2)** Gedir və onun dediklərinə iman edir. Bu küfrdür. **3)** Sadəcə onu yoxlamaq, yalanını üzə çıxarmaq üçün soruşurlar - bu caizdir.

***Uğursuzluğa İnanmaq – Mövhumat, Xurafat, Düşər-Düşməzlik*** (rusca - Suyeveriya) – sehrin bir əlamətidir. Xurafata iman şirkdir. Çünki, Tövhidin kamiliyyinə ziddir. Mövhumat, Xurafat – hansısa bir səbəb səni hansısa əməli etməkdən qoyur və ya sənin o, işə yönəlməyinə səbəb olur. ***Tətəyyur*** - kiçik şirkdir. Quş uçuşu ilə işin alınıb-alınmamasına inanmaqdır. Ərəblərdən biri səfər etmək və hər hansısa bir iş görmək istədikdə bir quş uçurardı. Əgər quş sağ tərəfə uçsaydı, o işi uğurlu sayardı, yox əgər sol tərəfə uçsaydı, uğursuzluq sayar və o işdən əl çəkərdi. ***Sanihə - Savanih -*** Sağa uçardısa xeyirə yozardılar. ***Barihə - Bavarih -*** Sola uçardısa şərdi. ***Natihə - Navatih -*** Sənə tərəf, arxaya uçardısa ***Qaid*** adlanardı. Mövhumat, Xurafat – əksər vaxtı heç quşlarla əlaqəsi olmur. Hansısa bir əlamətlərlə səfərin yaxşı və ya pis olacağına inanırlar. Nə zaman şirk sayılır? Qəlbdə narahatçılığın yaranmasından sonra o narahatçılıq onu əməli etməkdən qoyursa şirk olur (Mövhumat, Xurafat – ya səni əmələ yönəldir, ya da çəkindirir, qəlbdə narahatçılığın yaranması hələ də şirk deyildir). Lakin ondan sonra əməl gələrsə artıq şirkdir. ***Tətəyyur -*** İnsan gördüyü və eşitdiyinin (hiss etdiyinin) bədbəxtliyə gətirib çıxardığına etiqad edir. Onu bir səbəb kimi görərsə - kiçik şirk, əgər gördüyü və eşitdiyinin öz-özlüyündə, Allahdan başqa bir varlıq kimi ona bədbinlik gətirdiyinə etiqad edərsə, bu zaman, artıq böyük şirk etmiş olar. Gördüyündən və eşitdiyindən bədbinlik gözləyən insan iki vəziyyətə düşə bilər: **1)** Gördüyü, eşitdiyi və ya hansısa vaxtın, məkanın, görəcəyi işə uğursuzluq gətirəcəyinə inanıb, bu səbəbə görə fikrindən əl çəkərsə, cox böyük günaha - şirkə düşmüş olar. **2)** Belə bir şey gördükdə işini davam etdirən, amma rastlaşdığı xoşagəlməz halın işinə əngəl olacağından narahatlıq keçirən insanların düşdüyü vəziyyətdir. Bu halda onlar haram iş tutmuş olur. Həmin vaxt o insan Allaha olan ümüdini artırmalı, təvəkkül etməlidir ki, qəlbində olan şübhə ondan uzaqlaşsın. Auf Σ deyir: "***İyafə*** – quşların uçuş istiqamətlərinə görə gələcəkdən xəbər verməkdir. ***Tarq*** – yer üzərində xətlərin çəkilməsidir". ***Rimmal -*** Yerə və qum üzərinə sehr etmək qəsdi ilə cizgilər çəkmək, sehr etmək və ya qeybi bilmək üçün daş atmaq”- deyən də olmuşdur. Həsənul-Bəsri Σ

---

[664] Muslim 2924, 2925. “Məcmuul-Fətava” 19/ 62.

deyir: "***Cibt*** – şeytanın əks-sədasıdır".[665] Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim bir düyün bağlayıb ona üfürərsə, sehr etmiş olur. Kim də sehr edərsə, Allaha şərik qoşmuş olur. Kim bir şeyə bağlanarsa, ona təvəkkül etmiş olur".[666] İbn Məsud ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Tıyra şirkdir, Tıyra şirkdir. Elə bir kimsə yoxdur ki, bu hisslərə qapanarkən Allaha təvəkkül etdikdə bu ondan getməsin".[667] Peyğəmbər ρ buyurdu: "Uğursuzluğa inanmaq şirkdir".[668] Fadl ibn Abbas ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Tıyra səni işindən qoyan və ya irəli aparan bir şeydir".[669] Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Quş uçuran və onun üçün quş uçurulmasını istəyən, kahinlik edən və etdirən, cadu edən və etdirən bizdən deyildir".[670]

***Kəffarəsi*** **-** İbn Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim quş uçurmaqla (işin nəhs gətirməyinə inanıb) işindən qalsa şirk etmiş olur". Soruşdular: "Bəs bu günahı nə ilə yumaq olar?" Peyğəmbər ρ: "İlahi nə Sənin verdiyin xeyirindən başqa xeyir yoxdur, nə də Sənin (uçmasına) izn verdiyin quşdan başqa quş yoxdur və səndən başqa ilah yoxdur".[671]

Mövhumat, Xurafat – müşriklərin sifətlərindəndir. Müsəlmanın bunları bilməsi mühümdür. Mövhumat ümumi bir addır və onun bir neçə növü vardır. Tövhid əqidəsinə zidd olan belə haram əməllərdən: Ayların uğursuz olmasına inanmaq (Cahiliyyə ərəbləri Səfər ayında evlənməzdilər. Çünki, bu ayı uğursuz ay sayırdılar və aylarda baş verən nigahın uğursuz olduğuna da inanırdılar. Bu ayı boş bir ay sayardılar. Aişə O deyir ki, Peyğəmbər ρ mənimlə bu ayda evləndikdən sonra bu xurafata son qoydu), may ayında evlənməmək, günlərin uğursuzluğuna inanmaq (Birinci gün ağır gündür. Bu gündə iş görmək olmaz, beşinci günü ayın on üçünə düşərsə), rəqəmlərin uğursuzluğuna inanmaq (on üç rəqəminə), adların və ya şikəst adamların bədbəxtlik gətirməsinə inanmaq (dükançının ilk alıcısı şikəs birisi olarsa, o günü ticarətin zəif olmasına inanmaq), filankəsin əli yüngüldür və s. bu kimi xurafatlara inanmaq. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Nə

---

665 Əhməd "Musnəd" 20081, Əbu Davud 3907, ən-Nəsai "Sunənul-Kubra" 11108, İbn Hibban 6131, əl-Beyhəqi 8/ 139, İbn Əbu Xatim, Səid ibn Cubeyrin ψ sözlərini rəvayət edir ki: "Uca Allah İblisi lənətliyəndə onun siması dəyişərək mələklərin simasından tam başqa bir sima aldı və o, inildədi. Onun bütün əks-sədası bu dünyada Qiyamət gününə qədər qalacaqdır". Bəki ibn Məhləd özünün Qurana verdiyi təfsirində yazır ki: "İblis dörd dəfə inildəyib: Lənətlənəndə, qovulduqda, Allah Rəsulu ρ anadan olanda və Fatihə surəsi nazil olanda". Səid ibn Cubeyr ψ rəvayət edir ki, İbn Abbas ψ dedi: "Allah Rəsulu ρ Məkkəni fəth edəndə İblis elə fəryad çəkdi ki, səsinə bütün ordusu toplandı".

666 ən-Nəsai 7/ 112, Əhməd 4/ 310, əl-Hakim 4/ 216, ən-Nəsai "Sunənul-Kubra" 3542, ət-Tabərani "Mucəmul-Əvsat" 1492, əl-Albani "Zəif" 5702.

667 Əbu Davud 3910, ət-Tirmizi 1614, İbn Məcə 3537, İbn Hibban 6122, əl-Hakim 43, əl-Albani səhih demişdir.

668 Əhməd 1/ 389, əl-Albani "Səhihul-Cəmi" 3955.

669 Əhməd 1/ 213, Zəif.

670 ət-Tabərani 18/162, əl-Albani "Səhihul-Cəmi" 5435.

671 Əhməd 2/ 220, əl-Heysəmi "Məcməuz-Zəvaid" 5/ 180, əl-Albani "Səhih Silsilə" 1065.

xəstəliyə yoluxma (infeksiya), (Başqa rəvayətdə: "(Ey mömin!) Sən cüzəmlidən aslandan qaçdığın kimi qaç[672]), nə işin nəhs gətirməsi, nə bayquşun ulaması, nə də Səfər ayının nəhs ay olması, ulduzların təsiri yoxdur, təşəüm (hər hansı bir şeyi uğusuzluq saymaq) da yoxdur, qulyəbani də yoxdur, şər qüvvələr də".[673] Ənəs ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Nə xəstəliyə yoluxma, nə də işin nəhs gətirməsi doğrudur. Lakin gözəl bir söz, xoş bir kəlmədən ibarət olan Təfəul – söz mənim xoşuma gəlir".[674] Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Təşəüm yoxdur. Onun ən xeyirlisi təfəuldur".[675] "Ya Rəsulullah! Təfəul nədir?"- deyə soruşdular. Peyğəmbər ρ buyurdu: "Sizdən birinizin eşidəcəyi gözəl bir kəlimə (Başqa rəvayətdə: "Mən saleh bir sözü sevirəm")".[676] İbn Məsud ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Uğursuzluğa inanmaq şirkdir. Ona inanan adam heç bir vəchlə bizdən deyildir".[677] İbn Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Hər hansı bir şeydə uğursuzluq yoxdur. Uğursuzluq ancaq qadında, (xidmətçidə), atda və evdə olur".[678]

***<u>İnfeksiya yalandır</u>*** **-** Ərəb müşrikləri etiqad edirdilər ki, infeksiya – öz-özlüyündə təsir etmək gücünə malikdir. Yəni Allahın təqdiri olmadan öz-özlüyündə başqasına təsir etməsinə inanırdılar. Bu hədisdə də onların olması, təsir etməsi inkar edilmir. Yəni infeksiya var və İnfeksiya səbəbdir, onun nəticəsi isə xəstəlikdir. Xəstə insanı isə sağlam olan bir kəslə bir yerdə tutmaq olmaz. Biz xəstəlikdən qorunmaq üçün qorunuruq, lakin bu o demək deyil ki, xəstəlik öz-özünə keçir. Lakin inkar edilən onun öz-özlüyündə Allahdan qeyri hansısa bir (qüvvə) kimi təsirə malik olmasıdır. İnfeksiya öz-özlüyündə heç nədir, Allahın istəmədiyi müddətdə heç bir təsir qüvvəsinə sahib deyildir. Hadisələrin baş verməsi, səbəbləri yaradan da Allahdır. Lakin ərəblər elə etiqad edirdilər ki, mütləq xəstələnməlidir. Görürsən ki, insan xəstələr içərisində işləyir, onlara xidmət göstərir, lakin Allahın izni ilə xəstələnmir və ya özü xəstəliyin daşıyıcısıdır. Lakin xəstə deyildir. İnfeksiya sadəcə səbəbdir. Allah izn versə təsir edəcək, izn verməsə təsir etməyəcək. İnfeksiya səbəbdir. Lakin

---

[672] Səqif heyəti içində cüzəmli bir kimsə vardır. Peyğəmbər ρ ona buyurdu: "Biz səninlə beyətləşdik. Artıq sən geri dön"- diyə xəbər göndərdi (Başqa rəvayətdə: "Cüzəmli ilə görüşdükdə aranızda bir və ya ik süngü boyu qədər məsafə olsun"). Muslim 2231.

[673] əl-Buxari 10/ 182, 5757, Muslim 2220, Əbu Davud 3911, ən-Nəsai 7591, İbn Hibban 6133.

[674] əl-Buxari 10/ 181, 5756, Muslim 2224, Əbu davud 3916, ət-Tirmizi1615.

[675] ***Təfəul*** – uğurlu və xeyirli saymaqdır. Gözəl sözlə təfəul haqqında ən gözəl misal Peyğəmbərin ρ Hudeybiyyə səfərində Suheyl ibn Amrın adı ilə təfəul etməsidir. Məmər deyir ki, Əyyub İkrimədən xəbər verir ki, Suheyl ibn Amr gəldikdə Peyğəmbər ρ səhabələrə buyurmuşdu: "Artıq sizin bütün işləriniz yüngülləşdi!" əl-Buxari 2731, Muslim 1783.

[676] Muslim 2223.

[677] Əbu Davud 3910, ət-Tirmizi 1614, İbn Hibban 1427, İbn Məcə 3538.

[678] Muslim 2225, 2226. İmam Məlik Σ deyir: "Hədis zahirinə görədir. Çünki, Allah bəzən evdə oturmağı zərər və ya həlaka bir səbəb edir. Müəyyən bir qadını, atı, yaxud da xidmətçini almaq da belədir ki, bəzən həlak Allahın qəzası ilə bu şeylərin yanında hasil olur". Digər alimlər isə: "Evin uğursuzluğu onun darlığı, qonşunun pisliyi və əzabına görədir. Qadının uğursuqluğu doğmamasına, dilinin pisliyinə görədir. Atın uğursuzluğu isə qiymətinin baha olması və döyüş edilməməsi və səyahət edilməməsinə görədir". İmam Nəvəvi.

mövhumat, xurafat – isə heç səbəb də deyildir. Allahın qədərinə qayıdır. İnsan özü öz qəlbini belə şeylərlə bağlayır. Allahın təqdir etdiyinə heç vaxt təsir edə bilməz. Çünki, bu uydurulmuş bir şeydir. Allaha təvəkkül edib yoluna davam et. ***Bayquş Yalandır*** **-** Bayquşa oxşayan quşdur. Guya ki, öldürülən kimsə bayquşa dönərək qisas axtarır və ya hansı evə qonsa, deməli o evdə kimsə ölməlidir. Cahiliyyə ərəbləri bu quşların əcaib səslərini uğursuzluğa yozardılar. ***Səfər Yalandır*** – Cahiliyə ərəbləri haram aylarda olan qadağaları Səfər ayına keçirərdilər, bu ayları isə halal edərdilər. Digər təfsirdə: "Cahiliyyə ərəbləri Səfər ayında evlənməzdilər. Çünki, bu ayı uğursuz ay sayırdılar və aylarda baş verən nigahın uğursuz olduğuna da inanırdılar". ***Ulduzlar Yalandır*** **-** Cahiliyyə ərəbləri deyərdilər ki: filan ulduz şər gətirir, filan ulduz xeyir gətirir. Bütün bunları Allah ilə bağlamırdılar. ***Qulyəbani Yalandır*** – Qulyabanilər insanlara narahatçılıq törədirdilər. Evlərdə səs-küy salıb insanları qorxudurdular. İnsanlar müəyyən yerlərə getməyə qorxurdular. Bu hədislərdə olan qadağa bu şeylərin qadağan olunması deyildir. Bu şeyləri öz-özlüyündə təsir etməsinin inkar edilməsidir. Onlar yalnız Allahın izni ilə təsir edirlər; ***"Onlara bir yaxşılıq üz verəndə: "Bu, bizə məxsusdur!"– deyərdilər. Onlara bir pislik üz verdikdə isə, Musa və onunla birlikdə olanları uğursuzluq əlaməti sayardılar. Əslində onların uğursuzluğu Allah yanındadır, lakin onların çoxu bunu bilmir".*** *(əl-Əraf 131).* Fironun ailəsi bədbəxtliyə uğrayanda bunu Musaya υ və onunla olanlarla əlaqələndirib deyərdilər: "Bunların hamısı Musa υ və onun səhabələrinin ucbatındandır". Lakin Allah onların dediklərini təkzib edərək, onların əməllərindən nə baş verirsə (xeyir və şər) hər biri Allahdandır; ***"Elçilər dedilər: "Sizin uğursuzluğunuz öz ucbatınızdandır. Məgər sizə edilən öyüd-nəsihəti bəd əlamət sayırsınız? Doğrusu, siz həddi aşmış bir millətsiniz".*** *(Yasin 19).* ***"Harada olursunuz olun, hətta uca qalalar içərisində olsanız belə, ölüm sizi haqlayacaqdır. Onlara bir xeyir yetişdikdə: "Bu Allahdandır"– deyirlər, bir pislik üz verdikdə isə: "Bu səndəndir"– söyləyərlər.*** *(Onlara)* ***de: "Hamısı Allah tərəfindəndir. Bu camaata nə olub ki, az qala söz də anlamır! Sənə yetişən hər bir yaxşılıq Allahdandır, sənə üz verən hər bir pislik isə özündəndir. Biz səni insanlara Peyğəmbər göndərdik. Allahın buna şahid olması*** *(sənə)* ***kifayət edər".*** *(ən-Nisa 78-79).*

***Təfəul*** **-** Yaxşı söz deməkdir. İnsanlar yaxşı sözlə uğursuzluğu qarışdırırlar. Qara pişik keçdi, axsaq insan keçdi və s. mövhumata inanaraq yolunu dəyişir, işindən qalır – bu uğursuzluğa inanmaqdır. Çünki, bütün bu şeylər onun qarşısına çıxmasaydı yoluna davam edəcəkdi. ***Təfəul*** – nədir? Peyğəmbər ρ hansı Təfəulu sevərdi? İnsan nə olursa olsun yoluna çıxmalı, qara pişik çıxırqarşısından keçəndə ***Bismilləh*** – deyərək yoluna davam edir, qarşısına ***Səhl*** (asanlıq) adlı yaxşı bir adam çıxdıqda – "***İnşəallah***, Allah mənim üçün asanlaşdırar"– deyərək yoluna davam edir. Bu Təfəuldur. ***Gözəl söz*** **-** insana sevinc, fərəh gətirir, insanın təvəkkülünü, ümidini artırır. Peyğəmbər ρ bunu sevərdi. Allahın ona verəcəyi xeyrə ümidi daha da artır. Qəlbi möhkəmlənir,

xəstə yanında edilən gözəl söhbət onu həvəsləndirir, Allaha ümidini artırır, yaşamaq istəyini qüvvətləndirir. Allah barəsində xeyir zənn edir. Bu sözlər insanın qəlbini sevindirir, insana dəstək olur. Lakin buunla yanaşı insan Allaha təvəkkülünü çoxaltmalı, bu şeylərə isə bağlanmamaq Tövhidin kamilliyidir. İnsan Allah barəsində daima xeyir düşünməlidir. ***Təfəul*** – uğurlu və xeyirli saymaqdır. Gözəl sözlə təfəul haqqında ən gözəl misal, Peyğəmbərin ρ Hudeybiyyə səfərində Suheyl ibn Amrın adı ilə təfəul etməsidir. Məmər deyir ki, Əyyub İkrimədən xəbər verir ki, Suheyl ibn Amr gəldikdə Peyğəmbər ρ səhabələrə buyurmuşdu: "Artıq sizin bütün işləriniz yüngülləşdi!".[679] İnsan daima xeyir düşünməlidir. Bu insanın qəlbini genişləndirir, qəlbi rahatlayır. Müsəlmanda Təfəul olmalıdır. Nə baş verirsə xeyrədir. Əgər bütün işlərini qara pişiklə səbəb olaraq bağlayarsa kiçik şirk, bir başa bağlayarsa böyük şirk etmişdir və ya hansısa bir mövhumat ilə qarşılaşır, lakin əhəmiyyət vermədən keçib gedir. Getdikdən sonra şeytandan ona vəsvəsələr gəlir, qəlbi sıxılır, daralır, qorxuya düşür və s. Bu şirk olmasa da haramdır. Ona görə də müsəlmana vacibdir ki, qəlbinə bir şey düşərsə Allaha təvəkkül edib yoluna davam etsin. Baş verən şeylərə də əhəmiyyət verməsin. Hər şey qəza və qədərdəndir. Təvəkkülü güclü olan kimsə bu fikirlər qəlbə düşməzdən əvvəl onu qəlbindən çıxardar. Allah insanı imatahan da edə bilər, görəsən Allaha iman edəcək yoxsa, bu mövhümata. Mütləq Allah barəsində gözəl zənn etməlisən. Səbəb və hadisənin baş verməsi Allahdandır. Batan kimsə sahildə olanı köməyə çağırırsa, o da Allahın izni ilə onu xilas edirsə, deməli bu səbəbi yaradan, göndərən də Allahdar. Əgər Allah istəsəydi heç kəs ona kömək etməzdi. Bütün güc və qüvvət Allaha aiddir.

Bütün bunlar quşların uçuşu, qara pişiyin yoldan keçməsi, həftənin müəyyən günlərini, gecə vaxtı dırnaq tutmaq, ev süpürmək, qaşıq düşdü qonaq gələcək, gecə vaxtı güzgüyə baxmazlar və s. müxtəlif əşyaları, sözləri yozmaqla bədbinliyə qapanmaqdır. Allah mövhümatçılığı haram buyurub və pis əlamətləri inananları qınayır. O, gözəl əlamətləri sevir və pis əlamətlərə nifrət edir. Bu iki anlayış arasında xeyli fərq vardır. Xoş əlamət insanın əqidəsinə və şüuruna təsir etmir. Həmçinin onun qəlbini Allahdan başqa heç nə ilə bağlamır. İnsan bəd əlamət gördükdə qəti olaraq etmək fikrində olduğu işdən imtina edər və ya hansısa işdən dönə bilər. Bu da insanın qəlbinin bu haram əmələ bağlandığını və öz iradəsini və inancını ona tabe edərək onun ardınca gtməsidir. Şübhəsiz ki, bu da onun Allaha olan inamına, Tövhidinə və təvəkkül etməyinə təsir edir. Bu kimi fikirlər insana gələrsə, bununla mübarizə aparmalı, Allaha sığınmalı və Ondan kömək diləməlidir.

***<u>Ulduzlar</u>* -** barəsində elm iki qismdir: **1)** ***Elmun Təsir*** – Ulduzların təsiri. Bu da ***Astrologiya*** – elmidir. Hökmü nədir? Sehrin növlərindəndir. Küfr və şirkdir. İbn Abbas ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Astrologiya elmindən bir sahəni

[679] əl-Buxari 2731, Muslim 1783.

öyrənən sehrdən bir sahə öyrənmiş olur. Artırdıqca, o da artar".[680] Münəccimin qeybdən ulduzlarla xəbər verməsidir. İnsanlar etiqad edirlər ki, ulduzlar öz-özlüyündə təsir edirlər. Yer üzündə baş verən hadisələrin bir çoxu ulduzlar vasitəsilədir - Bu da Sabiilərin etiqadıdır. Bir qrup insanlar etiqad edirlər ki, ulduz və planetlərin düzülüşü, çıxması, itməsi yer üzündə hansısa bir hadisənin baş verməsi və ya gələcəkdə baş verməsi deməkdir. Ulduzların düzülüşü kiminsə xoşbəxt, bədbəxt olması, talelərin həlli deməkdir. Bu da qeybdən xəbər verməkdir - küfrdür. Ulduzlar bunun üçün yaradılmamışdır. Qatadə Σ deyir: "Allah ulduzları üç məqsədlə yaradıb; səmaya zinət salmaq üçün, onlarla şeytanları vurmaq üçün və səfərdə olanlara (yolu tapmaq üçün) səmt göstərmək üçün. Kim onlardan başqa məqsədlər üçün istifadə etsə xəta etmiş və əməlini puç etmişdir. Ayrıca haqqında heç bir biliyi olmayan bir yükün altına girmiş olar".[681] ***"And olsun ki, Biz dünya səmasını qəndillərlə** (ulduzlarla)* ***bəzədik, onları şeytanlara atılan mərmilər etdik və onlar** (şeytanlar)* ***üçün yandırıb-yaxan alovlu atəş əzabı hazırladıq".*** *(əl-Mulk 5).* ***"Suyun və qurunun zülmətində** (yolunuzu)* ***düz getmək üçün ulduzları sizin üçün yaradan da Odur. Biz bu ayələri anlayan bir camaat üçün bu cür ətraflı izah etdik".*** *(əl-Ənam 97).* ***Həmçinin –*** jurnal və qəzetlərdən ulduz falına baxmaq da bu qəbildəndir. Taleyinə ulduzların (bürclərin) və planetlərin təsiri olduğuna inananlar müşrik, asi və günahkardırlar. Bunları inkar etmək vacibdir. Hətta kimsə buna inanmasa da belə əylənmək, "baxım görüm filan bürc haqqımda doğru deyir, yoxsa yalan" üçün ulduz fallarını oxuyarsa belə kimsə kahinin yanına getmiş sayılar və onun namazı qırx gün qəbul olunmaz. Əgər inansa artıq Muhəmmədə ρ nazil olana küfr etmiş olar. Bu da Tövhidin kamilliyinə ziddir.

***Ulduz Falı*** – şeytan əməlidir. Nə üçün? Çünki, onun dedikləri əgər düz olsaydı onda insanın həyatı zəhrimara dönərdi. Birinci gün evdən bayıra çıxma - başına bəla gələcək, üçüncü gün filan dostunla görüşmə - xətrivə deyəcəkdir, dördüncü gün filan yerə getmə - səni aldadacaqlar və s. Ulduzlarla gələcəyi söyləməyin yalan olduğu haqda bir çox rəvayətlər vardır. Peyğəmbər ρ buyurdu: "Mən ümmətimdə üç şeyin yaranmasından qorxuram. İmamların ədalətsizliyindən, ulduzlara inanmaqdan və qədəri inkar etməkdən".[682] Peyğəmbər ρ buyurdu: "Mən özümdən sonra ümmətimdə iki şeyin yaranmasından qorxuram; qədəri inkar etməkdən və ulduzlara inanmaqdan".[683] Peyğəmbər ρ buyurdu: "Üç nəfər Cənnətə girməz; sərxoşluq edən, sehrin doğruluğunu təsdiq edən, qohumluq əlaqələrini kəsən".[684] **2)** ***Elmun Təsyir –*** insan ulduzlarla vaxtı, istiqaməti təyin edir, filan ulduzun istiqamətində filan ölkə yerləşir, Qiblə yerləşir və s. Bəzi alimlər icazə vermişlər. İcazənin səbəbi: Ulduzların

---

[680] Əhməd 1/ 277, 311, Əbu Davud 3905, İbn Məcə 3726, əl-Albani "Səhihul-Cəmi" 6074, "Səhih Silsilə" 893.
[681] əl-Buxari 6/ 211, 341.
[682] İbn Asakir.
[683] Əbu Yala.
[684] Əhməd 4/ 399, İbn Hibban 1380, 5346, əl-Hakim 4/ 146, əl-Albani "Səhih" 678.

hərəkətini, düzülüşünü yalnız müəyyən vaxtlarda baş verməklə əlaqələndirirlər. Lakin ulduzu səbəb götürmürlər. Demir filan ulduza görə yağış yağır. Lakin deyir ki: İlin filan vaxtı bu ulduz olanda (Allahın izni ilə) yağış yağır. Çünki əksər vaxtı hava haqqında məlumatlar səhv də çıxır. Yağışın yağması, küləyin əsməsi ulduza görə deyildir, sadəcə vaxta bağlıdır.

***Yağışın Yağmasını Ulduzlarla Əlaqələndirmək*** **-** Cahiliyyə ərəbləri hesab edirdilər ki, yağışın yağması ulduzlara görədir. Yağışı hansısa bir ulduza aid edirlər. Bir başa ulduzdan istəyirdilər. Bu da Astrologiyadır, astrologiya da sehrin bir növüdür. Bu da Tövhidin kamilliyinə ziddir. Yağışın yağması Allahın nemətidir. İnsan istənilən bir rəhməti Allaha nisbət etməlidir. Bu neməti Allahdan qeyrisinə nisbət etmək qadağandır. Sadəcə bu nemətlər sənə hansısa bir səsəblər vasitəsilə verilmişdir. Çox vaxt eşidirsən ki: "Birisi kasıbladıqda, çətin bir vəziyyətdə ilk növbədə düşünür ki, kimdən borc alım, çətin vəziyyətdən çıxış üçün kimə müraciət edim"- deyə düşünür. Əli çatdığı yerlərə müraciət etdikdən sonra heç bir şey alınmadıqda Allah yadımıza düşür. Ğaniy və Saməd olan Allahı son anda düşünürük. Ona görə də müsəlman hər bir şeyə Tövhid nöqteyi-nəzərilə baxmalıdır. Bütün bu nemətləri Allaha aid etməklə Allahın nemətlərinə şükür etmiş oluruq. Əli ψ rəvayət edir ki: ***"Ruzisinə şükr etməli olduğunuz halda onu yalanmı hesab edirsiniz".*** *(əl-Vaqiə 82).* Yəni sizin şükrünüz: "Yağış ulduzların hansısa yerləşməsinin və ya hansısa ulduzun sayəsində yağdı"- deyərək: "Onun inkar edilməsidir".[685] Peyğəmbər ρ buyurdu: "Ümmətimdə cahiliyyə dövründən tərk edilməmiş dörd əlamət qalmışdır; öz əsil-nəcabəti ilə fəxr etmək, başqasının nəslinə tənə etmək (pisləmək), yağışın yağmasını ulduzlarla əlaqələndirmək və ölü üstündə ağı deyib ağlamaq".[686] Şeyx Useymin Σ deyir: "Ulduzlardan yağış diləmək iki qismə bölünür: **1**. Böyük şirkdir. Bunun da iki növü vardır: **1)** Ulduzlara və bürclərə dua edərək onlardan yağış diləmək. Bu da Allahdan qeyrisinə dua etməkdir. Uluhiyyətdə olan şirkdir; ***"Kim Allahla yanaşı, haqqında özünün heç bir dəlili olmadığı başqa bir məbuda ibadət edərsə, onun cəzasını Rəbbi Özü verəcəkdir. Şübhəsiz ki, kafirlər nicat tapmazlar!"*** *(əl-Muminun 117).* **2)** Yağışın yağmasını ulduzlara mənsub etmək: "Yağışı filan ulduz yağdırdı"- kimi. Bu da böyük şirk olan Rububiyyətdə şirkdir. Yəni yağışı yağdıran Allahdan qeyrisidir. **2.** Yağış diləmənin ikinci növü isə kiçik şirkdir. Bu da ulduzları səbəb götürməkdir. Bu səbəbə görə yağış yağdı. Kiçik şirk insanı İslamdan çıxarmır. Lakin bəzi alimlər kiçik şirkin də İslamdan çıxardığını qeyd edirlər; ***"Şübhə yoxdur ki, Allah Özünə şərik qoşanları əfv etməz. Lakin istədiyi şəxsə bundan başqa olan günahlarını bağışlayar. Allaha şərik qoşan şəxs əlbəttə ki, böyük günah etmişdir".*** *(ən-Nisa 72).* ***"Allah Ona şərik qoşmağı əsla bağışlamaz. Bundan başqa olan günahları isə istədiyi şəxsə bağışlayar.***

---

[685] Əhməd 1/ 89, 108, 131, ət-Tirmizi 3291.

[686] Muslim 934.

***Allaha şərik qoşan şübhəsiz ki, çox azmışdır".*** *(ən-Nisa 116).* Ayədə Allah ümumi olaraq dedi ki, şirki bağışlamır. Buna görə də şirkin hər birindən çəkinmək lazımdır. Zeyd ibn Xalid əl-Cuhəni ψ demişdir: "Allah Elçisi ρ Hudeybiyyədə gecə ikən yağmış yağışdan sonra bizə sübh namazını qıldırdı və namazı bitirdikdən sonra üzünü camaata çevirib soruşdu: "Bilirsinizmi, Rəbbiniz nə buyurdu?" (Əshabələr:) "Allah və Onun Elçisi daha yaxşı bilir!"- dedilər. Peyğəmbər ρ dedi: "(Allah buyurdu): "Qullarımdan bir qismi mömin, digər qismi isə kafir oldu. (Başqa rəvayətdə: "Kimisi şükr etmiş, kimisi küfr"). "Bizə Allahın lütfü və mərhəməti sayəsində yağış göndərilmişdir"- deyənlərə gəlincə, onlar Mənə iman gətirmiş və ulduzları inkar etmişlər. "Yağış bizə filan və filan ulduza görə nazil olmuşdur"- deyənlərə gəldikdə, onlar Mənə küfr etmiş və ulduzlara iman gətirmişlər".[687] (Başqa rəvayətdə: "Allah qullarına hər nə zaman bir nemət ehsan etdisə bir qrupu "onu ulduzlar etdi, ulduz sayəsində oldu"- deyərək o, nemətə küfr etdilər"). ***"Ulduzların mənzillərinə and olsun ki, kaş bunun nə qədər böyük bir and olduğunu biləydiniz – bu çox qiymətli Qurandır. Qorunub saxlanılan kitabdır. Ona yalnız pak olanlar toxunar.*** *(O)* ***Aləmlərin Rəbbi tərəfindən nazil edilmişdir. İndi siz bu kəlamı yalan sayırsınız? Ruzinizə şükür etməli olduğunuz halda onu yalanmı hesab edirsiniz".*** *(əl-Vaqiə 75-82)".* [688] Əgər kimsə yağışın yağmasını ulduzların müəyyən düzülüşünə görə yağdığını deyirsə bu tövhidin prinsiplərinə ziddir. Etiraf edilməlidir ki, yağış və digər nemətlər Allahın öz bəndələrinə olan mərhəmətidir. Ulduzların yağışın yağmasına heç bir təsiri yoxdur. Çünki, bunun səbəbi Allahın öz bəndələrinə onların ehtiyaclarına olan diqqəti və onlara olan rəhmidir. Allah öz rəhmətilə yağış göndərir. Çünki, insanların və bütün canlı aləmin buna çox ehtiyacı vardır. Ulduzların və ya onların yerləşməsinin yağışın yağmasına təsir etməsi küfr və şirk olan əməldir, eynilə ölüyə və ya olmayana yalvarıb onun fayda gətirməsi və ya şərdən qoruması iddiası kimi. Peyğəmbərin ρ zamanında günəş tutuldu. İnsanlar: "Günəş İbrahimin (Peyğəmbərin ρ oğlu İbrahimin) ölümünə görə tutulmuşdur"- dedilər. Peyğəmbər ρ buyurdu: "Həqiqətən günəş və ay Allahın rəmzləridir. Onlar heç kəsin ölümünə və ya doğulduğuna görə tutulmurlar…".[689]

***<u>Sehr, Cadu Və Gözdəymədən Müalicə - Ovsun - Ruqiyyə</u>*** – İnsanı ilan və ya əqrəb sancanda, cadu olunanda və ya göz dəyəndə, xəstələnəndə başına gələn bədbəxçiliyi götürmək üçün Qurandan və Sünnədən oxunan dualardır. Sehrbazın cəzası ölümdür. Qazancı haramdır. Cahillər, zalımlar və imanı zəif olanlar bəzi insanlara düşmənçilik bəslədiklərinə görə onlardan intiqam almaq məqsədilə cadu edənlərin yanına cadu

---

[687] əl-Buxari 801, 810, 846, 980, 991, 1038.

[688] əl-Buxari 846, Muslim 71,73.

[689] əl-Buxari, Muslim. Üçüncü oğlu İbrahimdir. Hicri **8**-ci ildə Mədinədə dünyaya gəlmiş və hicri **10**-cu ildə **17** və ya **20** aylıq ikən vəfat etmişdir. Ənəs ψ rəvayət edir ki, Peyğəmbər ρ oğlu İbrahim öldüyü zaman buyurdu: "O, körpə ikən öldü. Onun Cənnətdə iki süd anası vardır. Onlar onun südünü iki ilə tamamlayacaqlar. Çünki o, mənim oğlumdur".

etdirməyə gedirlər. Ruqiyyədə şirk yoxdursa və sözləri aydındırsa bunu etmək olar. Şirk olan Ruqiyyədə Allahdan qeyrisindən kömək istəmək, sığınmaq, şeytanı isimləri ilə çağırmaq vardır. Etiqad edilsə ki, ruqiyyə öz-özlüyündə şəfa verir - qadağandır. Ruqiyyə adı altında at nalı, təsbeh, heyva budağı, gözmuncuğu asırlar, boyunlarına dəridən olan dualar, imamların, övliyaların, seyyidlərin şəkillərini həm öz üzərlərindən, həm evdən, həm də miniklərindən asırlar - asırlar ki, onları göz dəymədən qorusun və ya hansısa xeyirə nail olsun, şərdən uzaq etsin. Hətta heç bir niyyətin olmasa da belə bu haramdır. Cadunu hansısa şirk olan yollarla və ya şirk olmayıb qadağan olunan yollarla aradan qaldırırlar. Bütün bu yollar haramdır və şəriət bunu qadağan etmişdir. Bəziləri deyirlər ki, əgər cadu olunan kimsə çarəsizdirsə və ona müalicə tapmaq olmursa, hansısa bir sehr olan yollarla onu müalicə etmək olar. İnsanın sağalması vardır. Lakin bu da qadağandır.

Sehrə məruz qalmış kimsəni Allahın iznilə qurtarmaq, biri haram olan digəri halal olan iki yolla mümkündür: **1.** Sehri, başqa bir sehrlə qaldırmaq bu kiçik küfrdür. Cabir ψ rəvayət edir ki, Peyğəmbərdən ρ sehrin (sehr yolu ilə) götrülməsi haqqında soruşanda, o buyurdu: "Bu şeytanın əməllərindən biridir".[690] Şeyx Useyminə Σ sual verirlər ki: "Müalicə almaq üçün, ona mömin cinlər kömək edirlər, deyən bir kimsənin yanında müalicə almaq olarmı?" ***Cavab***: Cinlər vasitəsilə İstianə etmək istər o cin müsəlman olsun, istərsə də kafir - şirkə aparan bir yoldur. İstianə kömək tələb etməkdir. Elm əhli müsəlman cinlərdən kömək istəməyi qadağan ediblər. Səhabələrdən heç biri buna daha layiq olduqları halda cinlərdən kömək istəməyib....".[691] Hər hansı bir cin bir insana girən başqa cini çıxarmaq üçün yardım etməyi təklif etdiyi təqdirdə, o insan bu təklifi qəbul edə bilərmi?" İbn Bəzz Σ deyir: "Bu məkruh bir əməldir". Zamanımızda cinlərdən kömək alanların etdiklrəi dəccallıqlar çoxalmışdır. Cinlərdən kömək almaq düz bir iş deyildir. Bu halın möminin halına, etiqadına bir çox zərərləri vardır. Onun imanını zəiflərdir. Bu işlə məşğul olanların çoxları cahil kimsələr olduqları üçün onların sözlərinə güvənilməz. Ən doğru bilən Allahdır!" Günümüzdə cindarlar (cin çıxardanlar) barəsində də çox eşidirik. Səhablərdən heç kəs cin çıxardan kimi tanınmamışdı. İndi artıq cin çıxarmaq pul qazanmaq üçün bir sənət olub. Müalicə zamanı cinlərlə söhbət edir, onlara suallar verir və onun dediklərinə inanırlar. Halbuki, Peyğəmbər ρ onun yalançı olduğunu söyləmişdir. Yalançının sözünə inanıb onu insanlar arasında danışmaq olarmı? Qeybi xəbərlərin doğru olduğunu sən haradan bilirsən? Məgər kimsə səhabələrdən belə edib. Şeyx Albaninin Σ yanına bir nəfər gəlir və öz müalicə üslubundan danışır. Şeyx:

---

[690] Əbu Davud 3868, Əhməd 3/294.

[691] Nişan üzüyünün qadağan olumasının səbəblərindən biri də: Şeyx Useymin Σ deyir: "Nişan üzüyü iki sevən şəxsi bir-birinə bağlanması deməkdir. Bu üzüyü çıxarmaq olmaz. Artıq sən onu çıxardıqda, deyilir ki, sevmirsən. Əgər etiqad etsə ki, üzük sevginin və onlar arasında olan bağlılığın (xoşbəxtçiliyin) səbəbidir - kiçik şirk etmişdir. Heç bir etiqadı olmasa da belə haramdır. Çünki, Kitab Əhlinə bənzəməkdir". "Qavlu Mufid".

"Sən Sələfsən?"- deyə ona sual verir. O: "Bəli"- deyə cavab verir. Şeyx deyir: "Sənin etdiyini Sələflərdən kimsə edibmi? Belə bir kimsəni tanıyırsan?" O: "Yox"- deyir. Şeyx deyir: "Mən də tanımıram". Bu cür edən Peyğəmbərin ρ hədisidir: "Kim bir falçının yanına gedib ona inanarsa qırx günlük namazı qəbul edilməz" hökmünə girir.

**2.** İmam Süyuti Σ ovsun barəsində demişdir: "Alimlər belə bir yekdil fikrə gəliblər ki, üç şərt yerinə yetirildikdə ovsunla müalicəyə icazə verilir: **1)** Ovsunla müalicə Allahın kəlamı, yaxid İsim və Sifətləri, yaxud da Onun Peyğəmbərinin ρ hədisləri ilə olmalıdır; *"(Ya Muhəmməd!)* ***de ki: "O, iman gətirənlərə hidayətdir və*** *(cəhalət xəstəliyinə tutulmuş ürəklərə)* ***şəfadır".*** *(əl-Fussilət 44). "**Biz Qurandan möminlər üçün şəfa və mərhəmət olan ayələr nazil edirik".** (əl-İsra 82). "(Ey insanlar!)* ***Sizə Rəbbinizdən bir öyüd-nəsihət, ürəklərdə olana bir şəfa, möminlərə hidayət və mərhəmət*** *(Quran)* ***gəlmişdir".*** *(Yunus 57).* Aişə O rəvayət edir ki, Peyğəmbər ρ xəstələndiyi zaman Cəbrail υ gələrək ona: "Bismilləh! Allah sənə hər xəstəlikdən şəfa versin və həsəd etdiyi zaman həsəd edəndən, hər göz sahibinin (göz dəyməsindən) şərindən də səni qorusun"- deyərək ruqiyyə edərdi".[692] Əbu Səid əl-Xudri ψ rəvayət edir ki, Cəbrail υ Peyğəmbərin ρ yanına gələrək: "Ya Muhəmməd! Narahatsan?"- deyə soruşdu. Peyğəmbər ρ: "Bəli"- deyə buyurdu. Cəbrail υ: "Bismilləh! Sənə səni incidən hər şeydən, hər şər nəfsdən, həsəd edici gözdən ruqiyyə edirəm. Allah sənə şəfa versin. Allahın İsmilə sənə ruqiyyə edirəm"- dedi.[693] Aişə O rəvayət edir ki, bizdən bir kimsə narahat olduqda Peyğəmbər ρ onu sağ əli ilə məsh edər və: "Ey insanların Rəbbi! Bu xəstəliyi apar. Şəfa ehsan et. Ancaq Sən şəfa verirsən. Sənin şəfandan başqa heç bir şəfa yoxdur. (Ya Rəbbim! Bu xəstəyə elə bir şəfa ver ki, xəstə üzərində heç bir xəstəlik izi qalmasın". Aişə O deyir: "Peyğəmbər ρ xəstələndiyi zaman əlini tutdum və onun etdiyinin eynisini etmək istədikdə əlini əlimdən çəkdi və: "Ya Allahım! Məni məğfirət et və məni ən yüksək Rəfiq ilə bərabər et"- deyə buyurdu".[694] Aişə O rəvayət edir ki, Peyğəmbərin ρ ailəsindən bir kimsə xəstələndiyi zaman onun üzərinə (əllərinin iç hissələrini birləşdirərək içinə üflər) və Muavizateyn surələrini oxuyardı".[695] Aişə O deyir ki, özü xəstələndikdə isə onun üçün mən oxuyur və öz əli ilə bədəninə məsh edərdi".[696] İbn Abbas ψ rəvayət edir ki, Peyğəmbər ρ nəvələri olan Həsən və Hüseyn N üçün dua oxuyar və deyərdi ki, bu duanı atanız olan İbrahim υ öz oğulları İsmail və İshaqı H Allaha sığındırırdı: "Hər şeytandan, zərərli həşəratlardan və hər pis gözdən qorunmaq üçün sizi Allahın tam kəlmələrinə həvalə edirəm".[697] Peyğəmbər ρ buyurdu: "Kim səhər-səhər Mədinənin ən yaxşı xurma

[692] Muslim 2185.
[693] Muslim 2186.
[694] Muslim 2191.
[695] əl-Fələq və ən-Nəs surələri.
[696] Muslim 2192.
[697] əl-Buxari 4/ 119.

növündən yeddi ədəd (Başqa rəvayətdə: "Mədinənin iki dağı arasındakı acva xuma növündən) yesə, həmin gün ona nə zəhər, nə də cadu zərər gətirə bilər".[698] **2)** Ovsunla müalicə ya ərəb dilində, ya da başqaları tərəfindən başa düşülən bir dildə olmalıdır (Bəziləri deyirlər ki: Ərəb dilində olmasa da dua etmək olar). **3)** Tam əminliklə hər iki tərəf də etiqad etməlidir ki, ovsunla müalicə bilavasitə deyil Allahın qüdrəti sayəsində təsir göstərir və o, insanın şəfa tapmasında sadəcə olaraq bir vasitə rolunu oynayır. Qurani-Kərim qəlb və bədən, dünya və axirət xəstəliklərinin tam dərmanıdır. Heç bir xəstəlik, cadu, sehr, göz dəymə və s. Quranın qarşısında əsla tab gətirə bilməz. Aişə O rəvayət edir ki, Bəni Zureyq yəhudilərindən Ləbid ibn əl-Əsləm adında bir yəhudi Peyğəmbərə ρ sehr etdi. Hətta Peyğəmbər ρ bəzi işləri etmədiyi halda ona elə gəlirdi ki, bu işləri edib. Nəhayət günün birində, yaxud da gecənin birində Peyğəmbər ρ dua etdi, sonra təkrar dua etdi, sonra təkrar yenə də dua etdi. Sonra mənə buyurdu: "Ey Aişə! Allahdan fətva istədiyim şey haqqında Allahın mənə fətva verdiyini bildinmi? Mənim yanıma iki nəfər gəldi (Cəbrail və Mikail). Bunlardan biri baş tərəfimdə, digəri isə ayaq tərəfimdə oturdu. Baş tərəfimdə olan ayaq tərəfimdə olana və ya ayaq tərəfimdə olan baş tərəfdə olana: "Bu kimsənin xəstəliyi nədir?"- deyə soruşdu. O da: "Sehrlənmişdir"- deyə cavab verdi. O: "Kim onu sehr etmişdir?"- deyə soruşdu. Digəri: "Ləbid ibn əl-Əsləm"- deyə cavab verdi. O dedi: "Sehr nə ilə edilib?" Digəri: "Daraqdan götrülmüş saç, saqqal tükü və erkək xurmanın tumurcuğunun qurusu ilə"- deyə cavab verdi. Digəri dedi: "Harada edilmişdir?" O: "Zu-Zərvan quyusunda"- deyə cavab verdi. Səhəri Peyğəmbər ρ səhabələrdən bəziləri ilə çıxıb, o quyunun yanına getdi. Qayıtdıqdan sonra mənə buyurdu: "Ey Aişə! Allaha and olsun ki, quyunun suyu xına suyu kimi qırmızı, ətrafdakı xurma ağacının budaqlarının ucları isə şeytanın başları kimi idi". Mən: "Ya Rəsulullah! Sən o sehri çıxarıb basdırdınmı?"- deyə soruşdum. Peyğəmbər ρ buyurdu: "Xeyr, basdırmadım. Çünki, Allah mənə şəfa verdi. Bir də sehri çıxarmaqla insanlar arasında sehrin şərinin yayılmasını istəmədim". Quyunun ağzının bağlanmasını əmr etdi və quyu basdırıldı".[699] İbn Abbas ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Göz dəymə sabit bir həqiqətdir (Başqa rəvayətdə: "Göz dəymə həqiqətdir"). Əgər qədərin önünə keçən bir şey mövcud olsaydı, onun önünə göz dəymə keçərdi…".[700] Aişə O rəvayət edir ki, Peyğəmbər ρ göz dəymədən ruqiyyə etməyi əmr edərdi". Aişə O rəvayət edir ki, Peyğəmbər ρ Ənsardan olan bir ev əhlinə zəhərli heyvanlardan (zəhərli şeylərdən, ilan, əqrəb sancmasından, yan tərəfdə çıxan yaralardan və göz dəymədən) ruqiyyə etmək xüsusunda rüxsət verdi".[701] Peyğəmbərin ρ zövcəsi Ummu Sələmə O evində

---

[698] əl-Buxari 10/ 247, Muslim 3/ 1618.
[699] Muslim 2189.
[700] Muslim 2187.
[701] Muslim 2196.

üzü saralmış bir qız uşağını gördü və: "Bu uşaqda nəzər vardır, onun üçün ruqiyyə edin"- deyə buyurdu.[702]

Allah Qurani-Kərimdə qəlb və bədən xəstəliklərini və onların müalicəsini qeyd etmişdir. Müalicə üsulları bizə sələflərdən gəlmişdir: 1) Yunus 81-82. 2) Əraf 118. 3) Taha 69-cu ayələri su ilə dolu qabın içinə oxunduqdan sonra xəstənin başı üzərindən tökülür. ***Həmçinin*** – Vəhb ibn Munəbbih Σ deyir: "Yeddi ədəd Sidr ağacının yarpağı daş arasında üyüdülür və suyun içinə Ayətul-Kursi, əl-Kəfirun, əl-İxlas, əl-Fələq, ən-Nəs surələri oxunur. Xəstə üç qurtum içdikdən sonra qalan su ilə qüsl alır". İbn Bəzz Σ deyir: "Sınanılmış (yoxlanılmış) bir şeydir".

***Qəlb Xəstəlikləri*** **- 1.** Şəkk-şübhə. **2.** Şəhvət və azğınlıq. Bədən xəstəliklərinə gəldikdə isə bunlar üçdür. **1.** Səhhəti qorumaq. **2.** Zərərli amillərdən çəkinmək. **3.** Bədəni zərərli və əziyyət verən maddələrdən təmizləmək.[703] Peyğəmbər ρ ilan və əqrəb sancmasından da ruqiyyə etməyi tövsiyə edərdi. Peyğəmbər ρ buyurdu: "Bunda bir maneə görmürəm. Sizdən hər kim qardaşına bir mənfəət etməyə gücü yetərsə ona mənfəət versin".[704] Peyğəmbər ρ buyurdu: "Ruqiyyəniz mənə göstərildi. Ruqiyyə etməkdə şirk olmadığı müddətdə heç bir maneə yoxdur"- deyə buyurdu.[705] Əbu Səid əl-Xudri ψ rəvayət edir ki, Peyğəmbərin ρ səhabələrindən bir dəstə insan səfərdə idilər. Ərəb qəbilələrindən birinə yetişdilər və onlara müsafir olmalarını istədilər. Lakin o qövm onları müsafir olaraq qəbul etmədilər. (Bu vaxtı qövmün başçısını ilan və ya əqrəb sancmışdı). Bir qadın bizə yaxınlaşaraq dedi: "İçinizdə ruqiyyə edən varmı? Qövmün başçısı ilan və ya əqrəb tərəfindən sancılmışıdır". Bizdən bir kimsə qadınla bərabər getdi. Biz o kimsənin ruqiyyəni gözəl edəcəyini zənn etmirdik. Nəhayət, o səhabə qövmün başçısını ***Fatihətul-Kitab*** ilə ruqiyə etdi. O, da sağaldı. Qövm ona bir sürü qoyun verdi və biz də süddən doyunca içdik. Səhabə bu hədiyyəni qəbul etmək istəməyərək dedi: "Bu məsələni Peyğəmbərə ρ xəbər vermədikcə bunları götürmərəm". Nəhayət Peyğəmbərin ρ yanına gəldik və hadisəni ona danışdıq. Peyğəmbər ρ təbəssüm edərək buyurdu: "Sən onun ruqiyyə olduğunu nə bildin? O qoyunları onlardan götürün və mənə də sizinlə bərabər bir pay verin".[706] Qurani-Kərim möminlər üçün rəhmət və şəfadır. İbn Qeyyim Σ deyir: "Mən bir müddət Məkkədə qalmalı oldum. Mənə xəstəliklər üz verirdi. Nə dərman, nə də həkim var idi. Özümü Fatihə surəsi ilə müalicə edirdim. Bunun da möcüzəvi təsirini görürdüm. Bir az Zəm-zəm suyu götürür və dəfələrlə ona Fatihə surəsini oxuyur sonra da içərdim. Beləliklə də tam sağalardım. Sonralar bir çox ağrıları müalicə edərkən bu üsula əsaslanır və faydasını da görürdüm. Ağrıdan şikayətlənənlərə də bu

[702] Muslim 2197.
[703] İbn Qeyyim "Zədul-Məad" 4/ 352.
[704] Muslim 2199.
[705] Muslim 2200.
[706] Muslim 2201.

müalicə üsulunu deyirdim. Əksəriyyəti də tez bir müddətdə sağalırdı". Bir məsələ də vardır ki, bu zikirlər, ayələr, dualar öz-özlüyündə fayda verəndir. Lakin qəbul edən də olmalıdır. Əgər şəfa gecikərsə ya onu edəndə zəiflik vardır, ya da şəfaya mane olan güclü maneə vardır. Şəfanın verilməsi üçün tək dua kifayət deyildir. Dua edənin də iradəsi güclü olmalıdır. Bəzən görürsən ki, dua özü zəif olduğuna görə duanın nəticəsi gecikir. O dua Allahın sevmədiyi dua olduğuna görə. Bəzən də dua güclü olur, lakin qəlb zəif olduğuna görə. Dua etdiyi zaman qəlb bütünlüklə Allaha yönəlmir. Bu dua da zəif yaya oxşayır. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Siz Allaha yəqinliklə dua edin. Allah qafil, ayıq olmayan qəlbdən duanı qəbul etməz".[707] Həmçinin də duanın qəbul olmasına mane olan səbəblərdən haram yemək, içmək, zülm, qəlbin pas ilə bağlanması da vardır. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Şübhəsiz ki, Allah pakdır (və nöqsansızdır) və pak olanı da qəbul edir. Allah Peyğəmbərlərinə əmr etdiyi şeyin eynisini möminlərə də əmr etmişdir. Allah buyurur: ***"Ey Peyğəmbərlər! Təmiz və halal nemətlərdən yeyin və yaxşı işlər görün".*** *(əl-Muminun 51)*. Yenə Allah buyurur: ***"Ey iman gətirənlər! Sizə verdiyimiz ruzilərin təmiz və halalından yeyin".*** *(əl-Bəqərə172).* Sonra Peyğəmbər ρ buyurdu: "Saçı-saqqalı bir birinə qarışmış, üst-başı toza bulaşmış halda uzun səfər etmiş, yediyi haram, içdiyi haram və haram ilə bəslənən birisini xatırladaraq, bu kişi əllərini səmaya qaldıraraq "ya Rəbbim, ya Rəbbim"- deyə dua etsə, necə ola bilər ki, onun duası qəbul olunsun".[708]

***Möcüzə*** – insanların gördükləri və ya Peyğəmbər olaraq göndərənin varlığına qəti bir dəlildir. Onları göndərən isə Allahdır. Çünki, bunlar bəşəriyyətin güc və

---

[707] əl-Hakim "Mustədrək".

[708] Səhih Muslim 1015. ***Dua*** – Dua ən faydalı dərmandır. O, bəlanın, müsibətin düşmənidir. Onunla vuruşur, onun enməsinə mane olaraq onu qaldırır və ya nazil olanı yüngülləşdirir. Bu da möminin silahıdır. Əli ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Dua möminin silahıdır, dinin dayağıdır, göylərin və yerlərin nurudur. Duanın bəla ilə yanaşı üç mövqeyi vardır: 1) Bəladan güclü olaraq bəlanı dəf etməsi. 2) Bəladan zəif olur ki, bəlada ona qalib gəlir. Bəla bəndəyə toxunur lakin onu zəif olsada belə yüngülləşdirərək. 3) Onlar bir-birilərinin arasında çarpışırlar. Peyğəmbər ρ buyurdu: "Dua nazil olan və olmayan bəlalar üçün xeyirlidir. Odur ki, ey Allahın qulları Allaha dua edin". ət-Tirmizi, əl-Hakim, Əhməd, əl-Albani "Səhuhul-Cəmi" 3/ 151, H. 3403. Peyğəmbər ρ buyurdu: "Qəza və qədəri dəyişdirən yalnız duadır, ömür isə yalnız yaxşılığın sayəsində uzanır". əl-Albani "Səhih Hədislər Silsiləsi" 1/ 76, H. 154. İmam Əhməd "Zühd" kitabında rəvayət edir ki: "Bəni İsrailin başına müsibət gəlir. Onlar bir yerə çıxırlar. Allah onların Peyğəmbərinə vəhy edərək buyurur: "Siz bu düzənliyə nəcis, murdar bədəninizlə çıxmısınız. Siz mənə qan tökmüş əllərinizi qaldırırsınız. Bu əllərinizlə evlərinizi haramla doldurursunuz. Mənim qəzəbimin sizə şiddətləndiyi vaxt əllərinizi qaldırırsınız. Məndən uzaq olun". Duanı etdikdə israrla etmək, duanın qəbul olunmasına tələsməmək. Artıq duanın qəbul olunmasının gec olmasındandır ki, bununla bezərək duanı tərk edirlər. Bunun da məsəli ağac əkən bağbana bənzəyir ki, daima ağaca qulluq edir, onun gec böyüdüyünü gördükdə onu tərk edir. Həmçinin, insan dua etdiyi vaxt hazır olması, qəlbinin büs-bütün Allaha yönəlməsi və həmçinin də qəbul olunma vaxtlarına münasib olması, xuşu ilə etmək, Allah qarşısında zəlil olmaq, dua edərkən qibləyə yönələrsə, dəstəmazlı olarsa, əllərini Allaha tərəf qaldırarsa və Allaha həmd-səna etməklə və Peyğəmbərə ρ salavat gətirməklə və bağışlanma diləməklə, duasını davamiyyətli olaraq diləyərsə bu dua heç vaxt rədd olunmaz. Xüsusən də Peyğəmbərin ρ xəbər verdiyi dualara uyğun olarsa və həmçinin Allahın əzəmətli adı ilə olarsa Yə Həyyu, Yə Qəyyum, Yə Zəl-Cələli vəl-İkram, Yə Əhəd, Yə Saməd.

taqətindən kənar olan xüsuslardır. Allah möcüzələri Peyğəmbərlərini dəstəkləmək və onlara kömək etmək üçün meydana gətirir. ***Kəramət*** – Allahın saleh (yalnız saleh) qullarına Allahdan onlara bir ikram olaraq verdiyi bir şeydir. Bu kəramət Quran ayələri, hədislərdən və əsərlərdən məlum olduğu kimi Allah bir çox qullarına bunu ikram etmişdir. Məs: İsanın υ dünyaya gəlməsi möcüzə, onun anası üçün isə kəramətdir. Zəkəriyyənin Məryəmin H yanına gəldikdə orada yayda qış meyvələrinin olduğunu, qışda isə yay meyvələrinin olduğunu görməsi, Allah Musanın υ anasına vəd verir ki, "Biz uşağı sənə qaytaracağıq". Ömər ψ xütbə verərkən öz göndərdiyi qoşunun uduzduğunu görərək onlara qışqırır ki: "Ey Səriyə! Dağa tərəf çəkil". Və həqiqətən də onlar qalib gəlib qayıtdıqda deyirlər ki, biz hamımız sənin səsini eşitdik". Həmçinin, Rahib Cureycin hadisəsi,[709] mağarada qalan üç kişinin halı və s.[710] Kəramət də yalnız Allahın vəlilərinə məxsusdur.

***Allahın Vəliləri (Övliyaları) Kimlərdir?*** – ***Vəli*** – əmr olunanı yerinə yetirən, qadağandan çəkinən, təqdir edilənlərə qarşı səbr edən, Allahın sevdiyi və Allahı sevən, Allahdan razı olan kimsədir; ***"Bilin ki, Allahın dostlarının heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər. O, kəslər ki, iman gətirmiş və pis əməllərdən çəkinmişlər. Onlara dünyada da, axirətdə də müjdə vardır. Allahın sözləri heç vaxt dəyişməz. Bu ən böyük qurtuluş və uğurdur".*** *(Yunus 62-63).* ***"Allah iman gətirənlərin Himayədarıdır, onları zülmətlərdən nura çıxarır. Kafirlərin dostları isə tağutlardır, onları nurdan zülmətə salarlar. Onlar Od sakinləridirlər və orada əbədi qalacaqlar".*** *(əl-Bəqərə 257).* ***"Sizin haminiz ancaq Allah, Onun Peyğəmbəri və iman gətirənlərdir. O, kəslər ki,*** *(Allaha)* ***boyun əyərək namaz qılar və zəkat verərlər".*** *(əl-Maidə 55).* Amr ibn əl-As ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Diqqət edin! Filankəslər mənim dostlarım (vəlilərim) deyildir. Mənim dostlarım Allah və saleh (təqvalı) möminlərdir"[711]. Həsənul-Bəsri Σ deyir: "Bir dəstə kimsələr Allahı sevdiklərini iddia etdilər. Uca Allah: ***"De ki: "Əgər Allahı sevirsinizsə mənə uyun ki, Allah da sizi sevsin…".*** *(Ali İmran 31).* İmam Şafii Σ deyir: "Siz bir adamın su üzərində yeridiyini və ya havada uçduğunu görsəniz belə, onun Peyğəmbərə ρ tabe olması haqqında bir bilgi sahibi olmadığınız müddətdə onu təsdiqləməyin. Onun bu halına aldanmayın".

***Kəramət Və Sehr*** **- 1.** Kəramət insanın istəyi ilə gəlmir. Onu Allah istədiyi vaxt və istədiyi saleh quluna verir. **2.** Kəramət mömin bəndə üçün olur. **3.** Kəramət sahibi təkəbbürlü olmaz və onu insanlar arasında yaymaz. **4.** Kəraməti heç nə məhv edə bilməz. ***Möcüzə Və Sehr*** **- 1.** Bu dünyada möcüzə yoxdur. Kəramət və ya sehr vardır. Peyğəmbərlər yoxdursa möcüzə də yoxdur. **2.** Möcüzə qeyri adi bir şey olur. Allah elə bir möcüzə göstərir ki, insanlar dəhşətə gəlilər. **3.** Möcüzə iman gətirən şəxs üçün

---
[709] əl-Buxari 3/ 51-52, Muslim 8/ 89-90.
[710] əl-Buxari 4/ 140, Muslim 8/ 3-4.
[711] Muslim 215.

olur. Sehr isə kafir, fasiq və s. üçün olur. **4.** Möcüzənin qarşısını heç nə ilə almaq olmaz. Sehrin isə Quran ayələri, dualarla qarşısını almaq olar. ***Sehirbazın Əlamətlərindən* -** mənası başa düşülməyən sözləri donquldaması, "Ananın adı nədir? Atanın adı nədir?" və s. mənasız suallar verməsi, murdar yerlərdə xoruz və s. heyvanı qurban kəsməyi tələb etməsi, boynundan Quran ayələrindən ibarət olan amuletlərin asılması. Maraqlı orasıdır ki, belə şeyləi asan kimsələr bu tilsimlərin Qurandan olan ayələrdən ibrət olduğunu söyləyirlər. Lakin açıb içinə nəzər saldıqda heç də belə olmadığını və əksinə qarmaqarışıq sözlərdən ibarət olduğunun şahidi olurlar. Aç və yoxla!

# TƏVVƏSÜL – VƏSİLƏ

***Təvəssül*** **–** məqsədə (qayəyə) sürətlə - Vəsilə ilə çatmaq, istənilən şeyə yaxınlaşmaq və ona arzulu bir şəkildə çatmaq deməkdir. Həmçinin tələb edilənə yaxın olmaq, ona arzu ilə çatmaq, hökmüdarın yanında yer, yaxınlıq mənasındadır. Vəsilə isə məqsədə çatılan şeydir. Biz Allahın razılığına necə çata bilərik? Bunun üçün hansı yollar vardır? Allah və Rəsulunun ρ şəriət etdiyi yollar hansılardır? ***"Onların yalvardıqları məbudların özləri də Rəbbinə – hansı daha yaxın olacaq deyə vəsilə axtarırlar, Onun rəhmətini umurlar, əzabından qorxurlar. Həqiqətən, Rəbbinin əzabından qorunmaq gərəkdir".*** *(əl-İsra 57).* İbn Abbas ψ deyir: "Bu ayə bir dəstə ərəblər barəsində nazil olmuşdur. Onlar cinlərə ibadət edirdilər. Cinlər Allaha iman gətirdikən sonra Onun razılığını qazanmaq üçün Ona yollar axtarırdılar. İnsanlar isə bunu bilmədikləri halda onlara ibadət edirdilər".[712] Azandan sonra oxunan duada da deyilir: "Allahım, Muhəmmədə vəsiləni ver".[713] Burada vəsilə ilə qəsd Allaha yaxınlıq, Qiyamət günündə şəfaətdir. Həmçinin bunun Cənnətdə bir mərtəbə olduğu da söylənilmişdir.[714] Firuzabadi Σ deyir: "Allaha yaxınlaşdırıcı bir iş etdi" mənasında ***Vəssələ İlləllahi Təalə Təvsilən*** – deyilir".[715] ***"Ey iman gətirənlər! Allahdan qorxun. Ona yol axtarın. Allah yolunda cihad edin ki, bəlkə nicat tapasınız".*** *(əl-Maidə 35).* Allaha vəsilə axtarmaq elm və ibadətlə Onun yolunu getmək və şəriətin əxlaqi gözəlliklərini axtarıb tapmağa çalışmaqdır. Vəsilə Allahı arzu edən deməkdir".[716] İmam Təbəri Σ deyir: "Ey iman gətirənlər! Allahdan qorxun, Onun əmrlərini yerinə yetirin və qadağalarından çəkinin. Allaha Onun razı olduğu şeylərlə yaxınlıq axtarın". ***İstilahi mənası*** **–** Allaha yaxınlaşdırıcı məşhur bir səbəbə sarılmaq və Allah rizası üçün olan bir ibadəti Allah Rəsulunun ρ tərif etdiyi şəkildə etməkdir. Allaha yaxınlaşmaq isə yalnız Allahın əmr etdiyi və Peyğəmbərin ρ buyurduğu formada saleh əməllərlə mümkündür.

***Qayda*** **-** Allah nəticəni əldə etmək üçün müəyyən səbəblər qoymuşdur. Bu səbəblər Şəri və Kovni (dünyəvi) ola bilər. Məs: **1.** Şəri səbəb - Şəhadət kəliməsi İslam dininə girmək üçün vasitədir, Peyğəmbərin ρ şəfaətinə nail olmaq istəyirsənsə azandan sonra onun üçün Vəsiləni dilə. Fatihə surəsi şəri bir səbəbdir. Nədən? Gözdən, bədnəzərdən, ilan və əqrəb sancmasından qorunmaq və şəfa tapmaq üçün. Ümumiyyətlə Quran möminlər üçün şəfadır. Bu şəri bir səbəbdir, hansıki Quran və Sünnə bunu təsdiqləyir. **2.** Kovni (dünyəvi) səbəb **2**) şərtlə qəbul edilir: **1.** Quran və

---

[712] İbn Abbas ψ deyir: "Bu İsa, Uzeyr, Məryəmdir". Bəzi təfsirçilər: "Cinlər, Mələklər, Günəş, Ay" demişlər. İbn Teymiyyə Σ deyir: "Bütün bu deyilənlər haqdır. Bu ayə özündə Allahdan qeyri bütün ibadət olunanları əhatə edir. Çünki, onların hər biri Allaha yaxın olsunlar deyə yol axtarırlar".
[713] Muslim.
[714] Lisanul-Arab 9/ 724.
[715] Qamusul-Muhit 1379.
[716] Rağib əl-İsfəhani "Mufrədətu Əlfazil-Quran" s. 871.

Sünnədə ona qadağa olmasın. **2.** İnsanlar arasında bilinən bir şey olsun. Məs: Baş ağrısından müalicə üçün dərmanlar vardır. Qəbul etdikdə baş ağrıları keçir. Susuzluqdan su içməklə, aclıqdan yemək yeməklə qurtarmaq olar. Bu da insanlar arasında məşhur olan və şəriətin qadağan etmədiyi bir səbəbdir. İnsanlar arasında məşhur olub, şəriətin qadağan etdiyi bir əməl olarsa bu da qadağandır. Lakin Allah bütlər, qəbirlər vasitəsilə (şəfa, övlad və s.) istəməni nəticəni əldə etmək üçün səbəb qoymamışdır.

***Vəsilə Üç Əsasa Dayanır:*** **1.** Təvəssül edilən - bu da Uca və Böyük olan Allahdır. **2.** Təvəssül edən, ehtiyacının qaldırılmasını istəyən qul. **3**. Təvəssül edilən Allaha yaxınlaşdırılan saleh əməllər. Bundan başqa təvəssül yoxdur, kim iddia edirsə ki, var, qoy dəlilini gətirsin.

***Təvəssülün Fayda Verməsi Üçün Şərtlər*** - **1.** Təvəssül edən bir qul saleh bir mömin olmalı, əməliylə Allah rizasını qəsd etməlidir. **2.** Təvəssül edilən əməl Allaha yaxınlaşmaq üçün, Allahın şəriətdə buyurduğu əməl olmalıdır. **3.** Edilən əməl məşhur bir əməl olmalı, Allah Rəsulunun ρ Sünnəsinə uyğun olmalıdır. Göründüyü kimi də mömin olmayanın əməli Allaha yaxınlıq vəsiləsi ola bilməz, bidət əməllərlə də Ona təvəssül edilməz.

***Təvəssülün Növləri*** – **1.** Bəyənilən (qəbul) edilən təvəssül. Bu da Allaha yaxınlaşdırılan sözlər, əməllər, etiqadlar şəkilində olan, Allahın sevdiyi və razı qaldığı vacib və ya müstəhəb ibadətlərlə Ona yaxınlaşmaqdır. Bunlar da üç qismdir. **1)** Allaha Onun gözəl İsimləri ilə yaxınlaşmaq; ***"Ən gözəl adlar Allahındır. Onu bu adlarla çağırıb dua edin".*** *(əl-Əraf 180).* Peyğəmbər ρ kədərləndikdə və ya sıxıntıya düşdükdə dua edərək: "Yə Həyy, Yə Qayyum (olan Allahım)! Sənin rəhmətinlə Səndən yardım istəyirəm (Başqa rəvayətdə: "Hiss etdiyim və qorxduğum şeyin şərindən Allaha və Onun qüdrətinə sığınıram")".[717] ***"Peyğəmbər sizə nə verirsə onu da götürün…".*** *(əl-Həşr 7)* əl-Albani Σ deyir: "Bizim üçün xeyirli olan Peyğəmbərin ρ Allaha dua etdiyi kimi dua etməkdir. Bu bizim özümüzün icad etdiklərimiz dualardan min dəfə daha xeyirlidir".[718]

**2)** Dua edənin öz saleh əməli ilə Allaha yaxınlaşması. Bir kimsənin: "Allahım! Sənə olan imanım və sevgim səbəbilə və Peyğəmbərin Muhəmməd ρ bağlılığıma, imanım və sevgim səbəbilə mənim sıxıntılarımı apar, məni bağışla!" Dua edən kimsəni Allah üçün etdiyi və Allah rizasından başqa heç bir şeyi qəsd etmədiyi saleh bir əməlini zikr etməsi də bu qəbildəndir; ***"O kəslər ki: "Ey Rəbbimiz! Həqiqətən, biz iman gətirdik, bizim günahlarımızı bağışla və bizi Od əzabından qoru!"– deyirlər"*** *(Ali İmran 16).* ***"Ey Rəbbimiz, bizə nazil etdiyinə iman gətirdik və Peyğəmbərinə tabe olduq. Artıq bizi şahid olanlarla bir yerdə yaz".*** *(Ali İmran 53).* Əbu Abdur-Rahmən ibn Ömər ibn

---

[717] Muslim, ət-Tirmizi 2796.
[718] əl-Albani "Təvəssül" s. 35.

əl-Xəttab ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Sizdən əvvəlki ümmətlərdə üç nəfər səfərə çıxırlar. Gecələmək üçün bir mağaraya girmək məcburiyyətində qalırlar. Mağaraya girdikdə bir qaya parçası yuvarlanıb mağaranın ağzını bağlayır. Onlar bir-birlərinə dedilər: "Bizi bu qayadan yalnız əvvəl etmiş saleh əməllərimizlə (Allaha) yaxınlaşmaqla (vasitə) etməklə Allaha yalvarıb-yaxarmamız qurtara bilər!" Onlardan biri dedi: "Allahım! Mənim qocalıq yaşına çatmış valideyinlərim vardı. Axşamlar (evə gəldikdə) onlara (süd) içizdirmədən nə uşaqlarıma, nə də qulluqçularıma (süd) içizdirərdim. Bir gün otlaq axtarmaq məni çox uzaqlara apardı. Geri qayıtdıqda onları (valideyinlərimi) yatmış gördüm. Hər gün olduğu kimi süd sağdım və onları (valideyinlərimi) yuxudan oyatmamaqdan ötrü səhərə kimi süd qabı ilə başlarının üstündə durdum. Ana və atamdan əvvəl nə uşaqlarıma, nə də qulluqçularıma içirmək istəmədim. Halbuki uşaqlar ayaqlarımın altında aclıqdan ağlayırdılar. Sonra (valideyinlərim) oyanıb axşam onlar üçün sağdığım südü içdilər. Allahım! Əgər mən bunu sənin rizanı (rəhmini, mərhəmətini) qazanmaq üçün etmişəmsə, onda bizi bu bəladan (vəziyyətdən) qurtar!" Bundan sonra qaya parçası bir az aralandı. Lakin çıxmaq mümkün olmadı. Onlardan digəri dedi: "Allahım! Mənim bir əmim qızı var idi. İnsanlar içərisində ən çox onu sevirdim. (Başqa rəvayətdə: "Mən onu kişilərin qadınları sevməkdə olduqları sevginin ən şiddətli dərəcəsində sevirdim"). Mən ona yaxınlaşmaq istədim. Lakin o, məndən üz döndərdi. Bir neçə il keçdikdən sonra (kasıblıq üzündən) mənim yanıma gəldi. Mən də ona mənimlə tək qalmaq şərti ilə yüz iyirmi dinar pul təklif etdim. O, da buna razı oldu. Ona yaxınlaşmaq fürsətini tapmışdım ki, (Başqa rəvayətdə: "Ayaqlarının arasına çökmüşdüm ki") qız mənə dedi: "Allahdan qorx! (haqsız yerə bakirənin möhürünü açma). Allahın qoyduğu bakirəlik möhürünü yalnız halal yolla (nigah yolundan başqa) bir yolla açma!" Bu əməldən dərhal vaz keçərək ondan uzaqlaşdım. O, isə insanların mənə ən sevimlisi idi. Onu çox sevdiyimə baxmayaraq. Allahım! Əgər mən bunu sənin rizanı (rəhmini, mərhəmətini) qazanmaq üçün etmişəmsə, onda bizi bu bəladan (vəziyyətdən) qurtar!" Bundan sonra qaya parçası bir az da aralandı. Lakin yenə də çıxmaq mümkün olmadı. Üçüncü şəxs dedi: "Allahım! Mən işçilər tutmuşdum. Hər birinin də (işlədikdən sonra) haqqını verdim. Birindən başqa. O, haqqını almayıb getdi. Mən onun haqqını (pulunu) dövriyyəyə buraxıb çoxaltdım. Bir müddət keçdikdən sonra o işçi mənim yanıma gəlib: "Ey Allahın qulu! Mənim haqqımı ver!"- dedi. Mən də: "Burada gördüklərin dəvələr, inəklər, qoyun və qullar sənin pulunun dövriyyəsindən artıb çoxalmışdır!"- dedim. O: "Ey Allahın qulu! Məni ələ salma!"- deyə cavab verdi. Mən də: "Mən səni ələ salmıram!"- dedim. O, da heç bir şey mənə saxlamayıb (hər şeyi) götürüb getdi. Allahım! Əgər mən bunu sənin rizanı (rəhmini, mərhəmətini) qazanmaq üçün etmişəmsə, onda bizi bu bəladan (vəziyyətdən) qurtar!" Bundan

sonra qaya parçası onlar çıxa biləcək qədər aralandı və onlar çıxıb yollarına davam etdilər".[719]

**3)** Saleh kimsələrin duası ilə Allaha yaxınlaşmaq.[720] Bu, Allah qatında duasının qəbul ediləcəyi umulan həyattakı saleh bir insanın duasıyla Allaha təvəssüldür. Bir müsəlman şiddətli bir sıxıntıya düşə bilər. Başına bir müsibət gələ bilər. Bu müsəlman Allah qatında özünün qüsurlu olduğunu bilməkdədir. Bundan ötrü də Allaha yönəlmək üçün güclü bir səbəbə yapışmaq lazımdır. Bu səbəblə də xeyirxahlığına, təqvasına, imanına, fəzilətinə, Quran və Sünnəyə bağlılığına güvəndiyi saleh bir kimsəyə gedər və sıxıntısının getməsi və üzüntüsünün qaldırılması üçün ondan özü üçün Rəbbinə dua etməsini istəyər; ***"Onlardan sonra gələnlər belə deyirlər: "Ey Rəbbimiz! Bizi və bizdən əvvəl iman gətirmiş*** *(din)* ***qardaşlarımızı bağışla".*** *(əl-Həşr 10).* ***"Biz hər bir elçini, Allahın izni ilə, ona məhz itaət edilsin deyə göndərdik. Əgər onlar özlərinə zülm etdikləri zaman sənin yanına gəlib Allahdan bağışlanma diləsəydilər və Peyğəmbər də onlar üçün bağışlanma diləsəydi, əlbəttə ki, Allahın tövbələri qəbul edən və Rəhmli olduğunu görərdilər".*** *(ən-Nisa 64).* Peyğəmbər ρ buyurdu: "Müsəlman bir kimsənin müsəlman qardaşı üçün (yanında yox ikən) etdiyi dua qəbul edilir. Dua edənin yanında olan bir mələk o, hər dua etdikcə onun üçün: "Amin! Eynisi sənin üçün də".[721] Rəvayət edilir ki, Ənəs ibn Malik τ demişdir: "Peyğəmbərin ρ yaşadığı dövrdə insanlara quraqlıq üz vermişdi. Peyğəmbər ρ cümə günü xütbə verərkən bir bədəvi ayağa qalxıb dedi: "Ey Allahın elçisi, mallar zay oldu, uşaqlar ac qaldı. Bizim üçün Allaha dua et!" Peyğəmbər ρ əllərini göyə qaldırdı. O an biz göydə bir dənə də olsun bulud görmürdük. Canım Əlində olan Allaha and olsun ki, o, hələ əllərini aşağı salmamış (başımız üzərində) dağlar qədər buludlar topalaşdı və o, minbərdən yerə enməmiş mən onun saqqalından süzülən yağış damçılarını gördüm. Həmin gün, ertəsi gün, ondan sonrakı gün, daha sonrakı gün – növbəti cüməyədək yağış ara vermədən yağdı. (Cümə günü) həmin bədəvi (və ya başqa birisi) ayağa qalxıb dedi: "Ey Allahın elçisi, evlər dağıldı, mallar su altında qaldı. Bizim üçün Allaha dua et!" Peyğəmbər ρ əllərini göyə qaldırıb dedi: "Allahım! (Yağışı) üstümüzə deyil, ətrafımıza yağdır". Sonra əli ilə hara işarə etdisə, oradakı bulud topası dağıldı və Mədinə (səması) çalaya bənzədi.[722] Qənat vadisində bir ay sel axdı, kənardan (Mədinəyə) gələn hər kəs bol yağışlar yağdığından danışırdı.[723] Allaha səmimi olaraq

---

[719] əl-Buxari 3465, Muslim 2743.

[720] Şeyx Useymin Σ deyir: "Səhabələr kimsə onlara gəlib: "Mənim üçün dua et"- deməyini xoşlamazdılar. Qadağan edərdilər. Səhabələr nə üçün bunun qarşısını alardılar? Dua etməyi istəyən kimsə qəlbini o, kəslə bağlayır, ümüdlü olur ki, onun duası qəbul olunar. Dua etməyi istəyən kimsə ehtiyaclıdır, ona görə də tələb edir. Daha gözəldir özü etsin. Həmçinin, insanın təvəkkülünü də azaldır. Artıq insan arxayın olur ki, kimsə onun yerinə dua edəcəkdir. Allah dualara cavab verdiyi halda, Allahdan istəmək daha gözəldir".

[721] Muslim.

[722] Yəni göyün üzü açıldı və Mədinənin ətrafı buludlarla əhatə olundu.

[723] əl-Buxari 933.

sığınan və duasının qəbul edilmə şərtlərini yerinə yetirən hər bir kəsin dualarının qəbul edilməsinin günümüzdə də şahidi oluruq. Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Ümmətimdən yetmiş min nəfərlik bir dəstə insan sorğu-sualsız Cənnətə girəcəkdir". Ukkaşə ibn Mihsan ψ ayağa qalxaraq dedi: "Ya Rəsulullah! Məni də onlardan etməsi üçün dua et". Peyğəmbər ρ: "Allahım bunu da onlardan et"- deyə buyurdu”.[724] Xəlifə Ömər ψ qıtlıq və ya quraqlıq vaxtı Abbas ibn Abdulmuttalib ψ ilə yağmur duasına çıxardılar və: "Allahım! Biz sənə Peyğəmbər ρ ilə təvəssül edərdik, Sən də bizə yağmur yağdırdın. İndi də Peyğəmbərin ρ əmisi ilə Sənə təvəssül edirik. Bizə yağış göndər".[725] Ömər ρ “Biz Sənə Sənin Peyğəmbərin ρ ilə təvəssül edirdik. İndi isə əmisi Abbas ψ ilə təvəssül edirik – deməsinin mənası budur; “Biz Peyğəmbər ρ sağ ikən, Ondan bizim üçün dua etməsini istəyirdik. Onun duasıyla Allaha yaxınlaşmaq istəyirdik. İndi o, Sənin axirətinə köçmüşdür. Bizə dua etməsi mümkün deyildir. Bunun üçün də biz, Peyğəmbərin ρ əmisi Abbas ψ ilə Sənə yönəlirik və Ondan bizim üçün dua etməsini istəyirik”. Yoxsa ki: “Sənin Peyğəmbərinin ρ məqamı ilə Sənə dua edirəm, Sənin Peyğəmbərinin ρ əmisi Abbasın ψ Sənin qatındakı məqamı xatirinə bizə yağış yağdır”- demək deyildir. Belə bir dua bidətdir. Sələfi Salihindən M heç kimsə belə bir dua etməmişdir. Eynilə Muaviyə ibn Əbu Sufyan ψ dövründə də xalq yağmur üçün dua istəyirdilər. Yəzid ibnul-Əsvəd əl-Curəşi saleh bir kimsə olduğu üçün ondan yağmur duası etməsini tələb etdilər. O, da Allaha dua etdi və duası da qəbul buyuruldu.[726]

***Bidət Olan Təvəssül* -** Allahın sevmədiyi söz, əməl, etiqadlarla Allaha yaxınlıq axtarmaq bidət təvəssülün içərisinə girməkdədir. Kitab, Sünnət və Sələfi Salihinin sözlərində dəlili olmayan bidət təvəssüldür. **1)** Şəxslərin haqqı və ya məqamı ilə Allaha təvəssül etmək. Əvvala bu iki tərəfdən günahdır. ***Birinci* -** Allahdan başqasının adı ilə and içməkdir. ***İkinci* -** hər hansı bir kimsənin Allahın üzərində haqqı olduğunu söyləməkdir. Yuxarıda göstərilən dəlillərdən bizə aydın oldu ki, Səhabələr Peyğəmbər ρ ilə o, həyatda ikən təvəssül etmələri - məqamı və zatı ilə deyil, sadəcə duasıyla olmuşdur. Lakin səhabələr Peyğəmbər ρ dünyasını dəyişdikdən sonra onun əmisi Abbasa ψ yönəldilər və onun duasıyla təvəssül etdilər. Əgər məqsəd Abbasın ψ zatı və ya məqamı ilə olsaydı, səhabələr Peyğəmbərin ρ məqamını buraxıb əmisi ilə təvəssül etməzdilər. Halbuki, Abbasın ψ məqamı Peyğəmbərin ρ məqamı yanında aşağı idi. Məs: "Bir insanın başına xoşlanmadığı bir şey gələrsə və yanında da bir Nəbi ilə bir başqa insan olsa, sıxıntıya düşən insan Nəbi ilə təvəssül edər, yoxsa o, kimsə ilə? Əlbbətə, Nəbi ilə. Əgər o, kimsə Nəbini buraxıb başqası ilə təvəssül edərsə cahillərdən və günahkarlardan olar. Həmçinin, Peyğəmbərin ρ qəbri də onların

---

[724] əl-Buxari 5705.

[725] əl-Buxari 2/ 398, 7/ 67, Müxtəsər əl-Buxari 536.

[726] İbn Əsakir "Tarix" 18/ 151, İbn Həcər "İsabə" 3/ 634.

yanlarında idi. Necə ola bilər ki, Ömər ψ və onunla olan səhabələr Allah Rəsulunun ρ zatı ilə təvəssül caiz ikən, onu buraxıb başqasının zatı ilə təvəssül etsinlər. Səhabələrin hamısının bu cür təvəssülə etiraz etməyərək səssiz qalmaları ən böyük dəlil və ən açıq bir icmadır. Çünki, onlar Sünnəyə zidd bir əməl görsəydilər dərhal onu düzəldərdilər. Çünki, onları Peyğəmbər ρ öyrətmişdir.

**2)** Ölmüş vəlilərə və salehlərə dua etmək və nəzir vermək. Peyğəmbərlərdən, vəlilərdən və saleh insanlardan ölmüş və ya həyatta olanların zatı ilə Allaha təvəssül etmək, onlarla dua etmək, onlardan yardım diləmək, məqamlarıyla təvəssül etmək, onlar üçün nəzir demək, Allahdan başqa heç kimsənin etməyəcyi bir işi onlardan istəmək və Allah ilə öz aralarında onları vasitə etmək şirk olub dinimiz tərəfindən qadağan edilmişdir. Allahın dinində belə bir şey yoxdur və saf Tövhid əqidəsinə zidd olan bir şeydir; ***"Kim Allahla yanaşı, haqqında özünün heç bir dəlili olmadığı başqa bir məbuda ibadət edərsə, onun cəzasını Rəbbi Özü verəcəkdir. Şübhəsiz ki, kafirlər nicat tapmazlar!"*** *(əl-Muminun 117).* Qurani-Kərimdə qaydadır ki, ***"Yəsəlunəkə"*** – "soruşanda" sözü gəldikdə ***"Qul"*** – "de ki" sözü işlədilir. Məs: "**(***Ey Muhəmməd!)* ***Səndən qənimətlər barəsində soruşurlar. De ki: "Qənimətlər Allaha və Peyğəmbərə aitdir".*** *(ən-Ənfal 1).* ***"Səndən şərab və qumar haqqında soruşurlar. De ki:…".*** *(əl-Bəqərə 219). "(Ey Muhəmməd!)* ***Səndən heyz barəsində soruşurlar. De ki:…".*** *(əl-Bəqərə 222).* ***"Səndən yetimlər haqqında soruşurlar. De ki:…".*** *(əl-Bəqərə 220).* ***"Səndən nələrin halal olduğunu soruşurlar. De ki:…".*** *(əl-Maidə 4).* Lakin bu ayədə Allah istisna edərək Peyğəmbərə ρ gələn vəhydə "***De ki***" kəlməsini zikr etməmişdir. Ey Muhəmməd! Qullarım səndən mənim barəmdə soruşsalar mən onlara yaxınam. Ondan istəyənin duasını qəbul edərəm. Dua etmək üçün kiminsə qəbrinə, pirinə getmək lazım deyil; ***"Əgər bəndələrim səndən Mənim barəmdə soruşsalar, mən onlara yaxınam. Dua edən Məni çağırsa onun duasına cavab verərəm".*** *(əl-Bəqərə 185).* ***"Rəbbiniz buyurdu: "Mənə dua edin, mən də sizin dualarınızı qəbul edim!"*** *(əl-Mumin 60).* Allah demir ki, övliyaları çağırın, onlara dua edin və ya Mənim saleh bəndələrimdən kömək diləyin.

**3)** Vəlilərin ruhları üçün qurban kəsmək. Qurani-Kərimdə və Peyğəmbərin ρ Sünnəsində varid olan çox sayda dualar vardır. Bu duaların heç birində nə məqamı, nə hörməti, nə haqqı, nə də qullardan hər hansı birinin yeri üçün dua yoxdur.[727] ***"De ki: "Mənim namazım da, qurbanım da, həyatım və ölümüm də aləmlərin Rəbbi Allah üçündür! Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən ilk müsəlmanam!"*** *(ən-Ənam 162-163).*

***<u>Müsəlmanların Təvəssül Mövzusunda Azmalarının Səbəbi</u>*** – **1.** Təqlid etmələri (filan şeyx belə dedi, filan molla belə dedi və s). **2.** Ayə və hədislərin bir qismini götürüb, bir qismini isə tərk etmək. **3.** Zəif və uydurma hədislərlə və xəbərlərlə əməl

---

[727] Bu haqda daha geniş məlumat üçün dualar kitabı olan Səid əl-Qahtaninin "Müsəlmanın Qalası", "Şəfa duaları və ovsunlar" kitabına baxa bilərsiniz.

etmək; *"**Onlara: "Allahın nazil etdiyinə və Onun Peyğəmbərinə tərəf gəlin!"– deyildiyi zaman: "Atalarımızın getdiyi yol bizə yetər"– deyə cavab verirlər. Bəs ataları heç bir şey bilməyib doğru yolda deyildilərsə necə?"*** *(əl-Maidə 14).* ***"Allahın göndərdiyinə tabe olun!"– deyildiyi zaman onlar: "Biz ancaq atalarımızın getdiyi yolla gedəcəyik"– deyirlər. Bəs ataları bir şey anlamayıb, doğru yolda deyildilərsə necə?"*** *(əl-Bəqərə 170).* ***"Çünki onlar atalarını azmış gördülər. Bununla belə yürüyə-yürüyə onların ardınca düşüb getdilər".*** *(əs-Saffət 69-70).* ***"Allah yanında yer üzündə gəzən canlıların ən pisi*** *(haqqı)* ***dərk etməyən karlar və lallardır".*** *(əl-Ənfal 22).* ***"Üzləri odda o yan-bu yana döndəriləcəyi gün onlar deyəcəklər: "Kaş biz Allaha ibadət edəydik, Onun Elçisinə müti olaydıq!" Onlar deyəcəklər: "Ey Rəbbimiz! Biz başçılarımıza və böyüklərimizə itaət etdik, onlar da bizi haqq yoldan azdırdılar".*** *(əl-Əhzab 66-67).* ***"Onlar Allahı qoyub baş keşişlərini və rahiblərini, bir də Məryəm oğlu İsanı tanrılar qəbul etdilər".*** *(ət-Tövbə 31).* Huzeyfə ibn Yəmən ψ bu ayə haqqında soruşulduqda, o: "Rahibləri və alimləri onlar üçün haramı halal edir, onlar da halal sayırlar. Halalı onlara haram edir, onlar da bunu haram sayırlar".[728] ***"İbrahim atasına və tayfasına: "Sizin tapınıb durduğunuz bu heykəllər nədir?"– dediyi zaman onlar: "Biz atalarımızı onlara ibadət edən gördük!"– deyə cavab vermişdilər".*** *(əl-Ənbiya 52-52).*

***Bidət Əhlinin Gətirdiyi Şübhələr Və Onlara Verilən Cavablar* - "Ey iman gətirənlər! Allahdan qorxun. Ona yol axtarın. Allah yolunda cihad edin ki, bəlkə nicat tapasınız".** *(əl-Maidə 35).* ***"Onların yalvardıqları məbudların özləri də Rəbbinə – hansı daha yaxın olacaq deyə vəsilə axtarırlar, Onun rəhmətini umurlar, əzabından qorxurlar. Həqiqətən, Rəbbinin əzabından qorunmaq gərəkdir".*** *(əl-İsra 57).* Bütün Əhli Sünnə vəl-Camaat alimləri İbn Abbas, Mucahid, Əbu Vail, Səuri, Zeyd, əl-Həsən, Alusi, Təbəri, İbn Kəsir M deyirlər ki: "Bu ayədə qəsd olunan Allaha itaət edərək və razı olduğu əməllər edərək yaxınlaşmaq deməkdir".[729] Allah: "Ey Muhəmməd! Allahı buraxıb, yaratdıqlarına ibadət edən qömünün müşriklərinə de ki: "Ey qövmüm başınıza bir bəla gəldikdə Allahı buraxıb Rəbb və İlah (övliya, seyyid, daş, ağac) zənn etdiklərinizə yalvarırsınız? Gəlin baxaq görək sizdən bu zərəri dəf edə biləcəklərmi. Siz onlara müqəddəs, ilah olaraq yalvarırsınız. Halbuki onların buna gücləri çatmaz və əllərindən bir şey gəlməz. Buna ancaq onları və sizi Yaradanın gücü çatar. Sizin yalvarıb-yaxardığınız o kimsələr özləri Allaha yaxınlaşmaq, Onun rəhmətini, mərhəmətini, günahlarının bağılanmasını qazanmaq üçün yol axtarırlar. Onlar qəbirlərində öz hallarını düşünürlər. Gələn mələklərin suallarına nə cavab verəcəklərini düşünürlər, sizin onlara yalvarıb-yaxarmanızdan isə xəbərsizdirlər; ***"Biz hər bir elçini, Allahın***

---

[728] Təbəri "Təfsir" 6/114, Təfsir İbn əbi Hatim 6/1784.

[729] Təbəri 4/226, 9/103-106, Alusi "Təfsiri Qurani Azim" 3/124, Şingiti "Advaul-Bəyan" 2/97-99, 3/598, İbn Kəsir "Təfsir" 2/55.

***izni ilə, ona məhz itaət edilsin deyə göndərdik. Əgər onlar özlərinə zülm etdikləri zaman sənin yanına gəlib Allahdan bağışlanma diləsəydilər və Peyğəmbər də onlar üçün bağışlanma diləsəydi, əlbəttə ki, Allahın tövbələri qəbul edən və Rəhmli olduğunu görərdilər".*** *(ən-Nisa 64).* Bu ayə Peyğəmbərin ρ verdiyi hökmdən uzaqlaşıb tağuta müraciət edən bəzi münafiqlər haqqında nazil olmuşdur. Əgər onlar günahlarını etiraf edərək Peyğəmbərin ρ yanına gələrək tövbə edərlərsə, bu günahdan ötrü Allahdan bağışlanma diləyərlər, Peyğəmbər ρ də onlara şəfaətçi olaraq onlar üçün Allahdan bağışlanma diləyərsə onların tövbələrini qəbul edəcəyini bəyan edir. Ayədə zaman mənasına gələn "*İz*" kəliməsi keçmiş zamana dəlalət edir. Gələcəyə dəlalət etməz. Allah "***İzə***" kəliməsini işlətmədi. Əksinə "***İz***" kəliməsini işlətdi. Bütün bunlar da Peyğəmbər ρ həyatda ikən baş vermişdir, ölümündən sonra yox.[730] ***"Halbuki sən onların arasında ola-ola Allah onlara əzab verən deyildir.*** *(Tövbə edib)* ***bağışlanmalarını diləyərkən də Allah onlara əzab verməz".*** *(əl-Ənfal 33).* Zəlalət əhli bu ayədən Peyğəmbərin ρ həm həyatında, həm də ölümündən sonra ümməti üçün istiğfar edəcəyini zənn etmişlər. Allah Peyğəmbərə ρ onların içində ikən və onların arasında onları Allaha ibadətə dəvət edərkən, o topluluğa əsla əzab etməyəcəkdir. Çünki, Peyğəmbər ρ onların içində olduğu müddətdə ümməti üçün bir əmin-amanlıq sığortasıdır.[731] ***"Onlara Allah tərəfindən əllərindəkini*** *(Tövratı)* ***təsdiq edən bir kitab*** *(Quran)* ***göndərildiyi zaman onu qəbul etmədilər. Halbuki əvvəlcə kafirlərə qələbə çalmaq üçün Allaha yalvarırdılar. Bildikləri*** *(Peyğəmbər)* ***gəldikdə isə ona inanmadılar. Allah kafirlərə lənət eləsin".*** *(əl-Bəqərə 89).* Bir qrup insan bu ayənin təfsirində İbn Abbas ψ haqqında yalan uyduran bir ravinin dəlilini də gətirirlər. Bu yalançının rəvayətinə görə Xeybər yəhudiləri Qatafanla döyüşlərində səhəri yola çıxarkən bu dua ilə Allaha yalvarırdılar: "Allahım! Axır zamanda bizə göndərəcəyini vədd etdiyin ummi Peyğəmbər haqqı üçün səndən onlara qarşı bizə zəfər nəsib etməyini istəyirik".[732]

Osman ibn Hənif ψ rəvayət edir ki, kor bir kimsə Peyğəmbərin ρ yanına gələrək: "Mənim üçün Allaha dua et! Mənə şəfa versin"- dedi. Peyğəmbər ρ: "Əgər istərsən dua edim, istərsən səbr et bu sənin üçün daha xeyirlidir"- deyə buyurdu. Adam: "Allaha dua et!"- dedi. Peyğəmbər ρ ona gözəl şəkildə dəstəmaz alıb iki rükət namaz qılmasını və bu şəkildə dua etməsini əmr etdi: "Allahım, mən Səndən istəyirəm və Sənin Peyğəmbərin, rəhmət Peyğəmbəri Muhəmməd ilə Sənə yönəlirəm. Ey Muhəmməd! Bu ehtiyacım üçün Rəbbimə səninlə yönəldim. Diləyimi yerinə yetir. Allahım, onu mənə şəfaətçi et!"- dedi. Adam Peyğəmbərin ρ dediklərini etdikdən sonra gözləri açıldı.[733] Bu hədisdə bidət əhli üçün heç bir əsas yoxdur. Əksinə bu

---

[730] Təbəri 4/ 157, Abdur-Rahmən əs-Səədi "Təfsir – ən-Nisa 64".
[731] İbn Kəsir 2/ 319-320.
[732] İbn Kəsir "Təfsir", əl-Beyhəqi "Dəlailun-Nubuvvə" 2/ 76, əl-Hakim "Mustədrək" 2/ 263 zəif hədis.
[733] Əhməd 4/ 138, ət-Tirmizi 3831, əl-Albani "Səhih ət-Tirmizi" 3/ 172, "Səhih İbn Məcə" 1/ 231.

hədis elə onların özlərinə bir dəlildir. Çünki, kor kişi Peyğəmbərin ρ yanına onun üçün dua etməsinə görə gəlmişdi və bilirdi ki, Peyğəmbərin ρ duası dərhal qəbul olur və Peyğəmbər ρ də ona necə dua etməsini öyrədir. Bu duada da heç bir məqamı, haqqı ilə sözləri də yoxdur. Həmçinin Peyğəmbər ρ də sağ idi. Diri insandan dua etməsini istədi. Peyğəmbər ρ də ona daha böyük bir xeyrin verilməsini diləyərək ona dəstəmaz alıb iki rükət namaz qılaraq özü üçün dua etməsini əmr etdi. Bu əməllərin hər biri də Allaha yaxınlaşmaq üçün itaət yollarıdır. Peyğəmbər ρ kor kişiyə dua etməklə kifayətlənmədi, üstəlik onu Allaha itaətə və yaxınlıq ifadə edən əməllərlə məşğul etdi. Əbu Səid əl-Xudri ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Kim namaz üçün evdən çıxarkən – Allahım! Səndən istəyənin haqqı üçün istəyirəm. Mən təkəbbürlüklə və istəksiz çıxmadım – şəkilində dua edərsə Allah onun duasını olduğu kimi qəbul edər".[734] Peyğəmbər ρ buyurdu: "Allahın adıyla Allaha iman etdim. Ona arxalandım. Güc və qüvvət Allahdandır. Allahım! Sənə dua edən və bu çıxış səbəbinin haqqı üçün, şübhəsiz ki, mən şəfaətsiz çıxmadım".[735] Əlinin ψ anası Fatimə bint Əsədi dünyasını dəyişdikdə Peyğəmbər ρ onun qəbrinin yanına gələrək: "Dirildən və öldürən də Allahdır. O, ölümsüz bir həyata sahibdir. Anam Fatimə bint Əsədin günahlarını bağışla. Öz Peyğəmbərinin və məndən əvvəlki Peyğəmbərlərin haqqı ilə onun qəbrini genişləndir. Sən rəhmlilərin ən Rəhmlisisən".[736] Ömər ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Adəm xəta etdiyi zaman dedi: "Ey Rəbbim! Muhəmmədin haqqı üçün məni bağışla". Allah: "Mən hələ onu yaratmamışam. Sən haradan bilirsən?"- deyə buyurdu. Adəm: "Ey Rəbbim! Sən məni əlinlə yaradıb, ruhundan üfürdüyün zaman başımı qaldırdıqda Ərşin sütunlarında Lə İləhə İllətlah Muhəmməd Rəsulullah – sözlərinin yazıldığını gördüm. Beləcə başa düşdüm ki, məxluqatın ən sevimlisini öz İsminlə bərabər zikr etmisən"- dedi. Allah: "Səni bağışladım. Əgər Muhəmməd olmasaydı səni yaratmazdım"- deyə buyurdu.[737] Əbu Cövzi Əvs ibn Abdullah rəvayət edir ki: "Mədinə xalqı bir qıtlığa düçar oldu. Bu halı Aişəyə O xəbər verdilər. O, da: "Nəbinin qəbrini qoruyun və üstündə göyə açılan bir ayna açın"- dedi. Onlar da dediyi kimi etdilər. Ardından güclü bir yağış yağdı".[738] Peyğəmbər ρ 23 il müşriklərlə mübarizə aparıb ki, onları Tövhidə dəvət etsin, bunlar deyirlər ki, Peyğəmbər ρ buyurub: "Çətinliyə düşəndə (ehtiyac anında) ölülərdən istəyin (Başqa rəvayətdə: "Biriniz daşa gözəl zənn bəsləyərsə, o daşın ona faydası olar)". [739] Peyğəmbər ρ buyurdu: "Allahdan bir şey istədiyiniz zaman mənim

---

[734] Əhməd 3/ 21, əl-Albani "Zəif" hədis 24.
[735] əl-Albani "Zəif" hədis.
[736] əl-Albani zəif hədis.
[737] əz-Zəhəbi "Mizan" adlı əsərində batil və uydurma olduğunu qeyd edir. əl-Albani deyir ki: "Bu hədis Qurani-Kərimin özünə ziddir". Geniş məlumat üçün bax: əl-Albani "Təvəssül".
[738] əl-Albani "Zəif" hədis.
[739] əl-Albani "Uydurma" hədis.

məqamımla istəyin. Çünki, mənim məqamım Allahın yanında böyükdür".[740] Ömərin ψ zamanında bir ara qıtlıq başladı. Bir nəfər Peyğəmbərin ρ qəbrinə gələrək: "Ey Allahın Rəsulu! Ümmətin üçün Allahdan yağmur tələb et! Çünki, onlar həlak olurlar". Adama yuxusunda: "Ömərin yanına get"- deyilmişdir".[741] Əli ibn Məymun rəvayət edir ki, İmam Şafii Σ dedi: "Mən Əbu Hənifə Σ ilə təbərruk edirəm və hər gün onun qəbrinə gedərək ziyarət edirəm. Bir ehtiyacım olduğu zaman onun qəbrinə gəlir və onun qəbri başında Allahdan istəyirəm. Çox keçmədən ehtiyacım ödənilir".[742] Subhənəllah! Bu qədər də böhtan və yalan olar! Yaxşı onda Peyğəmbər ρ iyirmi üç il nəyə görə əziyyət çəkib müşrikləri dəvət edirdi? Nəyə görə onlar arasında bu qədər döyüşlər baş verdi, qanlar axıdıldı? Məgər Məkkə müşrikləri Allahı inkar edirdilər? Xeyr, onlar Allahı inkar etmirdilər, əksinə Allahı qəbul edirdilər. Lakin ibadətdə Allaha şərik qoşurdular. Ölüləri Allaha yaxınlaşmaq üçün vasitə qoşurdular. Onlar demirdilər ki, bu büt fayda verir? Onlar deyirdilər ki, bu bütün içində saleh bir qul təmsil olunur və biz də günahkar olduğumuz üçün onlar vasitəsilə Allaha yaxınlaşırıq. Bəlkə də Allahdan bu qədər istəmirlər nə qədər ki, ölülərdən istəyirlər. Buna görə də İslam düşmənləri insanları zəlalətə sürükləmək üçün bu cür vasitələrə əl atırlar. Allah bizi və bizim dövlətimizi bu cür insanlardan qorusun. Amin!

Peyğəmbərin ρ vəfatından sonra onun səhabələri bəzən qıtlıq, bəzən qorxu, müsibətlərə məruz qalırdılar. Lakin heç birisi nə Peyğəmbərin ρ qəbrinə, nə də başqa Peyğəmbərlərin qəbrinə gedərək: "Biz səndən zamanın qıtlığını, düşmən qüvəsindən və ya günahlarımızdan şikayət edirik. Allahdan bizim üçün və ümmətin üçün ruzi verməsini və bizə yardım etməsini istə"- deyə dua etməmişdi. Çünki, bu əməl nə vacibdir, nə də müstəhəb. Çünki, bidətin nə vacibi. nə də müstəhəbi olur. Hamısı pisdir. Səhabələr, Sələflər bilirdilər ki, Peyğəmbər ρ nə Rububiyyət, nə də Uluhiyyətdən heç bir şeyə malik deyildir. O, sadəcə Allahın qulu və Rəsulu idi. Nəyə görə xüsusən şəhadət kəliməsində ***Abd*** – qulu sözü işlədildi? Yəni, ey insanlar Peyğəmbər ρ haqqından həddi aşmayın. O, da Allahın sizin kimi bir quludur. İnsanlardan üstünlüyü yalnız Allah tərəfindən seçilməsində və Peyğəmbərliyinə görədir. O, da sizin kimi bəşərdir, Allah deyildir ki, ona ibadət edilsin, ona dua edilsin, ondan kömək dilənsin, onun qəbri təvaf edilsin, köməyə çağrılsın. Çünki, Peyğəmbər ρ özü də Allahdan istəyirdi. Buna görə də şəhadət kəliməsində, İslama girmək, müsəlman olmaq üçün ilk söylənilən kəlimədə ***Lə İləhə İlləllah*** – Muhəmmədən abduhu və Rəsulu deyə söyləyirik. Allahın qulu və Rəsulu. Lakin buna baxmayaraq bu kəliməni söyləyən insanların əksəriyyəti, bəziləri cahilliklərindən, bəziləri də qəsdli şəkildə Allahın Rəbb, Rububiyyət sifətini

[740] əl-Albani deyir: "Heç bir əsli və əsası olmayan batil hədis".
[741] əl-Albani zəif hədis. Bu hədis Quran ayəsinə də ziddir. Çünki, yağış diləmək üçün istiska namazı da vardır. ***"Rəbbinizdən bağışlanmağınızı diləyin. Çünki O, çox bağılayandır. O, sizə göydən bol yağış göndərər".*** *(Nuh 10-11).*
[742] Xatib əl-Bağdadi "Tarixul-Bağdadi" 1/ 123, batil və uydurma rəvayət.

Peyğəmbərinə verirlər. İnsanlar Həcc edir ki, günahları bağışlansın, bunlar isə: "Ey Peyğəmbər! Mənə kömək ol! Ey Peyğəmbər! Mənə şəfa ver, mənə övlad, ruzi və s. ver". Görürsən ki, insanları bu kimi şeylərdən çəkindirdikdə sənə: "Sən Peyğəmbəri sevmirsən, bu mənim ona qarşı olan məhəbbətimdən yaranan hisslərimdir"- deyirlər. Biz Peyğəmbəri ρ övladlarımızdan, ata-anamızdan da çox sevirik. Bu o demək deyil ki, biz ondan kömək diləməliyik. Çünki, onu sevmək imandandır. Əgər sən bizim Peyğəmbəri ρ necə sevdiyimizi bilmək istəyirsənsə, Əhli Sünnə vəl-Camaata aid olan kitabları oxusan bunu çox gözəl başa düşərsən. Sənin kimi bir qrup da var idi. Hansı ki, Peyğəmbərin ρ yanına onu sevdiklərini bildirmək üçün gəlmişdilər. Lakin Allah ayə nazil edərək Peyğəmbəri ρ necə sevmək barədə onlara xəbər verdi; *"(Ya Muhəmməd!)* ***De ki: "Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin və günahlarınızı bağışlasın. Allah bağışlayan və mərhəmətlidir".*** *(Ali İmran 31).* Bəli, Allah öz sevgisini Peyğəmbərə ρ itaətə bağlamışdır. İtaət et, onda onu sevmiş olacaqsan və həqiqi sevgi də elə budur. İbadət isə Allahın haqqıdır. Çünki, o özü Allaha ibadət edib, Ona qurban kəsib, Ondan yardım və məğfirət diləyib və bu kimi şeyləri də öz ümmətinə əmr edib.

***Yaradanı Məxluq İlə Qiyas Etmək*** **-** Vasitələr və şəfaətçilər Allahın I qəzəblənməsinə səbəbdir. Burada bir məsələ vardır ki, ona olduqca çox diqqət yetirmək lazımdır. Çünki, biz günümüzdə də bu məsələlərlə, suallarla rastlaşırıq. Allaha şərik qoşan insanın görürsən ki, qəsdi Allahı təzim etməkdir. O kimsə öz-özündə fikirləşir ki, Allah I əzəmətli olduğu üçün biz onun yanına yalnız vasitəçilərlə daxil ola bilərik. Necə ki, padşahların (böyük bir vəzifədə işləyənlərin) yanına daxil olduqda onlara yaxın olan, sözü keçən kimsələr vasitəsilə yaxınlaşırıq. Buna görə də deyirlər ki, biz günahkarıq, ola bilər ki, Allah bizim dualarımızı qəbul etməyib bizi rədd edər. Bunun üçün də Nəbilər, Rəsullar, şəhidlər, salehlər vardır. Onlar Allaha yaxın olduqları üçün onların istəkləri geri qaytarılmaz. Müşrik insan öz-özlüyündə Allahın I Rububiyyətini aşağı saymamışdır. Onun diqqətsizliyi Allahı təzim etməkdədir. O deyir ki: "Mən bu vasitələrə ibadət edirəm ki, onlar məni Allaha yaxınlaşdırsınlar və ona aparan yolu göstərsinlər". Bunlar isə vasitələrdir. Baxmayaraq ki, o insanın öz-özlüyündə niyyəti yaxşıdır. Bəs onda nəyə görə bu əməl Allahın qəzəbini, o kimsənin Cəhənnəmdə əbədi qalmasını, onun qanını halal edir? Bunun üzərində də başqa bir sual da doğur ki, Allah bəndələrinə özünə şəfaətçilərlə, vasitəçilərlə yaxınlaşmağı buyurarmı? Belə bir vasitəçiliyin haramlığı şəriətdən götrülmüşdür, yoxsa bu insanın ağlında, fitrətində olan çirkin bir şeydir? Cavab olaraq deyirik ki: "Bu əməli insanın fitrəti də çirkin görür, həmçinin şəriət də. Bu ağıl da, fitrət də olanı iqrar (etiraf) edərək gəlmişdir. Bunun sirri nədir ki, Allah bu qədər günahın içərisindən məhz şirki bağışlamır? Sən onda bu sualı fikirləş, fikrini və zehnini bu sualın cavabına topla. Bununla da müşriklərlə tövhid əhli arasında fərq

ortaya çıxır. Allahı tanıyanlarla, tanımayanlar, Cənnət ilə Cəhənnəm əhli arasında fərq bilinir.

Şeyx əl-Albani Σ "Təvəssül" adlı əsərində deyir: "Göylərin və yerin tək və mütləq Qoruyucusu, hakimlər Hakimi, Adil, mərhəmətlilərin Mərhəmətlisi olan Allahı o, zalım, işğalçı, qəddar olan insanlara bənzətmək olarmı? Bunlar əmrləri altında olanların haqlarını yerinə yetirmir, maaşlarını vaxtı-vaxtında vermirlər, aralarında elə bir məsafə saxlayırlar ki, arada kimsə olmadan onlara yaxınlaşmaq mümkün deyildir. Sən bu insanları rüşvət və hədiyyələrlə razı edirsən, ona boyun əyirsən, onu razı etməyə çalışırsan. Heç düşünürsən, ey miskin! Bunu etməklə Rəbbini tənqid etmiş və nifrət etmiş olduğu şeylərlə onu vəsfləndirirsən. Sən Rəbbini zalım insanlarla qiyas etdiyin zaman Onu ən çirkin sifətlərlə vəsfləndirmiş olursan. Sizin dininiz bunu sizə necə mübah görür? Düşünün! Bir insan arada vasitəçi olmadan idarəçi ilə görüşə bilirsə, bu onun üçün şərəf sayılar. Siz belə bir hökmü necə verirsiniz? Ağlınız başınızdadır?" *"**Müşriklər** (Allaha qoşduqları) **şəriklərini gördükdə: "Ey Rəbbimiz! Bunlar bizim Səninlə yanaşı** (bizi Sənə yaxınlaşdırmaq məqsədilə) **ibadət etdiyimiz şəriklərimizdir"– deyəcəklər. Bütlər də onlara: "Siz yalançısınız!** (Biz sizi Allahı tərk edib bizə tapınmağa dəvət etməmişdik)"– **deyə cavab verəcəklər".** (ən-Nəhl 86). "(Qiyamət günü) **hamı Allahın hüzurunda peyda olacaqdır. Zəiflər, acizlər** (iman gətirməyi) **özlərinə sığışdırmayan** (başçılarına) **deyəcəklər: "Biz sizə tabe idik. İndi Allahın əzabını, azacıq da olsa bizdən dəf edə bilərsinizmi?" Onlar belə cavab verəcəklər: "Əgər Allah bizə doğru yolu göstərsəydi, biz də sizə göstərərdik. İndi ağlayıb sızlasaq da, səbr etsək də, fərq etməz** (əzabdan xilas ola bilmərik). **Bizim üçün heç bir qurtuluş, heç bir sığınacaq yoxdur". İş bitdikdə** (Cənnətliklər Cənnətə, Cəhənnəmliklər Cəhənnəmə daxil olduqda) **şeytan** (onu məzəmmət edən kafirlərə) **belə deyəcəkdir: "Allah** (Peyğəmbərlər vasitəsilə) **sizə** (pis əməllərinizə görə Cəhənnəmə düşəcəyiniz barədə) **doğru vəd vermişdi. Mən də sizə vəd vermişdim. Amma sonra vədimə xilaf çıxdım. Əslində mənim sizin üzərinizdə heç bir hakimiyyətim yox idi. Lakin mən sizi** (günah etməyə, Allaha asi olmağa) **çağırdım, siz də mənə uydunuz. İndi məni yox, özünüzü qınayın. Nə mən sizin dadınıza çata bilərəm, nə də siz mənim dadıma. Mən öncə** (dünyada) **sizin məni Allaha şərik qoşmağınızı da inkar etmişdim. Həqiqətən zalimləri şiddətli bir əzab gözləyir".** (İbrahim 21-22).*

Son olaraq Muvahhid bir qulun üzərinə düşən onu böyük şirkə, kçik şirkə və ya bidət bir əmələ aparan bidət təvəssüldən çəkinməsidir. Çünki, bu duada həddi aşmaqdır. Allah isə yalnız şəriətin əmr etdiyi formada olan duaları qəbul edir. Qul dualarını Quran və Sünnədə seçməyə səy göstərməlidir. Çünki, bu qəbul edilməsi tərəfdən daha münasibdir.

# QİYAMƏTƏ YAXIN ŞİRKİN ZÜHUR ETMƏSİ

Qiyamətin əlamətlərindəndir ki, Peyğəmbərin ρ ümmətində şirk zühur edəcəkdir. Artıq İslam gəldikdən sonra, peyğəmbərlik verildikdən sonra Peyğəmbər ρ ümmətini Tövhidə dəvət etdi. Ümməti İslamı qəbul edərək şirkdən çəkindilər. Artıq Məkkənin fəthindən sonra Məkkədə müşrik qalmadı. Ərəbistan yarımadası bütünlüklə İslamı qəbul etdilər. Peyğəmbər ρ bunun üçün göndərildiyi və Quran bunu qadağan etdiyi halda çox keçmədi ki, insanlar yenidən bu çirkin əməli işləyərək Allaha şəriklər qoşmağa başladılar. Səuban ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Mən ümmətim üçün haqq yoldan azdıran imamlardan qoxuram. Ümmətimin arasına qılınc davası düşdüsə bu Qiyamət gününədək davam edəcəkdir. Ümmətimin bəzi tayfaları müşriklərə qoşulmadıqca və bəzi tayfaları bütlərə ibadət etmədikcə Qiyamət qopmayacaqdır". [743] *"(Ya Muhəmməd!)* ***Kitabdan özlərinə az bir şey verilənləri*** *(yəhudiləri)* ***görmürsənmi? Onlar Cibt və Tağuta inanır və kafirlər üçün də: "Bunlar möminlərdən daha doğru yoldadırlar"– deyirlər".*** *(ən-Nisa 51).* Əbu Hureyra ψ rəvayət edir ki, Peyğəmbər ρ buyurdu: "Dəvs qəbiləsinin qoca qadınları Zul-Xalasa (bütü) ətrafında tavaf edə-edə quyruqlarını titrətmədikcə qiyamət qopmayacaqdır. Zul-Xulasa Dəvs qəbiləsinin cahiliyyə dövründə ibadət etdikləri bütdür".[744] Peyğəmbər ρ buyurdu: "Gecə və gündüz, Lat və Uzzaya ibadət edilmədikcə yox olub getməz".[745] Artıq şirk insanların əqidəsinə çevrilmişdir. Haradan bir səs eşitsələr, harada bir işıq görsələr (istər ağac olsun, istər daş olsun, istər qəbir olsun onlara fərq etməz) dərhal oranı ibadətgaha çevirirlər. Ağacın üzərinə əskilər, parçalar bağlayaraq niyyət edən kim, təvaf edən kim, övlad diləyən kim. Peyğəmbərin ρ dövründə də səhabələr Peyğəmbərdən ρ belə bir ağac istədilər. Lakin görün Peyğəmbər ρ onlara nə cavab verdi: Əbu Vaqid əl-Leysi ψ rəvayət edir ki, Peyğəmbər ρ ilə birlikdə Məkkədən Huneynə tərəf yola çıxmışdıq. Biz o, vaxtlar təzə müsəlmanlardan idik və küfrdən yenicə çıxmışdıq. Müşriklərin üstündən silahlarını asasaraq (ibadət etdikləri) bir Sidr ağacı vardı. Onun ətrafında yığışaraq öz adət ən-ənələrini (mərasim, ayin) yerinə yetirir və o, ağacı "Zətu Ənvat" deyə çağırırdılar. Biz də bu böyük bir Sidr ağacının yanından keçdikdə: "Ey Allahın Rəsulu! Onların "Zətu Ənvatı" olduğu kimi bizim üçün də "Zətu Ənvat" düzəlt"- dedik. Peyğəmbər ρ buyurdu: "Allahu Əkbər! Şübhəsiz ki, bunlar hamısı keçmiş adət ən-ənələrdir. Nəfsim əlində olana and olsun ki, siz İsrail oğullarının Musadan istədikləri şeyin eynisini məndən istədiniz: *"**...Bizə onların sitayiş etdikləri bütlər kimi bir büt düzəlt!**"* *(əl-Əraf 138)* Həqiqətən, siz

[743] Muslim 4/2215, Əbu Davud 4202,4252, İbn Məcə 3952, Əhməd 5/278,284.

[744] əl-Buxari 13/76, Muslim 4/2230,2906.

[745] Muslim 4/2230,2907.

əvvəlkilərin adət ənənəsi ilə gedəcəksiniz”.[746] Bu səhabələr İslamda yeni olduqları üçün bir çox tövhid məsələlərini bilmirdilər. Məhz buna görə də Peyğəmbərdən ρ müşriklərin uğur gətirmək üçün dilədikləri bir büt kimi, onlar üçün də uğur diləmək üçün bir büt düzəltmələrini istəmişlər; ***"Allahı qoyub özlərinə dost tutanlar: "Biz onlara bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik!"- deyirlər".*** *(əz-Zumər 3).* ***"Onlar Allahı qoyub özlərinə nə bir xeyir, nə də bir zərər verə bilən bütlərə ibadət edir və: "Bunlar Allah yanında bizdən ötrü şəfaət edənlərdir!"- deyirlər. De ki: "Allaha göylərdə və yerdə bilmədiyi bir şeyimi xəbər verirsiniz? Allah Özünə şərik qoşulan bütlərdən uzaqdır və ucadır".*** *(Yunus 18).*

Şeytan öz Rəbbinə vəd vermişdir ki, insanları haqq yoldan azdıracaqdır və hər bir vəchlə, fitnə və hiylə ilə insanları Allaha ibadət etməkdən yayındırmağa çalışır. Təki insanlar Allaha ibadət etməsinlər. Şeytana qulluq edənlər də belə bir ibadətgahlar qurmaqla insanları azdırmağa çalışırlar. Siz deyirsiniz ki: “Onlar salehlərdir, övliyalardır, Allahın sevimliləridir. Biz isə günahkarlarıq, Allah yanında heç bir qədir-qiytimiz yoxdur. Onlara qarşı məndə olan sevgiyə, məhəbbətə görədir ki, mən onun vasitəsilə Allaha yaxınlaşıram”. Mənim sizə bir neçə sualım vardır. Bizə İslam dinini çatdıran, hər bir şeyi ətraflı şəkildə xəbər verən kim olub? Sözsüz ki, deyəcəksiniz Peyğəmbər ρ. Məgər Peyğəmbər ρ bizə əmr edib ki, “mən öləndən sonra məni Allah ilə öz aranızda vasitəçi tutun” və ya Peyğəmbər ρ bunu özü edib və ya səhabələrinə tövsiyə edib ki, ölüləriniz vasitəsilə Allaha yaxınlaşın və onlardan nə istəyirsinizsə diləyin və ya Əbu Bəkr, Ömər, Osman, Əli M və s. səhabələr hansı ki, cüzi bir yaxşı əməl olduqda onu dərhal etməyə çalışardılar. Heç olmasa bir ayə, bir hədis də belə gətirin ki, biz də iman edək. Əgər gətirə bilməsəniz bilin ki, onda siz özünüzü onlardan ağıllı sayırsınız. Çünki, onlar bu böyüklükdə əfzəl əməli görmürdülər və ya bilmirdilər, amma siz bundan xəbərdarsınız. Allah bizi və əhli-əyalımızı şirkə tapınmaqdan qorusun. Amin!

## ALLAHA I QARŞI PİS ZƏNNDƏ OLMAQ[747]

Allah I barəsində zənn iki cürdür: **1.** Xeyir zənn etmək. Bu da iki şeylə bağlıdır: **1)** Allahın kainatda etdiyi əməllərə, müsəlamn bir kimsə etiqad etməlidir ki, bunlarda hikmət vardır. **2)** İnsan Rəbbi barəsində, Allah nə edirsə gözəl zənndə olmalıdır. İnsan dua edir və gözəl zənn bəsləyir ki, Rəbbi onu eşidir və duasını da qəbul buyuracaqdır. Bir şərtlə ki, Allahın qoyduğu şəriətə uyğun olsun; ***"Onlar Allaha,***

---

[746] ət-Tirmizi 2180, Əhməd 5/ 218, əl-Albani “Səhih Cəmi” 1063.

[747] ***"Zənn əsla həqiqət ola bilməz".*** *(ən-Nəcm 28).* ***"Ey iman gətirənlər! Çox zənnə-gümana qapılmaqdan çəkinin. Şübhəsiz ki, zənnin bəzisi günahdır…".*** *(əl-Hucurat 11).* Peyğəmbər ρ buyurdu: "Zəndən çəkinin. Çünki, sözün ən yalanı zəndir". əl-Albani "Səhihul-Cəmi" 1/ 45.

***axirət gününə inanır,*** *(insanlara)* ***yaxşı işlər görməyi əmr edir,*** *(onları)* ***pis əməllərdən çəkindirir və xeyirli işlər görməyə tələsirlər. Onlar əməlisaleh şəxslərdəndirlər".*** *(Ali İmran 114).* **2**. Pis, şər zənn etmək; ***"Allah Onun barəsində bədgüman, bədniyyət olan münafiq kişi və qadınları, müşrik kişi və qadınları əzaba düçar etsin. Onların bədniyyətliyi öz başlarında çatlasın!"*** *(əl-Fəth 6).*

Əgər bu məsələ sənə bəyan olarsa, burada məsələnin sirrini açan böyük bir əsas vardır. Bu da Allahın qatında günahların ən böyük olanı Allah haqqında pis zəndə olmaqdır. Allah haqqında pis zəndə olan Allahın kamilliyinə, Allahın İsim və Sifətlərinə qarşı pis zənn etmişdir. Allah barəsində pis zənn etmək (Allahı layiqincə qiymətləndirməmək) Tövhidin kamilliyinə ziddir. Buna görə də Allah özünə qarşı belə zəndə olanları hədələmiş, bundan qeyri heç kəsi bu cür hədə ilə hədələməmişdir; ***"Allah Onun barəsində bədgüman, bədniyyət olan münafiq kişi və qadınları, müşrik kişi və qadınları əzaba düçar etsin. Onların bədniyyətliyi öz başlarında çatlasın!"*** *(əl-Fəth 6).* ***"Siz qulaqlarınızın, gözlərinizin və dərilərinizin əleyhinizə şəhadət verəcəklərindən qorxub*** *(günah işləməkdən)* ***çəkinmir, etdiyiniz əməllərin çoxunu isə Allahın bilməyəcəyini zənn edirdiniz. Sizin öz Rəbbiniz barəsindəki bu zənniniz sizi məhv etdi və ziyana uğrayanlardan oldunuz!"*** *(Fussilət 22-23).* Onlar elə zənn etdilər ki, Allah etdiyi hər bir işi bilmir və bununla da Allahın elm sifətini inkar etdilər. Həmçinin də; ***"Allahı qoyub uydurma məbudlarımı diləyirsiniz? Aləmlərin Rəbbi barəsində nə düşünürsünüz?"*** *(əs-Saffət 86-87).* Yəni siz Allahın Rububiyyətində, Uluhiyyətində, İsim və Sifətlərində pis bir şey zənn etdiniz ki, bu da sizi Allahdan qeyrisinə qulluq etməyə vadar etdi. Sizə vacib olan isə Allaha layiq olduğu şəkildə zənn etmək idi.

***Həmçinin*** - Biz günahkar bəndələrik, onlar isə övliyalardır. Biz bu kimsələrin vasitəsi ilə, padşahların yanına daxil olduqda birbaşa daxil ola bilmədiyimiz kimi elə övliyalarla Allaha yaxınlaşırıq. Belə bir kimsə Allahı layiqincə qiymətləndirməmişdir. Belə bir kimsə Allahın Rububiyyətinə, Uluhiyyətinə, Allahın təkliyinə tən etmişdir. Allahın vasitəyə ehtiyacı yoxdur. Onlar isə acizdirlər. Belə bir pis zənn gətirən insan Allaha qarşı pis bir zənn etmişdir. Belələrinin cazası əzab, lənət və Cəhənnəmdir. Allahın belə bir çirkin şeyi əmr etməsi qeyri mümkündür. Ağıl, fitrət bu cür şeyi qəbul edə bilməz. Ən çirkin zülmdür ki, insan Allahın haqqını özü kimi bir insana versin və ya onu özü ilə Allah arasında şərik tutsun. Bu şərik qoşulan da Allahın öz quludur. Nə qədər insanlar vardır ki, Allahdan qeyrisinə ümid edir, dua edir və təvəkkül edirlər. Görürsən ki, namazlarını heç xuşu ilə qılmırlar. Namaz qıldıqda fikirləri orada-burada olur. Lakin kiminsə qəbrinin yanında durduqda isə xuşu ilə, zəlil olaraq dua edir. Allahın qarşısında isə bu cür zəlillik yoxdur, nəinki qəbrin, hansısa bir məxluqun yanında. Belə insan artıq onu Allahdan üstün tutmuşdur; ***"Allah sizə özünüzdən bir məsəl çəkir. Sahib olduğunuz kölələr içərisində sizə***

***verdiyimiz mal-dövlətə sizinlə bərabər ortaq olan, özünüzdən*** *(bir-birinizin haqqına toxunmaqdan)* ***çəkindiyiniz kimi o kölələrdən də çəkindiyiniz şərikləriniz varmı? Biz ayələrimizi ağılla düşünən bir qövm üçün belə ətraflı izah edirik".*** *(ər-Rum 28).* Necə ola bilər ki, insanlar mallarında, dövlətlərində Allahın onlara verdiyi bu ruzidə kiminsə onlara şərik olmasını istəmirlər. Onda nə üçün siz Mənim qullarımı, bəndələrimi Mənə şərik tutursunuz. Kim belə bir zənndə olarsa, Məni lazımınca qiymətləndirməmişdir, lazımınca təkləşdirməmişdir, lazımınca təzim etməmişdir; *"(Ey insanlar!)* ***Bir məsəl çəkildi, ona qulaq asın! Şübhəsiz ki, Allahdan qeyri ibadət etdiyiniz bütlər heç bir milçək də yarada bilməzlər – lap hamısı bunun üçün bir yerə yığışsa belə! Əgər milçək onlardan bir şey götürüb aparsa, onu milçəkdən geri ala bilməzlər. İstəyən də aciz, istənilən də! Müşriklər Allahı lazımınca qiymətləndir-mədilər".*** *(əl-Həcc 73-74).*

***Həmçinin*** - Allahı lazımınca qiymətləndirməmişdir; Allah Peyğəmbərlər göndərməyib, kitablar nazil etməyib. O insan Allahı layiq olmayan bir şeyə nisbət etmişdir. Çünki, belə bir iş məxluqatı yaratdıqdan sonra onları başlı-başına buraxmaq Allaha yaraşmaz. Bu sözləri işlədən insan artıq küfr etmişdir; ***"Biz göyü, yeri və onların arasında olanları boş-boşuna yaratmadıq. Bu kafirlərin pis zənnidir. Vay olsun onlara və onları Cəhənnəmdə əzab gözləyir".*** *(Sad 27).*

***Həmçinin*** - Allahın İsim və Sifətlərini inkar edən şəxs Allahı layiqincə qiymətlən-dirməmişdir; Qədərilər, Cəbərilər və s. firqələr kimi. Allah onların bu sözlərindən uzaqdır; *"(Müşriklər)* ***Allahı lazımınca qiymətləndirmədilər. Halbuki Qiyamət günü yer bütünlüklə Onun Ovcunun içində olacaq, göylər isə Onun sağ Əli ilə bükülədəkdir. Allah*** *(müşriklərin)* ***Ona aid etdikləri sifətlərdən təmamilə uzaq və ucadır".*** *(əz-Zumər 67).*

***Həmçinin*** - Allah Ərşə yüksəlməyib, Allah göydə deyildir hər yerdədir və s. deyənlər Allahı lazımınca qiymətləndirməmişdir; Həmçinin də Allahın hikmətini, məhəbbətini, rəhmətini, qəzəbini, qısqanmasını, təəccüblənməsini, gülməsini, Qiyamət günü görünməsini, Ayaq sifətini və s. inkar edənlər də Allahı lazımınca qiymətləndirməmişlər. Həmçinin də Allaha övlad nisbət edənlər, hər bir şeyin Allah olmasını söyləyənlər (Hüluliyyə) və s. İbn Arabi deyir: "Qul Allahdır, Allah isə quldur". Bunlar hamısı azğın firqələrdir.

***Həmçinin*** - Allah Peyğəmbərin ρ düşmənlərini yüksəldib, onların ailələrini yüksəldib, zikirlərini ucaldıb - bu da Allahı layiqincə qiymətləndirməmişdir. Mülkü, xəlifəliyi, izzəti Peyğəmbərin ρ düşmənlərində etmişdir deyənlər də Allahı lazımınca qiymətləndirməmişdir. Peyğəmbərin ρ əhli-beytini alçaltmış, onlara zəlillik vermişdir - deyənlər də Allahı lazımınca qiymətləndirməmişdir. Kim belə bir fikirdədirsə o, Allaha qarşı böhtan atmışdır. Bu sözlər yəhudi və nəsranilərin Allah barəsində sözündən alınmışdır. Onlar deyirlər ki, "Allah zalım bir padşah göndərmiş və o,

özündən Peyğəmbərlik iddia etmişdir. Allaha qarşı yalan danışmışdır. Onun adından əmr etmiş, qadağan etmiş və çəkindirmişdir. O, kimsə Peyğəmbərlərin şəriətini nəsx etmişdir”. Bəllidir ki, bu böyük bir böhtan, Allaha olan tənədir. Allahın elminə, hikmətinə, Rububiyyətinə olan böhtanı əhatə edir. Allah bu inkarçıların sözlərindən uzaqdır.

***Həmçinin*** - Allah öz övliyalarına, dostlarına cəza verə bilər, asilik etməyənləri cəzalandıra bilər və onları Cəhənnəmə daxil edər deyənlər də Allahı layiqincə qiymətləndirməmişdir; Həmçinin də “Allah öz düşmənlərinə, Ona iman gətirməyənlərə nemət verər və onları Cənnətlərə daxil edər”. Əksinə Quran ayələri və hədislər bu deyilənlərin əksinə gəlmişdir. Allah öz övliyalarına nemət verər və düşmənlərinə isə nemət verməyəcəkdir. Artıq Allah Öz Kitabında belə bir şeyləri özünə caiz görəni inkar etmişdir. Belə bir hökm verənləri ən pis hökm verənlərdən saymışdır; ***“Biz heç iman gətirib yaxşı işlər görənləri yer üzündə fitnə-fəsad törədənlərə tay tutarıqmı? Ya da Allahdan qorxanları günahkarlara tay tutarıqmı?”*** *(Sad 28).* ***"Yoxsa dünyada pis əməllər edənlər*** *(axirətdə)* ***onları iman gətirib yaxşı işlər görənlərlə bir tutacağımızı, onların həyatlarının və ölümlərinin eyni olacağını güman edirlər! Onlar nə pis mühakimə yürüdürlər".*** *(əl-Casiyə 21).*

***Həmçinin*** - Allah ölüləri diriltməyəcəkdir, Allah Qiyamət günü bəndələrini bir yerə toplamayacaqdır, sorğu-sual olunmayacaqdır deyənlər Allahı lazımınca qiymətləndirməmişlər. Belə bir söz deyənlər Allahın hikmətinə də böhtan atmışlar. Əgər ölümdən sonra dirilmək yoxdursa onda insanların yaradılışında bir məqsəd də yoxdur. Əgər ölümdən sonra dirilmək yoxdursa bu qədər Peyğəmbərlərin, kitabların nazil olması nəyə görə idi? Bütün bunlar bizə xəbər verir ki, ölümdən sonra dirilmək vardır. O günü hər bir kəs nə etdiyini biləcəkdir, o günü yalan sayanlar da peşmançılıqlarından, yalanlarına görə barmaqlarını gəmirəcəklər. Vay olsun o günü yalan sayanların halına. Vay olsun! ***"Kafirlər onlar öldükdən sonra əsla dirilməyəcəklərini iddia edirlər.*** *(Ya Peyğəmbər!)* ***De ki: “Bəli, Rəbbimə and olsun ki, siz mütləq diriləcəksiniz. Sonra da etdiyiniz əməllər sizə*** *(bir-bir)* ***xəbər veriləcəkdir. Bu Allah üçün çox asandır".*** *(ət-Təğabun 7).*

***Həmçinin*** - Allahın əmrinə səhlənkar yanaşaraq, Allahın əmrinə asi olan kəs, Allahın haramlarını edən insan Allahı lazımınca qiymətləndirməmişdir. Həmçinin də Allahın qadağanı ona yüngül gələrək, Allahın haqqı ona elə-belə, boş bir şey kimi gəlir. Allahın haqqını, zikrini zay edir. Həmçinin də qəlbi Allahın zikrindən qafil olan kimsə də Allahı lazımınca qiymətləndirməmişdir. Onun öz nəfsi istəyi, arzuları Allahın razılığını tələb etməkdən, axtarmaqdan üstün olmuşdur. Belə bir kimsənin məxluqa olan itaəti Allaha olan itaətdən daha mühümdür. Ona görə məxluqun əmrini, buyuruğunu yerinə yetirmək Allahın əmrlərini yerinə yetirməkdən daha mühümdür. Elə bil ki, Allah onun dilində, qəlbində artıq bir şeydir. Allahdan qeyrisi

isə ona görə daha üstündür. O kimsə Allahın onun üzərindəki baxışını aşağı görür. Halbuki o, Allahın Ovcundadır. Onun ixtiyarı Allahın Əlindədir. İnsanların baxışını isə üstün sayır. İnsanlardan utanır, Allahdan isə utanmır. İnsanlardan qorxur, Allahdan isə qorxmur. İnsanlarla münasibətdə olduqda bacardığı qədər güc və qüvvəsindən istifadə edərək çalışır. Allah ilə münasibətdə olduqda (Allahın əmrlərini yerinə yetirdikdə) isə ən aşağı, dəyərsiz şəkildə hərəkət edir. İnsanlardan sevdiyi bir kəsin xidmətində durduqda ciddiliklə, çalışqanlıqla onun qarşısında durur. Onun xidmətində həm qəlbi, həm də əzaları ilə çalışır. O insana olan xidmətini öz işlərindən də belə üstün tutur. Allahın haqqını yerinə yetirdikdə isə elə bir şəkildə edər ki, özü kimi bir məxluq bundan razı qalmazdı. Allah üçün elə mal sərf edər ki, o malı özü kimi bir məxluqa sərf etməz. Belə bir sifəti olan insan Allahı lazımınca qiymətləndirmişdirmi? Əlbəttə ki, yox. Görürsən ki, insan ən qiymətli şeylərini dünya üçün, Allahdan qeyrisi üçün edir, vaxtının ən çox hissəsini dünya üçün, faydasız şeyləri əldə etmək üçün ayırır. Lakin Allaha gəldikdə isə çox az bir hissəsini Allaha sərf edir.

***Həmçinin* -** İçki içir – Allah bağışlayır, rüşvət verir, alır – Allah bağışlayır, Allah mənə qarşı ədalətsizdir, mənə zülm edir, haqqımı tapdalıyır deyənlər Allahı lazımınca qiymətləndirməmişdir. Onun Allah barəsində olan düşüncələri pisdir, şərdir. Dua edir və qəbul olmadığını gördükdə dərhal pis zənn edir. Lakin insan bilməlidir ki, bütün bunlarda böyük hikmət vardır. Allahın qadağalarını edib sonra da Allah barəsində - “Allah bağışlayar” deyən kimsə Rəbbi barəsində pis zənn edir. Münafiqlər Uhud döyüşündə zənn edirdilər ki, Allah bu dinə kömək etməyəcəkdir, Peyğəmbərinə yardım etməyəcəkdir, bu iş yox olub gedəcəkdir, küfr və şirk qalib gələcəkdir, bütün bunlar hikmətsiz olaraq baş vermişdir və s. Allahdan onun əməlləri barəsində heç nə soruşulmur. O, istədiyini edəndir. Allahın rəhm etdiyi kimsələrdən başqa çox az bir qism insanlar bu pis zəndən qurtulmuşlar. Ona görə sən özünə nəzər sal və gör bundan qurtulmusan yoxsa?

***Həmçinin*** - Allahla yanaşı Allahın düşmənini, Allaha şərik qoşan bir kimsə Allahı lazımınca qiymətləndirməmişdir. Ona Allaha təzim etdiyi kimi təzim edir, ona itaət edir, onu ümid edir, ondan qorxur. Allahın düşmənini, Allahın gözündən düşən birisini Allaha şərik qoşur. Müşriklər mələklərə ibadət etdikləri vaxt öz iddialarına görə onlar elə zənn edirdilər ki, onlar mələklərə ibadət edirlər. Həqiqətdə isə onlar şeytana ibadət edirdilər; ***“O gün Allah onların hamısını toplayacaq, sonra da mələklərə buyuracaq: "Bunlar sizəmi ibadət edirdilər?" Mələklər deyəcəklər: "Sən paksan, müqəddəssən! Onlar deyil, Sənsən bizim Hamimiz! Xeyr, onlar cinlərə ibadət edirdilər. Əksəriyyəti də məhz onlara iman gətirmişdi”.*** *(Səba 40-41).* Şeytan insanı özünə ibadətə çağırır və elə ilham etdirir ki, o mələkdir. Həmçinin günəşə, aya, ulduzlara ibadət edənlər də belədir. Buna görə də günəş doğanda şeytanın iki buynuzu arasında doğur və kafirlər günəşə səcdə edirlər. Həqiqətdə isə günəşə deyil

şeytana səcdə edirlər. Həmçinin günəş batdığı zaman, İsaya, Məryəmə, övliyalara, pirlərə, seyyidlərə ibadət edənlər də onlara deyil şeytana ibadət edirlər; ***"Ey Adəm övladı! Məgər Mən sizə: "Şeytana ibadət etməyin, o sizin açıq düşməninizdir"– deyə buyurmadımmı".*** *(Yasin 60).* Bütün bunlar şirkin Allah qatında böyük günahlardan olmasının sirrini bildirir. Allah onu tövbəsiz qəbul etmir. Şirk insanın əbədi əzabda qalmasını vacib edir. Allah bizi şirkdən qorusun! Amin!

# TÖVHİDİN QORUNMASI

Müsəlmanların bu günkü hallarına baxsaq görərik ki, onlar çox zəlil bir vəziyyətdədirlər. İslam tarixi boyu müsəlmanlar bu günkü kimi ağır vəziyyətdə olmamışlar və qəlbində zərrə qədər iman olan hər bir müsəlman, müsəlmanların bu vəziyyətinə baxdıqda (əgər onun qəlbində iman varsa) mütləq onun qəlbi ağramalı, acı çəkməlidir. Müsəlmanların 80-90 % demək olar ki, müsəlmanların bu halına baxdıqda yalnız və yalnız öz hisləri, qəzəb və nəfsi-istəkləri tərəfdən baxırlar. Və bəd dua edərək: "Allah kafirlərə lənət etsin, Allah onların bəlalarını versin, Allah onların başlarına daş yağdırsın"- deyirlər. Lakin çox az bir qism insanlar - *Allahın Rəhm Etdiyi Kimsələr* - onlar müsəlmanların bu hallarına öz hisləri, qəzəb və nəfsi-istəkləri tərəfdən deyil, elm tərəfdən baxırlar və elm tərəfdən baxaraq müsəlmanların bu halına doğru düzgün diaqnoz qoya bilirlər. Lakin kim ki, bu məsələlərə qəzəb, kin-küdurət tərəfdən baxırsa, onlar bu məsələyə doğru düzgün diaqnoz və düzgün fikir yürüdə bilmirlər. Ona görə də fiqhi məsələlərdə belə bir qayda var: "***Əl-Hukmu Farun Anid Tasavvur -*** Əgər sən bir məsələni ətraflı şəkildə təsəvvür etməsən, o məsələ haqqında bir hökm, qərar verə bilməzsən". Ona görə də mütləqdir ki, biz müsəlmanların bu halına elm tərəfdən baxaq və görək müsəlmanlar nə üçün bu vəziyyətdədirlər? Axı onlar nə ediblər və nə edirlər ki, bu cür zəlil və sınmış bir vəziyyətə düşüblər. Dinin zəifləməsi, cahilliyin baş alıb yayılması, yad adətlərin dinə daxil olması, kafir dövlətləri tərəfdən əzilmələr və s. Biz bu məsələni araşdırmalıyıq.

Həqiqətən də müsəlmanların bu günkü halı misal olaraq sizə söyləyəcəyim bir hekayədədir. Bu hekayə bir qövmlə bağlıdır ki, onlar dağların əhatəsində, gözəl bir guşədə yaşayırdılar. O qövmün məskunlaşdığı yerdə yağış suları ilə yığılaraq, təmiz saf bir çay dağların ətəyindən axaraq onların ərazisində bir göl yaratmışdı. Bu qövmün camaatı gölün suyundan içər, mal-qaralarını suvarar və əkin sahələrində istifadə edərdilər. Və o gölün suyunun səbəbilə Allah bu qövmə izzət, şan-şöhrət, şərəf, qüdrət, qüvvət vermişdi. O qövmün ağsaqqalları daima öz camaatlarına deyərdilər: "Bu gölü qoruyun, göz bəbəyiniz kimi qoruyun. Bu gölə nə çör-çöp, nə də zibil atmayın". Hətta o, qövmün camaatı o çaya nə isə atıb onu zibilləməyi heç düşünmürdülər. Buna baxmayaraq ağsaqqallar onlara daima nəsihətlər edir, daimə xatırladaraq yadlarına salardılar ki, "bu çaya heç bir şey atmayın. Bu çayı canınızdan da çox qoruyun". Çünki, onlar bilirdilər ki, onların bu cür qüvvətlənməsi, qüdrətlənməsi, izzət, şan-şöhrət, şərəf tapmalarına səbəb yalnız və yalnız bu göldür. Bu qövmün ətrafında bir çox tayfalar yaşayırdılar. O tayfalar bilirdilər ki, bu qövm güclü və qüvvətlidir. Onlara hörmət edir və sayırdılar. Bilirdilər ki, onlara heç bir şey edə bilməzlər. Hətta o qövmlər heç düşünmürdülər ki, onlara hücum edib qalib gələ bilərlər. Çünki bilirdlər ki, bu mümkün olan şey deyil. Onların güclü və qüvvətli

olmalarına səbəb yalnız və yalnız bu çaydır. Lakin vaxt ötür, illər keçir, ağsaqqallar, bu qövmün ağıllı, dünya görmüş insanları dünyalarını dəyişirlər. Yeni nəsillər gəlir. Yeni nəsillər gəldikcə, onlar o vədi (əhdi) unutmağa başlayırlar. O vəd ki, bu qövmün ağsaqqaları nəsillərdən-nəsillərə ötürərək bu çayın qorunması barəsində öz qövmlərindən əhd alırdılar.

Bir gün bu qövmün cahil bir sakini heç kəsin onu görmədiyini zənn edərək çayın içinə bir çöp atır. Görür ki, ona heç kəs güldən artıq bir söz demədi və bundan sonra bu qövmün camaatı bu çaya istədikləri zir-zibili, istədikləri çör-çöpü, istədikləri ölmüş heyvanların leşlərini atmağa başlayırlar. Öz ehtiyaclarını belə o çayda ödəməyə başlayırlar və nəticədə bu çayın suyu çirkab, bulanmış bir hala gəlir. Allah bu çayı qorumadıqlarına görə onlara dəhşətli xəstəliklər göndərir. Qövmün camaatı xəstəlik tapır. Bu xəstəlik nəticəsində camaat zəifləyərək çox aciz bir hala gəlirlər. Buna baxmayaraq onlar çayı zibilləməyə davam edirdilər və düşmənlər bu qövmün zəiflədiyini artıq hiss etmişdilər və düşündülər ki, artıq vaxt yetişib onlara qalib gəlmək olar. Düşmən hücumlara başlayır. Onları öz əsarətləri altına alaraq başlarına istədikləri oyunu gətiritlər, mal-qaralarını məhv edir, dövlətlərini əllərindən alır, ailələrini dağıdır, özlərini də zəlil bir vəziyyətə qoyurlar. Elə bir vəziyyətə ki, artıq bu qövm çox zəifləmiş, heç bir sözləri də keçmirdi, heç bir şey də edə bilmirdilər. O qövmlər istədikləri zülmü onların başlarına gətirirdilər. Bir gün bu qövmün sağ qalmış adamları bir yerə toplanaraq: "Biz qərar verməliyik, sözü bir yerə qoyub camaatımızı bu zülmkarlardan necə qurtarmağı düşünməliyik". Bu fikirlərə əsasən qövmün camaatı üç yerə bölündü.

***Birinci qrup:*** Bu qövmün cavan nəsli toplanır. (Qollarında güc, başda ağıl olmayanlar). Onlar deyirlər: "Bizim bu vəziyyətə düşməyimizin səbəbi yalnız düşmənlərimizdir. Onlar bizi bu hala salıblar. Biz onlara qarşı silah toplayıb döyüşərək qalib gəlməyə çalışmalıyıq. Bu yolda ölsək də, məhv olsaq da, kökümüz kəsilsə də belə onlara qarşı döyüşməliyik. Bu cavanların fikri idi.

***İkinci qrup:*** Orta nəsil toplanır. Onlar deyirlər: "Xeyir biz onlara qarşı vuruşa bilmərik. Biz zəif və çarəsizik. Hər bir vasitəyə əl ataq ki, özümüzü bu xəstəlikdən təmizləməliyik. Özümüzü müalicə etdikdən sonra biz onlara qalib gələ bilərik. Bu orta nəslin fikiri idi".

***Üçüncü qrup:*** Bu qrup isə ağsaqqallardan ibarət idi. Dünya görmüş, saç saqqalları bu yolda ağarmış insanlar idi. Onlar: "Bizim gücümüz yoxdur, biz düşmənə qarşı nə ilə vuruşa bilərik? Bizim indi vuruşmağa taqətimiz yoxdur. Çünki, xəstəlik bizi çox zəiflətmişdir. Bizim indi özümüzü müalicə etməyə də gücümüz yoxdur. Axı biz özümüzü necə müalicə edə bilərik ki, biz yenə də o çirkab sudan içirik. Bir tərəfdən özümüzü müalicə edək və sonra da gedib o çirkab sudan içək. Bizim xəstələnməyimizə səbəb çayı qorumamağımız və onun suyunu bulandırmağımızdır". Onlar

dedilər: "Biz yalnız və yalnız o çayı təmizləməliyik. Çayı təmizləmək üçün ata-babalarımızın (Sələfi Salehlərin) dedikirlərinə qayıtmalıyıq, onlar bu çaya atılan nəcasətdən, zibildən qorumağı vəd almışdılar. Biz çayı mənbəsindən təmizləməliyik. Ondan sonra Allah bizə güc də verəcək, qüvvət də. O ağsaqqallar cavanlara da, orta nəsilə də nəsihət verərək: "Vallahi, heç döyüşməyə də ehtiyac olmayacaq. Allah bizim düşmənlərimizin qəlblərinə qorxu salacaqdır. Onlar bizim gücümüzü görərək geri çəkiləcəklər. Düşmənlərin bizə qalib gəlməsi, bizim zəifləməyimizə görədir, onların güclü olmasına görə deyildir. (Məs: "20 yaşında bir gənci hamı döyür, söyür heç kəsə gücü çatmır cavab versin. 20 yaşı olsa da zəif və acizdir. Onun yanına 5 yaşında bir uşaq gətirirlər. 20 yaşında olan cavan 5 yaşında olan uşağı öz gücünə görə döyəcək, yoxsa 5 yaşında uşağın zəif olmasına görə ona gücü çatacaq? Sözsüz ki, 5 yaşında uşağın zəif olmasına görə uşağa qalib gəldi, öz gücünə görə deyil). Ağsaqqallar da o qrupları başa salmağa çalışırdılar ki, düşmənlərin bizə qalib gəlmələrinə səbəb yalnız və yalnız, bizim zəif olmağımıza görədir, onların güclü olmalarına görə deyildir. Vallahi, əgər biz çayı qorusaq, bu çayı təmizləsək Allah bizə güc də verəcək, əvvəlki izzəti, şan-şöhrəti, qüdrəti də verəcəkdir. Düşmənlər bizim bu güclənməyimizi gördükdən sonra, özləri qorxub geriyə çəkiləcəklər".

Həqiqətən də bu ağsaqqalların nəsihətində ağıllı insanlar üçün böyük faydalar vardır. Çünki, onlar dünya görmüş kimsələr idi. Bu cavanlara və orta nəsilə verdikləri böyük nəsihət həqiqətən də doğru idi. Onları başa salmağa çalışdılar ki, bizim bu vəziyyətdən çıxmağımızın yolu yalnız və yalnız birdir: ***Tasfiyyə Vət Tarbiyyə*** **–** Təmizlənmək və Tərbiyyə olunmaqdır.

O, çay – ***Tövhid*** – çayıdır. Bu çayı şirkdən, küfürdən, bidətdən, nifaqdan, cürbəcür günahlardan təmizləməliyik. Biz o çayı təmizlədikdən sonra özümüzü tərbiyə etməliyik. Tərbiyə etdikdən sonra da, Allah bizə qələbə verəcəkdir.

İmam Malik Σ deyir: "Bu ümmətin başı nə ilə islah olunmuşsa (düzəlmişsə, nə ilə doğru yola yönəlmişsə), bu ümmətin sonu da yalnız onunla islah olunar. O, gün din olmayan heç bir şey bu gün də din olmaz".[748] Vallahi, doğurdan da bu belədir. Müsəlmanların bu hala düşmələrinə səbəb yalnız və yalnız özümüzük, düşmənlərimiz deyildir. Biz özümüz bu Tövhid çayını günahlarla, şirklərlə, bidətlərlə o qədər bulandırmışıq ki, Allah bizi zalımlarla imtahana çəkib. Ona görə də biz mütləq öz Sələflərimizin, Allahın və Peyğəmbəri Muhəmmədin ρ yoluna qayıtmalıyıq. Səhabələrin dediklərini etməliyik ki, Allah onlara şan-şöhrət, izzət, şərəf verdiyi kimi, bu şan-şöhrəti, izzəti bizə də versin. Peyğəmbərimiz Muhəmmədin ρ bir çox moizələrində oxuduğu məşhur ***Xutbətul-Hacə*** adlanan duasında belə bir kəlamlar vardır: "Şübhəsiz ki, sözlərin ən doğrusu Allahın kəlamı, yolların ən xeyirlisi Muhəmmədin ρ yoludur. Əməllərin ən pisi sonradan uydurulanlardır. Sonradan

[748] Qadi-İyad "əş-Şifa" 2/ 88.

uydurulub dinə salınan hər bir əməl bir bidətdir, hər bir bidət isə zəlalətdir, hər bir zəlalət isə oddadır".[749]

Bir düşün? Peyğəmbər ρ bu sözləri nə zaman demişdi? Məgər Peyğəmbərimizin ρ zamanında bidət var idi? Xeyr! Peyğəmbər ρ öz ümmətinə, səhabələrinə daima xatırladırdı ki: "Tövhid çayını, tövhidi bidətlərlə zibilləməyin. Bidətlərdən çəkinin, necəki, o ağsaqqallar öz qövmlərinə deyərdilər ki: "Bu çayı təmiz saxlayın. Çünki, bizim izzət və qüvvət tapmağımıza səbəb yalnız və yalnız bu çaydır. Bu çaya görə Allah bizə güc-qüvvət verib". Eyniylə bizə də Peyğəmbərimiz Muhəmmədin ρ sözlərini insanlara çatdıraraq: "Allaha şərik qoşmayın, bidət etməyin, küfr etməyin. Bunlarla Tövhidi bulandırmayın kı, Allah da bizə güc, qüvvət, izzət versin". Səhabələr bu yolu necə qoruyurdular? Ömərin ψ dövründə, Ömərə ψ xəbər gəlir ki, Subaya adında bir nəfər Allahın mütəşəbih ayələri barəsində insanlar arasında şübhə yayır. Ömər ψ onu yanına çağırtdırır və ondan əqidəsi (fikirləri) barəsində soruşur. O, da Ömərə ψ öz əqidəsindən xəbər verir. Bu vaxt Ömər ψ əlində olan xurma ağacının çubuğu ilə onun başına o qədər vurur ki, başı yarılır. Deyir ki, aparın onu zindana salın. Bir müddətdən sonra yenə deyir ki, onu mənim yanıma gətirin. Yarası yenicə sağalmışdı ki, Ömər ψ yenə çubuqla onun başına vurur, başı yenə qanayır və deyir ki, aparın salın zindana. Bir müddətdən sonra yenə onu yanına çağırtdırır, yarası təzə sağalmışdı ki, yenədə çubuqla onun başına vurmağa başlayır. Bu vaxt: "Ya Ömər! Bəsdir artıq, ya məni xeyirli ölümlə öldür, ya da əgər sən istəyirsən ki məni təmizləyəsən, Vallahi, artıq sən məni (bu fikirlərdən) təmizlədin". Ömər ψ Allahın dinini necə qoruyurdu. Ömərin ψ xəlifəliyindən sonra Xəvariclər çıxır. Onlar toplanaraq Ömərin ψ cəzalandırdığı kimsənin yanına gəlirlər və: "Ey Subay, sənin fikirlərini dəstəkliyənlər çıxıb, ged onlara qoşul". Həmin şəxs: "Vallahi, xeyirli insan, artıq məni islah etmişdir, məni artıq bu fikirlərdən təmizləmişdir, mən o yola heç vaxt dönmərəm". Baxın, görün səhabələr Allahın dinini necə qoruyurdular.

Ömər ibn Yəhyə öz atasından, o da öz atasından rəvayət edir ki, hər gün biz sübh namazından öncə İbn Məsudun ψ evinin ətrafında yığışar və birlikdə namaza gedərdik. Bir gün səhər Əbu Musa əl-Əşari ψ də gəldi və İbn Məsuda ψ: "Bir az bundan əvvəl məsciddə bir hadisə ilə qarşılaşdım ki, heç xoşuma gəlmədi. Gördüm ki, bir dəstə insan dairə şəklində toplaşıb namazı gözləyirdilər və hər bir kəsin əlində də xırda daşlar var idi. İçərilərindən bir nəfər: "Yüz dəfə ***Lə İləhə İlləllah*** deyin" və onlar da yüz dəfə zikr edərdilər. Sonra yenə də: "Yüz dəfə Subhənəllah deyin"- deyirdi. İbn Məsud ψ: "Sən onlara nə dedin"- deyə soruşdu. Əbu Musa ψ: "Sənin fikrini bilmədiyimə görə heç bir söz demədim"- dedi. Məscidə gəldik. İbn Məsud ψ camaatdan birinə yaxınlaşdı və: "Sizin halınız nədir?"- deyə soruşdu. Onlar: "Bu

---

[749] Muslim "Şərhu Nəvəvi" 6/ 153-156, Əhməd 3/ 319,371, ən-Nəsai 3/ 188-189, əl-Beyhəqi "Sunənul-Kubra" 3/ 214 Cabir ibn Abdullah N yolu ilə: əl-Albani "Muxtəsər Səhih Muslim" 409, "Mişkətul Məsabih" 3149, 5860.

daşlar vasitəsilə biz nə qədər zikr etdiyimizi sayırıq"- dedilər. İbn Məsud ψ: "Daha gözəl olardı ki, siz öz pis əməllərinizi sayasınız. O ki qaldı sizin yaxşı əməllərinizə, mən zaminəm ki, onların heç biri itməyəcəkdir. Vay sizin halınıza, ey Muhəmməd ümməti! Səhabələr sizin arasında olduğu vaxt siz nə tez uçuruma doğru getdiniz…" Onlar: "Ey Abdur-Rahmən! Biz yalnız xeyir istəyirdik!"- dedilər. O: "Sizin kimi nə çox xeyir istəyənlər, lakin bu xeyirdən məhrumdurlar. Həqiqətən, Peyğəmbər ρ buyurmuşdu: "İnsanlar vardır ki, onların oxuduqları Quran boğazlarından aşağı enməz. Allaha and olsun ki, bəlkə də sizin çoxu onlardansınız". Amr ibn Salam deyir ki: "Həqiqətən də biz onların çoxunu Nəhrəvanda Xəvariclərin dəstəsində gördük".[750] Baxın İbn Məsud ψ Allahın dinini qoruyur, baxın səhabələr Allahın dinini necə qoruyur, baxın Muhəmməd ρ Allahın dinini necə qoruyurdu. Onlar çalışırdılar ki, bu Tövhid çayına zərrə qədər də bir zibil, bir çirkablıq atmasınlar. Çalışırdılar ki, Tövhid çayını qorusular, bilirdilər ki, müsəlmanların izzət, şan-şöhrət tapmasında, qüvvətli, qüdrətli olmasında səbəb yalnız və yalnız bu Tövhid çayını qorumalarıdır.

O qövmün cavanları və otra nəsili ağsaqqallara dedilər: "Siz bizim düşmənlərə qalib gəlməyimizi istəmirsiniz". Ağsaqqallar: "Vallahi, biz sizdən də çox xeyir istəyirik və istəyirk ki, bizim bu qövm əvvəlki halına qayıtsın, izzətlənsin, şöhrətlənsin. O qövmlər ki, onlara hücum ediblər, onlar geri qayıtsınlar". Cavanlar dedilər: "Onda siz bizim düşmənlərimizin cəsuslarısız, onlara tərəf işləyirsiniz ki, biz onlara qalib gəlməyək".

Bu gün müsəlmanların halı ilə müqayisə etdikdə Şeyx Useymin, Şeyx Albani, İbn Bəzz Σ kimi ağsaqqallara, saç saqqalları İslam dinini öyrənməkdə ağarmış insanlara, o cavanlar - *Qolda Güc, Başda Ağıl Olmayanlar* - eyni kəlimələri deyirlər: "Siz bizim xeyrimizi istəmirsiniz, siz istəmirsiniz ki, müsəlmanlar qalib gəlsinlər. Siz bizim düşmənlərimizin cəsuslarısınız". Amma Vallahi, o alimlər, saç-saqqalları bu yolda ağarmış Peyğəmbərlərin varisləridir, Peyğəmbərlərin qoyduğu elmi daşıyanlardır.

Şeyx Useymin Σ deyir: "... Bəs biz müsəlmanlar nə etməliyik? Döyüşməyimiz axmaqlıqdır. Bu Allahın qoyduğu (Quran və Sünnədə) hikmətə ziddir. Lakin biz Allahın əmr etdiyini etməliyik: ***"Onlara qarşı gücünüz çatdığından hazırlayın…"***. Bu bizim üzərimizə düşən ən xeyirli olanıdır. Ən böyük güc də İman və Təqvadır. İman və Təqva – bizim nəfsi-istəklərimizə qarşı, tənbəlliyimizə qarşı və dünyaya olan sevgimizə qarşı mübarizə aparmaq üçün ən böyük gücdür". O deyir: "Üzərimizə düşən ən vacib olan əməl özümüzdə imanı və təqvanı tərbiyələndirmək və bu yolda bütün gücümüzü sərf etməkdir. O ki qaldı gücümüz çatmayan işlərə, bu bizim üzərimizə vacid deyildir".

Şeyx Albaninin Σ Təqva studiyası tərəfindən, 1579-cu kasset, Kuveytdə "İhyə ət-Turas əl-İslam – İslam irsinin dirçəlişi cəmiyyəti" tərəfindən İordaniya şəhərində

---

[750] əd-Dərimi.

verdiyi moizəsindən götrülmüşdür. Mövzunun adı isə, Xalis Tövhid və zəlalət firqələridir. Şeyx Albani Σ bu moizəsində Tövhid haqqında, zəlalat firqələri haqqında müsəlmanlara xəbər verdikdən sonra, zalda iştirak edən bir nəfər Şeyxə, müsəlmanların bu günkü halı barəsində sual verir. Şeyx: "Şübhəsiz ki, hər bir müsəlmana məlumdur ki, bu gün müsəlmanlar İslam tarixində misli bərabəri görülməyən zəlillik, acizlik içərisindədirlər. Ona görə də biz müsəlmanların bu halına qarşı yalnız qəzəb və sərt hislərimizi bildiririk. Lakin bu kifayət deyildir. Bu qəzəbimiz müqabilində öz hazırlığımızı, tədarükümüzü görməliyik… Şeyx burada ayə oxuyur; ***"Onlara qarşı döyüşmək üçün, onlara qarşı çıxmaq istədikləri zaman, hazırlılıq görərlər…"*** Ona görə də biz döyüşə çıxmazdan öncə, hər tərəfli silahlanmalıyıq. Hər birimiz Allhın bu ayəsini oxuyuruq, (xütbələrdə) bu ayələr deyilir, divarlar bu ayə ilə bəzədilir: ***"İntənsurullahə Yənsurukum – Əgər siz Allaha*** *(Onun dininə)* ***kömək göstərsəniz, O da sizə kömək göstərər...".*** *(Muhəmməd 7).* Qızıl saplarla bu ayə yazılaraq divarlardan asılır. Çox təəssüf ki, divarlar bu ayə ilə bəzədilsə də müsəlmanların qəlblərində bu ayədən əsər-əlamət belə yoxdur. Hətta fərqinə də varmırıq ki, bu ayə nəyə işarə edir. Müsəlmanların bu günkü acizliyini görürük, halbuki bu ayə acizlikdən çıxmağı bizə bəyan edir. Hər birimiz: ***"Əgər siz Allaha kömək etsəniz"*** ayəsinin cavabının nə olduğunu bilirik: ***"Allah da sizə kömək edər".*** Sanki: "Əgər sən qidalansan, yaşayacaqsan, əgər yemək və içməkdən imtina etsən öləcəksən"- sözlərinə bənzəyir. Bu da ayədə olan kəlimələrə bənzəyir. Alimlər bu ayənin əksi olaraq: ***"İnləm Tənsurullahə ləm Yənsurukum – Əgər Allaha kömək etməsəniz, Allah da sizə kömək etməz".*** Bu da müzəlmanların bu günkü halıdır. Hər bir müsəlman mənimlə razılaşar ki, bu gün İslam ümməti elə bir haldadır ki, İslam tarixində heç bir zaman belə bir şey görünməmişdir. Biz nədən başlamalıyıq? Müsəlmanları idarə edən əmirlərə qarşı müharibədən, yoxsa yer üzündə olan bütün kafirlərə qarşı döyüşməkdən və ya bizi zülmə sürükləyən nəfsimizdən? Bundan da başlamaq lazımdır. Buna görə də müsəlmanlar bu gün kafirlərə qarşı döyüşə bilməzlər, onlar ilk öncə Allaha və Rəsuluna ρ həqiqi şəkildə iman gətirməlidirlər. Lakin insanların çoxu bunu bilməz.

Yaxşı, biz Allaha nə ilə kömək edirik? (Şeyxin sözləri deyil: "Misirdə bir kənd var və o kənddə saleh bir insan yaşayırdı. O insan öldükdən sonra onun qəbri üzərində böyük bir ibadətgah tikiblər. İnsanlar onun ad günündə ora gələrək, ondan kömək istəyirlər və həmin o ad günü o kəndə **7** milyon insan gəlir, ondan kömək istəyirlər. Bundan sonra biz Allahın hansı köməyindən danışa bilərik? Yer üzündə bu gün Allahdan qeyri ibadət olunan nə qədər yerlər var. Peyğəmbər ρ Meracı günü minlərlə insan Peyğəmbərin ρ Peyğəmbərlərə namaz qıldırdığı yerə gələrək oradan kömək, şəfa diləyirlər, övlad istəyirlər. Bundan sonra biz Allahın hansı köməyindən danışa bilərik).

Şeyx sözünə davam edərək deyir: "İkinci isə ***"Onlara qarşı gücünüz çatdığından hazırlayın…"***. Biz ittifaqa gəldik ki, bizdə nə maddi silah var, nə də mənəvi silah. Bəs onda onlara qarşı necə vuruşmalıyıq? Daha yaxşı olmazmı biz ağıllarımızla hökm verməyi, öz hislərimizə qapanaraq hökm verməyi buraxaraq, bir az özümüzü boğub, daha bir az öncəyə, keçmişə, sələfilərimizin yoluna qayıdaq və deyək ki: "Vallahi, döyüş üçün gərək bizim imanımız olsun, həm maddi, həm də mənəvi silahımıza ehtiyacımız var. Ona görə də gəlin birinci öz imanımızı düzəldək, sonra da özümüzü silahlarla təchiz edərik. Lakin biz imanımızı düzəltməyə qadirik. Allah Peyğəmbərimiz Muhəmmədə ρ, onun səhabələrinə onların silahlarının çox olmasına görə qələbə verməmişdir. Onların saylarının çox olmasına görə qələbə verməmişdir. Məgər tarix bunu sübut etmir?" Həmin şəxs dedi: "Düz deyirsiniz Şeyx". Tariximiz sübut etmir ki, Peyğəmbərimiz Muhəmməd ρ döyüşlərdə həmişə say etibarı ilə az olub, güc etibarı ilə zəif olub, lakin çox sayda güclü düşmənlərə qalib gəlirdilər. (Məgər Peyğəmbərimiz Muhəmməd ρ bizə buyurmayıb ki: "Məndən əvvəl heç bir Peyğəmbərə verilməyən beş şey mənə verilib; Mən bir yerə hücum etməmişdən bir ay qabaqcadan Allah mənim düşmənlərimin qəlblərinə qorxu salır". [751] Bəs indi düşmənlərin qəlblərində olan o qorxu hanı? Vallahi, yoxdur. Əksinə müsəlmanların qəlbləri qorxu ilə bürünmüşdür. Çünki, tövhid əqidəsi əmin-amanlıq əkir. Əmin-amanlığı dağıtmır. Həm daxildə, həm də düşmənlərin qəlbində. Əgər biz Allaha haqqı ilə iman gətirsək, bu əqidə həm bizdə, həm də cəmiyyətdə əmin-amanlıq yaradar. Əgər əmin-amanlıq istəyiriksə, gərək biz düzgün əqidəyə, Allaha qayıdaq. Əgər istəyiriksə əmin-amanlığımız qorxu ilə əvəz olunsun, onda biz ixtiyar sahibiyik. Çünki, qorxunun məsdəri şirkdir; ***"Haqqında heç bir dəlil nazil etmədiyi şeyi Allaha şərik qoşduqlarına görə kafirlərin ürəklərinə qorxu saldıq".*** *(Ali-İmran 151).* Əmin-amanlığın məsdəri isə Tövhiddir; ***"İman gətirib imanlarını zülmlə qarışdırmayanlar əmin-amanlıqdadırlar. Haqq yola yönəlmişlər də onlardır".*** *(əl-Ənam 82).* İnsanların dindən uzaq düşdükləri bir gündə, şirkin baş alıb getdiyi bir gündə, yad adət-ənənələrin İslam adı ilə dinimizə daxil edildiyi bir gündə hansı əmin-amanlıqdan danışmaq olar. Dünyaya nəzər salsaq görərik ki, müsəlmanların saylarının çox olmasına baxmayaraq zəlil gündədilər. Cürbəcür təzyiqlərə, işkəncələrə, hücumlara məruz qalıblar. Çünki, müsəlmançılıqdan (İslamdan) yalnız adı qalıb. Əli ψ deyir: "Vaxt gələcək ki, İslamdan yalnız onun adı qalacaqdır, vaxt gələcək ki, Qurandan yalnız onun şəkili qalacaqdır, məscidlər boş qalacaqlar, qondarma alimlər çıxacaqdır". Peyğəmbər ρ buyurur: "Ümmətlərin (dövlətlərin) birləşərək sizin üzərinizə vəhşi heyvanların öz şikarlarının üzərinə hücum etdikləri kimi hücum etmələri artıq yaxındır". Səhabələr: "Ya Rəsulallah! Bizim sayımızın az olduğuna görə belə olacaqdır?"- deyə soruşdular. Peyğəmbər ρ buyurdu: "Əksinə, sizin sayınız onda

[751] əl-Buxari, Muslim.

çayın gətirdiyi çör-çöp kimi çox olacaqdır. Lakin Allah düşmənlərin qəlbindən sizə qarşı olan qorxunu çıxaracaqdır. Sizin qəlbinizdə isə Allah ***Vəhm*** yerləşdirəcəkdir". Səhabələr: "***Vəhm*** nədir, ya Rəsulullah!" Peyğəmbər ρ buyurdu: "Dünyaya sevgi, ölümə isə nifrət".[752] Ömər ψ deyir: "Biz elə bir ümmətik ki, Allah bizi İslam ilə izzətləndirib. Əgər biz İslamdan qeyrisində (qərbdə, avropada) izzət axtarsaq Allah bizi zəlil edər". Ona görə də insan Allahdan I nə qədər qorxarsa, düşmənləri də bir o qədər ondan qorxarlar. İnsan özü ilə Allah arasında olanı nə qədər islah edərsə, Allah da onunla başqaları arasında olanları islah edər).

Şeyx sözünə davam edərək deyir: "Tarixçilərin bu sözünü təhlil etmək lazımdır. Vallahi, tarix təkrarlanır, müsəlmanlar öz həqiqi imanlarına döndükləri zaman, Allahın və Peyğəmbərin ρ buyurduqlarına döndükləri zaman, Allah onları qələbə ilə sevindirəcəkdir. Qələbə ilə onlara sevinc bəxş edəcəkdir, onları izzətli, şərəfli, hörmətli edəcəkdir".

Vallahi, bu gözəl sözlərdir. Həqiqətən, biz imanımıza Allahın və Rəsulunun ρ buyurduqlarına qayıtsaq, Allah bizə o qələbəni vəd buyurub. Vallahi, bizim zəifliyimiz, acizliyimizdir ki, biz elm almırıq, elm oxumuruq, elm öyrənmirik. Hətta öyrədirlər də belə gedib o dərslərdə iştirak etmirik. Bu bizim acizliyimizdir. Bu gün müsəlmanların bu hala düşmələrinə səbəb də onların cahillikləridir ki, biz Allahın və Rəsulunun ρ dediklərini üstün tutmuruq. Hansısa bir şeyxlərin, imamların, axundların dedikləri sözləri üstün tuturuq.

Allah ən-Nur surəsinin 55-ci ayəsində buyurur: ***"Allah sizdən iman gətirib yaxşı işlər görənlərə vəd etmişdir ki, özlərindən əvvəlkiləri varislər etdiyi kimi onları da yer üzünün varisləri edəcək, möminlər üçün onların Özünün bəyəndiyi dinini möhkəmləndirəcək və onların qorxusunu sonra arxayınçılıqla əvəz edəcəkdir. Onlar Mənə ibadət edir və heç nəyi Mənə şərik qoşmurlar. Bundan sonra küfr edənlər – məhz onlar fasiqlərdir".*** Vallahi, Allah bizə vəd buyurub. Allah vədinə xilaf çıxmaz, vədə xilaf çıxan bizik. Allah bizə vəd buyurub ki, əgər biz iman gətirsək və yaxşı işlər görsək bizi əvvəlkilər kimi yer üzünün varisləri edəcək. Allah bizim özümüzün, Allahın razı qaldığı İslam dinini möhkəmləndirəcək. Allah bizim qorxumuzu əminamanlıqla, arxayınçılıqla əvəz edəcək. Amma bu gün biz baxırıq ki, bu yoxdur. Deməli biz Allahın Peyğəmbərinin ρ buyurduğu şəkildə iman gətirməmişik. Saleh işlər görmürük, insanlara - ***Əmr Bil Mərufu -*** yaxşılığa əmr edib, - ***Nəhyi Ənil Munkəri*** - qadağalardan çəkinməyi tövsiyyə etmirik. Allahın bu şərtini yerinə yetirmədiyimizə görə Allahın vədi hələ yerinə yetməyib. Məgər Allah buyurmayıb ki: ***"Möminlərin əleyhinə heç vaxt kafirlər üçün yol açmaz?"*** Amma indi əksinə görürük. Görürük ki, kafirlər müsəlmanları əzir. Görəsən bu nəyə görədir? Vallahi, Allah I zalım deyildir, Vallahi Allah I zülm edən deyildir. Zalım bizik, zülm edən bizik. Ona

[752] Əbu Davud 4297, Əhməd 5/ 278.

görə də Allah bizi zalımlarla imtahana çəkir. Vallahi, biz Allaha asi olduq, biz Allaha üsyan etdik, biz insanlara yaxşılıq əmr edib, pislikdən çəkindirmədiyimizə görə, Allah bizi məğlub etdi. Biz məğlubuq, çünki biz dinimizi öyrənmədik, yalnız və yalnız "gücümüzə arxalanaraq, ağlımızı işlətmədən onlara qarşı vuruşmalıyıq"-dedik. Subhənallah! Sən onlara qarşı nə ilə vuruşacaqsan? Məgər o ağsaqqallar bu ümmətin, İslamın xeyrini istəmirlər? Məgər Şeyx Albani, Şeyx Useymin, Şeyx İbn Bəzz Σ bu ümmətin xeyrini istəmirdilər? Onlar bu ümmətin xeyrini bizdən də çox istəyirlər. Onların saç-saqqalı bu yolda ağarıb, onlar bilirlər ki, bizim yalnız və yalnız güclənməyimizə, qüdrətlənməyimizə, izzət, şan-şöhrət tapmağımıza səbəb bizim Allahın və Peyğəmbərin ρ yoluna qayıtmaqdır. İnsanları şirkdən, nifaqdan, bidətdən, küfrdən çəkindirməyimizdir. İnsanlara xeyir işləri əmr edib, pislikdən uzaqlaşdırmağımızdır. Həsənul-Bəsri Σ əmirə qarşı bəd dua edən birini gördükdə deyir: "Onu da bil ki – *Allah Sənə Rəhm Etsin* – hökmdarların zülmləri Allahın intiqamlarından bir intiqamdır. Uca Allahın intiqamlarına da qılıncla qarşılıq verilməz. Bu intiqamlar dua, tövbə, Allaha dönüş, günahlardan çəkinmək ilə bir tərəf edilir və silinir. Allahın intiqamı qılıncdan daha kəskindir".[753] Başqa bir rəvayətdə: Həsənul-Bəsri Σ Həccaca bəd dua edən bir kimsənin sözlərini eşitdikdə belə demişdir: "Bunu etmə, Allah sənə rəhmət etsin. Əslində bu müsibətlər sizə öz əllərnizlə etdiklərnizdən ötrü gəlmişdir. Biz qorxuruq ki, Həccac əsir edilir və ya ölürsə, meymunlar və donuzlar gəlib sizə rəhbər olurlar".[754] Məgər o zalım hökmdarların olmasına səbəb, bizim öz əllərimizlə etdiyimiz günahlarımız deyil? Allah Qurani-Kərimdə buyurur: ***"İnsanların öz əlləri ilə etdikləri əməllər üzündən suda və quruda fəsad, pozuntu əmələ gələr ki, Allah onlara etdikləri bəzi günahların cəzasını daddırsın və bəlkə onlar qayıtsınlar".*** *(ər-Rum 41).* Vallahi, Allah I zülm edən deyil, zülm edən bizik. Biz zülm etdik, biz zalım olduq, Allah I bizi zalımlarla imtahana çəkdi. Ona görə də yalnız və yalnız tövhidə, haqq yola qayıtmaq üçün bizim məqsədimiz birdir. Allahın dininə, tövhid dininə insanları dəvət etməkdir. İnsanları Sələflərin rəhbəri olan Muhəmmədin ρ yoluna qaytarmalıyıq.

Görürsən ki, bəziləri deyirlər: "Nə qədər dəvət etmək olar. Biz dəvət edirik bizə qulaq asan kimdir?" Məgər sən Peyğəmbərlərdən üstünsən? Sən ölənə kimi insanları Allahın dininə dəvət etməlisən. Nəticəni fikirləşmə. Çünki, nəticəni verən Allahdır. Bizim boynumuza düşən dəvətdir ki, biz də bunu etməliyik. Allah Qurani-Kərimdə İbrahimi υ tək olmasına baxmayaraq ümmət adlandırdı. Nəyə görə? İbrahim υ tək idi, haqqa dəvət etdi, doğru söylədiyinə görə Allah onu ümmət adlandırdı. İbn Məsud ψ deyir: "Əgər sən haqq üzərindəsənsə, tək olsan da belə sən camaatsan". Əgər biz insanlara doğrunu deyiriksə, haqqı deyiriksə demək biz ümmətik. Kim istəyir bizə

[753] İbnul-Cövzi "Ədəbul-Həsənul-Bəsri" s. 119.
[754] İbnul-Cövzi "Ədəbul-Həsənul-Bəsri" s. 119.

qulaq assın, kim də istəyir qulaq asmasın. Allah İbrahimə υ buyurdu: "İnsanları həccə dəvət et". İbrahim υ dedi: "Ya Rəbbim! Mən kimi dəvət edim? Heç kəs yoxur". Allah buyurdu: "Sən dəvət et". İbrahim υ təpənin üzərinə çıxaraq insanları həccə dəvət etdi". İbrahim υ dünyasını dəyişdi, həccə gələnləri görmədi. Lakin indi baxın neçə milyon insan həccə gedir. Nəticəsi nə oldu? Neçə milyon insanın Həccə gedməsinə səbəb oldu.

Həmçinin, Buruc surəsində keçən ***Əshəbul-Uhdud*** – hadisəsi. Suheyb ψ rəvayət etdi ki, Peyğəmbər ρ buyurdu: "…Hökmdar: "Mənim göndərdiyim adamlara nə oldu?"- deyə soruşdu. Uşaq: "Allah məni onlardan qorudu!"- dedi. Uşaq sözünə davam edərək: "Sən mənim dediklərimi yerinə yetirmədən məni öldürə bilməzsən!"- dedi. Hökmdar: "O nədir?"- dedi. Uşaq: "Camaatı bir meydana topla, məni də bir xurma ağacına bağla. Sonra oxumdan birini götürüb yayın ortasına qoyaraq: "***Bismilləhi Rabbil-Ğuləm*** - Uşağın Rəbbi olan Allahın adı ilə!"- de və sonra oxu at. Belə etdikdə məni öldürə bilərsən!"- dedi. Hökmdar camaatı bir meydançaya topladı və uşağı da xurma ağacına bağladı. Uşağın dediyi kimi oxlardan birini götürüb yayın ortasına qoyaraq "***Bismilləhi Rabbil-Ğuləm*** - Uşağın Rəbbi olan Allahın adı ilə!"- deyərək oxu atdı. Ox uşağın alnına batdı. Uşaq əlini alnına qoyub öldü. Bu zaman camaat: "Biz uşağın Rəbbinə iman etdik! Biz uşağın Rəbbinə iman etdik! Biz uşağın Rəbbinə iman etdik!"- dedilər. Daha sonra hökmdarın adamları: "Gördünmü? Qorxduğun şey başına gəldi. Artıq camaat iman etdi!"- dedilər. Hökmdar dərhal yol ağızlarında xəndəklər qazılmasını əmr etdi.[755] Xəndəklər qazıldı, içərsində od qalandı. Hökmdar: "Özünüzü xəndəklərə atın! Hər kim dinindən dönməzsə onu xəndəyə atın!"- deyə əmr etdi. Hökmdarın adamları əmri yerinə yetirərək insanları odla dolu xəndəklərə atmağa başladılar. Nəhayət növbə yanında körpə uşaq olan bir qadına gəldi. Qadın odla dolu xəndəyə düşməkdən qorxaraq geri çəkildi. Bu an körpə uşaq dilə gələrək: "Anacan! Səbr et, şübhəsiz ki, sən haqq üzərindəsən!"- dedi".[756]

Bu padşah nə Allah qəbul edirdi, nə də hər hansı bir din. Oxu çəkib, atır və ox gedib uşağa dəyir və uşaq ölür. Lakin uşaq ondan sonra baş verən nəticəni görmür, amma uşaq dəvətini etdi. Nəticəsi nə oldu? Bütün qövm əllərini göyə qaldıraraq: "Biz bu uşağın Rəbbinə iman gətirdik". Padşah təəccübləndi və dedi ki: "Gör üşaq nə etdi. Mən bir uşağa qalib gələ bilmirdim, amma indi bütün qövm mənə qarşıdır".

Biz də yalnız və yalnız dəvət etməliyik. Heç bir sözlərdən, təhqirlərdən qorxmamalıyıq. Əgər biz düz deyiriksə, əgər haqqı deyiriksə nədən çəkinməliyik! Məgər bizdən yaxşıları, bizdən xeyirliləri dəvət edərək əzab-əziyyətlərlə qarşılaşmayıblar? Məgər Peyğəmbər Muhəmmədə ρ sehirbaz, şair, məcnun deməyiblər? Məgər Peyğəmbərimiz Muhəmməd ρ Meraca gedərkən, orada yanında heç kəs olmayan Peyğəmbərlər

[755] əl-Buruc surəsinin 4-10-cu ayələrinə baxa bilərsiniz.
[756] Muslim 3005.

görmədimi? Nuh υ doqquz yüz əlli il dəvət etdi, əlli-altmışa yaxın insanı dəvətini qəbul etdi. Allaha çox şükür olsun ki, Allah bizə bu neməti verib, biz insanları dəvət edə bilirik. Kimisə İslama gətirə bilirik. Biz buna görə Allaha şükr etməliyik. İnsanlara Əmr bil mərufu, Nəhyi ənil munkəri bildirməliyik. İnsanlara yaxşılığı əmr edib, pisliklərdən çəkindirməliyik. Yalnız və yalnız bundan sonra Allah qələbəni, zəfəri, qüdrəti, şan-şöhrəti bizə nəsib edəcək. Yalnız və yalnız Tövhid çayını təmizlədikdən sonra küfrdən, şirkdən, bidətdən, nifaqdan təmizlədikdən sonra Allah bizə güc verəcək. Allah bizə elə bir güc verəcək ki, düşmənlərimiz qorxularından geri çəkiləcəklər. Vallahi, bu belədir! ***"Allah sizdən iman gətirənlərə və yaxşı işlər görənlərə onları özündən əvvəlkilər kimi yer üzünün varisləri edəcəklərini, möminlər üçün onların Allahın özü bəyəndiyi dini, İslamı möhkəmləndirəcəyini və onların qorxusunu əmin-amanlıqla, arxayınçılıqla əvəz edəcəyini vəd buyurmuşdur. Bundan sonra küfr edənlər şübhəsiz ki, əsl fasiqlərdir".*** *(ən-Nur 55).*

Allaha dua edirəm ki, Allah bu qısa moizəni İslam ümməti, Muhəmməd ümməti üçün xeyirli və faydalı etsin! Allah bizə haqqı haqq olaraq göstərsin və haqqa tərəf yönəlməkdə, haqq əhli ilə birlikdə olmağa yardımçı olsun! Allah bizə batili batil olaraq göstərsin və batildən batil əhli ilə birlikdə uzaqlaşmaqda kömək etsin! Allah bütün əməllərimizi ixlasla Onun üçün Sünnəyə uyğun olaraq edənlərdən etsin! Allah bizi fitnədən və fitnə əhlindən qorusun! Allah bizim yaşadığımız bu dövlətimizi, məmləkətimizi cürbəcür fitnələrdən, bəlalardan qorusun! Bizim dövlətimizə hidayət versin! Allah bizə torpaqlarımızı düşmənlərdən tezliklə almaqda yardımçı olsun. Allah bizi dünyada və axirətdə möhkəm bir kəlimə olan ***Lə İləhə İlləllah*** ilə sabit qədəm etsin! Bizi yalnız və yalnız müsəlman olduğumuz halda öldürsün! Amin!

# ƏHLİ SÜNNƏ VƏL CƏMAAT SƏLƏFİ SALİHİN ETİQADI

AbdurRahman əs-Səədi Σ deyir ki: “1. Əhli Sünnə - etiqadında olanlar Allaha, Onun Peyğəmbərinə, kitablarına, mələklərinə, Axirət gününə, Qədərə, xeyir və şərrin Allahdan olduğuna iman edirlər.

2. Əhli Sünnə - ibadət edilməyə layiq sadəcə Allah olduğuna, hər bir kamilliyin Ona aid olduğuna inanaraq yalnız Ona ibadət edirlər.

3. Əhli Sünnə - Yaradan, var edən, surət verən, ruzi və digər nemətləri verən, mane olan və bütün işləri ən gözəl şəkildə idarə edən sadəcə Odur.

4. Əhli Sünnə - Allah tək maqsud olan və ibadət ediləndir. O, Əvvəldir – Ondan öncə heç bir şey yoxdur. O, Axırdı – Ondan sonra heç bir şey yoxdur. O, Zahirdi – Onun üzərində heç bir şey yoxdur. O, Batindir – Ondan o, tərəfə heç bir şey yoxdur. O, həm zatı, həm də sifətləri ilə Ucadır. O, ərşə istiva etmiş. Bu istiva Onun əzəmət və cəlalına yaraşan bir halda mütləq ucalığı və üstünlüyü ilə bərabərdir. Onun elmi gizli

və aşkar olan, uca və aşağı olan hər bir əhatə etmişdir. O, elmi ilə qulları ilə bərabərdir, onların bütün hallarından xəbərdardır.O, qullarına yaxındır və onların bütün istəklərinə cavab verəndir. O, zatıilə bütün yaratdıqlarından Mustəğni (heç birinə ehtiyacı olmayandır). Bütün yaradılmışlar hər bir etdikləri işdə (həyatları ilə) Ona möhtacdırlar. Yaradılmışlar bir göz qırpımı belə Ona möhtac olmadan var ola bilməzlər. O, kəramətli və rəhmət sahibidir. O, dərəcədə ki, qullarına gələn hər bir dini və dünyəvi nemət və pislikləri qoruma ancaq Ondandır. Neməti verən və pislikləri uzaqlaşdıran Odur. Rahmətindəndir ki, hər gecə dünya səmasına enərək qullarının ehtiyaclarını ödəyir. Allah dilədiyi kimi enər. ***"Onun bənzəri heç bir şey yoxdur. O, eşidən və görəndir".*** *(əş-Şura 11).*

5. Əhli Sünnə - etiqad edirlər ki, Allah hikmət sahibidir. Onun təqdir etməsində və hökm verməsində hikmət vardır. Boş yerə heç bir şey yaratmamış və heç bir hökm də verməmişdir. Onun hökümləri mütləq şəkildə bir hikmət və fayda olaraq buyurulmuşdur.

6. Əhli Sünnə - Allahın tövbələri qəbul edən, əff edən və bağışlayandır. Qullarının tövbəslərini qəbul edər, pisliklərini əff edər. Ona dönərək tövbə edən böyük günah sahiblərinin günahlarını bağışlayar.

7. Əhli Sünnə - Allahın edilən az şeylərə beləbol-bol əvəz verəndir. Verdiyi nemətlərə görə şükr edənlərin nemətlərini isə artırandır.

8. Əhli Sünnə - Uca Allahı Özünün və Peyğəmbərini xəbər verdiyi sifətləri ilə tanıyırlar. Onun həyat sahibi, eşitməsi, görməsi, əzəməri, qüdrəti, cəlal və camal, mütləq həmd sahibi olması zatı sifətlərindəndir.

9. Əhli Sünnə - Allahın Mərhəmət etməsi, rıza göstərməsi, danışması feli sifətlərdəndir. Allah necə diləyərsə danışar. Onun sözləri bitib-tükənməz və yox olmaz.

10. Əhli Sünnə - Quranın yaradılmış olmaması və Allahın kəlamı olmasına etiqad edir. Quran Ondan başlamış Ona da dönəcəkdir. Allah dilədiyini etmə sifətinə əvvəl də sahib idi, indi də və gələcəkdə də sahibdir. Dilədiyi şəkildə danışır. O, malik olan və hpkm edəndir. Ondan başqa nə varsa Onun mülkü və Onun haqqında hökm verdikləridir. Qullarından heç biri Onun mülkündən və hökmündən kənar deyildir.

11. Əhli Sünnə - Quranda bildirildiyi və sünnətdə təvatur dərəcədə xəbər verildiyi kimi möminləri Axirətdə Allaıhı görəcəklərinə, Onu görmə və Onun rızasına qovuşmaq nemətinin nemətlərin ən böyüyü olduğuna inanırlar.

12. Əhli Sünnə - İmansız, Tövhid olmadan ölən (böyük şirk üzərə) əbədi Cəhənnəmlikdir. Lakin böyük günah edən kimsə tövbə etmədən, etdiyi günahlara kəffarə olan bir şey etmədən və onun üçün şəfaət edilməzsə cəhənnəmə gisə belə əbədi qalmaz. Qəlbində zərrə qədəər iman olan kimsə Cəhənnəmdən qurtulacaqdır.

13. Əhli Sünnə - İmanın qəlbin etiqadı, silin söyləməəsi və əməllərin etdiyi işlər olduğuna inanırlar. İmanın çərçivəsinə daxil olan şeyləri ən mükəmməl şəkildə yerinə yetirən mömindir. Belə bir mömin savab əldə etməyə haqq qazanır, cəzaya uğramaqdan qurtulur. İman çərçivəsinə girən şeyləri naqis edən kimsənin imanı zəifləyər. Buna görə də iman edilən xeyir və itaətlərlə artar, pislik və günahlarla azalar.

14. Əhli Sünnə - etiqadında olanlar Allahdan kömək dləməklə din və dünyəvi işlərində çalışaraq səy göstərərlər. Beləcə bütün hərəkətlərində Allah üçün ixlaslı hərəkət edərlər. Allahın Rəsuluna itaət edərlər.

15. Əhli Sünnə - Muhəmmədin ρ Allahın qulu və peyğəmbəri olduğuna şahidlik edərlər. Allah onu aləmlərə rəhmət, bütün dinlərə üstün olaraq haqq din ilə göndərmişdir. Peyğəmbər möminlərə canlarından da üstün və əzizdir. O, Peyğəmbərlərin sonuncusudur. Allah onu insan və cinlərə müçdələyən və qorxudan olaraq göndərmişdir. Allah onu din və dünyanın islahı üçün və yaradılmışların Allaha ibadət vəzifəsini yerinə yetirməsi üçün göndərmişdir.

16. Əhli Sünnə - bilirlər ki, Muhəmməd ρ insanların ən biliklisi, ən doğrusu, ən səmimi olandır. Müsəlmanlar onu böyük sayar və sevərlər. Onun sevgisini bütün yaradılmışların sevgisindən önə salar. Dinin bütün sahələrində ona uyarlar. Onun söz və dvranışını hər kəsin davranış və sözlərindən önə keçirərlər.

17. Əhli Sünnə - etiqad edir ki, Allah Muhəmmədin ρ simasında bütün fəzilətləri, özəllikləri və mükəmməlikləri onda toplamışdır. O, məqam baxımından yaradılmışların ən uca məqama sahib olanıdır. Nə qədər xeyir qapıları varsa onu ümmətinə bəyan etmiş, nə qədər pislik varsa onu da ümmətinə göstərmişdir.

18. Əhli Sünnə - Allahın nazil etdiyi bütün kitablara, göndərilmiş bütün Peyğəmbərlərə inanırlar. Allahın göndərdiyi Peyğəmbərlər arasında ayırım etməzlər.

19. Əhli Sünnə - qədərə iman edərlər. Qədər ilə baş verən bütün xeyir və şərr Allahın təqdir etdiyi ilə baş verməsinə iman edir. Allah qullarından hə biri üçün güc və iradə yaratmışdır. Onlar bu güc və iradə ilə istədikləri söz və əməllərini edirlər. Allah qullarını əməl etmək və söz söyləmək baxımından məcbur etməmişdir. İnsanlar etdiklərini öz seçimləri ilə edirlər. O, mömin qullarına imanı sevdirmiş və qəlblərinə salmışdır. Usyan, küfr və fahiş işləri onlara pis göstərmişdir.

20. Əhli Sünnə - Yaxşılığı əmr edib, pislikdən çəkindirər, valideyinlərə, qahum əqrabaya, qonuşuya, əmri altında olanlara, əmir sahiblərinə, haqq sahinlərinə yaxşılıq etməyi əmr edərlər.

21. Əhli Sünnə - gözəl əxlaqa dəvət edər, pis və çirkin əxlaqdan çəkindirərlər.

22. Əhli Sünnə - etiqad edir ki, müsəlmanların iman baxımından ən kamil olanı əxlaqı ən gözəl olan, sözü ən doğru olan, xeyir və fəzilətdə ən çox yönələn və hər bir rəzillikdən uzaq olan kimsədir.

23. Əhli Sünnə - Allah yolunda cihad etməyi əmr edər. Çünki cihad dinin ən yksək zirvəsidir və iki qismdir: Elm və dəlil cihadı və silahlı (kafirlərə) qarşı olan cihad.

24. Əhli Sünnə - müsəlmanları birlik və bərabərlikdə olmağa çağırarlar. Parçalanmaqdan və düşmənçilikdən uzaqdırlar. Bunun üçün hər bir yola əl atarlar.

25. Əhli Sünnə - etiqadına görə ümmətlərin ən fəzilətlisi Muhəmməd ρ ümməti, bu ümmətin ən fəzilətlisi Rəsulullahın səhabələridir. Səhabələr arasında 4 Rəşidi xəlifəsi, Cənnətlə müjdələnən 10 səhabə, Bədr əhli, Ridvan beyətində olanlar, mühacir və ənsarlardır. Peyğəmbərin ρ Əhli Beytini Allah üçün sevər və hörmət edərlər. Onları yalnız və yalnız xeyirlə anarlar.

26. Əhli Sünnə - etiqadına görə hidayəti göstərən alimlərə, Peyğəmbərin ρ varislərinə hörmət edər, ədalət üzərə olan əmirlərə, yüksək məqamda olanlara hörmət edərlər.

# TÖVHİDƏ ZİDD OLAN SÖZ VƏ ƏMƏLLƏR

AbdurRahman əl-Cibrin Σ deyir ki: “1. Növü nə olursa olsun, isətr dəmir, istər tunc və ya dəridən olan ip və ya halqa şəkilində olan bir şeyi başına gələcək bir bəlanı uzaqlaşdırır niyyəti ilə taxmaq.

2. Tilsim, amulet, gözmuncuğu və s. başa düşülməz sözlərdən ibarət olan şeyləri taxmaq. Nal, heyva budağı və s. şeylərin həm insanların üzərinə, həm də heyvanların üzərinə nəzər dəyməsin və s. səbəblərlər taxılması şirkdir.

3. Müəyyən şəxsləri mübarək sayaraq onlara əl sürtmək, onlardan bərəkət keçəcəyinə inanmaq, Ağac və daşlara qarşı da belə bir inancda olmaq bu qəbildəndir.

4. Allahdan qeyrisinə qurban kəsmək, xeyir əldə etmək, zərərdən qaçmaq məqsədilə cin və övliyalara qurban kəsmək, Allahdan qeyisinə qurban kəsilən yerdə qurban kəsmək qadağandır.

5. Allahdan qeyrisinə nəzir demək. İbadət olduğu üçün Allahdan qeyrisinə edilməz.

6. Allahdan qeyrisinə sığınmaq və ya Allahdan qeyrisindən yalnız Allahın qadir olduğu br şeydə kömək diləmək.

7. Saleh kimsələri və Allahın vəli qullarını onların olduğu məqamlardan həddi aşaraq daha yüksək məqamlara qaldıraraq tərifdə həddi aşmaq. Onların günahsız olduqlarına, bəzi Peyğəmbərlərdən üstün olduqlarına və s. etiqad etmək.

8. Qəbir ətrafında təvaf, orada namaz qılmaq və s.

9. Qəbirlər üzərinə tikili, məqbərə, türbə və s. ucaldılması, qəbirlərin rənglənməsi və s.

10. Falçılıq, fal oxları, kahinlik, münəccimlik, qeyddən xəbər və s. küfr və şirk əməllərlər məşğul olan və bu kimi şeylərə getmək. Hətta saleh və övliya adlansalar da belə bu kimi şeylərdə onlara müraciət edilməz.

11. Uğursuzluğa, işin nəsh gətirməsinə inanmaq. Günlərin, ayların, hansısa heyvanın uçuşu ilə işin uğurlu olub-olmaması və s. kimi mövhumatlara inanmaq.

12. Qəlbi Allahdan qeyrisinə bağlamaq, Allaha təvəkkül etməmək.

13. Qəlb ilə edilən ibadət növlərində hansısnısa Qorxu, məhəmmət və s. Allahdan qeyrisinə etmək.

14. Allahın qəzəbinə uğramayacağından əmin olmaq və Allahın rəhmətindən ümüd kəsmək qadağandır.

15. Allahın təqdiri ilə baş verən qədər qarşısında səbr etməyib, qədərə qarşı çıxmaq. Allahım! Bunu mənə nə üçün etdin? Demək.

16. Dünyalıq bir iş olsada belə riya ilə etmək olmaz.

17. Əmirlərə halalın haram edilməsində, haramım da halal edilməsində itaət etmək.

18. Allah və sən istəyən, göydə Allah yerdə sən, Allah və filakəs olmasaydı və s. kimi sözlərin işlədilməsi.

19. Zamana, günlərə, aylara sözymək.

20. Din, Peyğəmbər, Quran ilə istehza etmək,. Möminlər və alimlərlər istehza etmək və s. Başqa saqqal, isbal, hicab və s. ilə istehza etmək.

21. AbduNəbi, AbdulKabə, Hüsynqulu, Əliqulu və s. kimi adları qoymaq.

22. Canlı bir varlığın surətini çəkmək, onlara təzim və s. etmək.

23. Kafir və münafiqləri dost tutmaq, onları sevmək və s.

24. Allahın hökmündən başqa hökmləri qəbul etmək, onları daha yaxşı saymaq.

25. Alahdan qeyrisinə and içmək.

# TÖVHİDİN QƏLBDƏ KÖK SALMASINA SƏBƏBLƏR

1. Allah qatında olan mükafata çatmaq üçün Onun əmrlərinə itaət etmək.
2. Allahın cəzasından qorxaraq günahları tərk etmək.
3. Göylərin və yerin mülkünün kimin əlində olduğunu düşünmək.
4. Allahın İsim və Sifətləri barəsində bilik əldə etmək.
5. Quranı oxuyarkən mənasını və nə qəsd edildiyini düşünmək.
6. Fərz ibadətlərdən sonra nafilə ibadətlərlə Allaha yaxınlaşmaq.
7. Dil və qəkb ilə Allahı zikr emək.
8. Bir kimsənin sevdiyi birdən çox sevgi bir yerə cəm olduğu zaman bunlar arasından Allahın sevgisini üstün tutmaq.
9. Allahın nemətləri barəsində danışmaq, düşünmək.

10. Allahın qarşısında sınmış bir vəziyyətdə, Ona möhtac olduğunu yaddan çıxarmamaq.

11. Allahın dünya səmasına gecənin 3/1 endiyini düşünərək bu vaxta dua və istiğfarı artırmaq.

12. Saleh kimsələrlər oturub-durmaq.

13. Qəlb ilə Rəbbi arasına girən hər bir şeydən uzaqlaşmaq.

14. Lağlağıdn, faydasız söz-söhbətlərdən, çox yatmaq və çox yeməkdən çəkinmək.

15. Özün üçün arzu etdiyini qardaşın üçün də arzu etmək.

16. Müsəlmanlar haqqında qəlbində kin duymamaq, kibr, həsəd və s. uzaq olmaq.

17. Allahın təqdirinə rıza göstərmək.

18. Nemətə nail olduqda şükr edər, imtahanla qarşılaşdıqda səbr edər.

19. Günahdan sonra dərhal tövbə edərək Allaha qayıtmaq.

20. Kiçik və böyük hər bir işdə Peyğəmbərə ρ uymaq.

21. Allah yolunda cihad etmək.

22. Yaxşılığı əmr edib pislikdən çəkindirmək.

Allahummə! Bizləri Tövhid üzərə yaşadıb, xoşbəxt olanlardan, Tövhid üzərə vəfat etdirib şəhidlik məqamına çatanlardan et!

## ŞİRKİN ZƏRƏRLƏRİ VƏ FƏSADLARI

**1.** Dünya və axirətdə pis aqibətlə qarşılaşmaq. **2.** Dünya və axirətdə olan sıxıntıların ən böyük səbəbi şirkdir. **3.** Şirk dünya və axirətdə olan əminliyi qaldırır, qorxulara səbəb olur. **4.** Şirk dünya və axirətdə zəlalətə düşməyə səbəbdir. **5**. Böyük şirk edən kimsə ölümündən öncə tövbə etməzsə bağışlanması mümkün deyildir. **6.** Böyük şirk bütün əməlləri yox edir. **7.** Böyük şirk sahibinə Cənnəti haram, Cəhənnəmi ilə halal edir. **8.** Böyük şirk sahibi Cəhənnəmdə əbədi qalacaqdır. **9.** Şirk ən böyük zülm və iftiradır. **10.** Allah və Rəsulu ρ müşriklərdən uzaqdır. **11.** Şirk Allahın qəzəbini, cəzasını gətirən və Allahdan uzaqlaşdıran ən böyük səbəbdir. Allahı qəzəbləndirən hər şeydən Allaha sığınırıq. **12.** Şirk fitrət nurunu söndürür. **13.** Gözəl əxlaqı yox edir. Gözəl əxlaq fitrətdəndir. **14.** Böyük şirk sahibinin qan və mal toxunulmazlığını qaldırır. **15.** Kiçik şirk imanı zəiflədir və böyük şirkə aparan səbəbdir.

Ey müsəlman qul! Böyük olsun, kiçik olsun şirkin hər birindən uzaq ol! Bundan Allaha sığın, Allahdan dünya və axirətdə salamatlıq, məğfirət və rəhmət diləyirik! Amin.

# BÖYÜK VƏ KİÇİK ŞİRKİN FƏRQİ

1. Böyük şirk insanı İslamdan çıxardır, kiçik şirk isə İslamdan çıxarmır.

2. Böyük şirk öz sahibini əbədi olaraq Cəhənnəmə salır, kiçik şirk isə əbədi deyildir.

3. Böyük şirk bütün əməlləri batil edir, kiçik şirk isə yalnız riya ilə olunan əməlləri batil edir.

4. Böyük şirk edənin canı və malı halal olur, kiçik şirk edənin isə canı və malı halal deyildir.

5. Böyük şirk edən kimsə ilə müsəlmanlar arasında düşmənçilik olması lazımdır. Müsəlmanların onu sevməsi mümkün deyildir. Yaxın əqrabası olsa da belə. Kiçik şirk sahibini sevməməyə bir səbəb yoxdur. Sahib olduğu şirkinə görə nifrət edilir, imanına görə isə sevilir.

# İSTİFADƏ OLUNAN ƏDƏBİYYAT

"Qurani-Kərim" Ziya Bünyadov və Vasim Məmmədəliyevin tərcüməsi.
"Sələsətil-Usul" Məhəmməd ibn Saleh əl-Useyminin şərhi ilə - Türk dilində.
"Kəşfi Şubuhət" Məhəmməd ibn Saleh əl-Useyminin şərhi ilə - Türk dilində.
"Aləmus-Sunnətul-Mənşura" Hafiz ibn Əhməd əl-Həkəmi - Türk dilində.
"əl-Əqidətut-Təhaviyyə" İbn Əbil İzz əl-Hənəfinin şərhi ilə - Türk dilində.
"Səhih Muslim"- Türk dilində.
"Muxtəsər Səhih əl-Buxari"- Türk və Rus dillərində olan nəşrlər.
"Buluq əl-Məram – Достижение Цели" Перевод с арабского Кулиева Ельмира.
"Riyadus-Salihin"- Türk və Rus dillərində.
"Qəbir Ziyarətləri" İmam Birgivi - Türk dilində.
"Hənəfi Uləmalarina Görə Şirk Və Səbəbləri" Muhəmməd ibn Abdur-Rahmən əl-Humeyyis - Türk dilində.
"Təvəssül" Abdullah ibn Abdul-Həmid əl-Əsəri - Türk dilində.
"Təvəssül" əl-Albani - Türk dilində.
"Təvəssül" İbn Teymiyyə - Türk dilində.
"Основы Религии" Перевод с арабского Кулиева Ельмира.
"Мудрост и Логика Призыва Пророков к Аллаху" Перевод с арабского Кулиева Ельмира.
"Əqaid Risalələri – Qəbirlər, Bidətlər və Ölümü xatırlama" Əhməd ər-Rumi əl-Hənəfi - Türk dilində.
"Qəlbin və Dinin şirk və Küfrdən təmizlənməsi" Əhməd ibn Həcər əl-Btami - Azəri dilində.
"Tövhid Kitabı" Süleyman ət-Təmimi - Azəri, Rus və Türk dillərində.
"Tövhidə Dəlillər Barədə Faydalı Söz" Süleyman ət-Təmimi - Azəri dilində.
"Tevhid Kalesi" Abdur-Rahmən əs-Səədi, Abdul-Aziz ibn Bəz, Saleh əl-Useymin, Abdur-Rahmən Cibrin, Abdul-Kərim əl-Aql – Türk Dilində.
"Soru Ve Cevaplarla Tevhid İnanaci" Dr. İbrahim ibn Salih el-Hudayrî Riyad Büyük Mahkemesinde Kadi – Türk dilində.
“Türbeler Size Muhtaç” – Türk dilində.
"İslamda Qəbirçiliyin Fəsadları" əl-Albani - Türk dilində.
“Lə İləhə İlləllah” Saleh ibn Fovzan – Türk dilində.
“Kəlimətul-İxlas” Hafiz ibn Rəcəb – Türk dilində.
“Tövhidə Zidd Əməllər” Abdul-Əziz ər-Reyys – Azəri dilində.
“Nəvəqidul-İsləm” Muhəmməd ibn Abdul-Vahhab – Rus və Ərəb dilində.
Adil Rəcəbov "Günahlar" səsli dərslər.

Mübariz Qarayev "Kitabu Tövhid" Muhəmməd ibn Abdul-Vahhab, Şərh Muhəmməd İbn Saleh əl-Useymin səsli dərslər.
"Передел Желающего" Салех Али Шейх – Rus dilində.
"Доказательства Единобожия" Шейх: Абд ар-Раззак ибн Абд аль-Мухсин аль-Бадри, Перевод: Кулиева Э.Р.
"Книга Единаобожия" Салих ибн аль-Фавзан.
Ринат Абу Мухаммад "Книга Единобожия" Мухаммад ибн Абдул-Ваххаб, Разъяснение Салех Али Шейх.
Абу Йахйа "Книга Единобожия" Мухаммад ибн Абдул-Ваххаб, Разъяснение Абдур-Рахман ас-Саади.
Руслан Абу Ибрахим "Ширк В Булгаре".
Абу Йахйа "Книга Единаобожия" Салих ибн аль-Фавзан.

# KİTABIN İÇİNDƏKİLƏR